Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 23-24 noyabr 2011-cu il tarixli 10 №-li iclasının qərarı ilə nəşr edilir.

Rəyçilər:
Möhsün Nağısoylu
filologiya elmləri doktoru

Əskər Qədimov
filologiya elmləri doktoru

Toplayıb tərtib edən, ön söz, lüğət və izahların müəllifi:
Hacı Mustafa Mailoğlu

Redaktor:
Hacı Arif Buzovnalı

## ÖN SÖZ

XIX əsrin əvvəlləri və XX əsrin 20-ci illərinə qədər – sovet hakimiyyəti qurulanadək – Azərbaycanın demək olar ki, əksər böyük şəhərlərində ədəbi məclislər fəaliyyət göstərmişdir. Baxmayaraq ki, Azərbaycan xalqının mədəni həyatında ədəbi məclislərin tarixi çox qədimdir, lakin XIX yüzillik ədəbi məclislərin tarixində, əgər belə demək mümkünsə, intibah dövrüdür.

Həmin yüzillikdə Tiflisdə Mirzə Şəfi Vazehin və Gəncədə Mirzə Mehdi Nacinin başçılıq etdikləri "Divani-hikmət", əsrin 30-cu illərində Qubada A.A. Bakıxanovun rəhbərliyi ilə "Gülüstan", yüzilliyin 30-cu illərindən etibarən Ordubadda Şıxəli Naib tərəfindən əsası qoyulmuş, əsrin ortalarından etibarən Hacağa Fəqirin, onun vəfatından sonra isə Məhəmməd Tağı Sidqinin başçılığı ilə "Əncümənüş-şüəra", 1850-1900-cu illərdə Lənkəranda Mirzə İsmayıl Qasirin rəhbərlik etdiyi "Fövcül-füsəha", 1867-ci ildən Şamaxıda əvvəlcə Seyid Əzimin, sonra isə Molla Ağa Bixudun başçılığı ilə "Beytüs-səfa", 1864-cü ildən Şuşada əvvəlcə Hacı Abbas Agəhin, daha sonra Xurşid Banu Natəvanın rəhbərlik etdikləri "Məclisi-üns", 1872-ci ildə Mir Möhsün Nəvvabın təşəbbüsü ilə yaradılmış "Məclisi-fəramuşan", əsrin 80-cı illərində Bakıda Məhəmmədağa Cürminin rəhbərliyi ilə "Məcməüş-şüəra" kimi ədəbi məclislər fəaliyyət göstərmişdir.[1] Qeyd edək ki, klassik irsin öyrənilməsində, söz sənətinin xalq arasında təbliğ olunmasında, həmçinin yeni-yeni istedadların üzə çıxmasında ədəbi məclislərin böyük əhəmiyyəti olmuşdur.

---

[1] Poetik məclislər. Bakı, Yazıçı, 1987

Belə istedadlardan biri də, Azərbaycan ədəbiyyatına bir çox böyük sənətkarlar bəxş etmiş "Əncümənüş-şüəra" ədəbi məclisinin fəal üzvlərindən biri, Naxçıvan ədəbi mühitində özünəməxsus yeri olan Kərbəlayi Hüseyn Nadim Naxçıvanidir.

Azərbaycan ədəbiyyatı tarixində "Nadim" təxəllüsü ilə yazıb-yaradan bir neçə şair olmuşdur. Lakin bunlardan ikisi daha çox məşhurdur. Birincisi XIX əsrdə yaşamış və özündən sonra çox böyük irs qoyub getmiş navahılı Mirzə Baxış Nadim, ikincisi isə növhə və sinəzənləri indi də dillər əzbəri olan Hüseyn Nadim Naxçıvanidir. Çox təəssüflə qeyd etmək lazımdır ki, hər iki sənətkarın əsərləri bu vaxta qədər bütöv halda çap olunmamış, yaradıcılıqları ətraflı şəkildə araşdırılmamışdır.

* * *

**Yazın əvvəlləri idi. İstedadlı qəzəlxan-şair, dostum Hacı Arif Buzovnalı mənə zəng vurub Nadim adlı şair haqqında nə bildiyimi soruşdu. Mən Mirzə Baxış Nadimi nəzərdə tutduğunu zənn edib dedim ki, mərhum tədqiqatçı Cəfər Rəmzinin tərtib etdiyi "Deyilən söz yadigardır" adlı topluda onun haqqında bəhs olunmuş və bir neçə qəzəli verilmişdir. Əlyazmalar İnstitutunda da əsərləri qorunmaqdadır. Lakin Hacı Arif cavabında başqa Nadimi nəzərində tutduğunu dedi. Məlum oldu ki, bu, Naxçıvanın Nehrəm kəndindən olan və orada yaşayıb-yaratmış və orada da vəfat etmiş Hüseyn Nadim Naxçıvanidir. Mən bu şair haqqında eşitdiyimi, lakin təəssüflər olsun ki, həyatı və yaradıcılığı barədə məlumatsız olduğumu dedim. Hacı Arif məndən onun Əlyazmalar İnstitutunda saxlanılan əsərləri haqqında məlumat əldə etməyimi xahiş etdi və**

**dedi ki: "Mən Nadimin nəvəsi Şahin Abdullayevlə uzun müddətdir ki, dostluq edirəm. Hər zaman özümün yeni qəzəllərimi onun üçün oxuduqda çox diqqətlə qulaq asar və fikrə gedərdi. Çox düşünürdüm ki, qəzəliyyata olan bu maraq Şahin müəllimdə haradandır. Bir dəfə söhbət əsnasında o, dedi ki, mənim babam da şair olub. Amma təəssüflər olsun ki, əsərləri tam şəkildə çap olunmayıb. Bu işdə mənə yardımçı ol. Mən bu işi sənə həvalə etməyi ona məsləhət bildim".**

**Mən bu barədə filologiya elmləri doktoru Möhsün Nağısoylu ilə məsləhətləşməyi qərara aldım. Möhsün müəllim mənə filologiya elmləri doktoru Əsgər Qədimovun tərtib etdiyi kitabı verdi (Hüseyn Nadim Naxçıvani. Seçmə şeirlər. Azərbaycan Dövlət Nəşriyyatı, Bakı, 1993). Yeri gəlmişkən, kitabın həcmcə kiçik olmasına və burada əsasən şairin qəzəllərinə yer verilməsinə baxmayaraq, Nadim yaradıcılığı haqqında ilkin məlumatı əldə etmək baxımından əhəmiyyətlidir.**

* * *

AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda Nadimin iki dəftərdən ibarət əlyazması qorunub saxlanılır. B-7792 şifrəsi altında saxlanılan əlyazmanın cildi kartondur. Ümumi dəftərə təhriri xətlə köçürülmüşdür. Həcmi 104 vərəqdən ibarətdir. Ölçüsü 16,5x23,5 sm-dir. 1a-dan 17b-yə qədər olan hissə səliqəli nəsx xəttilə qara mürəkkəblə yazılmışdır. Növhələr ardıcıllıqla sıralanmışdır. Əvvəldən təxminən 10-15 səhifə düşmüşdür. Bəzi növhələrə müxtəlif xətlərlə düzəlişlər edilmişdir. Əlyazmada 134 növhə və sinəzən, payi-minbər, minacat, qəsidə və çavuşi yer almışdır. Bəzi növhələrə başlıq verilmiş,

əksəriyyətində isə sadəcə sinəzən yazılmışdır. Səkkiz növhə natamam, bir növhə isə təkrardır.

Nadimin digər əlyazması B-1241 şifrəsi altında saxlanılır. Ümumi dəftərə təhriri xətlə yazılmış olan bu əlyazmanın da cildi kartondur. B-7792 şifrəsi altında saxlanılan dəftərin davamıdır. Bu əlyazmada 141 növhə, qəsidə, payi-minbər, müstəqil əfrad (bunlar orijinalda dübeyt adı altında verilmişdir) yer almışdır. Həcmi 149 vərəq olan əlyazmanın ölçüsü 17,5x22,2 sm-dir. Burada da növhələr ardıcıllıqla sıralanmışdır. 10 növhə natamam, bir neçə növhə təkrar getmişdir.

Bunlardan başqa, Nadimin nəvəsi Şahin Abdullayev bizə atası mərhum Məhəmməd Abdullayev tərəfindən kiril əlifbasına çevrilən və makinada çap olunmuş dəftərləri təqdim etmişdir. Dəftərlərdən biri mərhum Məhəmməd Abdullayevin kiril əlifbası ilə yazdığı əlyazmadır. Ümumilikdə, makinada yazılmış növhələrin sayı 62-dir. Lakin bunların çox hissəsinin Nadimin orijinal əlyazma nüsxələrində mövcud olduğundan və növhələrin əksəriyyətində çoxlu səhvlərə yol verildiyindən tərtib etdiyimiz "Divan"a daxil etmədik. Bundan əlavə Əsgər Qədimovun tərtib etdiyi kitaba düşməyən bəzi qəzəlləri də "Divan"a daxil etdik. Təəssüflə qeyd etməliyik ki, Nadimin qəzəllərinin orijinalı günümüzə gəlib çatmamışdır. Bu səbəbdən biz mərhum Məhəmməd Abdullayevin dəftərlərindəki qəzəllərdən istifadə etməli olduq.

Biz Nadimin növhələrini hadisələrin ardıcıllığı ilə sıraladıq. Növhələrə başlıq verərək öz qəhrəmanlarının dili ilə təqdim etdik. Qəzəlləri də divan ədəbiyyatı qaydalarına uyğun olaraq əlifba sırası ilə sıraladıq.

Mərhum Məhəmməd Abdullayevin arxivindəki dəftərlərdə olan növhə və qəzəllərdə çoxlu xətalar mövcud idi. Bu səhvlərin düzəldilməsində kitabın redaktoru, qəzəlxan-şair Hacı Arif Buzovnalının zəhmətini xüsusi qeyd etmək lazımdır.

* * *

Hüseyn Nadimin həyat və yaradıcılığı haqqında ilk məlumatı "Şərq qapısı" qəzetində (27 mart 1947-ci il) Əli Hüseynov adlı müəllif vermişdir. "Hüseyn Abdulla oğlu (Nadim)" adlı bu məqalədə Nadim haqqında qısa məlumat verilmişdir. Sonralar isə onun haqqında müxtəlif illərdə bir neçə məqalə çap olunmuşdur. Fərman Xəlilovun "Nadim" adlı məqaləsini ("Şərq qapısı", 27 iyul, 1971-ci il), Rasim Tağıyevin "Azərbaycan müəllimi" qəzetində (1 noyabr 1974) "Açılmamış səhifələrdə döyünən ürək" adlı məqaləsini, Əsgər Qədimovun "Hüseyn Nadim Naxçıvani" ("Şərq qapısı", 23 may 1975-ci il) adlı məqaləsini göstərmək olar. Nadimin ədəbi irsindən seçmə nümunələri ilkin olaraq filolofiya elmləri doktoru Əsgər Qədimov "Seçmə şeirlər" (Azərnəşr, 1993) adı altında kitabça şəklində çap etdirib oxuculara çatdırmışdır.

* * *

Hüseyn Abdulla oğlu Mehdiyev (Nadim) 1871-ci ildə Naxçıvanın Nehrəm kəndində anadan olmuşdur. İlk təhslini mollaxanada alan Hüseyn, sonra Cəlil Məmmədquluzadənin dərs dediyi məktəbdə oxumuşdur. Təəssüflə qeyd etməliyik ki, atası vəfat etdiyinə görə erkən yaşlarından böyük bir ailənin qayğısını çəkən Hüseyn maddi ehtiyaclar üzündən təhsilini yarımçıq qoymaq məcburiyyətində qalmışdır. Lakin

məktəbi bitirməsə də, təhsilini şəxsi mütaliə yolu ilə artırmış, ərəb və fars dillərinə yiyələnmiş, bu dillərin sayəsində İslam tarixini, həmçinin Şərq ədəbiyyatını, xüsusilə klassik Azərbaycan poeziyasını mənimsəmişdir. Nadimin oğlu mərhum Məhəmməd Abdullayev atası haqqında aşağıdakıları xatırlayır: "Atam Nehrəm kəndinin mollaxanasından və şəxsi mütaliəsi ilə ərəb və fars dillərini mükəmməl öyrənmişdi. Nizamini, Füzulini, Sədini, Hafizi, Xəyyamı, Nəvaini çox oxuyardı. Nizaminin farsca əsərləri, Qumrunun, Racinin kitabları atamın kitabxanasında saxlanılırdı. Lakin atamın vəfatından sonra 1930-cu illərdə ərəb əlifbası ilə yazılan kitabları evlərdə saxlamaq qadağan edildiyi üçün qorxudan o kitabların hamısını başqaları kimi biz də yandırdıq. Çox güman ki, atamın əsərləri də elə o zamanlar itib-batdı. Sonralar dini şeirlərini və qəzəllərinin bir qismini tapıb Əlyazmalar fonduna verə bildim..."

Hüseyn Nadim Naxçıvani həddindən artıq vətənpərvər bir şəxs olmuşdur. Şairin oğlu Məhəmməd Abdullayevin arxivində olan və yazılı şəkildə mühafizə olunan sənədlər sübut edir ki, Nadim 1918-1920-ci illərdə daşnak Andronikin "Böyük Ermənistan" yaratmaq xülyası ilə Naxçıvana, şairin doğma kəndi Nehrəmə və Ordubad ərazilərinə basqınını öz gözləri ilə görmüş və daşnakların hücumunu dəf etmək üçün yaradılan partizan dəstəsinin tərkibində vuruşmuşdur. O zaman türklər bu xəbəri eşidir və öz ərazilərindən ermənilərə top atəşi atırlar. Andronik türk topunun səsini eşidən kimi türklərin bizə köməyə gəldiyini başa düşür və qoşunlarını Naxçıvandan çıxarır. Bu hadisədən sonra erməni-daşnaklar fürsət tapan kimi Naxçıvana hücum edərmişlər. Nəhayət, 1920-ci ildə ermənilər Naxçıvanın Ordubad və Tivi ərazilərinə hücum edirlər. Hüseyn Nadim

Ordubadın Əlƞgəz dağı ətrafında gedən döyüşlərdə yaralanır. Vətənpərvər şair elə bu yaranın nəticəsində 1927-ci ildə vəfat etmiş və böyük izdihamla Nehrəm məzalığında torpağa tapşırılmışdır.

* * *

Qeyd etdiyimiz kimi, Hüseyn Nadim o qədər də xoş güzəran keçirməmişdir. Atasının vəfatından sonra Nadim Nehrəm kəndində kiçik bir çayxana açmış və həmin çayxananın cüzi gəliri ilə dolanmışdır. Deyilənlərə görə, Nadimin çayxanası şeir-sənət adamları ilə dolu olarmış. Culfa və Ordubaddan bir sıra şeir həvəskarları və şairlər gəlib Nadimlə şeirləşər, Nadim də tez-tez Ordubada gedib ədəbi məclislərdə iştirak edərmiş...

..."Əncümənüş-şüəra" ədəbi məclisinə Hacağa Fəqir, Məhəmməd Tağı Sidqi, Molla Hüseyn Bikəs, Usta Zeynal Nəqqaş, Məşədi Həsən Dəbbağ, Məhəmmədqulu Salik, Mir Əbdürrəhim Qüdsi Vənəndi, Mirzə Mehdi Naxçıvani kimi ustad sənətkarlar toplaşardılar. Təbii ki, ədəbi mühit olmadan ədəbiyyatın inkişafından söhbət gedə bilməz. "Əncümənüş-şüəra" ədəbi məclisinin və bu məclisə yığışan ustad sənətkarların da Nadimin yaradıcılığına təsiri danılmazdır. Yeri gəlmişkən, Nadimin yaradıcılığında Bakı və Qarabağ ədəbi mühitinin də təsiri duyulmaqdadır. Bu da onu göstərir ki, XIX-XX əsrlərdə Azərbaycanda fəaliyyət göstərən ədəbi məclislərin bir-biri ilə sıx əlaqələri olmuşdur.

Mərhum tədqiqatçı alim Nəsrəddin Qarayev "XIX əsr Azərbaycan ədəbi məclisləri" adlı kitabında yazır ki: "ömrünün son illərində Hacağa Fəqirin gözləri tutulur. Bu zaman onun dediyi şeirləri dostu Sidqi yazıb toplayırdı. Məclis üzvlərindən Bikəs və Nadim də bu işdə ona kömək

edirdilər. Çox güman ki, Fəqirin əldə olan əsərlərini də vaxtilə onlar toplamışlar”.[1]

Hüseyn Nadimin qəzəllərindən danışarkən, şairin klassik üslubda yazılmış aşiqanə-lirik qəzəlləri ilə yanaşı, dini-ictimai motivli qəzəllərini də xüsusi qeyd etməliyik. Vətən və millətin taleyi, din və əqidə təəssübkeşliyi, insaf və ədalət axtarışları Nadim qəzəllərinin əsas leytmotivini təşkil edir:

Yox bircə kəs xilas edə bu nardən bizi,
İmdad edən yoxdı bu biçarə millətə.

İslamdən kənar eləsün bu bəlaləri,
Olsun müin zəmanədə dilparə millətə...

... Mən Nadiməm, zəmanədə millət cünuniyəm,
Ağlar gözüm həmişə bu biçarə millətə!

Nadim Əhli-Beyt (ə) aşiqi olduğundan dəfələrlə Kərbəla və Məşhəd ziyarətinə getmiş, İmamların qəbrini ziyarət etmişdi. Lakin o həm də bir Füzuli aşiqi idi. Kərbəla ziyarətində olarkən dahi Füzulinin məqbərəsi önündə yazdığı qəzəl buna bariz nümunədir:

Füzuli, dur əyağə, qəmə giriftarəm, ağlaram,
Dəstgirəm sənüntək ruzgardə, xarəm, ağlaram.

---

[1] Nəsrəddin Qarayev. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, Nurlan, 2010

Qəbrün üstə baş əydim, qüssədən qanla dolub könlüm,
Solub gülistandə güllərim, səntək zarəm, ağlaram.

Cismi-pakun xak olubdur türbəti-Kərbübəladə,
Lal oldı dilim, yox bir sözüm, əzadarəm, ağlaram.

Eşq eyləyübdi dərbədər bimunisü yar Nadimi,
Kəhrəba kimi soldı gül yüzüm, biyarəm, ağlaram.

Qəzəlləri ilə yanaşı, Nadimin qəsidələri, növhə və sinəzənləri, dini-ictimai məzmunlu şeirləri, satiraları da mövcuddur. Lakin qeyd edildiyi kimi, şairin ədəbi irsinin çox hissəsi itib-batdığından əldə olan şeirləri içərisində növhə və sinəzənlər çoxluq təşkil edir.

Hüseyn Nadim Naxçıvani son dərəcə İslam dininə bağlı, imanlı, etiqadlı bir şəxs olmuşdur. Oğlunun söylədikləri də bunu təsdiq edir: “Atam həddindən artıq dindar idi. Kərbəla müsibətlərini nəzmə çəkərdi”. “Əfv elə” adlı şeirində yazır:

Şahid ol iqrarimə, mən ol Xəlilə millətəm,
Ənbiya xətmi Rəsuli-rəhnümayə ümmətəm,

Şiəyəm, çünki Əmirəlmö`mininə rəyyətəm,*
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

Cə`fəriməzhəb, Xuda, Qur`an kitabimdür mənim,
Yox səadət min günah yazsa, əzabimdür mənim...

---

* Rəiyyətəm

Qeyd etdiyimiz kimi, müxtəlif şeir növlərində əsərlər yaradan Nadimin yaradıcılığında növhə janrı xüsusi yer tutur. Bu səbəbdən də onu növhəxan-şair kimi təqdim etmək daha məqsədəuyğundur.

Klassik növhə ədəbiyyatında növhə şairləri bir qayda olaraq əruzun bir neçə bəhrindən istifadə edirdilər. Lakin Nadim bu qaydanı pozaraq öz növhə və sinəzənlərində demək olar ki, çox az işlənən bəhrlərdən də istifadə etmişdir ki, bu da onun güclü təbə malik olması, əruzu yaxşı bilməsi və yaradıclığının çoxşaxəli olması ilə əlaqədardır.

* * *

İnsanlar ta qədimdən şadlıqlarını ifadə edən nəğmələr, mahnılar yaratdıqları kimi, kədərlərini büruzə verən hüznlü şeirlər də yaratmalı idilər. Təbii ki, Yaxın və Orta Şərqdə, eləcə də Azərbaycanda yaranmış olan oxşamalar, ağılar, daha sonralar məna etibarilə bunlara yaxın, lakin məzmun, kompozisiya, üslub və dil cəhətdən bir qədər fərqli olan mərsiyələr, növhə və sinəzənlər də məhz bu ehtiyacdan meydana gəlmişdir.

Əvvəllər məşhur şəxsiyyətlərin, hökmdarların, eləcə də müxtəlif elm və sənət adamlarının ölümü münasibətilə yazılan mərsiyələr Kərbəla faciəsindən sonra İranda və Azərbaycanda daha önəmli və daha geniş vüsət tapdı.

Xatəmül-ənbiya Həzrət Mühəmməd (s) Allah-təalanın ona nazil etdiyi müqəddəs qayənin – İslamın təbliği yolunda məşəqqətlərə dözdü, cəfalara sinə gərdi. Peyğəmbərimizin sevimli nəvəsi, "həyat əqidə və cihaddan ibarətdir!" – buyuran Həzrət Hüseyn (ə) isə özünün, əshabının, Əhli-Beytinin şəhadətiylə, Əhli-əyalının əsarətiylə İslamın

izzətini, imanın qüdrətini, haqqın batil üzərindəki qələbəsini bütün aləmə bildirdi, dinimizi ehya etdi, yaşatdı...

Ey olan ismi-şərifi ərşə zinət, ya Hüseyn,
Şafiyi-ruzi-qiyamət, babi-cənnət, ya Hüseyn.

* * *

**Hicri tarixi ilə 61-ci il məhərrəm ayının 10-da Kərbəla çölündə qanlı bir faciə baş verdi. Tərəfdarları və Əhli-Beyti (ailə üzvləri) ilə birlikdə Məhəmməd (s) Peyğəmbərin nəvəsi Həzrət İmam Hüseyn (ə) çox böyük işgəncələrlə qətlə yetirildi.**

**Həzrət Hüseyn (ə) on iki imamın üçüncüsüdür. Atası Əli ibn Əbu Talib (ə), anası Məhəmməd (s) Peyğəmbərin qızı Fatimədir (ə). Hicrətin 4-cü ilində şəban ayının 5-də (02.01.626) Mədinədə dünyaya gəlmişdir. On iki İmamdan ikincisi İmam Həsən (ə) atası Həzrət Əlinin vəfatının ertəsi günü Kufə məscidinə gəlib minbərə çıxdı, bir xütbə oxudu. Xütbədən sonra Abdullah ibn Abbas ayağa qalxıb: "Ey insanlar, bu şəxs Peyğəmbərimizin nəvəsidir, sizdən biyət istəyir, sözünüz nədir?" – deyə məsciddəkilərə müraciətlə dilləndi. Məsciddəkilər bir ağızdan: "Biyət etdik!" – deyə səsləndilər. Bu hadisədən o qədər də çox keçməmiş 40 min adam Həzrət İmama (ə) biyət etdi. Lakin...**

**Şam valisi Müaviyənin əsas rəqibi İmam Həsən (ə) kufəlilərin vəfasızlığı üzündən bəzi şərtlərlə Müaviyə ilə sülh bağlamağa məcbur oldu. Bu şərtlərdən biri Əhli-beytin vəziyyətinə dair idi. Digəri, Müaviyə ölərkən yerinə bir kimsəni təyin etməməsi idi. Belə ki, İmamın şərtinə görə, müsəlmanlar toplaşıb özlərinə başçı seçməli idilər.**

**Şərtlərdən biri də bu idi ki, minbərlərdə Həzrət Əli (ə) haqqında pis bir söz söylənməyəcək, ona lənət oxunmayacaqdı. Müaviyə o biri şərtləri qəbul etdi, təkcə Həzrət Əliyə lənət oxunmaması şərti ilə razılaşmadı, lakin Əhli-beytin, xüsusilə İmam Həsənin iştirak etdiyi məclislərdə lənət oxunmayacağını söylədi. Ancaq sonradan şərtlərin heç birinə riayət olunmadı. Müaviyənin təhriki ilə dəfələrlə zəhər içirilən Həzrət Həsən (ə) hicrətin 47-ci ilində, səfər ayının 29-da (1.5.667) 43 yaşında Mədinədə vəfat etdi.**

**Müaviyə hicrətin 60-cı ilində rəcəb ayının 15-də (21.04.680) öldü. Müaviyənin oğlu Yəzid xəlifə təyin edildi və xalqdan biyət aldı. Lakin Həzrət Hüseyn Yəzidə biyət etmədi. Bununla əlaqədar, Yəzidə əmisi oğlu Vəlid ibn Ütbəyə məktub göndərdi. Məktubunda mədinəlilərdən, xüsusilə Əli oğlu Hüseyndən biyət almasını tələb edir və yazırdı ki, əgər biyət etməzsə, başını kəsdirib mənə yolla. Vəlid məktubu alan kimi Mərvan ibn Həkəmi çağırtdırıb, onunla məsləhətləşdi. Mərvan Hüseynin biyət etməyəcəyini söylədi və Həzrət Hüseynin öldürülməsini məsləhət gördü. Vəlid gecə ikən bir məclis qurdurdu, Hüseyn üçün xəbər yollayıb, onu çağırtdırdı.**

**Hüseyn (ə) bu xəbəri alan kimi, 30 silahlı adamla Vəlidin hüzuruna getdi. Adamlar bayırda hazır vəziyyətdə durdular, Həzrət Hüseyn (ə) içəri daxil oldu. Mərvan da məclisdə idi. Həzrət Hüseyn (ə) bildirdi ki, Yəzid kimi əqidəsi və məsləki şübhəli bir adama tabe olmayacaq. Mərvanın israrına baxmayaraq, Vəlid söylədi ki, Peyğəmbər nəvəsinin qanına bais ola bilməyəcək. Həzrət Hüseyn (ə) məclisdən çıxdı. Bu hadisə hicrətin 60-cı ilinə, rəcəb ayının 27-nə (3.5.680) təsadüf edirdi. Həzrət**

Hüseynin (ə) Yəzidə biyət etməyəcəyi artıq məlum idi. Kufəlilər Həzrət İmama (ə): "Biz də biyət etməyəcəyik, gəl, başçımız ol, uğrunda candan keçərik!" - deyə məktublar göndərirdilər. Hüseyn (ə) əmisi oğlu Müslimi Kufəyə yolladı və onunla göndərdiyi məktubda yazırdı: "Müslimə, mənim adıma biyət etsəniz və o, həqiqətən də gerçək olduğunuzu bildirərsə, gələrəm!".

Hüseyn (ə) Mədinədə hər an təhlükə ilə qarşılaşa bilərdi, halbuki Məkkədə hərəm vardı. İslama görə, hərəmdə qisas almaq qadağandır. Doğrudur, Üməyyə nəslinə bel bağlamaq olmazdı. Lakin çox güman ki, müsəlmanların qorxusundan buna cürət etməzdilər. Həzrət Hüseyn (ə) bütün yaxın adamları ilə birlikdə Mədinədən Məkkəyə getdi. Köçməmişdən əvvəl Həzrət Peyğəmbərin (s), anası Fatimənin (s.ə), qardaşı Həsənin məzarlarını ziyarət etdi.

Hüseyn (ə) Məkkəyə şəban ayının 3-də (9.5.680) çatdı. Abdullah ibn Abbasla Abdullah ibn Zübeyr ziyarətinə gəldilər. İmam onlara səbirli olmalarını əmr etdi.

Bəni Üməyyədən olan Məkkə valisi, Yəziddən aldığı əmrə əsasən Həzrət Hüseyni sıxışdırmağa başladı. Müslim də onu Kufəyə dəvət etmişdi. Hüseyn (ə) Məkkədə elə bir vəziyyətə düşmüşdü ki, o müqəddəs yerdə hər an qan tökülə bilərdi. Həzrət Peyğəmbər (s)-in zövcəsi Ümmü Sələmə, Peyğəmbərin əmisi oğlu Abdullah, İmamın qardaşı Məhəmməd Hənəfiyyə Həzrət İmama öyüdlər verib dedilər ki, kufəlilərə inanmasın, Məkkəni tərk etməsin. Lakin Hüseyn (ə) onu nələr gözlədiyini, başına nələr gələcəyini qabaqcadan bilirdi.

Həzrət Hüseyn (ə) Müslimin Kufədə şəhid edildiyi gün Məkkədən çıxdı. Vali Məkkədən çıxmasına mane

**olmaq istədisə də, niyyəti baş tutmadı. Müslimin ölüm xəbərini İmam (ə) yolda eşitdi. Nəhayət, bir gün, Kufədən gələn bir ordu ilə qarşılaşdı...**

**...Kərbəlaya gəlişlərinin 4-cü günü Həzrət Hüseyn (ə)-ın dəstəsi böyük bir ordu tərəfindən mühasirəyə alındı. Ordu komandanı Ömər ibn Səd idi. Ertəsi gün Fərat suyunu mühafizə altına aldılar, bir gün sonra döyüşə başlamaq istədilər. Hüseyn (ə) o gecə namaz qılmaq, Allaha dua etmək, Qur`an oxumaq üçün düşmən tərəfdən izn aldı. O gecə Tasua günü, yəni Aşura gününün gecəsi idi. Sabahı gün, hicrətin 61-ci ilinin ilk ayının 10-cu günü (12.10.680) isə Aşura günü - müdhiş bir faciə kimi tarixə həkk olunacaqdı! Bu, hakimiyyət davası deyildi. Hüseyn (ə) bilirdi ki, 80-100 adam otuz iki min nəfərlik orduya qarşı tab gətirə bilməz. Onun qarşısında iki yol var idi: zillətlə yaşamaq – Şərəflə ölmək!**

**Hüseyn (ə) ikincisini üstün tutdu. Döyüşə girişdi. Özü, dostları, qohum-əqrəbası, altı aylıq südəmər körpəsi gözləri önündə şəhid oldular... Həzrət Hüseyn (ə) bu tarixi savaşı, yenilməz iradəsi ilə sanki bütün insanlara demək istəyirdi ki, izzəti-nəfsinizi qoruyun, şərəflə yaşayın.**

* * *

Məşhur ədəbiyyatşünas Firidun bəy Köçərli Kərbəla faciəsini və bu faciənin fövqündə duran İmam Hüseynin (ə) müsibətini xarakterizə edərək yazırdı: **“Əgər iradü etiraf olunsa ki, kədər ilə səfa və qəm ilə sürur və yaş ilə nur bir yerdə ola bilməz, bunlar bir-biri ilə zidd olduğu halda uyuşmaz, onda deyə bilərik, bəli, İmam Hüseyn müsibətində bu feyz vardır, bir yandan ağladır, bir yandan nuraniyyət bəxş edib şad qılır; Bir yandan qəmləndirir, bir**

**yandan qəmü qüssədən azad edir. Bir yandan şikəstəvü pərişanhal edir, bir yandan uca məqamlarda dövr etməyə pərü bal verir. Bu feyzü bərəkət, bu qeyri-adi halət və xüsusiyyət ancaq Seyyidüş-şühəda (ə) müsibətü əzasına müxtəsdir, ancaq mahi-mühərrəmdə tərtib olunan təziyələrdə hiss olunur..."**[1]

Bu təziyələri şərafətləndirən, bu matəmləri rövnəqləndirən təbii ki, Azərbaycan mərsiyə ədəbiyyatının Qumri, Raci, Dəxil, Sərraf, Pürqəm, Dilsuz, Şüai, Tuti, Nadim və onlarla digər görkəmli nümayəndəsinin bu günümüzə gəlib çatan və şübhəsiz həmişə yaşayacaq əsərləridir. Bəli, növhəxan şairlər həm özlərinə, həm də əsərlərinə əbədi həyat bəxş etmişlər desək, yanılmarıq. Çünki dünya durduqca onu sevənlərin könlündə əbədi məqam tapan İmam Hüseyn əleyhissəlamın müsibəti unudulmayacağı kimi, bu böyük müsibətin poetik əks-sədası olan mərsiyələr və növhələr də unudulmayacaq.

Ağla Hüseynə, göz yaşı tök ruzi-həşrətək,
Qəsri-cinan, huriyü qılman bəhası var.

Nadim, həmişə ağla Hüseynün o halinə,
Gəlməz şümarə, cismdə hədsiz yarası var.

Nadim Kərbəla faciəsini Dəxil, Qumri, Şüai kimi ardıcıllıqla təsvir etməmişdir. Nadimin növhələrində daha çox Raci və Sərraf ruhu duyulur. Nadim də Raci və Sərraf kimi əhvalatın ayrı-ayrı hadisələrini yanıqlı bir dillə nəzmə çəkmişdir. Nadimin İmam Hüseyn (ə)-ın, onun övladlarının,

---

[1] Firudin bəy Köçərli. Azərbaycan ədəbiyyatı. Bakı, Yazıçı, 1981

digər şəhidlərin başına gətirilən əzablardan bəhs edən, qəm-qüssə dolu növhə və sinəzənlərini oxuduqca, insanda zülmə, azğınlığa, vəhşiliyə qarşı dərin nifrət hissi oyanır:

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Nadimin növhələrində daha çox şəhidlərin qəhrəmanlığından deyil, məzlumiyyətindən bəhs edilir. Bu məzlumiyyətin sayəsində qüvvələrin qeyri-bərabərliyindən doğan çarəsizlik deyil, İLAHİ EŞQ dayanır. Bu eşqin yolunda şəhidlərin hər biri canını fəda etməyə hazırdır:

Cəzbeyi-eşq edüb əgər azimi-Kərbəla səni,
Dəşti-bəladə gözləyir firqeyi-əşqiya səni,
Rəhm et əmuyə, dutmuşam çün məni-binəva səni,
Nadimi eyləmə, əxa, qəbri-Peyəmbər həsrəti.

Və ya,

Qasimin Əkbər öləndən sora səbri tükənüb,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.

Son olaraq, Hüseyn Nadim Naxçıvaniyə – qüdrətli qələm sahibinə, Əhli-Beyt (ə) və İmam Hüseyn (ə) aşiqinə Allah-təaladan rəhmət, məğfirət, əbədi səadət diləyirik.

**Hacı Mustafa Mailoğlu**

Yox bircə kəs xilas edə bu nardən bizi,
İmdad edən yoxdı bu biçarə millətə.

İslamdən kənar eləsün bu bəlaləri,
Olsun müin zəmanədə dilparə millətə.

Versün səsimizə səsini, eyləsün mədəd,
Bir çarə eyləsün bu güni qarə millətə.

Gəlsün cəhanə dini-müsəlmani hifz edən,
Lütf eyləsün bu haldə avarə millətə.

Yetsün bu gündə milləti-İslam hərayinə,
Hər səmtdən yetüb genə min yarə millətə.

Mən Nadiməm, zəmanədə millət cünuniyəm,
Ağlar gözüm həmişə bu biçarə millətə!

* * *

Edərəm eşqi ilə canımı dildarə fəda,
Necə Sən`an elədi canını küffarə fəda.

Sən qəbul et məni qurbanlığa, qurbanın olum,
Qoy edim canımı ol səfheyi-rüxsarə fəda.

Aşiqin canı həmişə rəhi-cananda çıxar,
Yoxsamı aşiqi mə`şuqinə yalvarə, fəda.

Neçə müddətdi könül vəslinə amadə olub,
Yetmədim vəslinə, ta canım edəm yarə fəda.

Nə edim, istəyirəm ayrı cür illac eləyim,
Düşürəm dərdü qəmə, tapmayıram çarə, fəda.

Nadiməm, ya yetişəm vəslinə dünyadə gərək,
Ya ki, payində olam dilbəri-xunxarə fəda.

* * *

Gərək insan olanın qeyrəti, həm qanı ola,
Adil, insaflı və həm məzhəbü imanı ola.

Aqibət yoxdur olar fani cəlalü cəbərut,
Bir açıq süfrəsi, miskin doyuran nanı ola.

Gülüm, əhmər səni qoy eyləməsün məst, oyan,
Əhli-vicdan olanun xeyratı, ehsanı ola.

Bükəcəkdür fələk axırda o ər`ər qədüvi,
Başun üstə oxunan ayeyi-Qur`anı ola.

Qəbrstan ola mənzil, oxunar ə`malı,
Sağlığında pis işi, ya ki, bəd ünvanı ola.

Mələkül-mövt oturar sinəvün üstündə sənün,
Xeyr elə, Nadim, o dəm dərdüvə dərmanı ola.

* * *

Üşşaqın adəti gərək ahü fəğan ola,
Məcruh qəlbi, zinəti əlbəttə qan ola.

Ey ömr, gəl dəvam elə cəhan fəraqinə,
Bülbül gərək çəməndə müdam pasiban ola.

Heç bülbüli rəvadımı tənha qoyub güli,
Gülşəndə xar ilə gedübən həmzəban ola?

Cəhd eyləyür ki, canım ala, yoxdı heç sözüm,
Əmri-Xudadı, nazlı gərək mehriban ola.

Az ağla, gəlmə naləyə, Nadim, məlal ilə,
Ağlar qoyan səni özi xari-cəhan ola!

* * *

Eşq odı aşiqə aləmdə gərək qismət ola,
Yanub hicran oduna dəhrdə bitaqət ola.

Nə mənim eşqim olaydı, nə də hicranın odı,
Nə də əğyarlər ol yar ilə həmsöhbət ola.

Nə, Xuda, bülbül olaydı, nə də gülzardə gül,
Nə də ol qönçeyi-gül xar ilə həmvəhdət ola.

Nə könül mülki yana eşq ilə hicran oduna,
Nə də hicran ilə bu xəstə könül qarət ola.

Nə siyah çeşm ola, nə zülfi-siyah, sib zənəx,
Nə də eşq əhlinə nalə eləmək adət ola.

Nə ola Nadimə ruzi rüxi-zibayi-sənəm,
Nə də bu xilqət ola, dərdü qəmü möhnət ola.

* * *

Bəlayə səbr edərəm, gər vüsali-yar olsa,
Əlimdə dəsti əgər bircə gün şikar olsa.

Rəqib tə`nəsinə eylərəm zəmanədə tab,
Yanımda şərt ilə ki, yar bərqərar olsa.

Səbəb budur ki, qəmim aşikar olubdı mənim,
Çün əndəlib çəkər ah, gül dibində xar olsa.

O əndəlib kimi qəmlərim ziyadə olub,
Qəmim fənayə gedər əsl növbəhar olsa.

Məzəmmət eyləmə zahid məni, qəmim çoxdur,
Həmişə ağlayar hər kəs ki, intizar olsa.

Gözətləyər* rəhi-cananı Nadim əldə qələm,
Gərək nigarə yetə, qanı laləzar olsa.

* * *

Bülbül cəfa çəkərmi məgər xar olmasa?
Gəlməz nəvayə xar ilə əğyar olmasa.

Cəh-cəh edərmi şaxeyi-güldə səbahədək?
Qılmaz nəvanı xilqəti-gülzar olmasa.

Zahid dil ilə razü niyaz eyləməz yəqin,
Qəlbində gər məhəbbəti-Qəhhar olmasa.

Bimarlər bu bəstəri-qəmdə həlak olar,
Dünyadə gərçi haziqü təb`dar olmasa.

---

* Gözləyər

Gəlməz nəvayə Nadimi-şeyda, məlal ilən,
Qəlbində gərçı firqəti-dildar olmasa.

* * *

Mülki-dil yandı genə yari-cəfakar oduna,
Görüm heç kimsə düçar olmasun ol yar oduna.

Bu könül meylini bir aşiqi-xunxarə salub,
Yandım aləmdə əbəs hicr ilə əğyar oduna.

Aldanub bir sənəmin gülrüxü zibasinə mən,
O da yandırdı məni firqəti-dildar oduna.

Meylüvi salma dedim, kafərü biganələrə,
Yandırır həşrə kimi cismüvi azar oduna.

Büti-zibadı bular, zərrəcə yox rəhmləri,
Yandırırlar səni, bil, Xaliqi-Qəhhar oduna.

Keçdi vəqt, Nadim, oyan fürsəti fövt eyləməmiş,
Nə əcəb yanmamısan həşrdə Səttar oduna.

* * *

Əhsən ola o gözlərüvə, məh cəmaluva,
Qurban olum yanağuva, ol qarə xaluva.

Bəxş etgilən bu aşiqə bir busə naz ilə,
Canım fəda o ləblərüvə, gül yanağuva.

Bu aşiqi-bəlakeşüvə mərhəmət buyur,
Qoy bu ləblərini ol gülə bənzər dodağuva.

Gəl, eylə mərhəmət ki, tərəhhüm zəmanidür,
Olsun fəda bu canım o şirin məqaluva.

Rəhm et, məriz aşiqüvi qəmdən et xilas,
Aludədür bu könlüm o çeşmi-xumaruva.

Hicrində Nadimin necə gör, biqərardur,
Bir leyl sübh olunca məni al kənaruva.

* * *

Lütf ilə etdim ləbi-dildardən busə tələb,
Bu yəman əhvalimə təğyir verüb etdi əcəb.

Qoydı ol busini məcruhimə çün cərrahi-xas,
Dərdi-bidərmanimə verdi dəva ol şəhdləb.

İcz ilə ərz eylədim, bir busə ehsan et mənə,
Bəlkə rədd olsun bu canım qüssədən, azari-kəb.

Bu ləbi-suzanə qoydı ləblərin həmraz olub,
Bu mərizi-eşq ilə ta sübhətək ol biədəb.

Bir gülə aludə olmuşdı könül, tapmaz əlac,
Ol güli didarını etdi bu şəb Nadim ləqəb.

* * *

Fələk fəraqi-nigar ilə əqlim əldən alub,
Düşübdi firqət arayə, gözüm yolunda qalub.

Solubdı rəngi-rüxüm nari-hicrə yanmaqdan,
Qəmü məlalü müsibət, mən ilə munis olub.

Nedim[*] ki, yoxdı vəfası bu yari-huriveşün,
Səbəb nə oldı ki, öz aşiqin kənarə salub.

Nigəran eyləyüb, aramü taqətim kəsilüb,
Bəli, o dilbəri-məhru məni bu halə salub.

Edüb bu Nadimi, avareyi-vətən o mələk,
Vüsali-yar ilə qürbətdə min xəyalə dalub.

* * *

Səbəb nədür bu sənəm böylə bimürüvvət olub,
Cəfalər eyləməgi bu nigarə adət olub.

Neçün[**] bəlayə salub aşiqi-bəlakeşini?
Belə güman edirəm, yar qüruri-dövlət olub.

Məni salubdı nəzərdən ol şux mahparə,
Belə tazə cəhandə bir əziz dövlət olub.

Mərizi-eşqə əgər dilbərim şəfaət edə,
O gün bilün ki, mənim dərdimə şəfaət olub.

Yəqindi bu sənün eşqündə, ey sənəm, dünya,
Bu Nadimin gözünə guşeyi-qəzamət[***] olub.

---

[*] Nə edim
[**] Nə üçün
[***] Qazamat, həbsxana

* * *

Dərdi-firqət genə, canan, məni avarə qoyub,
Əcəb hicran ilə bu bəxti, güni qarə qoyub.

Hanı aləmdə cəfakarə deyən kim bu yetər,
Nə edim kim, məni həsrət rüxi-gülnarə qoyub.

Aşiqi zibh eləməklikdən ötər huricəmal,
Qeyz ilə qətlim üçün xəncəri-xunxarə qoyub.

Yandırub hicr oduna canımı dünyadə mənim,
Firqətin dilbərin afaqdə dilparə qoyub.

Nadimi-qəmzədəni parə edüb müjgan ilə,
Eyləməz bircə əlac, qəlbimi sədparə qoyub.

* * *

Dəgdi gözümə tülkisifət hacı bu yerdə,
Xər sərçulu tək əgri qoyub tacı bu yerdə.

Bu dəhbaşılar pulsuza divanə deyərlər,
Verməz pulunı, fə`lə dutar acı bu yerdə.

Dövlətlilərün məzhəbü imanı, qəpikdür,
Zorlar hər işə əppəgə möhtacı bu yerdə.

Məhrəmlərini özlərinə oğrı dutarlar,
Bəsləllə* hərəm küncdə oynacı bu yerdə.

---

* Bəsləyərlər

Gər zülmlərün ərz eləsəm, həddən aşıbdur,
Axırda qoyub simüzərin bacı bu yerdə.

Amadədi bir cütdən ötür bir neçə müddət,
Gözyaşlı qoya Nadimi-taracı bu yerdə.

* * *

Qurban olum sənə, məni-nalanə rəhm elə,
Eşqündə bu könül gəlüb əfğanə, rəhm elə.

Bir dəf`ə çarə eylə, nəzər sal bu halimə,
Lütf ilə qıl nəzər dili-büryanə, rəhm elə.

Xamuş elə bu dərdü bəla içrə qəlbimi,
Eşqün odı düşübdi şirin canə, rəhm elə.

Hicrün məni məriz eləyüb, gəlmişəm genə,
Loğman bilüb çü payüvə dərmanə, rəhm elə.

Abi-ləbündi çarə bu biçarə Nadimə,
Eylə əlac, bu dideyi-giryanə rəhm elə.

* * *

Mə`şuq atar kənarəmi* yarın, məgər belə?
Mə`yus edər zəmanədə zarın, məgər belə?

---

* Kənara atarmı

Gülşən yüzün, ləbin, gözəlim, qürsi-mahdür,
Gül sinəsidi bülbüli-zarın məgər belə?

Səyyarələr, bu rəsmdi ki, seyr edər müdam,
Məcruh edər xədəngi şikarın məgər belə?

Bülbül hesab eyləmisən, xar hesab elə,
Gül saxlayarmı sayədə xarın məgər belə?

Şəhla gözün ki, əldən alubdur qərarımı,
Səbrim kəsübdi çeşmi-xumarın məgər belə?

Pərvanə kimi şəm`üvə yandırma Nadimi,
Hicrində yandı ömrü bəharım məgər belə?

* * *

Səbr elə bir, dur, təmaşa eyləyim rüxsarüvə,*
Böylə ruygərdan olub, cananuvı xar eyləmə.

Qoy əmim, sib ləbün bu dərdimün dərmanıdur,
Firqətinlə aşiqi zülm ilə bimar eyləmə.

Dur, həram etmə, əmandur, dərdimi izhar edim,
Yarını gözdən salub, əğyarı, gəl, yar eyləmə.

Qəlbimi məcruh edüb əbrulərün, insaf qıl,
Həq rizası, aşiqi-canana azar eyləmə.

Bircə şəb çək Nadimi ağuşüvə bir can kimi,
Əl gətür qəmxardən, ə`danı qəmxar eyləmə.

---

* Qəzəlin mətlə beyti yoxdur

* * *

Bu şəb məhəbbət et mənə, mehman olum sənə,
Ağuşə al gözün kimi, qoy, can olum sənə.

Mə`yus qılma aşiqi, Allah rizasinə,
Könlün bağında saxla ki, bağban olum sənə.

Can, qadirəm verim sənə rahində, dilbərim,
Qoy şövq ilə bu bəzmdə qurban olum sənə.

Yer olmasa yanında əgər razıyam, gülüm,
Qoy asitandə belə dərban olum sənə.

Sən istirahət eylə fərağətlə, nazənin,
Qoy pasiban mən dili-viran olum sənə.

Göz yaşı Nadimün sənün eşqündə qan olub,
Rəhm etgilən bu Nadimə, qurban olum sənə.

* * *

Fələk salubdı məni möhnətü məlalə genə,
Olubdı adətim, aləmdə ahü nalə genə.

Günim qəra, gecələr adətim olub əfğan,
Fəraq ilə məni, mahru salub xəyalə genə.

Tükətdi ömrümi aləmdə firqəti-dildar,
Dönübdi sərv qədim tazədən hilalə genə.

Yanubdı mülki-könül nari-firqəti-yarə,
Qalubdı gözlərim həsrət, o xəttü xalə genə.

Gözüm o gül yüzə bir yol nəzər salub, əmma
Olubdur aşiqi-sadiq o məhcəmalə genə.

Gözün fədası olum, Nadim etmə aşiqüvi,
Mürüvvət et, məni, canan, yetir vüsalə genə.

* * *

Qurban olum o qarə gözə, can fəda sənə,
Səd afərin kəmaluva, yüz mərhəba sənə.

Cananıma bu canımı mən eylərəm fəda,
Sidq ilə aşiq olmuşam, ey aşina, sənə.

Təqsim edəndə ruzi-əzəl Xaliq aləmi,
Bəxş eyləyübdi surətü hüsni, Xuda sənə.

Qoy payüvi bu sinəmə, minnətdi canıma,
Pabəstə olmuşam genə, ey məhliqa, sənə.

Hüsnü cəmaldə, gözəlim, yox bərabərün,
Həsrət çəkillə* cümlə hamı əqrəba sənə.

Mə`yus qılma Nadimi, Allah rizasinə,
Müştaqdur könül quşı, çeşmi qəra, sənə.

* * *

İlahi, yetməz əlim tazədən vüsal əlinə,
Nolu** əlim yetə bir də, o gülcəmal əlinə.

---

* Çəkirlər
** Nə olar

Görəndə gül yüzüvi başdan əqlimi aldı,
Yüzünə zülfüni sərmiş, alubdı şal əlinə.

Bu aşiqi, əcəb avareyi-vətən eyləyüb,
Məhaldür, düşə bir də o qarə xal əlinə.

Günahdı qaşlaruvı Zülfiqarə bənzətmək,
Alubdı qarə gözi tazə bir hilal əlinə.

O şəhd ləbləri şirindi şəhdü şəkkərdən,
Çox afərin ola, düşmüş belə cəmal, əlinə.

İlahi, Nadiməm, hicri-nigar ilə yandım,
Şam eylə, barı, yetir yari-xoşməqal əlinə.

* * *

Nə rəvadur düşə gül, gülşənara xar əlinə,
Düşə ol ətrli gül, xari-cəfakar əlinə.

Ey fələk, mən kimi aləmdə güni qarə hanı?
Düşmüşəm sehrsifət dilbəri-xümmar əlinə.

Məni hicran oduna yandurur aləmdə əbəs,
Çünki vəslini verüb dəhrdə əğyar əlinə.

Siyah əbrulərinün hər biri şəmşirə misal,
Qorxuram axır ala canımı xunxar, əlinə.

Məni aləmdə gözi yaşlı qoyub çərxi-fələk,
Verəcək qolları bağlı belə xunbar əlinə.

Nadimi-xuncigərəm, axırı dövrani-zəman,
Qoymadı barı, əlim bir yetə dildar əlinə.

* * *

Gəlməz nigar, bu can yetə canan vüsalinə,
Həsrət qalub könül, genə ol can vüsalinə.

Ağlar gözüm həmişə, çəkər intizarını,
Amadəyəm mən ol məhi-xuban vüsalinə.

Bülbülsifət bu xəstə könül eyləyər səda,
Gülşəndə dəsti yetmədi reyhan vüsalinə.

Güllər saraldı, yetdi xəzan, soldı gül, çəmən,
Bülbül yetişmədi bu gülistan vüsalinə.

Ömri qutardı, qaməti xəm oldı Nadimin,
Səd heyf, dəsti yetmədi canan vüsalinə.

* * *

Olum fəda ləbüvə, ey nigari-məhparə,
Neçün bəs etməyürsən eşq dərdinə çarə?

Fərağun eyləyüb aləmdə bəxti qarə məni,
Kənaruva dolanım mən misali-təyyarə.

Nolar[*] ki, lütf ilə biçarə qəlbi şad edəsən,
Məni fəraqun edibdür cəhanda avarə.

---

[*] Nə olar

Gözün qərasinə qurban, o mah cəmalə fəda,
Nolar ki, bəzl edəsən bu mərizi-biyarə.

Xuda rizasinə, könlüm vüsal ilən şad et,
Qəmimdən eyləmərəm şur zari-dilparə.

Bu Nadimin yüzünə bircə gül, səni Tari,
Ki, qoyma yalvara könlüm cəhani-biarə.

* * *

Var ümidim düşə gün bir də gülistan üzünə,
Sala öz nurini bu səhndə reyhan üzünə.

Çünki məşhurdür Misr içrə Züleyxayi-həzin,
Qalmayub həsrət o zər, Yusifi-Kən`an üzünə.

Gərçi hər aşiq olan, çox çəküb hicranü cəfa,
Axırı qalmayub həsrət gözi canan üzünə.

Rəhm qıl, aşiqüvi eyləmə avaravətən,
Salma Məcnun kimi səhravü biyaban üzünə.

O siyah zülflər ilə ruyüvi pünhan eləmə,
Zülfüvi səf eləmə lə`li-Bədəxşan üzünə.

Baxgilən Xaliqə bir, rəhm elə müştaqüvə sən,
Qeyz ilə baxmagilən, Nadimi-nalan üzünə.

* * *

Dolubdur qan ilə könlüm, nigari-mehriban üstə,
Əcəb xari-cəhan oldum, güli-şirinzəban üstə.

Qəzəblənmiş gəlür dildar əlində xəncəri-üryan,
Qılınc əbruləri daim olub ruhi-rəvan üstə.

Kəmantək, didə ətrafın alub müjgani-xunxarı,
Xədəng atmaqlığa rüxsət verüb bu xəstə can üstə.

Dolubdur gözlərim qan-yaş, dili-xunbarım aludə,
Həyatım qət` olur axır, nigari-xoşbəyan üstə.

Deyən yoxdur, o mahparə məni-naçarı əfv etsün,
Düşüb bu halə əhvalım, uçur mahi-cəhan üstə.

Batub nari-fəraq ilə, dönüb xakistərə qəlbim,
Fəna oldı ömür, Nadim, əcəb huri-cinan üstə.

* * *

Gözüm aludə olub aşiqi-şeyda gözüvə,
Maşaallah ola ol hüsnüvə, şəhla gözüvə.

Bilürəm, öldürəcəklər sənün eşqündə məni,
Beş dəqiqə edərəm, barı, təmaşa gözüvə.

Qaşlarun qarə, gözün qarə, ləbün şəhdü şəkər,
Heç gözəl, hüsnidə olmaz yəqin həmta gözüvə.

Şövq ilə canımı qurban edərəm payündə,
Aşiqin canı fəda, ey qədi rə`na, gözüvə!

Məgər ki, aşiqü mə`şuqligün rəsmi budur,
Qoy, qoyum ləblərimi misli-Züleyxa, gözüvə.

Yetmədi vəslə əlim, söylədi ol cani-həzin,
Qaldı həsrət bu gözüm, Nadimi-şeyda, gözüvə.

* * *

Genə bu mülki-könül yandı, pürşərar oldı,
Batub imarəti-dil, uçdı tarümar oldı.

Gəzərdi mürği-könül bir vüsal sorağında,
Vüsalə yetmədi axır, cəhanda xar oldı.

Nə busə aldı ləbündən bu aşiqi-xəstə,
Nə gül yüzün gözə görsəndi, aşikar oldı.

Nə gül yanaqlarun ağlar gözümi şad etdi,
Nə əqlim özümə verdi, nə huşiyar oldı.

Nə zülfi sinəmə sərdün, nə bağladun gözümi,
Gözün fədası ilə məskənim məzar oldı.

Ölüm zəmanı yetişdi, nolar ki, rəhm edəsən,
İşıqlı gün necə, gör, gözlərimə tar oldı.

Mürüvvət et, ölürəm, barı, gəl cənazəmi gör,
Öləndə aşiqüvi gör, nə növ`i zar oldı.

Yox ehtiyac ki, buyursun həkimü cərrahə,
Fəraqın oldı səbəb, ömr zəhrimar oldı.

Gəl, eylə başımın üstə tilavəti-Qur`an,
Deyim, bu Nadim, öləndə sənə düçar oldı.

* * *

Fələk nədən məni cövri-nigarə yandırdı,
Salub fəraq oduna, aşikarə yandırdı.

Bu kökdə qoydı məni küncə, misli-divanə,
Çün əndəlibsifət cövri-xarə yandırdı.

Nə vəslə yetdi əlim, nə vüsali-yar oldum,
Zülmlə nari-fəraqə dübarə yandırdı.

Çox istədim ki, yetəm bir də vəsli-dildarə,
Vüsali hicr eləyüb suzi-narə yandırdı.

Çox arizu elədim, dəsti-yarə əl yetirim,
O çəkdi dəstini məndən kənarə, yandırdı.

Mənim bu qəddimi xəm eylədi xəmidə qaşun,
Sitəmlə eylədi müjganı parə, yandırdı.

Ədu məzəmməti, bir də rəqib tə`nələri,
Bu Nadimi sitəmi-ruzigarə yandırdı.

* * *

Gözlərün, ey nazənin, əldən alub samanımı,
Nari-eşqə saldı bu aləmdə hicran, canımı.

Rəhm elə, yox taqətim hicranuva tab etməgə,
Zülm ilən ərşə çıxardun naləvü əfğanımı.

Nari-eşqə yanmağı asan hesab etmə, rəfiq,
Döndərüb xakistərə hicran, dili-suzanımı.

Vəsl ilə şad et, əmandur, aşiqi-biçarəni,
Qoyma həsrət ruyüvə bu dideyi-giryanımı.

Vergilən bir busə, canan, Nadimi qəmdən qutar,
Ey nigar, azad elə bu dərdü qəmdən canımı.

* * *

Təmam olaydı omür, görməyeydi bu anı,
Dutum nə növ` ilə mən bu həyati-dünyanı?

Əcəl yetəydi, Xuda, kaş öleydim əzzəldən,
Salub bəlayə fələk tazədən bu nalanı.

Bəlayə səbr edirəm, tazə bir bəla yetirür,
Qəmin fəraqı bükübdür, bu qəddi-rə`nanı.

Nedim,[*] nə çarə qılım, olmurı[**] bu dərdə əlac,
Yoxumdı tab, çəkim dərdi-eşqü hicranı.

Nihani dərdə salub bircə mahparə məni,
Xuda, vüsal ilə şad et bu qəlbi suzanı.

Günüm qəra, işim əfğan, dilimdə va əsəfa,
Bəlayə yaxşı düçar oldı Nadimin canı.

---

[*] Nə edim
[**] Olmur

* * *

Qıldı fələk fəraq oduna mübtəla məni,
Eylüb[*]cəfa ilə çü vətəndən cüda məni.

Bəxtim qəra, olub üzümə cari göz yaşım,
Məcnun hesab edir nə ki var, masiva məni.

Əzbəs ki, çoxdı möhnətü qəm, qan olur könül,
Saldı bu dərdi-möhnətə ol mahliqa məni.

Badi-bəlayə verdi fələk aşiyanımı,
Ədnalərün yanında edibdür cida məni.

Yox Nadimin o səbri ki, çəksün bəlaləri,
Bəlkə xilas eyləsün ol dilrüba məni.

* * *

Dilbəra, hicr oduna, rəhm elə, yandırma məni,
Naz ilə qəmzə satub, candan usandırma məni.

Eşqüvi, varmı yadunda, mənə izhar elədün.
Ərz qıldım, çəküb ağuşə dadandırma məni.

Söylədim ki, sənə pabəstədi bu mürği-könül,
Sənə aludəyəm, ardınca dolandırma məni.

Açub öz eşqüvi tə`lim elədün ahəstə,
Dedim, əvvəl oyadub eşqüvə qandırma məni.

---

[*] Eyləyib

Nadiməm, əvvəl-axır, ruyüvə pərvanə mənəm,
Yandırub hicr oduna, eşqə tapındırma məni.

* * *

Genə yandırdı gülüm atəşi-hicranə məni,
Firqəti nari-şəm`ə eylədi pərvanə məni.

Yetmədi vəslə əlim, karım olub ahü fəğan,
Üzdi yarımdan əlim, saldı biyabanə məni.

Yandırur şəm` oduna cismimi pərvanə kimi,
Çünki həsrət eləyüb vəslinə canənə məni.

Saxlayıbdur məni sail kimi payində, nedim,*
Genə möhtac eləyüb zülfi-pərişanə məni.

Canımı qıldı sipər dəhrdə biganələrə,
Hicr ilə qıldı nişanə dəmi-peykanə məni.

Nadimin mail olub ruyinə pabəstə qulam,
Qoyub həsrət bu fələk, sərvi-xuramanə məni.

* * *

Gətirdi xilqətün, ey dilbər, ahü zarə məni,
Qarə telin kimi eyləyübdi bəxti qarə məni.

Nə yetdi vəslə bu dəstim, nə bir kənar oldum,
Ölüncə yandıracaq möhnəti-şərarə məni.

---

* Nə edim

Ləbün fədası olum, şad elə vüsalın ilə,
Nolar bir alasan, mahliqa, kənarə məni.

Nolar əmim, qoyasan, gül dodağuvun şəhdin,
Bu qədr candan usandırma, mahparə, məni.

Neçün bu xəstə aşiqini salmısan gözdən,
Ki, qorxuram yetirə bu mehr məzarə məni.

Neçün kənar elədin Nadimi vüsalindən,
Gözümdə əşki-bəsər, atdun hər diyarə məni.

* * *

Qurban olum o gözlərə, bimar edüb məni,
Hicrində dərdi-eşqə giriftar edüb məni.

Bir baxmaq ilə əldən alub ixtiyarımı,
Sən`an kimi nə həsrəti-didar edüb məni.

Şamü səhər, səbahə kimi zarü müztərəm,
Ol mahi-ənvərimdi, şərmsar edüb məni.

Gəlməz yuxum, səbahə kimi qıllam ahü zar,
Bu qəmlərim gəlüb dilə, bizar edüb məni.

Məcnuntək olmuşam genə avareyi-vətən,
Qəhri nədür ki, həsrəti-rüxsar edüb məni?

Mən Nadiməm, vüsalə əlim yetmədi nedim,
Bu dərdə mübtəla o cəfakar edüb məni.

* * *

Nəsibim oldı bəla, göz  yaşım olur cari,*
Fələk fəraq oduna yandırır dübarə məni.

Gecə səbahə kimi bəstərim olub suzan,
Budur ki qorxum, edər axırı şərarə məni.

Nə bir yüzüm gülər, Allah, nə şad olar qəlbim,
Edüb Ələstə qəza muyi-zülfi-yarə məni.

Çəməndə qumrisifət adətim olub qu-qu,
Qəza, nedim, edüb həsrət genə bəharə məni.

Həmişə, Nadiməm, ağlar gözüm fəraqında,
Bu nalələr yetirə bəlkə rəhgüzarə məni.

* * *

Zəmanə yaxşı məni xari-ruzigar elədi,
Bəlavü möhnətə afaqdə düçar elədi.

Gətirdi zarə məni, nikbətü bəla qıldı,
Qərarü səbrimi aldı, qəmə düçar elədi.

Əziz canım əcəb aləm içrə xar oldı,
Ədu şəmatəti qəlbimi tarümar elədi.

Əlimdən əqlimi aldı hilali-əbrulər,
Bu can evini əcəb qarə bir məzar elədi.

Həmişə Nadiməm, ağlar gözüm fəraq ilə,
Məni məlamət ilə dəhr səngsar elədi.

---

* Qəzəlin mətlə beyti getməyib

* * *

Ey Xuda, qan oldı könlüm, həmzəbanım gəlmədi,[*]
Munisü xoşmənzərü arami-canım gəlmədi.

Mən əlili qoydular gözyaşlı, ağlar müttəsil,
İntizarəm ağlamaqdan, çıxdı canım gəlmədi.

Yanmayıb nari-qəmə bir kimsə məntək şübhəsiz,
Qəm nihan eylər məni, qəmpərvəranım gəlmədi.

Bəs nə çarə eyləyim, ya Rəbb, məni-zarü əlil,
Nə edim, nə söyləyim, ol mehribanım gəlmədi.

Qəlbim oldı qan, İlahi, gözlərəm hər gün yolun,
Nari-hicrə yandı can, qəlbi yananım gəlmədi.

Gül cəmalı kəhrəbatək Nadimün qəmdən solub,
Ruzü şəb məcnunsifət gözlər ki, canım gəlmədi.

* * *

Bilmirəm noldı, [**] fələk, ol mahmənzər gəlmədi,
İntizar qoydı məni ol nazlı dilbər, gəlmədi.

Noldı ki, saldı vüsalindən kənarə aşiqi,
Aşiqin almağa könlün mahpeykər gəlmədi.

Gül yüzündən bülbüli-qəmnakı məhrum eyləyüb,
Barı, şad etsün məni ol hurimənzər, gəlmədi.

---

[*] Bu beyt təkrardır. Növhələrdən birində getmişdir. Növhədə ikinci misradakı “munis” yerinə “Əkbər” verilmişdir.
[**] Nə oldu

Gəlmədi, bu Yusifi zindandən etsün kənar,
Ol Züleyxa ismli, Tubayə bənzər gəlmədi.

İntizarəm dilrübadən hər zəman, şamü səhər,
Saldı canim firqətə, zülfi-sənubər gəlmədi.

Nadimi-məhzuni hicran ilə sərgərdan qoyub,
Mahliqa, huri baxışlı, sibi-ənvər gəlmədi.

* * *

Çoxdur qəmim, qəmlərimin yoxdı çarəsi,
Əldən alubdı canımı canan işarəsi.

Müjganlar ilə qəlbimi istər yar oxlasun,
Dil mülkini yəqin yıxacaq ox sitarəsi.

Zülfilə istixarə edir, öldürür məni,
Yaxşı gələydi hurivəşin istixarəsi.

Gər xəncər ilə öldürə, min dəf`ə raziyəm,
Guşimə can verəndə gələ mahru səsi.

Gər yetməsə vüsaluva, biçarə Nadimin
Qəbr içrə də yəqin gələcək ahü nələsi.

* * *

Könül nə vəqtə kimi o nigarə yalvaracaq,
Ol mahpareyi-çeşmi-xumarə yalvaracaq.

Həzar əliylə həqiranə, boynı çignində,
Gedüb çəməndə zəlilanə xarə yalvaracaq.

Hər növ` yalvaram əğyarə, xeyli himməti var,
Necə bu tuti gedüb zülmkarə yalvaracaq.

Baxub cəmalinə mən dildə məkrə aldandım,
Ki, bilmədim bu könül bir də yarə yalvaracaq.

Əgər yetişməsə dəstim vüsali-dildarə,
Bu Nadim həzl ilə, ol çeşmi-yarə yalvaracaq.

* * *

İçüb badə, olub məstanə aşiq,
Doyubdur eşq əlindən canə aşiq.

Gəzüb mülki-cəhanı eşqpərvər,
Olub sail dəri-cananə aşiq.

Qəmi-dünya ilə qəlbi ləbaləb,
Olub hicran ilə divanə aşiq.

Tökər göz yaşını rüxsarə, qəmdən
Gecə-gündüz gələr əfğanə aşiq.

Yanar hicran ilə nari-fəraqə,
Olar nari-qəmə pərvanə aşiq.

Deyün, Nadim olub məhzunü müztər,
Olub bir dilbəri-xubanə aşiq.

* * *

Xubru, hər hüsn var kim, səndə Leyladən gözəl,
Bil ki, bu aləmdə sənsən ol Züleyxadən gözəl.

Mahi-ənvərdür yüzün, gül ləblərün, şəhla gözün,
Xəlq olub əbrulərün taği-kəlisadən gözəl.

Güllər içrə çox ucadur cümlə güldən qamətin,
Zülflərün xəlq eyləyüb Xaliq, səmənsadən gözəl.

Cismüvi tə`rif edən xövf eyləməz niyrandən,
Çox ucadur qamətin ol sərvi-Tubadən gözəl.

Gül yüzün övsafini vəsf eylərəm hər ruzü şəb,
Çün kəşidə qamətün şümşadi-rə`nadən gözəl.

Sibi-əhmərdür yanağun, gül yüzün, şəhla gözün,
Ləblərün gül bərgi tək zibadı, zibadən gözəl.

Nadiməm, hər şəhri gəzdim, tapmadım növrəstə can,
Görmədim bir nazənin mən bu diləradən gözəl.

* * *

Ey qüssəvü məlal ilə viran olan könül,
Mahparənün cəfası ilə qan olan könül.

Xaliq həmişə hər kəsə səbr eyləyüb əta,
Səbr eylə sən də qismətə, talan olan könül.

Az ağla, tökmə səfheyi-rüxsarə göz yaşın,
Az nalə eylə, göz yaşı ümman olan könül.

Axır saraldı rəngi-rüxün kəhrəba kimi,
Dərdi bilinməyən, qəmi tüğyan olan könül.

Olmaz əlac bu dərdə gələ yüz təbibi-xas,
Qəm bəstərində didəsi giryan olan könül.

Yə`qubtək bu Nadimi saldun bəlalərə,
Yusif misali, məskəni zindan olan könül.

* * *

Olmuşam dünyadə mən zarü hərasan, ağlaram,
Adətim dünyadə oldı ahü əfğan, ağlaram.

Ağlamaqdan qan olub könlüm, üzüm gülməz mənim,
Qüssədən qan oldı könlüm, çünki hər an ağlaram.

Barilahi, rəhm qıl, qurtar məni qəmdən özün,
Möhnəti-hicran məni eylübdi nalan, ağlaram.

Suzi-ahim eyləyüb tə`sir bütün düşmənlərə,
Ağlayar imdi mənim halimə divan, ağlaram.

Qismətim nalə, işim əfğan, gözüm yaşı rəvan,
Mülki-dil bu ahü zardən oldı al qan, ağlaram.

Halimə rəhm eyləyən heç bir kəsim yoxdur mənim,
Qəlb dağlı, didə yaşlı, çeşmi-giryan ağlaram.

Nadiməm, olmuş cəhanda ahü nalə adətim,
Eylərəm hər ruzü şəb şur ilə əfğan, ağlaram.

* * *

Həlal qıl mənə canan ki, həsrət ayrılıram,
Könüldə qaldı təmam əhdü niyyət, ayrılıram.

Yetişdi mövsümi-qəm, ayrılıq zəmanı gəlüb,
Nedim ki, yoxdı əlac, yetdi firqət, ayrılıram.

Görəndə gül yüzüvi şad olur bəlalı könül,
Canımda qalmadı zərrəcə taqət, ayrılıram.

Vətəndə qal dolanub qövmü əqrəba ilə sən,
Fəraq olubdı mənə çünki qismət, ayrılıram.

Sən işrət etmək ilə qal bu yerdə, kamə yetiş,
Məkan ola mənə qoy künci-qürbət, ayrılıram.

Kənarə saldun əcəb Nadimi vüsalindən,
Yetişdi canıma min dərdü möhnət, ayrılıram.

* * *

Cövri-nigardən genə candan usanmışam,
Hər firqətə can odlanub, odlarə yanmışam.

Eşq əhlinin nəsibi olar qanlı göz yaşı,
Qanlı sirişkə dari-fənadə boyanmışam.

Məcnun kimi bir hurivəşün vəsl həvasinə,
Ruzü şəban bu dövri-cəhanı dolanmışam.

Əbrulərün qəra gətirüb tirə bəxtimə,
Müjganlarun da dövr eləyüb, yaralanmışam.

Mən Nadiməm, zəmanədə eşqin məriziyəm,
Canan yolunda eşq ilə odlara yanmışam.

* * *

Mən bir nigari-hurivəşün intizarıyam,
Sib zənəxdə xali-siyahın xumarıyam.

Cadu gözilə əldən alub ixtiyarımı,
Bu rəhgüzərdə bais odı, biqərarıyam.

Zülfi-siyəh təki eyləyüb qarə, bəxtimi,
Şəhla gözün cəhanda dili-tarümarıyam.

Bir yan rəqib tə`nəsi, bir yan fəraq odı,
Ağlar göz ilən ol sənəmin bəxtiyarıyam.

Hicran odı nəsibim olub, yandırur məni,
Çünki cəhandə həsrəti-sərvin vüqarıyam.

Nuş etmişəm o hurivəşün eşq badəsin,
Mən Nadiməm, cəhandə onun şərmsarıyam.

* * *

Dilbəra, malımı ol xaluva qurban demişəm,
Ya yetəm vəslüvə, qurban genə də can demişəm.

Mənə lazım dəgi[*] gülzarü səfa, səhni-çəmən,
Çünki o tellərini rişteyi-reyhan demişəm.

---

[*] Deyil

Bu cəhan içrə, gər İskəndəri-dövran olasan,
Sinəvün güzgüsünə təxti-Süleyman demişəm.

Səni mən lə`li-Bədəxşanə bərabər bilübəm,
Eşq bəzmində səni lə`li-Bədəxşan demişəm.

Səni saqiyi-süxən cümlə qələmdən keçirüb,
İki şəhla gözüvi cismivə sultan demişəm.

Neyləyim, yoxdı gözümdə dəxi tərsa gözəli,
Türki qəd-qamətə, tərsaləri qurban demişəm.

Nadimi-qəmzədəni şövq ilə bihuş elədün,
Dolanur kuçələri zarü pərişan, demişəm.

* * *

Gül cəmalından sənün, canan, gülü bar istərəm,
Vəslinə yetməkligə bir şiveyi-yar istərəm.

Arizu eylər könül hər ruzü şəb didaruvi,
Muyi-zülfündən sənün bir lalə bixar istərəm.

Bəxtimi kəc qaşlarun zülfün təkin eylüb qəra,
Tazədən lütf etməgə bir busə dildar istərəm.

Çün sənə mə`lum idi, mən aşiqi-rüxsarinəm,
Çox olub pünhan əyan, olsun genə, yar, istərəm.

Hüsnüvün bustani sibi-əhmərə bənzər əgər,
Ol həriri pirəhən altında cüt nar istərəm.

Gül yanağın, bal dodağın, ağ buxaq, qarə gözün,
Saymağa gəlməz, vücudində nə ki var, istərəm.

Sən həmişə gəz səlamət, düşmənün ölsün sənün,
Nadimün, olsun fəda payündə sərdar, istərəm.

* * *

Düşdi üqbayə yolum, zülfi-pərişan, gedirəm,
Qıldun aləmdə mənim dərdimi tüğyan, gedirəm.

Qoymadun ki, gəzim asudə məni-xuncigəri,
Zülm ilən qıldun əcəb çarəmi əfğan, gedirəm.

Məni divanəsifət eylədün avarəvətən,
Firqətün qıldı mənim sinəmi suzan, gedirəm.

İltifat etsən əgər, başımı alsan dizüvə,
Dizün üstündə başım, barı, verəm can, gedirəm.

İsmüvi vird eləyüb gəlmişəm eşqündə dilə,
Gəl, həlal eylə mənə, dilbəri-xuban, gedirəm.

İstəsən səndən əgər razı olam əzmi-bəqa,
Ölürəm, gəl, başım üstə oxu Qur`an, gedirəm.

Sənə dünyanı verüb, azimi-üqba oluram,
Tərk edüb dari-fənanı, gülüm, ünfan gedirəm.

Mən öləndən sora “Nadim” deyübən etmə fəğan,
Nazənin, eyləmədün dərdimə dərman, gedirəm.

* * *

İlahi, qüssədən ömrüm olur təmam, ölürəm!
Həyat olub mənə bu dəhrdə həram, ölürəm!

O qədr ağlamışam, göz yaşım olub al qan,
Vüsali-qan ilə məmlüv olubdı cam, ölürəm.

Dilimdə cövrü cəfa, gözlərimdə əşki-bəsər,
Məni bu dərdə salubdur öz aşinam, ölürəm.

İlahi, Nadiməm, olmaz bu dərdimə çarə,
Gözüm yaşilə yazub bir neçə kəlam, ölürəm.

* * *

Yetir özün mənə, ey yari-mehriban, ölürəm,
Sənün fəraqun edüb qəddimi kəman, ölürəm.

Nəsibim oldı xəzan, nari-firqətə yandım,
Gözümdə tirələnüb ruyi-asiman, ölürəm.

Olubdı qismətim ah, munisim gözüm yaşı,
Müdam ruzü şəban eylərəm fəğan, ölürəm.

Gecə səbahə kimi rəxtxabdə, ya Rəb,
Özüm-özümə edüb dərdimi bəyan, ölürəm.

Nə Nadiməm, gözəlim, dəhrdə olmam* rahət,
Qoyub kəlamımı dünyadə ərməğan, ölürəm.

---

* Olmaram

* * *

Ta can çıxınca cismdən ol canı gözlərəm,
Cismi-mərizlə dərdimə Loğmanı gözlərəm.

Can üstə intizarəm, əcəl eyləyüb həlak,
Can verməm, fəqət rəhi-cananı gözlərəm.

Yox bir nəfər nigarə yazub namə göndərəm,
Qəm bəstərində ol mahi-tabanı gözlərəm.

Ömrüm yetüb təmamə, könül eyləyür nəva,
Can verməzəm, o zülfi pərişanı gözlərəm.

Ol sərv qamətinə ədu mübtəla olub,
Ol nazənini, qaməti rə`nanı gözlərəm.

Mən Nadiməm, o dilbəri-xubanın eşqinə,
Qəm guşəsində fəsli-gülistanı gözlərəm.

* * *

Ey Xuda, ərzim budur dərgahuva, biçarəyəm,
Rəhm qıl bu əbdi-biənsaruva, biçarəyəm.

Bir nəfər yox dadxah olsun mənə səndən səva,
Qıl nəzər bu dideyi-xunbaruva, biçarəyəm.

Göz yaşım cari olubdur qüssədən rüxsarimə,
Mərhəmət et bəndeyi-naçaruva, biçarəyəm.

Xəlq edən sən, dərd verən sən, cümlə dərman səndədür,
Lütf elə bu əbdi-pürqəmxaruva, biçarəyəm.

Vardı təqsirim, Xudaya, şahidəm bəd karimə,
Keç günahimdən Şəhi-əbraruva, biçarəyəm.

Nadiməm, bir muyi-dildarə qalub həsrət gözüm,
Bəxş elə bir bu həqir biyaruva, biçarəyəm.

* * *

Ərz et, səba, bu halımi dildarə sən mənim,
Bildir səlamımı ol məhrüxsarə sən mənim.

Əvvəl mənim dilimdən o canana ərz qıl,
Yandırma canımı, əzizim, narə sən mənim.

Məcnuntək eylədün məni avareyi-vətən,
Bəsdür gətürdün ömrümi zinharə sən mənim.

Yusif kimi Misridə məni eylədün əsir,
Çəkdün bu xəstə canımı bazarə sən mənim.

Qıldun nişan peykərini Nadimün yenə,
Qoydun gözümi həsrət o rüxsarə sən mənim.

* * *

Əbrulərün qılub məni sədparə, neyləyim?
Dünyadə gətdi* ömrümi zinharə, neyləyim?

---

* Gətirdi

Qoydı məni zəmanədə avareyi-vətən,
Saldı əziz canımı azarə, neyləyim?

Hurimisal qürur olu* ol xəttü xalinə,
Çöllərdə eylədi məni avarə, neyləyim?

Müjganların xədəng kimi dəldı sinəmi,
Bu şişə könlümi elədi parə, neyləyim?

Yoxdur o məhparədə heç rəhm nişanəsi,
Rəhm eyləsün bu xəstəvü bimarə, neyləyim?

Qıllam nəzarə ruyüvə hər vəqt kənardən,
Həsrət qalubdı Nadim o rüxsarə, neyləyim?

* * *

Eşqün sənün edüb məni avarə, dilbərim,
Pərvanətək salub yanar odlarə, dilbərim.

Cəllad əlində qaldı başım, gəl xilas elə,
Saldun məni cəfa ilə azarə, dilbərim.

Məcnun kimi vilayətimi qürbət eylədün,
Qıldun sitəmlə qəlbimi sədparə, dilbərim.

Yox bir qəmim əlavə fəraqi-nigardən,
Qoydun məni bu hicrdə avarə, dilbərim.

---

* Olub

Bir busə ver mənə, dedim, o gül cəmalindən,
Olsun dəva bu xəstəvü bimarə, dilbərim.

Bir busə Həq rizasinə məndən əsirgəmə,
Rəhm etgilən bu Nadimi-naçarə, dilbərim.

* * *

Səni sevdim ki, dedim, bəlkə mənə yar olasan,
Qəm günümdə mənə, həm yar ilə qəmxar olasan.

Deмədim məkr torun məkrlə piçidə edüb,
Zahirən yar deyüb, batinən əğyar olasan.

O siyah qaşlarıvun tağinə aldanmaz idim,
Çünki aldandım əzəl bəlkə vəfadar olasan.

Gözlərin qəmzə edir, güldüri* zahirdə məni,
Nə rəvadur ox atub məkr ilə, xunxar olasan.

Var könüldə biləsən guşeyi-əhmər yarası,
Nə rəva zülfüni pünhan edübən xar olasan.

Tifl çağımda məni aşiqi-rüsva elədün,
Deмədim kamil olub, qeyr ilə dildar olasan.

Nadim öz canın edər şövq ilə payində fəda,
Bəlkə sən ibrət edüb, aqilü huşyar olasan.

---

* Güldürür

* * *

Cəhandə sən mənim sübhi-ümidim, həm gümanımsan,
Gözi yaşlı qoyub getmə məni, arami-canımsan.

Düşəm səndən kənarə beş dəqiqə, bil, həlak ollam,
Həyatımsan cəhandə, həm nigari-mehribanımsan.

Əgər səndən kənar olsam, könül tutisifət ağlar,
Mənə qəm yüz verən vəqtdə həmişə həmzəbanımsan.

Gözüm nuri, tərəhhüm qıl, bəlayi-hicr müşkildür,
O hüsnü surətinlə sən pənahü aşiyanımsan.

Cəmalun görməsəm, könlüm yanar suzanə hicründə,
Kənar olma, əman, məndən, mənim ruhi-rəvanımsan.

Xuda hər növ` ilə Həqq aşiqini imtəhan eylər,
Məni sən eylədün Nadim, bəlayi-imtəhanımsan.

* * *

Viran olubdı mülki-könül bir də tazədən,
Sevdayi-eşqi cuşə gəlüb sərdə tazədən.

Getdi bəhar, yetişdi xəzan, soldı laləzar,
Bülbülsifət könül də gəlüb dərdə tazədən.

Gəzdim, xəzani-fəsli-gülistanə yetmişəm,
Həsrət gözüm qalub gülünə bir də tazədən.

Saldı fələk nəzərdən, həqir eyləyüb əcəb,
İmdi məni bəyənmir o dilbər də tazədən.

Əvvəl rəfiq idi mənə, imdi cəfa edir,
Gözdən salub məni siyəhkər də tazədən.

Nadim, bu mahparələrün bivəfalığın,
Əldə qələm yazar hamı, dəftərdə tazədən.

* * *

Səmayə övc edər ahım bu dərdi-möhnətdən,
Əcəl yetə, qurtara canımı müsibətdən.

Təmamən aşiqi-sadiq bu fani aləmdə,
Səbəb nədür ki, qurtarmır bu cümlə zillətdən.

Nə bəxti qarəyəm, Allah, bu fani aləmdə,
Qurtarmıram, nə edim, heç bəlayi-firqətdən.

Həzar heyf, yetişdi əcəl, qutardı həyat,
Bəqayə dutmadı tuşə könül ibadətdən.

Usan, oyan, dəxi yoxdur əsər cəvanlıqdan,
O şəxsə ta ki, yetər dad həvayə rehlətdən.

Hüseyni yadə salub ağla ruzü şəb, Nadim,
Səni o rahət edər təkcə xövfü vəhşətdən.

* * *

Əl çək, könül, bu eşqi-səfayi-nigardən,
Ömrün təmamə yetdi qəmi-ruzigardən.

Bülbül kimi fəğanə gəlüb eyləmə səda,
Olmaz nəsib çün sənə busə o yardən.

Olmaz sənə nəsib genə səhni-növbəhar,
Yüz əndəlib ölüb sənitək cövri-xardən.

Ey virdi-cövrdən genə əfğan olan könül,
Bu fani dövrdən, bu dili-tarümardən.

Zülfi-siyahü qaməti-rə`nadən əl gətür,
Rəngi-ruyimiz saraldı, qəmü ahü zardən.

Bihudə ver, bu eyşi-səyahətdən əl gətür,
Sal bircə qətrə qəlbüvə rəngi-məzardən.

Nadim, həyat təmamə yetüb, ömr qurtarub,
Eylə həras məzardəki murü mardən.

* * *

Məgər bu növ`i dönərmiş cəhandə üz-üzdən,
Səbəb nədür, məni sən salmısan bu cür gözdən?

Boyun bəlasın alım, nitqə gəl, bəyan eylə,
Bu dərdimə ola dərman, o sən deyən sözdən.

Əlün fədası olum, qoy əlüvi sinəmə, gör,
Nə növ`i gör alışub, suznakdür izdən.

Dizini başımın altında azca rahət et,
Əgərçi doğrasalar, baş gətürmürəm dizdən.[*]

* * *

Məni nari-fəraqə həşr olunca yandıran sənsən,
Bu cür pərvanəvəş şəm`də məni odlandıran sənsən.

Dəhanın badeyi-şərbət, ləbin yaquti-pürqiymət,
Məni naçarü bamöhnət qoyan biaşiyan, sənsən.

Qoyub eşqün məni heyran, edibdür ləblərün tüğyan,
Gəl eylə dərdimə dərman ki, Loğmani-zəman sənsən.

O müjganun sənün, canan, edibdür qəlbimi al qan,
Məni Məcnuni-sərgərdan qoyan atəşfəşan sənsən.

Yanub mülki-könül yeksər, dönüb bir qəbzə xakistər,
Pərisən ya ki, sən dilbər və ya huri-cinan sənsən.

Çəkübsən zülfüvə şanə, libasun cümlə şahanə,
Doyubdur Nadimün canə, məni dərdə salan sənsən.

* * *

Nari-hicrində yanub bu cismü canım, nazənin,
Az qalub pərvaz edə ruhi-rəvanım, nazənin.

Can üzən əbrulərün afaqdə məftuniyəm,
Qatilimsən ölsəm, ey badi-xəzanım, nazənin.

Qəlbimi müjganlarun xun ilə yeksan eyləyüb,
Rəhm elə əhvalıma, ey həmzəbanım, nazənin.

---

[*] Qəzəl natamamdır

Sən həmayil tək qulac zülfün yenə sal boynuma,
Artırur vəslin mənim ahü fəğanım, nazənin.

Ləblərün, şəhla gözün, sərvi-səmənsa qamətün,
Ruzü şəb oldı mənim virdi-zəbanım, nazənin.

Nadiməm, hicrində göz yaşım axar hər ruzü şəb,
Bu fəna mülkündə sənsən mehribanım, nazənin.

* * *

Üşşaqdən kəsüb genə canan məhəbbətin,
Cövr ilə saldı canıma çün nari-firqətin.

Yusif kimi təhəmmül elə dərdə, ey könül,
Bu əsr içində guşeyi-zindandı qismətin.

Yə`qubtək göz yaşını etgilən rəvan,
Çün ağlamaq cəhandə yəqin oldı qismətin.

Neynim, bu Leylivəş məni Məcnun kimi genə
Səhrayə saldı, əldən alub tabü taqətim.

Qorxum budur zəmanədə Sən`an kimi, könül,
Vəslin yetişməmiş, yetişə vəqti-rehlətin.

Bu Nadimə asandı dəxi ruzü şəb çəkir,
Sənsiz həmişə dəhrdə əğyar töhmətin.

* * *

Könül nə vəqtə kimin nari-pürşərar olsun,
Yanub fəraq ilə xakistər aşikar olsun.

Nə vəqtədək nigaran gözlərüm rəhün gözlüb,
Çəküb səbahə kimin, çeşmim intizar olsun.

Nə qədri möhnətü dərdi-fəraqə tab etsün,
Zəmanə içrə əzilüb fəqirü xar olsun.

Yetübdi axıra ömrüm, Xuda, şəmatətdən,
Nə qədr aləmara xari-ruzigar olsun.

Sirişki-didə dolub qan ilə, üzüm gülməz,
Nə vəqtə kimi bu aşiq qəmündə zar olsun.

Çətindür etmək əgər tərki-aşiyan, Nadim,
Həqiqi aşiq odur, axır ömri xar olsun.

* * *

Gülüm, əmr et, yüzündən ol qarə zülfün kənar olsun,
Çəkilsün əbri-zülmət, mah üzün bir aşikar olsun.

Açub gülşən kimi sağü solunda laleyi-əhmər,
Çətindür laleyi-gülşən sənüntək abidar olsun.

Nihan eylüb o gülzarı, gülüm, incitmə bu yarı,
Rəva görmə dili-aşiq qəmindən tarümar olsun.

Əgər fikrün sənün rəng eyləməkdür aşiqi-zarə,
Qürur olma bu surət daima səndə qərar olsun.

Mürüvvət etgilən, incitmə, zalım, mürği-bibalı,
Məgər ki, rəsmdür hər nazənin bie`tibar olsun?

Xəyal etmə səni yaddan fəramuş eyləyüb Nadim,
Çətindür mürği-şeyda şaxi-güldən bir kənar olsun!

* * *

Ənisim olmağa, ey mahparə, xoş gəldün,
Qədəm qoyub sinəm üstə dübarə, xoş gəldün.

Bu xəstə başımı, lütf eylə, al dizün üstə,
Baxım doyunca ol çeşmi-xumarə, xoş gəldün.

Cəvanlığımda yerim, qorxuram, məzar olsun,
Bu dərdə vəslin ola bəlkə çarə, xoş gəldün.

Xəm etmisən qədimi o xəmidə qaşın ilə,
Öləndə barı, məni al kənarə, xoş gəldün.

Bu dərdi-eşqimə var ləbləründə dərmanın,
Qəra edüb günimi çeşmi-qarə, xoş gəldün.

Ölüm zəmanı yetib, gəl bu aşiqə ağla,
Özün bu Nadimini qoy məzarə, xoş gəldün.

* * *

Gül gərək öz bülbülün gülşəndə naşad etməsün,
Əndəlibün könlüni zülm ilə bərbad etməsün.

Zahida, etmə məzəmmət bülbüli-biçarəni,
Aşiq öz mə`şuqəsiyçün necə fəryad etməsün?

Bir güli-məhparənün eşqində fəryad eylərəm,
Həq, görüm, ta həşr olunca heç onı şad etməsün.

Bəs necə insafdür bu nazənin biçarə gül,
Xar ilə həmdəm olub, heç bülbülün yad etməsün?

Zahida, yoxdur səvadım, Nadimi-biçarəyəm,
Bəndəyə alim olan şairlər irad etməsün.

* * *

Qəflətən sinəmə çün urdı bir ox qarə gözün,
Lütf ilə çünki nəzər saldı bu bimarə gözün.

Bir nəzər qılmaq ilən əldən alub taqətimi,
Məni Məcnun kimi axır qoyub avarə gözün.

Rəhm elə, etmə cəfa aşiqi-nalanə bu qədr,
Qeyz əlilən verər axır məni xunxarə, gözün.

Firqətün canımı bir dərdə salub, yoxdur əlac,
Əmr elə, bəlkə edə dərdimə bir çarə gözün.

Xəstəhaləm ki, yaram var, nə edim, ah ölürəm,
Məni bu halə salub ol, ey gülü məhparə, gözün.

Guş qıl, mültəfit ol ərzimə, var bircə sözüm,
Nə ola rəhm eləyə Nadimi-naçarə, gözün.

* * *

Vay ola halına üqbadə bu ruhanilərün,
Baxmayun virdinə dünyadə bu ruhanilərün.

Yetməz itmamə ki, nöqsanların izhar eləyim,
Salalar eyblərin yadə bu ruhanilərün.

Ki, Peyəmbər qoyub aləmdə həlal ilə həram,
Yeməgə mə`dəsi amadə bu ruhanilərün.

Şamə sədr dügüsündən plov, üstündə cücə,
Küftə, dolma ilə həlva da bu ruhanilərün.

Arizu eyləmə, Nadim, dəxi dümbəkçiligin,
Toy, kəmança ilə zurna da bu ruhanilərün.

* * *

Ver mənə, badi-səba, ol bivəfadən bir xəbər,
Söyləyən yoxdı mənə çeşmi-qəradən bir xəbər.

Çün vüsalın müjdəsin hər kəs mənə e`lan edə,
Ey qəriblər qasidi, vəsli-vidadən bir xəbər.

Ömr keçdi, gün tükəndi, firqətində çıxdı can,
Yetmədi didarimə ol məhliqadən bir xəbər.

Bixəbərdir bəlkə yarım, ey səba, e`lan qıl,
Qıl rücu, ver yarə bu bəxti qəradən bir xəbər.

Tez yetir ərzi-səlam, yarın de ki, bimardur,
İstə bu dərdə əlac, ol aşinadən bir xəbər.

Həq rizası, Nadimə ver vəsli-yarın müjdəsin,
Hurivəş, tutizəban, çeşmi-ziyadən bir xəbər.

* * *

Sənsiz cəhanda fəsli-bəharım xəzan keçər,
Xoş günlərim fəraqın ilə çox yəman keçər.

Hicran nə qədər çəksə, gözüm ağlar ol qədər,
Gündə yaralı qəlbdə min qətrə qan keçər.

Firqət şərarəsi məni xakistər eylədi,
Sənsiz nəsibim olmuş həmişə fəğan, keçər.

Müştaqi-vəslinəm, gözəlim, olmuşam əsir,
Olmaz mənə nəsib o gələn karvan keçər.

Ədna güman edər məni, dünyayə talibəm,
Rəmz ilə aşiq eşqini eylər bəyan, keçər.

Vallah, budur ki, Nadim o Leyla cünunidür,
Səhni-çəməndə ismi onun bağban keçər.

* * *

Fəraq narinə yanmaq məgər ki, asandur?
Bu qəlbim eşq oduna odlanubdı, büryandur.

Canımda qüssəvü qəmdən dönübdi qanə cigər,
Ki, ləxtə-ləxtə olub, bircə kasə al qandur.

Əzəl məni özi ağuşinə çəkərdi o gül,
Görən bəs imdi nə olmuş, məgər peşimandur?

Gedün, deyün o nigarə ki, söz həman sözdür,
Yolunda gərçi öləm, can o canə qurbandur.

Nolaydı yar məni bir çəkəydi ağuşə,
Onun vüsalı mənə eyni-vəsli-rizvandur.

Bu Nadimin əli səndən kənar olan gündən,
Həmişə şamü səhər  kari ahü əfğandur.

* * *

Ey sənəm, hicründə bu dünya mənə zindan olur,
Qüssədən bu xəstə könlüm ləxtə-ləxtə qan olur.

Çün məhəbbət atəşin sinəmdə pünhan etmişəm,
İstəsən kəs xəncər ilə, gör, necə büryan olur.

Yağ necə şəm`də ərir, vallah, mənim qəlbim o cür,
Hər səni gördükcə, bil, şö`lə çəküb giryan olur.

Bir neçə ildür sənün eşqündə cani-müntəzir,
Eylər əfğan, ağlamaqdan göz yaşım ümman olur.

Ağlaram hər sübhü şam, karimdür əfğan eyləmək,
Vəslin olmuşdur həram, çün qismətim hicran olur.

Nadiməm, göz yaşım daim rəvan eylüm* gərək,
Çünki könlüm qəhri-zülmi-bar ilə bimar olur.

* * *

Sənün kimi necə bir kimsə əhli-surət olur,
Gözəldə də belə bir surətü vəcahət olur?

Bu nazü qəmzə ilə gündə qan edir çeşmün,
Sənün öz eşqüvə qürrən, mənə məlamət olur.

---

* Eyləyim

Kəşidə qaşlaruva əmr elə fəraqət ola,
Görəndə qaşı könüldə, əcəb qiyamət olur.

Fəda olum gözüvə, et rəqibdən pünhan,
Görəndə ruyüvi əğyar, mənə şəmatət olur.

Rəqibindən gözüvi, ey nigarım, yan döndər,
Görəndə gözüvi ədna, mənə müsibət olur.

Kənari-şəm`üvə yannam misali-pərvanə,
Vəcihlər eşidübsən ki, əhli-ismət olur.

Cəhandə ruzim olur, Nadiməm, gözüm yaşı,
Bülənd ismim əgər eyni bir səadət olur.

* * *

Nəzarə qıl məni-bimarə, yar, əman günidür,
Nihani dərdimə et çarə, yar, əman günidür.

Yetir vüsaluva, bir busə ver yanağından,
Qoyum ləbim ləbi-gülnarə, yar, əman günidür.

Yetim muradıma qoy barı, kami-dil gətürüm,
Tərəhhüm eylə bu biyarə, yar, əman günidür.

Əgər ki, doğrasalar parə-parə, məmnunəm,
Yetəm sənə, barı, bir parə, yar, əman günidür.

Kənarə salmagilən Nadimi vüsalından,
Yetir bu aşiqi dildarə, yar, əman günidür.

* * *

Xuda, nolaydı, bu dünyayə gəlməyeydim kaş,
Cəhanda dərdü qəmə munis olmayeydim kaş.

Təmam olaydı həyatım kiçik zəmanimdə,
Gözüm açub o cəfakarı görməyeydim kaş.

Nə həddi-kamil olaydım, nə maili-rüxsar,
Yetüb bu sinnə belə təng qalmayeydim kaş.

Nə şad olaydı bu didəm, nə böylə xunalud,
Əzəlki gündə bu dildarı sevməyeydim kaş.

Nə vəsli-yarə yetəydim, nə şad olaydı gözüm,
Düçar bu hicrü bəlayə mən olmayeydim kaş.

Olubdur Nadimi-biçarə qüssədən bimar,
Bu dərdi-eşqi çəkeydim, heç ölməyeydim kaş!

* * *

Gözün fədası olum, yari-mehriban, səbr et,
Gözümə payüvi qoy, bir qədər dayan, səbr et.

Nə qədr çəkmiş idim intizaruvı, səd şükr,
Yol üstə vəslə yetişdim, gəlüb əman, səbr et.

Yanubdur eşq oduna aşiqin fəraqində,
Sənə bu dərdimi, barı, edim əyan, səbr et.

Əlüvi sinəmə qoy, qüssədən xilas eylə,
Qədəm gətürmə ki, əl`an çıxar bu can, səbr et.

Əyağın altına cismim rəvadur fərş olsa,
Otur sinəmdə gəlüb, məhrəmi-zəban, səbr et.

Tərəhhüm eyləgilən Həq rizası, Nadimüvə,
Həmayil et qoluvı boynuma, dayan, səbr et.

* * *

Tərəhhüm eylə məni-cannisarə bir saət,
Yetir vüsaluva, canan, dübarə bir saət.

Bu şəb rəqibdən eylə məqaluvi xali,
Ol həmzəban bu şəbi-biqərarə bir saət.

İcazə ver, oturum bari, asitanında,
Baxım doyunca o çeşmi-xumarə bir saət.

Həram eyləməz əğyarlər, edüblər xab,
Ki, rubəru danışaq aşikarə bir saət.

Qoluvı boynuma sal, Nadimi qutar qəmdən,
Deyim yetişdi əlim vəsli-yarə bir saət.

* * *

Öz yarım üçün dutmuşam əğyarı əgər dust,
Gül xatirinə eyləmişəm xarə məhəbbət.

Yaddan, nə edim, bülbüli gül etdi fəramuş,
Çün bülbüli rədd eyləməgə eyləyüb adət.

Ol qədr həyatım ola dünyadə, İlahi,
Axır o gülün vəsli olaydı mənə qismət.

Çünki yanıram eşq oduna can ilə hər an,
Rəngim saralub, çəkmişəm eşqində əziyyət.

Qorxum budı, dildarimə çün yetməyə dəstim,
Əğyarlər eyləllə* bu biyarə şəmatət.

Etmə bu qədər hurivəşün vəslini pünhan,
Nadim, buların tə`rifini eylə kifayət.

* * *

Aşiq kimi aləmara bimar olar, olmaz?
Aşiqtək olan eşqə giriftar olar, olmaz?

Gül sayəsinə xar gəlüb sayə salanda,
Bülbül görə, aya, gözi xunbar olar, olmaz?

Səyyadın əgər daminə zağ olsa giriftar,
Öz bəxti o səyyadəmi əğyar olar, olmaz?

Dildarı üçün əhli-dilin mənzəri olsa,
Bəxti ola ziba, özi bidar olar, olmaz?

Müştaqi-xədəng ilə dili-aşiqi-sadiq,
Bir baxmaq ilə qan ilə gülnar olar, olmaz?

---

* Eyləyərlər

Dərya ola, Nadim, əgər eşq əhlinün əqli,
Divanəsifət hicr ilə biar olar, olmaz?

* * *

İlahi, mən kimi bir əhli-eşqün bağrı qan olmaz,
Əgər qan olsa da, məntək yəqin xari-cəhan olmaz.

Alışmış atəşi-eşqə, fəraqın narinə yanmış,
Dönüb xakistərə qəlbim, əsiri-xoşzəban olmaz.

Yanubdur balü pər, bülbülsifət bibalü pər qaldım,
Xəzan dutmuş çəməndə mən kimi biaşiyan olmaz.

İşim nalə olur çün xar tapanda səhni-gülzari,
Qılub gül xarə ülfət, bülbül ilə həmzəban olmaz.

Alub səbrü qərarım ol siyəh əbruləri əldən,
Belə müjgan, belə əbru, belə tirü kəman olmaz.

Olubdur, Nadiməm, ruzim gecə-gündüz gözüm yaşı,
Ki, qəlbim qan olub qəmdən, belə dərdi-nihan olmaz.

* * *

İlahi, mən kimi bir kəs qəmü dərdə düçar olmaz,
Ənisi naləvü əfğan, sədası aşikar olmaz.

Vətən, vallah, mənə qürbət olub dünyadə, xar oldum,
Cünuni-eşq ola hər kəs, belə biixtiyar olmaz.

Həmişə ağlaram, ya Rəbb, gözüm yaşı olub ruzim,
Fəqir olsa əgər hər kəs, belə bədruzigar olmaz.

Günüm qarə, könül pürqəm, gözümdə pərdeyi-zülmət,
Könül xakistərə döndi, ki böylə pürşərar olmaz.

Həyatımdan usandım mən, İlahi, ömrdən doydum,
Bəla hədsiz, özüm yalquz, mənə bir qəmküsar olmaz.

Yuxum gəlməz zibəs ki, rəxtxabım od kimi dağlar,
Bu ruzigar, görən, ya Rəb, nə üçün tarümar olmaz?

Olub ləbriz guya rəxtxabım marü mur ilən,
Nə tab odlanmağa qəlbim, nə səbrü nə qərar olmaz.

Fələk eylüb məni Nadim, cəhanda heç üzüm gülməz,
Nə bir yarü ənisim var, mənimtək kimsə xar olmaz.

* * *

Dilər bu aşiqi-sadiq, bəladən heç kənar olmaz,
Gedər əldən qərarü səbr, dildə ixtiyar olmaz.

Həmişə eşq rahində keçər malı ilə candan,
Yəqinən bu səbəbdən əhli-eşq həmruzigar olmaz.

Əgər ki, olmasa bir qəlbdə gər eşq sənduqi,
O kəsdə bu yəqindür, zərrəcə heç e\`tibar olmaz.

Gərək dünyadə hər kimsə ola bir zillətaludə,
O şəxsün olmasa yarı, o kəsdə zərrə ar olmaz.

Olubdur bir gülə aşiq cəhanda Nadimi-şeyda,
Təmamən lalə gülşəndə o gültək abdar olmaz.

## Bismillah

Bəhəmdüllah, yetişdim məskəni-irfanə, bismillah,
Yetüb gülşəndə dəstim dəsteyi-reyhanə, bismillah.

Xudavənda, qutardı, şükr ola, can dərdi-möhnətdən,
Sataşdı çeşmi-qəmnakım rəhi-cananə, bismillah.

Bəhəmdüllah, qutardım dəhrdə şərdən, zəlalətdən
Yəqindi, çün yetişdim rövzeyi-rizvanə, bismillah.

Təmamən rövzeyi-rizvan, nə kim, var huriyü qılman,
Tiküb göz saqiyi-Kövsər, Şəhi-mərdanə, bismillah.

Bəhəmdüllah,qutardım bu cəhanda şeyxi-zalimdən,
Yetişdim qədr üçün mən Əkbəri-ətşanə, bismillah.

Olub Kərbübəla Şahinə zarü dilfəşan Nadim,
Bəhəmdüllah, yetişdim sərvəri-dövranə, bismillah.

## Bəhəmdüllah

Bəhəmdüllah, tazədən düşdüm əcəb sevdayə mən,
Axir ömrümdə yetişdim ne`məti-üzmayə mən.

Gərçi çox ətşan idim suzi-ətəşdən dəhrdə,
Səd həzaran şükr, yetdim Zəmzəmü Minayə mən.

Çox dolandım bu cəhandə zarü giryan, dilfikar,
Səhni-gülşəndə yetişdim bir güli-həmrayə mən.

Gül nədür, bülbül nədür, sevda nədür ki, zahida,
Əsli mə`nadə yetişdim sərvəti-minayə mən.

Zair oldum eşq ilə mən Kərbəla Minasinə,
Ol gülüstandə yetişdim bülbüli-şeydayə mən.

Nadiməm, mən Əkbərün eşqində giryan olmuşam,
Ağlaram leylü nəhar ol gözləri şəhlayə mən.

**Var idi**

Əziz idim o zəman şanü şövkətim var idi,
Əlimdə şöhrət açan varü dövlətim var idi.

Ədəblə, əql ilə rəftar mənimlə munis idi,
Şərabü nani-ləzizanə ne`mətim var idi.

Acı sözüm olunurdı hesab çün qəndab,
Rəfiqü xiş ilə çox yaxşı ülfətim var idi.

Girəndə məclisə cümlə nişan verərdi məni,
Həmin məqamə görə çün ləyaqətim var idi.

Kənarlər o zəman qövm hesab edərdi məni,
Cəvab verməgə ə`dayə qüdrətim var idi.

Mənə qövmlər o vəqt xeyli mehriban idilər,
Əlimdə simü zərim, çox fərasətim var idi.

Xitab edərdi qarın-qılçalar, "Ağa Nadim!",
Əcəb rəvayehbəxş çay xəl`ətim var idi.

**Aldanma**

Aldanma, ey dil, ömrə ki, bunda vəfa hanı?
Göstər görüm, bu dəhrdə zövqü səfa hanı?

Yox zindəganlıq, ömri-fəna məhv olub keçər,
Söylə görüm, cəhanda bir əhli-vəfa hanı?

Bu mənzil içrə kim eyləyüb istirahətin,
Çoxlar gəlüb gedübdi, olardan bəqa hanı?

Dünya üçün həlakətə çoxlar özün salub,
Dövlət hanı, cəlal hanı, simü təla hanı?

Çox hurivəş bu aləmi seyran edüb gedüb,
Ə`za hanı, cəsəd hanı, cismü qəfa hanı?

Məhv oldı çox hərirlibasü gülcəmallər,
Yeksan olubdı xakə ol huriliqa hanı?

Çox mərdi-namdarlər aləmdə ism alub,
Noldı o mərdlərə, onlara irtiqa hanı?

Çoxları qərib ölüb, bəli, qürbətdə can verər,
Kərbübəla ərusi kimi binəva hanı?

Getdi ərusilər olub axır qəra duvaq,
Qasim ərusitək yaxa qandan həna hanı?

Çox növcəvanlar həsrətü nakam can verüb,
Damadi-Kərbəla kimi qərqi-bəla hanı?

Məskən qərib, ərusi qərib, əqrəba qərib,
İşrət güni olan səri təndən cüda hanı?

Çox növcəvanlarun gözi həsrət qalub toya,
Əkbər kimi sitəmzədə, gülgunqəba hanı?

Çox evləri xərabə edibdür bu ruzigar,
Bağlı qalan Əli evitək bir bina hanı?

Bu dərdmənd Nadimə dərmandı göz yaşı,
Göz yaşıtək zəmanədə bir pürbəha hanı?

**Keçər gedər**

Ey dil, bu ömri-fani, bu dünya keçər gedər,
Vəsli-səfayi-dilbəri-ziba keçər gedər.

Çün fanidür bu eyş, cəhanun vəfası yox,
Fəsli-bəhar seyri, bu səba keçər gedər.

Aldanma malü dövlətə, dünyayə, aqil ol,
Olsan da şah, bu zərrü mütəlla keçər gedər.

Gər mərdi-namdar ola İskəndəri-zəman,
Abi-həyatı etsə də bərpa, keçər gedər.

Loğmani-əsr gər olasan, əldə çarə yox,
Topraq yerindür, türfə bu xülya keçər gedər.

Libasuvı qəssal aparar, ətləs olsa da,
Çün mülkü rəxti-kürki-Buxara keçər gedər.

Verməz necə ki namü nişan, ismi-qəhrəman,
Rüstəm və ya ki, aqilü dana, keçər gedər.

Qövmü qəbilə cəm` ola dövri-cənazəvə,
Verməz səmər bir qurı qovğa, keçər gedər.

Nadim, tədarük eylə yola sən də, hazır ol,
Bir arpa qurusı ilə dünya keçər gedər.

**Öləcəksən**

Öləcəksən, bilüsən*, axırı sultan olasan,
Sahibi-təxti-zərü taci-zətəfşan olasan.

Gedəcək cahü cəlal, dövlətü mal ilə mənal,
Gərçi Qarun kimi badövləti-dövran olasan.

Atma ox Xaliqə, Fir`on kimi olma qürur,
Boğazun tirə keçər, axırı şeytan olasan.

Habilin qanına Qabil kimi iqdam eləmə,
Sipəri-lə`nət olub eldə, bir ünvan olasan.

Bəsdi bu cəhlü cəhalət, gözün aç, keçdi həyat,
Amil ol öz sözüvə, sən də bir insan olasan.

Nə xəyalatü nə tədbirü təşəbbüs, nə fikir,
İstəyürsən məgər aləmdə Süleyman olasan?

* Bilirsən

Ruyi-dünyanı dutan laməkan İskəndər hanı?
Xeyli müşkildi belə amiri-fərman olasan.

Də`vət etdi səni həqq dinə, peyəmbərlər hanı?
Gətirüb dinə səni bəlkə müsəlman olasan.

Ayəbəayə gəlüb rəhbəri-Qur`ani-məcid,
Həqqə sən arif olub, qaili-Qur`an olasan.

Bisəbəb vermədi can böylə ki, bu Ali-Əba,
Bəlkə bais budı, sən layiqi-rizvan olasan.

Belə ki, başlamışıq biz bu həlal ilə həram,
Qorxuram axırı sən vasili-niyran olasan.

Beşcə gün omrdən ötri dinü imanı satub,
Görürəm istəyüsən* dövrdə dərban olasan.

Nadima, ömri-fəna fanidür, fövt eyləməmiş,
Aç gözün, qorxgilən axırda peşiman olasan.

**Gərək**

Ey dil, müdam həqiqəti etmək bəyan gərək,
Qəmdən yüzə sirişki-qəm etmək rəvan gərək.

Üqba evin xəyaluva sal, et əlacını,
Bu şərhi nəfsə əql ilə etmək əyan gərək.

---

* İstəyirsən

Bir vəqt əgləşər mələki-mövt sinəvə,
Etmək özüvə ol mələki mehriban gərək.

Bir təxtəparə üstə soyulmuş cənazəsən,
Qəssal əlində durmağa tabü təvan gərək.

Ol vəqt qoyalla* qəbrə səni, kimdi munisin,
Bir kəs o vəqtə munisi-şirinzəban gərək.

Zülmat qəbrüvə dəxi şəm` eyləməz əsər,
Ol bəzmə nuri salmağa nuri-cinan gərək.

Can mərqədində əskik olunmaz qiyas ilə,
Mürği-cinanə də genə bir aşiyan gərək.

Yoxdur sənün hərasun əgər murü mardən,
Əğyardən yanan zəman olmaq nihan gərək.

Nari-cəhimdən səni hifz eyləməkligə,
Bir xeyr əməl ola sənə ta pasiban gərək.

Sultan hüzurinə gedənə vasitə olur,
Versün sənə həqiqət rahi nişan gərək.

Vardur həyatun, ağla Hüseynə səbahü şam,
Bir tuşə göz yaşın edəsən ərməğan gərək.

Dərdi-günahuva ola dərman bu göz yaşun,
Nadim, Hüseynə dutmaq əza hər zəman gərək.

---

* Qoyarlar

* * *

Ə`da sitəmlə etdi şəhid Əkbərün susuz,
Əkbər qəmində eyləmək ahü fəğan gərək.

Dəstində Əsğərini susuz oxladı ədu,
Bu Əsğər aşiqi ola çün bağrıqan gərək.

Əbbasını xəcil elədilə Səkinədən,
Bu qəmdə əşki-didələr olsun rəvan gərək.

Damadınun toy hicləsini odlayubdular,
Eşq əhli bu əzadə ola növhəxan gərək.

Zibh eyləyüb Hüseyn sərün Şimri-bihəya,
Lazımdı qarəpuş ola mərdü zənan gərək.

Nadim, həmişə ağla Hüseynə səbahü şam,
Bəzmi-əzadə sən olasan canfəşan gərək.

**Ey səba**

Məndən səlam yetür Şəhi-dövranə, ey səba,
Versün şəfa bu xəsteyi-hicranə, ey səba.

Olsun nəsib dübarə o Şahun ziyarəti,
Eylüm* səlam o Şahi-şəhidanə, ey səba.

Bu dərdimün əlacın mən istədim özüm,
Olmaz nəsib bu didəsi giryanə, ey səba.

---

* Eyləyim

Ərz et mənim dilimcə ki, əfv eyləsün məni,
Verrəm qəsəm o natiqi-Qur`anə, ey səba.

Qəmdən bu mülki-dil boyanub qanə sərbəsər,
Etsün əlac bu möhnəti-tüğyanə, ey səba.

Var niyyətim əlim yetə qəbri-şərifinə,
Hər leyl göz yaşım dönüb ümmanə, ey səba.

Bir mərhəmət edə nəzəri-kimiya ilə,
Versün şəfa bu Nadimi-nalanə, ey səba.

**Hüseyn (ə) əzasində**

Kor olsun ağlamayan göz Hüseyn əzasində,
Zəmini-maridə, Kərbübəla Minasində.

Bəsirətin var əgər, eylə Kərbəlayə nəzər,
Bəlavü qəm görünür dəşti-Neynəvasində.

Həmişə naləvü əfğan o çöldə zahirdür,
Səkinə indi də ağlar ata həvasində.

Dutubdı Qasimə matəm Səriyyeyi-naşad,
Əmoğlu vay, deyüb ağlar ərus yasində.

Yaralarından axub ləxtə-ləxtə qan, quruyub,
Qalubdı dideyi-damad toy hənasində.

Əliyyü Əkbər olub xuni-al ilə əlvan,
Toya çün həsrət olub, gül açub yaərasində.

Üzarə göz yaşı tök, Nadim, etgilən əfğan,
Nəsib ola, deyəsən növhə Kərbəlasində.

**Əfrad**

Nə qədr olsa həyatun, Hüseynə ağlagilən,
Fəğan edüb bu müsibətdə, sinə dağlagilən.

Zəmini-Kərbübəladə olubdı qanə hədəf,
O çöldə tə`ziyə bərpa edübdi şahi-Nəcəf.

Sipahi-Kufəvü Şam, ol qəribi doğradılar,
Əlinün üstə Əli Əsğərini oxladılar.

Gedüb o şahun əlindən təmam ənsarı,
Olubdı qanına qolsuz xizab Ələmdarı.

Dolubdı zülm ilə çü Qadisiyyə səhrası,
Fərat kənarına qolsuz salublar Əbbası.

Salubla xaki-bəlayə məhi-Mədinəsini,
Qoyubla naləkünan zülm ilə Səkinəsini.

Sitəmlə əhli-cəfa soldurubla güllərini,
Şəhid edübdilər ə`da Əliyyü Əkbərini.

Zəbih eylədilər rə`si-paki-məzlumi,
Əsir edüblə sitəmlə əzizə Külsumi.

O çöldə Qasimə toy dutdı Şahi-məzluman,
Nə toydı, əhli-hərəm cümlə eyləyir əfğan.

Ərusi-bəxti qəranun işi fəğan oldı,
O vəqtə gördi ki, damad hənası qan oldı.

Əsir eylədilər itrəti-müəddəbini,
Çəküblə qolları bağlı Dəməşqə Zeynəbini.

Cəfa oduna ədu yandurubla xeymələrün,
Çəküblə zülm ilə qəlbinə dağ çü şiələrün.

Fəda o haluva canım, Hüseyni-təşnəcigər,
Sənə vəsiyyət edən vəqtə növcəvan Əkbər.

Dedi, şəhidləri dəfn edəndə Zeynəl-əba,*
Məni də dəfn eləyün payün atda,** çünki baba.

Ziyarətüvə gələllər eşitmişəm zəvvar,
Səni ziyarət edən vəqtdə, Şəhi-əbrar.

Sənün məzaruva sürtən zəman dodağlarnı,
Qoyallar sinəmün üstə qaba əyağlarnı.

Nəsib elə yetişə bir də qəbrüvə Nadim,
O səhndə ucalaydı səmayə fəryadim.

## BƏHARİYYƏ

Fəsli-bəhardür genə, könlüm xumar olub,
Gülşəndə gül vüsalı üçün biqərar olub.

---

* İmam Zeynəlabidinə (ə) işarədir
** Altında

Bülbül çəməndə cəh-cəh edir gül həvasinə,
Susənü lalə, yasəməni bir qətar olub.

Ey əndəlib, ətirli gülün qönçədür hələ,
Reyhanlər şüküftələnüb, aşikar olub.

Gəzdim təmam gülşənləri bir gül soraq edüb,
Tapdım güli ki, cövri-xəzanə düçar olub.

Teyri-güzar şəhri-Xorasanə eylədüm,
Fəsli-xəzan o yerdə mənə növbəhar olub.

Bir buyi-xoşnəsimi yetirdi dimağimə,
Müşki-Xəta o buyi görüb şərmsar olub.

İstibdad ilə çünki Nikolay Romanoviç,
Cövr etməgə o bülbüli-gülzarə xar olub.

O gülşəni nişanə edüb toplar ağzına,
Bu vəqtdən gözümə cəhan tarümar olub.

O qədr keçmədi, üç yüz il olmamış təmam,
Təxti-rəyasəti yıxılub tarümar olub.

Qətl eyləyüb özün, vükəlasın və hey`ətin,
Nəslən qəbiləsi hamısı şərmsar olub.

Düşdi xəyalimə genə də dəşti-Kərbəla,
Bikəs Hüseyn o yerdə bəlayə düçar olub.

Bu zülm ilə o zülmlərün xeyli fərqi var,
Qan cövri-zəhr ilə ləbi üstündə bar olub.

Əmma onu şəhid eləyən vəqtə kufəyan,
Bikəs əsir əyalı qəribi-diyar olub.

Kərbübəla büsatına əl vırma, Nadima,
Bu qəmdə göz yaşım üzə hər gün nisar olub.

**Oldı bəhar...**

Oldı bəhar, mövsümi-gül aşikar olur,
Bülbül gülün açılmağına intizar olur.

Bülbül, oyan ki, yasəmənü lalələr açub,
Qəflətdən aç gözün ki, gülün tarümar olur.

Bilməm nə haldür, bu necə rəsmdür, Xuda,
Fəsli-bəhar olanda ümum aşikar olur.

Bülbül gəlübdi gülşənara lalə sehrinə,
Gül butəsində xarı görüb biqərar olur.

Düşdi xəyalə bülbüli-gülzari-Kərbəla,
Vəchi budur ki, çeşmlərim əşkbar olur.

Nazlı Səkinə bülbüli-şeyda ikən hənuz,
Növhə edər bu qəmdə dili pürşərar olur.

Vardur bəsirətün, baxuban Kərbəlayə, gör,
Gültək o qədr yarə açub haləzar olur.

Cismi-Hüseyndə on iki min yarə pabəsər,
Bəs hansı gül o yarə kimin abdar olur?

Mən Nadiməm, bu qəmdə gözüm ağlayar müdam,
Bu qissədən çü mülki-könül tarümar olur.

**Bəhar oldı...**

Bəhar oldı açub gülzardə güllər,
Həvayi-vəsl ilə qu-qu edəllə bülbüllər.

Vüsali-gül yetüşüb, əndəlib olub şeyda,
Çəməndə rişələnibdür təmam sünbüllər.

Gedübdi fəsli-zimistan, olubdı fəsli-bəhar,
Çalulla* rəngbərəng laləzar olub yerlər.

Təmam kuh ilə səhra olubdı rəngarəng,
Edübdi aləmi barəngi-laleyi-əhmər.

Çıxar səyahətə hər kimsə öz rəfiqilə,
Olubdı eyd, geyüb xəlq ətləsi-əhmər.

Olubdı xəlqi-cəhan eyşü işrətə məşğul,
Büruzə gəldi təb`im, açdı şövq ilə şəhpər.

Səyahət əzmi edüb seyr qıldım hər yani,
Sataşdı çeşmimə bir növgüli-şükufteyi-tər.

---

* Çalırlar

Necə çəmən, necə lalə, necə güli-ziba,
Bular təmamidə fanidür, ey bəradərlər.

Xəyalə qönçəni salsan, o çöldə zahirdür,
Batubdı qönçəsifət qanına Əli Əsğər.

Çün əndəlib kimin həsrət oldı öz gülinə,
O çöldə Qasimi-bixanimanü məhpeykər.

Edüb o halını niskil çün mühibbiləri,
Əza dutub ona ağlarla müttəsil illər.

Misali-laleyi-əhmər çəmən batub qanə,
Mədinə Yusifi şəhzadə növcəvan Əkbər.

O gülşən içrə sənubərdi qaməti-Əbbas,
Yetüşdi cisminə min zəxmi-nizəvü xəncər.

O səhnə daxil olanda Hüseyni-ləbtəşnə,
Fəğanə gəldilər ərş üzrə hər məlayiklər.

Mühərrəm ayı olub, oldı çün şəbi-nöhüm,
Cəm` etdi başına əshabın ol şəhi-məhşər.

Buyurdı cümleyi-əshabə ol büləndəsas,
Təmamivüz olun agah bu əmrə, ey ləşkər.

Gəlüb o şəxs ki, dövlət və mal həvasilə,
Hər ol kəs istəyə getsün, var ixtiyar gedər.

Bu Kərbəladə məni parə-parə doğrallar,
Qalar Mədinəyə həsrət Hüseyni-təşnəcigər.

Bu Kərbəladə gərək Zeynəbim əsir olsun,
Çəkəllə Zeynəbi qolbağlı Şamə əhli-səqər.

Bəyan edəndə bu əmri o sərvəri-mədəni,
Dağlımağa qoyub üz birbəbir münafiqlər.

Gəlüb hüzuri-şəhi-Kərbəlayə, qıldı bəyan,
Təmam dağıldı əsasın, yıxıldı çadırlər.

Yazub bu qissəni Nadim, tökər sirişk yüzə,
Verər muradını axır, Hüseyni-təşnəcigər.

**Olubdur**

Bilmirəm nə olub ki, xəlqün qəmləri əyan olubdur,
Gözlər əşk ilə ləbaləb, karları fəğan olubdur.

Lalələr həzardəstan, nilüfər geyübdi qarə,
Va Hüseyn deyər bənəvşə, göz yaşın tökər üzarə,
Qüssədən olubdı məhtab bərg-bərg, parə-parə,
Söyləyər, qərib Hüseynün gülşəni xəzan olubdur.

Eylədim sual, nəsrin, gəlmisən neçün nəvayə?
Sərv barlər çəküb əl, bardən gəlüb sədayə,
Söylədi, Hüseyn ölübdür, batmuşux təmam əzayə,
Mürği-bağ, güli-gülistan tərki-aşiyan olubdur.

Səhndə büsati-matəm başlayub güli-səmənsa,
Lalə oldı gülşən içrə qəmdən əndəlibi-şeyda,
Çün qalub oğulsız ağlar imdi Əkbərinə Leyla,
Yusifi-Mədinə tirü xəncərə nişan olubdur.

Ya olub məhi-mühərrəm cümlə əhli-aləm ağlar,
Qönçədür güli-müəttər, çün açılmaz hər dəm ağlar,
Qönçəvəş solubdur Əsğər, madəri dəmadəm ağlar,
Hülqi gül kimin açılmış, oxlara nişan olubdur.

Pərşikəstə bərgi-xəndan əgləşüb çəməndə gül-xas,
Göz yaşın tökər üzarə qətrə-qətrə misli-əlmas,
Nəhri-Əlqəm üstə qolsuz təşnə doğranubdı Əbbas,
Baş açub cənab Külsüm çeşmi əşkbar olubdur.

Baş açub gəlüb nəvayə bəs nədür ki, vəchi nərgis,
Bir tərəfdə baş açubdur sünbül əgləşübdi bihiss,
Qan yaxub əlinə Qasim, eyləyər ərus əfsus,
Bəxti qarə növərusun virdi əl-əman olubdur.

Laləni çəməndə gördüm geymiş əhmər üstə qarə,
Yasəmən qədi xəm olmuş susəni alub kənarə,
Şahi-din tapan zəmanda Əkbərini parə-parə,
Sərvi-qəddi xəm üzarə gözi yaş rəvan olubdur.

Gülsəbahi əsr həvası gördüm eyləyübdi məhzun,
Əndəlibi-zar olubdur gülşənün qəmində dilxun,
Əkbərün görəndə Leyla halı oldı çün digərgun,
Sökənübdi* yarə üstə yarə, qərqi-qan olubdur.

* Söykənibdir

Bir tərəfdə sərv gördüm qaməti olub xəmidə,
Xəm olub çəməndə şümşad, kəc olub qədi kəşidə,
Dəstgir olubdı Zeynəb yoxsa ləşkəri-ənidə,
Xətmitək xəzanə dönmüş, rəngi zə`fəran olubdur.

Nəstərən gəlüb nəvayə, eyləyər fəğanü şivən,
Qışa döndi növbəharı, tarümar olubdı gülşən,
Bülbüli-Mədinə olmaz möhnətü bəladən eymən,
Naləyə gəlübdi tuti, çünki növhəxan olubdur.

Qu-qu eyləməz, nolubdur, qumri əgləşüb əzayə,
Heyrətə düşübdür aləm, ağlaya bu macərayə,
Nadim, ağla sən də daim bu qəribi-Kərbəlayə,
Cəm`i-yari-cannisarı çün xizabi-qan olubdur.

**Bəhariyyə**

Könül səfa gətürüb növbəhar həvasindən,
Olubdı bülbüli-şeyda gülün səfasindən.

Açubdı gülşəni-lalə, sənübərü reyhan,
Nə gül, nə lalə deyim olmaz ibtidasindən.

Minayi-Kərbübəla gülşənində güllər açub,
O gül ki, zahir olub Əkbərün yərasindən.

O gülşəni edüb bəhrə şahi-Kərbübəla,
Xəzanə döndi o gülşən ədu cəfasindən.

Şəhid olan sora ənsarü Əkbərü Əbbas,
Üzüldi dəsti-Hüseyn qövm-əqrəbasindən.

Dedi, bu sən, bu da mən, bu diyari-Kərbübəla,
İcazə ver, gətürüm tuşə Həqq Minasindən.

Olub sirişki-Hüseyn gül üzarinə cari,
Dedi, yoxundı məgər məxfi iltimasindən.

Mənə atan veribdür səni edim damad,
Gərək ki, feyz alasan mətləbi-xəfasindən.

Buyurdı Zeynəbə Mövla, ərusə eylə xəbər,
Əlin xizab edə ta, Qasimün hənasindən.

O vəqt Qasimə bir toy-dügün dutub Şəhi-din,
O toy kənarə salub oğlunı anasindən.

Buyurdı, gəl, anacan, et həlal yetim balavı,
Bu növ`i ayrılu aya ana balasından?

Vida edüb anasın oldı azimi-meydan,
Ərus məxfidə ağlardı çün həyasindən.

Yetİşdi rəzmgəhə çün mübariz etdi tələb,
Pozıldı meymənəvü meysərə hərasindən.

Cəhimə etdi rəvanə neçə münafiqlər,
Mələklər eşqə gəlüb afərin sədasindən.

Gəlüb çün Əzrəqi-Şami misali-kəlbi-əqur,
Çəkərdi ahi-dəmadəm oğul əzasindən.

Olubdı rubəru zülmat nur ilən o zəman,
Çəküb o şumi-dəğa tiğini cəfasindən.

Vıranda Qasimə tiri-cəfa o şumi-ləin,
Kənar edüb qılıcı Qasim, Həqq duasindən.

Münəvvər oldı cəmalı əzizi-paki-Nəcəf,
Göründi qürsi-qəmər tiri-bərqasasindən.

Çəkübdi tirini əldə misali-şiri-jəyan,
Əsərdi bərgi-xəzantək onun hərasindən.

Dəxi müsibətə əl vırma, Nadimi-şeyda,
Dönübdi qanə könül, qan olan hənasindən.

### Peyğəmbər ayinə

Ey könül, dut ruyüvə vəsfi-Peyəmbər ayinə,
Dut əlində vəsf üçün bu ismi Allah ayinə.

Gəldi dini aşikar etməkligə afaqdə,
Eylədi əmri-Xudanı xəlqə yeksər ayinə.

Olmasaydı bu Mühəmməd, aşikar olmazdı din,
Eylədi dini-mübini Şahi-məhşər ayinə.

Xaricilər bu vücudin şə`ninə münkir degil,
Bu Şəhün əmri olubdur xəlqə rəhbər ayinə.

Müzməhil olmuşdı din bu gəlməseydi aləmə,
Dutdılar bu nuri cümlə ənbiyalər ayinə.

Dut bu nuri ayinə rüxsaruva məhşər güni,
Bundan ə`la olmaz ol gündə müyəssər ayinə.

Həşrdə bircə budur ümmətlərə imdad edən,
Babi-cənnətdür, budur ol gündə rəhbər ayinə.

Azimi-üqba olan saətdə Xətmi-ənbiya,
Canişin oldı o nurə nuri-Heydər ayinə.

Bu Rəsulun rehlətindən sonra ol Şahi-Nəcəf,
Bu fəna dünyadə oldı xəlqə rəhbər ayinə.

Canişini-Müstəfa, imdadxahi-masiva,
Zati-pakilə olubdur Şahi-davər ayinə.

Xari-müğilan üstə bipər düşən vəqt Cəbrəil,
Cəbrailə oldı o gün nuri-Səftər ayinə.

Çün Sərəndib içrə tirə şəbdə imdad eyləyüb,
Adəmün qəlbün edüb xəsldən ənvər ayinə.

Çün Əlinün nuri, Tur üstə təcəlla eylədi,
Saldı Turə nurini mövlayi-Qənbər ayinə.

Ayətüllahü yədullahü babullahdür Əli,
Bu Əli nuri dönüb cümlə mələklər ayinə.

Bu Əli oldı Xəlilə nar içində dadrəs,
Çün Xəlilə oldular xoş ətr güllər ayinə.

Yazmasaydı bu Əlinün ismini ərşə Xuda,
Olmaz idi aləmə mahi-münəvvər ayinə.

Salmaz idi nurini yer üstə xurşidü səma,
Tirü tarə aləmi etməzdi gözlər ayinə.

Olmasaydı bu Əli, dünyadə Əmri Xəndəqi,
Eyləyərdi bütləri biz qövmə yeksər ayinə.

Olmasaydı bu Əli, almazdı babi-Xeybəri,
Çün müşəxxəs olmaz idi həqq din hər ayinə.

Olmasaydı bu Əli, pamal olardı dari-din,
Kəştidə Nuhə olubdur fəthi-Xeybər ayinə.

Çün çəkəndə darə İsanı o gün qövmi-yəhud,
Oldı ruhullahə dar üstə Qəzənfər ayinə.

Nadima, ruzi-cəzadə, bil, şəfaətdür sənə,
Anla, dut dəstində övsafi-Peyəmbər ayinə.

**Peyğəmbərün vəfatinə**

Şiə, yetüb mövsümi-rehləti Peyğəmbərün,
İmdi əzadar olub itrəti Peyğəmbərün.

Yasə batub Fatimə, çünki Peyəmbər ölüb,
Ağlayar aləm bu gün, Şafiyi-məhşər ölüb,
Qarə geyüb ümməti, çünki o rəhbər ölüb,
Dutmuş əza ağlayar, ümməti Peyğəmbərün.

Fəsli-bükadur, təmam xəlq dəgüb bir-birə,
Maliki-ərşi-bərin qarə çəküb göglərə,
Biz də gərək tə`ziyə saxlayaq ol sərvərə,
Ta ki, gərək görk ola hörməti Peyğəmbərün.

Aləmə sərdarı ki, onda ki, dəfn etdilər,
Niyyətü məqsudinə əhli-cəfa yetdilər,
Əmrinə asi olub, nəhyinə əmr etdilər,
Qəbrdə məhv olmamış xəl`əti Peyğəmbərün.

Həqqi danub cümləsi biy`əti sındırdılar,
Küfr ələmün qalxızub məkr torun qurdular,
Axırı Peyğəmbərün babını yandırdılar,
Həddən ötüb tazədən möhnəti Peyğəmbərün.

Günbəgün əhli-cəfa zülmdə kəsb etdilər,
Beydəqi-küfri ədu məsnədə nəsb etdilər,
Həqqi-vəliyullahın həqqini qəsb etdilər,
Oldı fəna etdigi hüccəti Peyğəmbərün.

Sanki bir od yandırub dudi çıxub göglərə,
Etdi sirayət o od, rəxnə salub yerlərə,
Şimr Hüseyn hülqini etdi nişan xəncərə,
Xəm olub ənduh ilə qaməti Peyğəmbərün.

Səcdə edən vəqtə qan üstinə bikəs İmam,
Gətdi başun səcdədən sölədi, ey əhli-Şam!
Bircə içim su verün, eylərəm hüccət təmam,
Həşrdə yetməz sizə rəhməti Peyğəmbərün.

Ağlaram hər ruzü şəb, rəhbəri-ümmət, sənə,
Nadimin ağlar müdam, Şahi-vilayət, sənə,
Ruzi-cəzadə yetər əcri-şəfaət sənə,
Söylə yetüb, Nadima, rehləti Peyğəmbərün.

**Əli vəliyyi-Xudadur...**

Əli vəliyyi-Xudadur, vəsiyyi-Peyğəmbər,
Əlidi Şafiyi-ruzi-cəza, Şəhi-məhşər.

Verübdi xilqəti-əvvəldə Cəbrəilə nicat,
Olub səbəb bu Əli, Cəbrəil açub şəhpər.

Əlinün ismi əzəl tağı-ərşdə yazılub,
O ismi cümlə mələklər oxurdular əzbər.

Əli nicat verüb Adəmə Sərəndibdə,
Onun vücudi ilə bərqərar olub göglər.

Təcəlla etdi həman nur Turi-Sinadə,
İşıqlaşubdı həman nur ilə məhi-ənvər.

O nurdən ötəri xəlq olub bütün aləm,
O nurə səcdə edüblər təmam məlayiklər.

Həman Əlidi edüb Nuhə kəştidə imdad,
Həman Əli olub İsayə dardə davər.

Onun mübarək adı tağı-ərşə zinətdür,
Əlidi şiri-Xuda, dəsti-Xaliqi-Əkbər.

Onı Xuda özi tə`rif edübdi Qur`andə,
Bu dini-Əhmədi, çün bərqərar edüb Heydər.

Xəlili nari-cəfayə atanda qövmi-Yəhud,
Edübdi nari gülistan, olub ona yavər.

Əli cəhanda, bəli, cümlə xəlqə davərdür,
Cəhanə gəlməmiş oldı anasına davər.

Əlidi madərini şirdən xilas eləyən,
Əli gər olmasa zirü zəbər olur yerlər.

Həman Əliydi Peyəmbər çıxanda me`racə,
Gətürdi loğmə, Peyəmbərlə meyl edüb sərvər.

Bilən zəmanda Peyəmbər əlində sibi-behişt,
Həman əl ilə alub sib parəsin Səftər.

Həman Əlidür uşaqlığda əjdəhanı bölüb,
Dünim edüb yerə saldı bəzərbi-əngüştər.

Həman əl ilə Əli dini aşikar elədi,
Onun vücudi ilə sərnigun olub bütlər.

O gün ki, dini-Mühəmməd cəhanda qaim olub,
Gətürdi dəstinə çün babi-qəl`eyi-Xeybər.

Vıranda şəst ilə zərbət çün Əmrə şahi-Nəcəf,
Düşübdi xövfü hərasə hamı düşmənlər.

Oxundı göglərara afərin, cəzakəllah,
Deyərdi, "əl-həzər"ü "əl-əman" münafiqlər.

Həman Əlidi ki, Xəndəqdə Əmri öldürdi,
İşıqlaşubdı həman vəqtə çeşmi-Peyğəmbər.

Həman Əliydi ki, Həqq dini eyləyüb qaim,
Əlidi seyyidi-cənnatü saqiyi-Kövsər.

Əlidi şiələri həşrdə rəha eləyən,
Bunun vüsalı üçün müntəzirdi hurilər.

Bu yerdə məscidi-Kufə xəyalimə düşdi,
Cəfalər ilə Hüseyn qaldı Kufədə bisər.

O ibni-Mülcəmi-zalim əlində tiği-bəla,
Necə yazım ki, gözüm qəmdən oldı qəmpərvər.

Neçə qədəm gətürüb ta yetişdi səhrayə,
O vəqtə şiələrün başına səpüb küllər.

Qılıncı zərb ilən çün endirəndə ol zalim,
Boyandı qanə Əli, oldı qan ilə əhmər.

Bu qissədən cigərim yandı dağdar oldı,
Boyandı qaninə zülm ilə xaceyi-Qənbər.

Tökər sirişk yüzə Nadim qələm əlində, Əli,
Bu şərhi səbt eləyüb dəftərində, nəzmə çəkər.

## Saqinamə

Gətür bu aşiqə bir badə, saqi, xoşgüvar olsun,*
İçüb aşiq bu cami-eşqi, sərməstü xumar olsun.

Bəhar oldı dübarə tutiyi-təb` gəldi göftarə,
Bu növ` sərf edər ömrün yetincə vəsli-dildarə,
Həmişə cəhd edər bülbül yetişsün fəsli-gülzarə,
Zimistandan xilas olsun, nəsibi növbəhar olsun.

Genə eşqim əyan oldı, düşübdür ayrı sevdayə,
Yetişmək istəyür könlüm genə zibayi-dünyayə,
Neçə müddətdi bu aşiq düşübdür bu təmənnayə,
Ki, bəlkə balü pər açsun, rəvani-gülüzar olsun.

Könüldən et kənar, ey əql, bu bihudə sevdadur,
Rüxi-dildarı tə`rif eyləsən, gər hərfi-bicadur,
Rüxi-dildarə aldanma, sənə bu məhru ə`dadur,
Nə lazımdur bu şirintəb cəhandə ləhvkar olsun.

Əgər tə`rif edərsən, Heydəri-Kərrarə layiqdür,
Sual etsən əgər bu əqldən, ol şahə aşiqdür,
Onun həqqini hər kəs dansa, vallahi, münafiqdür,
Ki, az qaldı Əli eşqində könlüm pürşərar olsun.

Könül, baxsan əgər əl`an Nəcəf səhrasına sarı,
O səhradə yəqinən çün görərsən əsli gülzarı,

---

* Hüseyn Nadim Naxçıvaninin filologiya elmləri doktoru Əsgər Qədimov tərəfindən tərtib edilmiş “Seçmə şeirlər” (Azərbaycan Dövlət Nəşriyyatı, Bakı, 1993, səh.33) kitabında bu şeir dəyişdirilərək qəzəl kimi verilmişdir.

Mələklər ərşdə tə`rif edəllər Şahi-əbrarı,
O səhratək gülistan yoxdı nuri aşikar olsun.

Bu Şahun rütbeyi-şə`ni təmamən xəlqə e`landur,
Bu Şahun əmrini nəhy eyləyən axır peşimandur,
Bu bikəs Nadimün canı Şəhi-valayə qurbandur,
Nəsib eylə məzarında bu çeşmim əşkbar olsun.

**Bu şəb**

Əlvan edüblə qaninə Şiri-Xudanı çün bu şəb,
Ağlar qoyubla zülm ilə Ali-Əbanı çün bu şəb,
Çün ibni-Mülcəm bihəya oldı belə zülmə riza,
Zülm ilə yıxdı ol dəğa ərşi-Xudanı çün bu şəb.

Qan ilə əlvan eləyübdi Padşahi-məhşəri,
Çünki nəmaz üstə şəhid eylüb əmiri-Xeybəri,
Mehrab içində xun ilə yeksan edibdür Heydəri,
Qan ilə əlvan etdilə Şahi-cəhanı çün bu şəb.

Gəldi fəğanə Cəbrəil, oldı bu qəmdə növhəxan,
Mehrab içində qan ilə əlvan olub Şahi-cəhan,
"Qutiləl-əmirəlmö`minin"* söylüb, edüb şurü fəğan,
Qan üstünə saldı ədu miri-hüdanı çün bu şəb.

Saldı bu qəmdə vəlvələ ərşi-Xudayə Cəbrəil,
Aldı bu şəb tacın ələ, gəldi nəvayə Cəbrəil,
Növhə edüb ağlar bu gün şiri-Xudayə Cəbrəil,
Eylüb mələklər qarəpuş ərşi-Xudanı çün bu şəb.

---

* Əmirəlmöminin (İmam Əli) (ə) qətlə yetirildi

Zülm ilə əhli-kufəyan lövhi-Xudanı pozdular,
Hərfi-mə`nadə çün kəlami-"Hələta"nı pozdular,
Çün səfheyi-Qur`andə "Şəmsüz-züha"nı pozdular,
Öldürdülər zülm ilə Şahi-"Lafəta"nı çün bu şəb.

Amadə oldı bu müsibətdən Hüseyni-bivətən,
Oldı rəvanə məscidə ağlar Hüseyn ilə Həsən,
Göz yaşını cari edər Əbbas, sərdari-zəmən,
Ağlar qoyublar cümlə Ali-Müstəfanı çün bu şəb.

Çün həva tar oldı, lərzə eylədi ərşi-bərin,
Qan ilə yeksan olub çünki İmami-məşriqeyn,
Çün Cəbrəil eylüb nida, "qutiləl-əmirəlmö`minin",
Qoydı gözyaşlı ədulər Müctəbanı çün bu şəb.

Nadimün bu qəmdə oldı zarü giryan, ya Əli,
Cismüvi çünki edüblə qanə qəltan, ya Əli,
Ruzi-məhşərdə məni qoyma pərişan, ya Əli,
Ağlar qoyublar Zeynəbi-mahi-liqanı çün bu şəb.

**Əli (ə)**

Səcdəgahdə qan ilə xizab etdilər səni, rəhnüma Əli.
Şiələr sənün ağlar haluva, ey Şəhənşəhi-"Lafəta", Əli. (ə)

İbni-Mülcəmi-bihəya neçün etmədi Peyəmbərdən heç hicab,
Səcdəgahi-mehrabdə sənə eylədi necə zülmi-bihesab,
Zəhərli qılınc yarəsi, Ağa, səndə qoymadı onda zərrə tab,
Ağladı sənün haluva o vəqt ərşi-Xaliqi-kibriya, Əli.

Kəsb edüb ədu zülm əsasını, saldı zəxmdar, “Vəzzüha”, səni.
Yıxdılar səni xaki-xunara, çəkdi kaminə “Hələta” səni,
Cismi zəxmdar əhli-itrətün, tapdılar o gün qanara səni,
Ayələr sənün şə`nüvə nüzul eyləyüb, xüsus, “Hələta”, Əli.

Tərk edüb Peyğəmbər vəsiyyətin,
Etdilər sənün hətki-hörmətin.
Qaldılar yetim əhli-itrətin,
Ağladı hamı masiva, Əli.

Bir yara yetüb başuva sənün,
Dəstgir olub əldə düşmənün,
İzzətü cəlal ilə mədfənün,
Dəfn edüb səni Müctəba, Əli.

Ruhuva fəda cümlə şiələr,
Kərbəlayə sən eylə bir güzər,
Gör, Hüseynüvə etdilər nələr?
Qətlinə gələn əşqiya, Əli.

Əvvəl aldılar əldən Əkbərün,
Oxlanub susuz hülqi Əsğərün,
Zibh edüblə bir-bir köməklərün,
Həqqə eylədi can fəda, Əli.

Lə`nəti-Xuda əhli-kinəyə,
Vırdılar başın növki-nizəyə,
Etdilər rəvan Şamü Kufəyə,
Yandı xeymələr bərməla, Əli.

Bax bu Nadimün ahü vasinə,
Tez yetür onı iddəasinə,
Öz Hüseynivün Kərbəlasinə,
Zair etgilən, pişva Əli.

**O saət**

Ya Əli, neçün bəs aləm olmadı xərab o saət,
Qətlüvə çün ibn Mülcəm eylədi şitab o saət.

Vırdı bir qılınc yarası əldən ixtiyarun aldı,
Ali-Bu Türabı yeksər möhnətü bəlayə saldı,
Sübh vəqti səcdəgahun qan ilə müzəyyən oldı,
Etmədi o ibn Mülcəm Tanrıdan hicab o saət.

Zeynəbi-qəribü zarun başına ələndi küllər,
Cümləsi qərayə batdı Ali-itrəti-Peyəmbər,
Lərzə eylədi çü yerlər, etdilər nəva mələklər,
Gərdiş etməyüb dutuldı mahü aftab o saət.

Qan xizab edən zəmandə cismüvi çü misli-lalə,
Zeynəbün başun yarasın görcək etdi ahü nalə,
Zülfüni yolardı Külsüm gördi düşmisən o halə,
Möhnətün o dilhəzini eyləyüb kəbab o saət.

Bağlayub başun yarasın Müctəba silərdi qanun,
Təşnələb Hüseyn edərdi növhə kəsmiş idi yanun,
Başun üstə ağlayardı Əhli-Beyti-natəvanun,
Qarəyə batubla yeksər Ali-Bu Türab o saət.

Bəs nedəydi[*] Kərbəladə Şahi-insü can Hüseynün,
Təng dutdı ruzigarın əhli-kufəyan Hüseynün,
Aldı ixtiyarın əldən Şimr ilə Sinan Hüseynün,
Etdilər o Şahi-dinə zülmi-bihesab o saət.

Kəsdilər sitəmlə ə`da, vırdılar başın cidayə,
"Qutiləl-Hüseyn"[**] sədası düşdi dəşti-Kərbəlayə,
Kərbəladə Ali-Taha verdilər səda-sədayə,
Qan yüzində zahir oldı qandən xizab o saət.

Qarət etməgə ədulər yüz qoyubla xeyməgahə,
Yüz verüb qəmi-nəhayət Əhli-Beyti-bipənahə,
Belə zülmi-binəhayət eyləyüblə hansı şahə?
Qollarına Abidinün vurdılar tənab o saət.

Nadim, ağla bu Hüseynə, ağlayar buna Peyəmbər,
Bu qəribü bipənahə tə`ziyə dutar mələklər,
İstəsən sənə şəfaət eyləsün Şəfi`i-məhşər,
Zikr elə, neçün bəs aləm olmadı xərab o saət?

**Ya Əli (ə)**

Nuzdəhüm sübhi, ey kani-səxavət, ya Əli,
İbni-Mülcəm başuva çün vırdı zərbət, ya Əli. (ə)

Tapdı fürsət düşmənün, gördi nəmaz üstə səni,
İstədi bihiss edə razü niyaz üstə səni,

---

[*] Nə edəydi
[**] Hüseyn (ə) qətlə yetirildi

Bir qılıc zərbilə yıxdı canəmaz üstə səni,
Çün boyandı qanuva mehrabi-taət, ya Əli.

Bir qılıc zəxmi sənün aramuvı əldən alub,
Qan axub ətrafuva, mehrabdə bihiss salub,
Firqətündə Zeynəbi-mahi-liqa ağlar qalub,
Yandırub zülm atəşin əhli-şəqavət, ya Əli.

Başuva zərbət yetəndə, ey İmami-məşriqeyn,
Cəbrail etdi səda, "qutiləl-əmirəlmö`minin",
Ağladı gögdə mələklər, bir də cümlə insü cin,
Qalmadı bir zərbət ilə səndə taqət, ya Əli.

Can verən vəqtində sən cananə, ey Şiri-Xuda,
Çün yəminində, yəsarında Hüseynlə Müctəba,
Gözlərüvi bağladı ol Zeynəbi-bəxti qəra,
Canuvı canana verdün evdə rahət, ya Əli.

Bircə zərbətlə verüb cananuva can, qalmadun,
Görmədün dörd min yara cismündə, ətşan qalmadun,
Üç gecə-gündüz türab üstündə üryan qalmadun,
Bir başun məcruh idi, cismün səlamət, ya Əli.

Kaş gəleydün Kərbəlayə, Heydər, aşura güni,
İzdiham eylüb həman kufilər, aşura güni,
Şimri-laməzhəb əlində xəncər, aşura güni,
Qoydı xəncər həncərə Şimri-şərarət, ya Əli.

Yeddi zərbətlə başun zibh etdi ətşan quş kimi,
Qan içində çırpınardı bir qanadsız quş kimi,

Cəm`i-ərvahə nida eylərdi çün çavuş kimi,
Eylədi axır nəfəs itmami-hüccət, ya Əli.

Kaş, olaydın əsr vəqti odlananda xeymələr,
Xeyməgahə od vırub yandurdı qövmi-bədsiyər,
Hansı dində bu müsibətlər rəvadur, şiələr?
Şimri-laməzhəb qoyub asari-bid`ət, ya Əli.

Xeyməgahi yandırub, ağ oldular Peyğəmbərə,
Ahutək Ali-Əba yüz qoydular səhralərə,
Qəm hücumavər olub çün Zeynəbi-biyavərə,
Nuş edən vəqti Hüseyn cami-şəhadət, ya Əli.

Asiyəm, çox qorxuram mən Xaliqi-Qəhhardən,
Can verən vəqt başım üstə, gəl, qutar azardən,
Qət` olan vəqtə ümidim munisü ənsardən,
Nadimə eylə tərəhhüm, leyli-vəhşət, ya Əli.

**Əmirəlmö`minin (ə)**

Yetgilən imdadə, ya mövla Əmirəlmö`minin,
Çeşmimə zindan olub dünya, Əmirəlmö`minin. (ə)

Göz yaşı qanə dönüb, bir dadrəs dünyadə yox,
Qəmküsar olmağlığa biz şieyi-naşadə, yox,
Əhli-dil dindardən bir kəs fəna dünyadə yox,
Əksəriyyat oldılar ə`da, Əmirəlmö`minin.

Etdigün sə`yün necə ərz eyləyim, oldı hədər,
Kaş olaydı bu fəna dünya o gün zirü zəbər,
Adımız İslamdür zahirdə, bir növ` bəşər,
Din əsasın yox edən bərpa, Əmirəlmö`minin.

Aç gözüvi, ya Əli, sən qoyduğun peyğam hanı?
Bu əsasi-dinə bir kəs çəkməgə əncam, hanı?
Məhv olub qanuni-Qur`an, qaili-İslam hanı?
Ol əziz İslam olub ədna, Əmirəlmö`minin.

Din əsasın günbəgün tarac edir əğyarlər,
Əhli-dini möhnətə amac edir əğyarlər,
Əmri-dini-rəsmdən ixrac edir əğyarlər,
Göz yaşı qəmdən olub dərya, Əmirəlmö`minin.

Bülbüli-səhni-çəmən bir-bir gedüb xar oldılar,
Seydtək səyyadi-xunxarə giriftar oldılar,
Yarilər ə`da sözilə cümlə əğyar oldılar,
Zahirən inkar olur üqba, Əmirəlmö`minin.

Mərhəmət eylə, özün qurtar həlakətdən bizi,
Qət` əlaqə etgilən xani-vilayətdən bizi,
Rəhnümamızsan özün, rədd et zəlalətdən bizi,
Sən bəhəqqi hörməti-Zəhra, Əmirəlmö`minin.

Tabımız yoxdı belə bədru cəhanı görməgə,
Zindəganlıq eyləyüb ömri-təmamı görməgə,
Qətli-İslamə gələn nəzmü nizamı görməgə,
Günbəgün rövnəq tapur ə`da, Əmirəlmö`minin.

Mane`dür əhli-cəfa bikəs Hüseynün yasinə,
Qoymaz ə`da ağlayaq ətşan ölən Əbbasinə,
Qəlbimiz cövrü sitəmdən döndi qan dəryasinə,
Olmuşux qərqi-qəmi-üzma, Əmirəlmö`minin.

Təngdil olmuş cəhanda əhli-ismətlər təmam,
Çox mühəqqər oldılar cayi-ibadətlər təmam,
Şürb ilə zinətlənüb bəzmi-ziyafətlər təmam,
Oldular cümlə Yəzidasa, Əmirəlmö`minin.

Nadiməm, qurtargilən, rəhm eylə, zillətdən məni,
Lütf ilə azad elə dinsz vilayətdən məni,
Həqq rizası, et xilas tə`nü şəmatətdən məni,
Ağlaram hər ruzü şəb, mövla Əmirəlmö`minin.

**Mövla**

Qurban ola bu şiələr ol canuva, Mövla,
Mehrabdə cari olunan qanuva, Mövla.

İqdam elədi qətlüvə ol zadeyi-Mülcəm,
Çün şiələrün qəddi o saətdən olub xəm,
Cəbrili-əmin gögdə səda etdi həman dəm,
Yetdi o səda itrəti-nalanuva, Mövla.

Mehrabi-ibadətdə sənün tökdülə qanun,
Yandı cigəri möhnətilə Ali-əbanun,
Xakistər olub başlarına əhli-cəhanun,
Qan cari olub səcdədə hər yanuva, Mövla.

Əgləşdi qılıc başuva, xeyli sitəm etdi,
Rə`na qədüvi zərbəti-şəmşir xəm etdi,
Sən qanə batan dəmdə Hüseyn daduva yetdi,
Sə`y eylədilər mərhəmü dərmanuva, Mövla.

Qan cari olub zəxmdən, aramuvı aldı,
Zeynəb eləyüb növhə, qolun boynuva saldı,
Zülm ilə əgər səcdəgəhün qan ilə doldı,
Ox vırmadılar sineyi-suzanuva, Mövla.

Can Kufədə verdün rəhi-canənə vətənsiz,
Üç gün bədənün qalmadı səhradə kəfənsiz,
Əllərdə başun gəzmədi hər şəhri bədənsiz,
Çub ilə cəfa yetmədi dəndanuva, Mövla.

Xüşk etdi başun yarəsini Zeynəbi-müztər,
Qətlə yetirüb qatilüvi varisi-Heydər,
Gül həncərüvə Şimr sənün qoymadı xəncər,
Gün salmadı suziş ləbi-ətşanuva, Mövla.

Sən canuvı bəzl eylədün Həqqə qəmi rəstə,
Cəm` olmadılar qətlün üçün dəstəbədəstə,
Əhd etdi Hüseyn oğlun özi ruzi-Ələstdə,
Qurban ola ta Xaliqi-Sübhanuva, Mövla.

Gətdi Hüseyn izzət ilən qoydı qüburə,
Xuli başuvı qoymadı kül üstə tənurə,
Səslərdi səni dadə o baş surəbəsurə,
Bircə nəzər et Şahi-şəhidanuva, Mövla.

Nadim qələm əldə eləyər zikri-müsibət,
Çünki başuva əhli-cəfa vırdıla zərbət,
Məhşər güni sən xəlqə edən vəqtə şəfaət,
Lütf eylə bu biçarə nəvaxanuva, Mövla.

**Ya Əmirəlmö`minin (ə)**

Yağdı barantək yerə qəm, ya Əmirəl-mö`minin,
Eyşü işrət oldı bərhəm, ya Əmirəl-mö`minin.
Qum,* ya Əmirəl-mö`minin. (ə)

Düşmənin zülmi sənün qətlində iqdam eylədi,
Şiəni ruzi-cəza zarü pərişan eylədi,
Qətlüvə durdı ibn Mülcəm ki, iqdam eylədi,
Çəkdi şəmşir İbn Mülcəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Saldılar gül cismüvi mehrabdə qan üstünə,
Axdı qanun cari oldı sətri-Qur`an üstünə,
Olmadı dərman qoyan salsunla dərman üstünə,
Qoymadı cərrah mərhəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Cəbrili-Həqq eyləyüb ərzi-səmadə şurişin,
Söylədi əfğan ilə "qutiləl-Əmirəlmö`minin",
Cənnəti-Ədnadə qarə geydi hamı hurieyn,
Tazədən bağlandı matəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Gər sənə bir yarə dəgdi, yarələndi, sındı baş,
Pak edüblər qanuvı zərrində rəxti-fəraş,
Etməgə təşyi`-cənazə çoxları eylər təlaş,
Haluva ağlardı aləm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

---

* Qalx

Bir tərəfdə Zeynəbü Külsüm açubdur başını,
Şur ilə oğlanlarun tökdi yüzə göz yaşını,
Ah, o vəqt ki, Zeynəbün tapdı Hüseyn qardaşını,
Oldı rə`na qaməti xəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Gördi düşmüş topraq üstə peykəri-sədparəsi,
Birbəbir həddən şümarə gəlməz əsla yarəsi,
Qardaşınun nə`şini görcək kəsildi çarəsi,
Zülfini yoldı dəmadəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Gördi gül cismi Hüseynün qan ilə əlvan düşüb,
Rəxti-xabi xaki-meydan, peykəri üryan düşüb,
Dövrinə yetmiş birədək qanına qəltan düşüb,
Qalmayub qəmxarü məhrəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Görmədün oğlun Hüseynün zülm ilə doğranmağın,
Xeyməgahi odlanub nari-cəfayə yanmağın,
Zeynəbi-bixanimanın qolları bağlanmağın,
Bu əzadə ağlar aləm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Gah Hüseynə deyrlər məskən olur, gahi tənur,
Peykəri Kərbübəla səhrasını eylüb zinur,
Nizələr üstə tilavət eyləyər ayati-“Nur”,
Bir belə rə`si-müəzzəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

Can verəndə gərçi imdad eyləyüb yad eyləsən,
Bu dili-məhzunü zari lütf ilə şad eyləsən,
Bir də, Mövla, hiyni-vəhşətdə sən imdad eyləsən,
Nadim icz eylər dəmadəm, ya Əmirəl-mö`minin.
Qum, ya Əmirəl-mö`minin.

**Ya Fatimə (s.ə)**

Ağlarux əhvaluva sübhü məsa, ya Fatimə,
Ağlayar yeksər sənə Ali-Əba, ya Fatimə.

Çün atan rehlət edəndən sora çox ömr etmədün,
Həsəneyni şad edüb, kami-mərамə yetmədün,
Rehlət edüb əhli-kinün zülmünə tab etmədün,
Heç səni şad etmədi ömri-fəna, ya Fatimə.

Sən əcəb səbr elədün dərgahuvi yandırdılar,
Üstüxanun zülm ilə əhli-cəfa sındırdılar,
Möhsinin səqt eyləyüb zülm atəşün yandırdılar,
Çox cəfa eylüb sənə əhli-cəfa, ya Fatimə.

Oldun asudə səni ol gün ki, dərk etdi əcəl,
Qəbrdə asudə yatma, Kərbəlayə dadə gəl,
Başını bikəs Hüseynün gəzdirəllə əlbəəl,
Neyləsün bəs Zeynəbi-biəqrəba, ya Fatimə.

Göz önündə hər iki oğlanlarun öldürdülər,
Gülşəni-Ali-Əbanı zülm ilə soldurdular,
Əkbərün şəhla gözün al qan ilə doldurdular,
Oldı Leylanun qədi qəmdən düta, ya Fatimə.

Ol çəməndə cövr ilə həsrət qalub bülbül gülə,
Qəm necə munis olar fəsli-xəzanə bülbülə,
Çün hənatək qanını Qasim xizab eylüb ələ,
Vay oğul, söylər qəmində Müctəba, ya Fatimə.

Yıxdılar oğlun Hüseyni təşnə meydan üstünə,
İstədi dursun, yıxıldı qəşş edüb qan üstünə,
Yüz qoyub səflər təmam bir qanə qəltan üstünə,
Sinəsi üstə çıxub Şimri-dəğa, ya Fatimə.

Dad o vəqtdən yüz qoyublar xeyməgahə əşqiya,
Şimr Hüseynün başını təndən edən vəqtə cüda,
Əlləri başında Zeynəb sölədi, "va möhnəta",
Dadə yet, Zeynəb qalub bikəs, ana, ya Fatimə.

Xeymələr yandı təmam , qarət olub getdi əsas,
Kərbəladə, gəl, özün, barı, Hüseynə saxla yas,
Ruzi-məhşər Nadimin olma riza, etsün həras,
Ağlayar əhvaluva sübhü məsa, ya Fatimə.

**İmam Museyi-Kazımın (ə) şəhadətinə**

Mövsümi-qəmdür bu gün ağlar Peyəmbər, şiələr,
Can verüb Bəğdadidə Museyi-Cə`fər, şiələr.

Düşdi bu fikrə ki, Haruni-Rəşidi-bihəya,
Cəddinün qəbrində ol zülm ilə çün etsün cida,
Bəsrədə məhbus edüb bir il İmamı bərməla,
Şəhri-Bəğdadə gətürdi onı kafər, şiələr.

Eylədi Fəzli-Rəbi`nün xanəsin zindan ona,
Aşiyan oldı qəfəs bülbülsifət hər yan ona,
Ağlayardı şiələr Bəğdadidə pünhan ona,
Çün onun əhvalına ağlar mələklər, şiələr.

Saldılar cəbrən onı bikəs Rizasından cüda,
Düxtəri Mə`sumeyi-biəqrəbasından cüda,
Eylədi Harun onı qövm-aşinasından cüda,
Eyləyeydi iktifa, kaş, ol bədəxtər, şiələr.

Əmr edüb Sind ibn Şahək qətlinə oldı rəvan,
Zəhrli xurma əlində ol ləini-bədnihan,
Hazır oldı qətlinə zərbi-bətiği-cansitan,
Qətlinə iqdam edibdür ol sitəmkər, şiələr.

Naəlac meyl eylədi çün ol İmami-insü cin,
Parə-parə doğradı zəhri-cəfa gül ləblərin,
Söylədi, zalim, yıxıldı xanəsi Peyğəmbərin,
Çün yəqinim oldı imdi qaldı bisər şiələr.

Canını Cananinə təslim edüb şahi-zəmən,
İrsdür Canana can vermək bularda bivətən,
Nə`şi üç gün qaldı evdə, olmadı bir dəfn edən,
Ağlayar bu ləbləri xunbarə yeksər şiələr.

Dörd nəfər həmmal həqiranə ona qüsl edər,
Dəfnü kəfni gər həqiranə olubdur, şiələr,
Yadıma düşdi Hüseyni-bikəsü xunincigər,
Can verən vəqtə Hüseyni-bibəradər, şiələr.

Söyləyərdi, bircə şürbə su ver, ey Şimri-dəğa,
Xövf elə Allahdən, et bir Peyəmbərdən həya,
Su verərlər zibh olan qurbanə, əmr eylüb Xuda,
Vermədi bir şürbə su Şimri-bədəxtər, şiələr.

Ol Hüseyni ki, verüb qundağı zinət göglərə,
Naz edərdi tifl ikən Zəhra ilən Peyğəmbərə,
Busəgahi-Əhmədi-siddiq olan gül həncərə,
Şimri-laməzhəb qoyub axırda xəncər, şiələr.

Nadiməm, qurban sənə olsun bu canım, ya Hüseyn,
Ruzü şəb hər vəqtdə virdi-zəbanım, ya Hüseyn,
Can verəndə bir sənə vardur gümanım, ya Hüseyn,
Göz tiküblər bu Hüseynə əhli-məhşər, şiələr.

**İmam Riza (ə)**

Qürbət eldə boyanan ləbləri al qanə, Riza,
Can verən mülki-Xorasanda zəlilanə, Riza.

Kim sənə oldı müin qürbətara Şahi-zəmən?
Kim sənə qüsl eləyüb, bəs sənə kim biçdi kəfən?
Həqqə təslim elədün canuvı avarəvətən,
Bu müsibətdə dönüb göz yaşım ümmanə, Riza.

Nə edim, yoxdur əlacım sənə imdadə gəlim,
Göz yaşundan gətirim tuşə sənə dadə gəlim,
Ağlayım, növhə edim, naləvü fəryadə gəlim,
Gözi yaşlı gəlürəm mülki-Xorasanə, Riza.

Ləblərün zəhr ilə gül qönçəsitək yarələnüb,
Ləxtə-ləxtə cigərün qanə dönüb, parələnüb,
Bacuvın başına zülm ilə, əxa, kül ələnüb,
Qoy, gəlim şamü səhər naleyi-əfğanə, Riza.

*Əfrad*

Səni öləndə, əxa, bir doyunca ağlamadım,
Başun diz üstə alub, gözlərüvi bağlamadım.

Nə növ`i hicrüvə səbr eləyüm, bəradərcan,
Zəhrli ləblərüvə binəva bacun qurban.

*Təmamiyi-növhə*

Əvvəl ol haluva qurban bu güni qarə bacun,
Qaldı səndən sora, qardaş, əcəb avarə bacun,
Göz yaşun cari edər səfheyi-rüxsarə bacun,
Çünki həsrət qalub ol Şahi-qəribanə, Riza.

Kim ölən vəqtə gəlüb bağladı, qardaş, gözüvi?
Kim, bəradər, çevirüb qibləyə sarı yüzüvi,
Olmadı bircə nəfər, barı, deyəydün sözüvi,
Can verən guşələr içrə rəhi-cananə, Riza.

Doğranub zəhri-cəfa ilə, bəradər, cigərün,
Tökülüb zülm ilə rüxsaruva əşki-bəsərün,
Həşrətək saxlar əza, növhə edər şiələrün,
Ağlıyarlar sənə, həm Şahi-şəhidanə, Riza.

Növhə eylər sənə Nadim, dutar hər vəqtə əza,
Dadrəs ol bu nəvaxanə özün ruzi-cəza,
Dildə növhə, gözi yaşlı, geyinüb rəxti-qəra,
İstə gözyaşlı olam qəbrüvə pərvanə, Riza.

**Ya Riza (ə)**

Vey qəribü bikəsi-xaki-Xorasan, ya Riza,
Künci-qürbətdə verən Cananinə can, ya Riza.

Gördi Mə`muni-ləinü bihəya tənha səni,
Zəhrlə məsmum edüb ol kafəri-ədna səni,
Şiəyani-Mürtəzayə çox görüb guya səni,
Şiələr ol canuva olsunla qurban, ya Riza.

Çün sənə hər növ` ilən azar edüblər zülm ilə,
Cismüvə ruzi-müniri tar edüblər zülm ilə,
Ləblərüvi qan ilə gülnar edüblər zülm ilə,
Qəyy edərdün ləxtə-ləxtə zəhrli qan, ya Riza.

Can verən vəqtə sənə qürbətdə kimlər ağladı,
Kim edüb Qur`an tilavət, gözlərüvi bağladı,
Kim yanub əhvaluva, kimlər əzavı saxladı,
Bəs cənazən üstə kimlər eylüb əfğan, ya Riza.

Kim iyadət eylədi, yar oldı bəs kimlər sənə?
Xanələr küncində kim verdi təsəllilər sənə,
Ya qurı topraqlar oldı balıcü bəstər sənə,
Gül dodağun oldı öz qanilə əlvan, ya Riza.

Kim su hazır eyləyüb, kimlər sənə biçdi kəfən,
Kim verüb qüslün, hənutun kim edüb, şahi-zəmən,
Qürbət eldə canuvı bəzl eylədün Canana sən,
Tazədən dari-Peyəmbər oldı viran, ya Riza.

Kim, bəradər, qoydı gözyaşlı bacun Mə`suməni,
Saldı bu səhralərə misli-cünun Mə`suməni,
Qərq edər qürbətdə axır əşki-xun Mə`suməni,
Öldürər axır məni bu dərdi-hicran, ya Riza.

Qəlbimə vırdı sitəmlə bu fələk möhnət daşın,
Gözlərim cari edər rüxsarə qanlı göz yaşın,
Çox çətindür mehriban bacı itirsün qardaşın,
Ol ləbi-xunbaruva Mə`sumə qurban, ya Riza.

Şaki ollam cəddüvə mən zari zəvvar etməsən,
Firqəti, Mövla, özün lütf ilə didar etməsən,
Nadimi babi-rəvaqında nəvakar etməsən,
Ey qəribü bikəsi-xaki-Xorasan, ya Riza.

**Ya Sahibi-zəmanə (ə.f.)**

Heyrətdə qaldı aləm, ya Sahibi-zəmanə,
Artar mühən dəmadəm, ya Sahibi-zəmanə. (ə.f.)

Fəsli-xəzan yetişdi, gül qaldı xar əlində,
Səyyadi-xunfikarun oldux şikar əlində,
Biz bipənahə rəhm et, gəl, Zülfiqar əlində,
Din əmri oldı bərhəm, ya Sahibi-zəmanə.

Bir özgə aləm oldı, qəm yağdı qəmlər üstə,
Axır çıxarla kəlbü xinzir minbər üstə,
Çoxlar hücum edərlər dini-Peyəmbər üstə,
Əsrari-Həqqə məhrəm, ya Sahibi-zəmanə.

Ömr eylərik nəzərdə asudə, misli-məhbus,
Əl vəsli-yarə yetməz, olsun həzar əfsus,
Biz bipənahə rəhm et, vəslündən etmə mə`yus,
Eylər dad hamı aləm, ya Sahibi-zəmanə.

Zülmün ziyadə eylər əhli-cəfa dəmadəm,
Olmuş ziyadə möhnət, ağlarlar əhli-aləm,
Eylər bizə şəmatət ə`da hər il mühərrəm,
Yet dadə bu mühərrəm, ya Sahibi-zəmanə.

Bir yanda əhli-aləm dutmuş Hüseyn əzası,
Yas üstə əhli-kinə tökdi dübarə yası,
İslamə hər gün artar ə`dalərün cəfası,
Miri-Səfavü Zəmzəm, ya Sahibi-zəmanə.

İslamın aldı ə`da əldən hər ixtiyarın,
Nəmrudi-sani oldı əhli bu ruzigarın,
Bombardman eləllər Peyğəmbərin məzarın,
Qan ağlarux dəmadəm, ya Sahibi-zəmanə.

İslamı etdi ə`da İslam dininə yağı,
Düşmən əlində qaldı Peyğəmbərün rəvağı,
Qarurə oldı axır İslamın ittifaqı,
Həm Məkkeyi-müəzzəm, ya Sahibi-zəmanə.

Səndən əlavə yoxdur bir kəs hərayə gəlsün,
Yasə batublar ümmət, bəzmi-əzayə gəlsün,
Zəhra əlində mə`cər, matəmsərayə gəlsün,
Ümmət dutubla matəm, ya Sahibi-zəmanə.

Şad olmarux cəhanda, qərq olmuşux əzayə,
Gəh ağlarux Hüseynə, Zəhrayə, Mürtəzayə,
Axır bu nə sitəmdür eylə llə Müstəfayə,
Əsbabı et fərahəm, ya Sahibi-zəmanə.

Nadim o gül cəmalun etsün ziyarət istər,
Dari-fənadə içsün cami-şəhadət istər,
Ruzi-cəzadə səndən şiən şəfaət istər,
Heyrətdə qaldı aləm, ya Sahibi-zəmanə.

**Ya sahibi-zəmanə (ə.f.)**

Babi-nicatü rəhmət, ya Sahibi-zəmanə,
Xar oldı ali ümmət, ya Sahibi-zəmanə. (ə.f.)

Yox sadiqü sədaqət, əhli-vəfa tapılmaz,
Ə`da şəqidi yeksər, şərmü həya tapılmaz,
İtmiş rəhi-hidayət, bir rəhnüma tapılmaz,
Ey rəhnümayi-qüdrət, ya Sahibi-zəmanə.

Asari-dini-İslam dünyadə qalmayubdur,
Bir qəmküsar yetüşsün imdadə, qalmayubdur,
Yox səndən özgə yetsün fəryadə, qalmayubdur,
Dutmuş cəhanı zülmət, ya Sahibi-zəmanə.

Bənzər o ruzə ruzim Zəhra qapusı yandı,
Səqt oldı nuri-eyni, çün üstüxanı sındı,
Getdi Fədək əlindən, qəlbi qəmə boyandı,
Gözyaşlı etdi rehlət, ya Sahibi-zəmanə.

Ya kim, o gündi rə`si-Heydər boyandı qanə,
Dinün köki od aldı, şö`lə düşüb cəhanə,
Nari-cəfa o gündən qalmışdı yanə-yanə,
Əl`an edüb siraət, ya Sahibi-zəmanə.

Ol gündən əhli-kinə kəsb etdilər cəfanı,
Məsmum edüblə axır zəhr ilə Müctəbanı,
Tabutinə ədulər tuş etdilər kəmanı,
Oldı ziyadə möhnət, ya Sahibi-zəmanə.

İndi xəyalə bir də sal bivətən Hüseyni,
Qandan xizab olunmuş gülpirəhən Hüseyni,
Günlər önündə bisər gülgunkəfən Hüseyni,
Bihəddidür müsibət, ya Sahibi-zəmanə.

Şimrün cəfası ilə öz qanına boyandı,
Odlandı xeyməgahı nari-cəfayə yandı,
Xürdü kibar əyalı oldı əsir, talandı,
Çox çəkdilər riyazət, ya Sahibi-zəmanə.

Oldı əsiri-düşmən, yollandı Şamə dəstə,
Qolda tənabi-zillət, məcmui dəsti bəstə,
Əfğan edərdi Zeynəb suz ilə dilşikəstə,
Çox etdilər şəmatət, ya Sahibi-zəmanə.

Nadim doyubdı canə cövri-zəman əlindən,
Səd ah, ah, İlahi, əhli-cəhan əlindən,
Asudə olmaram heç dərdi-nihan əlindən,
Qalmubdı darə taqət, ya Sahibi-zəmanə.

## TÖVBƏNAMƏ

Ey Xuda, məni əfv eylə özün Şahi-Kərbəla macərasinə,
Tirə bəxtimi et səfidru, əfv eylə Hüseynün əzasinə.

Ömrüm təmam etdim, ey Xuda, heyf, həqqüvə arif olmadım,
Yox ləyaqətim ərzi-hal edəm, fani dəhrdə heç oyanmadım,
Çatmadım itaət məqamına, babi-rəhmətə arxalanmadım,
Can verən zəman kim bu bikəsün rəhm edər, Xuda, ahü vasinə?

Ömrümi cəhalətdə sərf edüb, tapmadım fəqət bir həqiqəti,
Həmdü səna eylərəm, imdi tapmışam babi-rəhməti,
Feyzyab edüb ruhimi əcəb Şahi-Kərbəlanun ziyarəti,
Sən də, ey Xuda, əfv elə məni ol kəlami-Həqq "Həlǝta"sinə.

Xalidür əlim, əldə tuşə yox, dərgəhündə şərməndəyəm özüm,
Asiyəm, Xuda, yox səadətim, ruzi-həşrətək qarədür yüzüm,
Ey Xuda, yetir sən icabətə xövfdən müdam ağlayur gözüm,
Ey Xuda, məni əfv elə özün, ənbiyalərün xətmi "Yasin"ə.

Mən səni qəsəm verrəm, ey Xuda, təşnələb Hüseynün dodağinə,
Həncərün edə xəncərə sipər düşdi Şimr onun iştiyaqinə,
Axır halinə düşmən ağladı, Əsğəri alan vəqt qucağinə,
Ya Rəbb, əfv elə həqiri Sən, Şahi-Yəsribün Kərbəlasinə.

Əsğərün alan vəqtdə ələ, eylədi ədu qan ilə xizab,
Oxladı əli üstə Hərmələ, etmədi Peyğəmbərdən heç hicab,
Etdi ol Şəhi-bikəsə o gün, Kərbəladə çox zülmi-bihesab,
Ağlaram mən şirəxarənün nazik hülqinün ox yərasinə.

Naümid olub Şahi-Kərbəla, hülqi yarəli məhcəmal ilən,
Gəldi xeyməyə Əsğəri qucağında, söylədi yüz məlal ilən,
Çıxdı xeymədən dışrə Zeynəbi-binəva o dəm suzü hal ilən,
Qundağı dolub qan ilən, bacı, ver xəbər oğulsuz anasinə.

Əhli-Beyt olub cümlə baxəbər xeymədən hamı çıxdı sinəçak,
Əsğəri görən vəqtdə, az qalub qüssə Zeynəbi eyləsün həlak,
Söylədi, oyan, şirəxarəsən, ey Əli, bala, gözlərüvi aç,
Rəhm elə, bibün Zeynəbün, oğul, ərşə övc edən ahü vasinə.

Əfv elə o şiri-şəhadətə bu həqirü biçarə Nadimi,
Ruzi-həşrdə, qoyma bir dəlil, eyləmə özün xar Nadimi,
Lütf ilə Peyəmbər məzarinə, ya Rəbb, eylə zəvvar Nadimi,
Axır əmrdə etmə naümid, Nadimi yetir müddəasinə.

**Əfv elə**

Barilahi, asiyəm, çoxdur günahım, əfv elə!
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

Çox xəciləm etdigim cəhlü cəhalətdən, Xuda,
Rusiyahəm, əldə yox tuşə, ibadətdən cüda,
Çox hərasım var mənim ruzi-qiyamətdən, Xuda,
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

Qadirü Qəhharsən, duzəx sənün, cənnət sənün,
Xaliqü Xəllaqsən, karxaneyi-xilqət sənün,
Rusiyahux, Bar İlahi, əbdi-bihimmət sənün,
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

And verrəm Adəmü Həvvayə, əfv eylə məni,
Müstəfa dürdanəsi Zəhrayə, əfv eylə məni,
Pak əşrəf Məscidül-Əqsayə, əfv eylə məni,
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

Üzrümi eylə qəbul, İdrisü Yəhya həqqinə,
Şə`nüvi izhar edən Musavü İsa həqqinə,
Turdə zahir olan nuri-təcəlla həqqinə,
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

Şahid ol iqrarimə, mən ol Xəlilə millətəm,
Ənbiya xətmi Rəsuli-rəhnümayə ümmətəm,
Şiəyəm, çünki Əmirəlmö`told minə rəyyətəm,*
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

Cə`fərimıəzhəb, Xuda, Qur`an kitabimdür mənim,
Yox səadət min günah yazsa, əzabimdür mənim,
Xövfdən hər ruzü şəb, göz yaşım abimdür mənim,
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

Nameyi-ə`malimə baxsan, yazılmış min günah,
Rəhmətindən naümid olmaz bu əbdi-bipənah,
Mərhəmətlə eyləsən, ya Rəb, bu naçarə nigah,
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

---

* Rəiyyətəm

Düşmədən mən bu bəlalı ruzigarə, Nadiməm,
Olmuşam bülbül kimi seyd imdi xarə, Nadiməm,
Yox əlimdə bu qəmi-üzmayə çarə, Nadiməm,
Səndən özgə dadxah, yoxdur pənahım, əfv elə!

**Əfv eylə bizi ayeyi-Qur`anə, İlahi!**

Əfv eylə bizi ayeyi-Qur`anə, İlahi!
Qanə boyanan Şahi-şəhidanə, İlahi!

Göz yaşımız axır görüsən qanə dönübdür,
Ənduh ilə əşki-bəsər ümmanə dönübdür,
Hər şamü səhər karımız əfğanə dönübdür,
İmdad et özün bu dili-viranə, İlahi!

Mülki-vətən olmuş bizə ənduh ilə qürbət,
Xəm eylədi xeyli qədi-rə`nanı əziyyət,
Din əhlinə bidinlər edə tə`nü şəmatət,
Təngə gətirübdür bizi biganə, İlahi!

Göndərdün əgər Müshəfi sən Qadiri-qüdrət,
Xəlqə yetirüb çəkdi Rəsulun min əziyyət,
İnkar olunur imdi o təbliği-risalət,
Nasir ol özün qaili-Qur`anə, İlahi!

Əşrar salub yer yüzinə şö`leyi-azər,
Məhv olmağa maildi, Xuda, əmri-Peyəmbər,

Bəs harda qalub Şiri-Xuda, fatehi-Xeybər?
Qurban ola şiə Şəhi-mərdanə, İlahi!

Qaldux necə gör, cümlə bu dövran arasında,
İslam ilə bu firqeyi-şeytan arasında,
Qaldux əcəb afaqdə tufan arasında,
Tuf əmri-fənayə, belə dövranə, İlahi!

Yox nasirü ənsar, bizə yar tapılmaz,
Əhli-dilə bir yari-vəfadar tapılmaz,
Biz bikəsə bir munisü qəmxar tapılmaz,
Eşq əhli fəraq ilə doyub canə, İlahi!

Tez sahib elə bizlərə ol Sahibül-əsri,
Kafi elə biz bisərə ol Sahibül-əsri,
Rəhbər elə biz bisərə ol Sahibül-əsri,
Məcmu` doyub şiə hamı canə, İlahi!

Nadim eləyər icz ilə dərgahüvə min ah,
Qeybətdə nə qədr qalacaqdur bə Şəhənşah?
Ya Rəb, sən özünsən hamı əsrardən agah,
İmdad et özün qaili-Qur`anə, İlahi!

**Ya Rəbbim, ətubu ileyh**

Xeyli günəhkar olmuşam,
Ya Rəbbim, ətubu ileyh.
Göz yaşıtək xar olmuşam,
Ya Rəbbim, ətubu ileyh.

Sıxdı məni səngi-bəla,
Oldum bəlayə mübtəla,
Yox dərdi-üsyanə dəva,
Ya Rəbbim, ətubu ileyh.

Dolmuş siyəh xaməm, Xuda,
Hər gözdə bədnaməm, Xuda,
Xeyli peşimanəm, Xuda,
Ya Rəbbim, ətubu ileyh.

Nə munisü yarım qalub,
Əqvamü qəmxarım qalub,
Nə bir həvadarım qalub,
Ya Rəbbim, ətubu ileyh.

Çün asiyəm, gülməz yüzüm,
Cari edər qan-yaş gözüm,
Çarəm kəsildi, yox sözüm,
Ya Rəbbim, ətubu ileyh.

Ruyi siyəh, şərməndəyəm,
Əbdi-zəliləm, bəndəyəm,
Agahsən mən hər nəyəm,
Ya Rəbbim, ətubu ileyh.

Ya sadiqi-kani-kərəm,
Dərgahuva ərz eylərəm,
Oldı səhi qəddim ələm,
Ya Rəbbim, ətubu ileyh.

Göz yaşıtək xarəm müdam,
Dərdə giriftarəm müdam,
Ərzim budur axır kəlam,
Ya Rəbbim, ətubu ileyh.

Əfv et məni Qur`anuva,
Min kəlmeyi-pünhanuva,
Öz rəhmi-bipayanuva,
Ya Rəbbim, ətubu ileyh.

Əfv et bəhəqqi-ənbiya,
Ya Rəbb, bəhəqqi-övliya,
Bəhürməti-Ali-Əba,
Ya Rəbbim, ətubu ileyh.

Ya Rəbb, məni et rəstgar,
Etmə dəxi xarü fikar,
Səndən bəğeyr yoxdı yar,
Ya Rəbbim, ətubu ileyh.

Verrəm qəsəm Peyğəmbərə,
Həm canişini Heydərə,
Zəhrayi-paki-əthərə,
Ya Rəbbim, ətubu ileyh.

Əfv et Hüseynün yasinə,
Qolsuz düşən Əbbasinə,
Həm Zeynəbi-kübrasinə,
Ya Rəbbim, ətubu ileyh.

Əfv eylə Əkbər həqqinə,
Ali-Peyğəmbər həqqinə,
Qundaği-Əsğər həqqinə,
Ya Rəbbim, ətubu ileyh.

Nadimi-nalan olmuşam,
Çün qərqi-üsyan olmuşam,
Zarü hərasan olmuşam,
Ya Rəbbim, ətubu ileyh.

**Əfv eylə, ya Rəbb!**

Qərqi-günahəm, əfv eylə, ya Rəbb,
Ət-tövbə, tövbə əstəğfürullah.
Həqqi-məlayikani-müqərrəb,
Ət-tövbə, tövbə əstəğfürullah.

Əfv et məni sən ismi-Rəhimə,
Öz nami-pakun, kani-Kərimə,
Ol ismi-ə`zəm, lövhi-əzimə,
Ət-tövbə, tövbə əstəğfürullah.

Ya Rəbb bəhəqi Həvvavü Adəm,
Xövfü hərasım vardur hər dəm,
Çıxmaz yadımdan hövli-cəhənnəm,
Ət-tövbə, tövbə əstəğfürullah.

Ya Rəbb, bəhəqqi-Habilü İdris,
Hud ilə Saleh, bəhəqqi-Cərcis,
Xövfindən oldum dünyadə bihis,
Ət-tövbə, tövbə əstəğfürullah.

Həqqi-Şüeybü Əyyubi-müztər,
Yüz igirmi dört min bərhəq Peyəmbər,
Həqqi-Süleyman, Nuhü İskəndər,
Ət-tövbə, tövbə əstəğfürullah.

Həqqi-Xəlili Nəmrud əsiri,
Saravü Hacər, qəm dəstgiri,
Ya Rəb, bəhəqqi-Yə`qubi-piri,
Ət-tövbə, tövbə əstəğfürullah.

Həqqi-Xuda, İsmailü Yusif,
Qərqi-günahəm, səd heyf, səd heyf,
Ya Rəb, bəhəqi-sədayi-hatif,
Ət-tövbə, tövbə əstəğfürullah.

Verrəm qəsəm mən Həyyü Qədimə,
Əfv et məni Musayi-kəlimə,
Yoxdur təvanım qəhri-əzimə,
Ət-tövbə, tövbə əstəğfürullah.

## Çavuşi

O kimsələr ki, olub aşiqi-bəla, gəlsün,
Bizimlə kim olu zəvvari-Kərbəla, gəlsün.

O göz ki, ağlar Əli Əkbərün fəraqinə,
Əyalü itrətini eyləyüb vida, gəlsün.

Hüseynün eşqi edüb əhli-eşqi divanə,
Bəla çölündə olan qabili-bəla, gəlsün.

O kəsləri ki, yolun gözlər həzrəti-Əbbas,
O şahdən olacaq dərdinə dəva, gəlsün.

O kəsləri ki, gəzər Əkbərün sorağində,
O növcəvanə edən nəqdi-can fəda, gəlsün.

Hüseyni-təşnəcigər Əsğəri qucağında,
Gözətləyir rəhi-zəvvari-Kərbəla, gəlsün.

O qəbri-paküvə pərvanə olmağa Nadim,
Yetirmə xarici rah, rahi-Kərbəla gəlsün.

## Mahi-mühərrəm oldı...

Bilməm nə mahi-qəmdi ki, matəm binası var,
Yoxsa ki, bir əzizi-cəhanun əzası var?

Hər kimsəyə nəzər edərəm ağlayur bu gün,
Bu ay təmam dillərün əfğan binası var.

Vardur bəsirətün, bax həvayə, həqiqətən,
Ərşi-Xudadə mahi-müsibət sədası var.

Aləm batub müsibətə matəm qurubdular,
Şahi-Mədinənün səfəri-Kərbəlası var.

Mərdü zənan, şahü gəda qarəpuş olub,
Əllərdə cümlə Ali-Peyəmbər qərası var.

Kərbübəla çölündə bu sultani-Yəsribün,
Ağlar göz olsa ərz edərəm, macərası var.

Hər kimsə bu Hüseynə əzadar ola, yəqin,
Dari-bəqadə rövzeyi-rizvan cəzası var.

Ağla Hüseynə, göz yaşı tök ruzi-həşrətək,
Qəsri-cinan, huriyü qılman bəhası var.

Nadim, həmişə ağla Hüseynün o halinə,
Gəlməz şümarə, cismdə hədsiz yarası var.

**Mahi-mühərrəm oldı...**

Mahi-mühərrəm oldı, müsibət binası var,
Va möhnəta, Hüseyni-qəribün əzası var.

Göz yaşı ilə ol şəhə imdad qılgilən,
Yoxdur pənahı, bircə çü qolsuz əxası var.

Əhli-cəfa ki, doğradılar Əkbərin susuz,
Ağlar həmişə, bir gözi giryan anası var.

Öldürdilər bir həsrətü nakamı kufəyan,
Əlvan edübdi, əllərin al qan hənası var.

Əfğanü nalə eyləməgə növərusinə,
Munis həmişə madəri-biəqrəbası var.

Baxmaqlığa həmişə ərus ilə madəri,
Ondan nişanə, qanə boyanmış libası var.

Toy rəxti qan, təbağıdı qan, rəxtxabı qan,
Hansı şəhün çü bir belə növkədxudası var?

Dəstində Əsğərini susuz oxladı ədu,
Bir şirxarə, ləbləri ətşan balası var.

Ağlar həmişə Əsğəri-ətşanuva, Hüseyn,
Nadim tökər sirişk yüzə, ahü vası var.

**Bu qissədən**

Yandı könül mülki sərasər bu qissədən,
Qəlbim alovlanub genə yeksər bu qissədən.

Mahi-mühərrəm oldı əyan, ağlayar gözüm,
Ləbriz olubdı əşk ilə gözlər bu qissədən.

Vəqti-bükadı, növhə edər külli-kainat,
Əl`an gəlübdi lərzəyə yerlər bu qissədən.

Mahi-əza göründi, gəlür qəm nişanəsi,
Qarə geyüblə cümlə mələklər bu qissədən.

Zülm ilə Kərbəladə ölüb sərvəri-Hicaz,
Ağlar o şahın halinə göglər bu qissədən.

Qarə çəküb məlalikələr ərş tağinə,
Kə`bə batubdı qarəyə yeksər bu qissədən.

Almış əlinə Kərbübəladə əmaməsin,
Saxlar əza o çöldə Peyəmbər bu qissədən.

Geymiş qərasını şəhi-dövran Hüseyninün,
Ağlar o çöldə Şafiyi-məhşər bu qissədən.

Qoymuş əlin belinə deyər: vay, oğul, Hüseyn,
Döndi kəmanə qaməti-Heydər bu qissədən.

Saxlar əza Hüseynüvə, biçarə Nadimün,
Hifz et, əmandı, Saqiyi-Kövsər, bu qissədən.

**Dad o gündən...**

Dad o gündən əmr olar İsrafilə Qəhhardən,
Nəfxi-sur eylər o dəmdə əmr olan vəqt Tardən.

Ruhlər bidar olallar cümlə nəfxi-surdən,
Ərseyi-məhşər olar məmlüvv o gündə şurdən,
Minbəri hazır olar çün məhşər içrə nurdən,
Əmr olar Məhmudi-Həqqə Xaliqi-Səttardən.

Cəbrəil sölər Rəsuli-əkrəmə: “Qum, ya əxa”,*
Dur, qiyam eylüb qiyamət, çün gəlüb qəhrə Xuda,
Cəm` olublar məhşərə gözyaşlı cümlə masiva,
Az qalub ümmət həlak olsun cəfayi-nardən.

Cəm`i-ərvahə yetən vəqtdə sədayi-nəfxi-sur,
Çün kəfən çignində qalxarlar hamı əhli-qübur,
Nari-niyran şö`lələnmiş misli-yüz min-min tənur,
Kamə çəksün, əmr gözlər, ümməti, Cəbbardən.

Ol zəman va əsəfa** söyləllə təmamən ənbiya,
Çün görəllər bəhrtək mövcə gəlüb qəhri-Xuda,
Əl duadə söyləyər Məhmudi-Həqq va ümməta,***
Ey Xuda, narı kənar et, ümməti-naçardən.

Ümməti-asilərimdən et, Xuda, niyrani rəf,
Yalquzam, imdadimə gəlsün gərək Şahi-Nəcəf,
Həzrəti-Zəhra əlində Möhsini qanə hədəf,
Ümmətin asilərin rahət edək azardən.

Ya əxa, ya Cəbrəil, sən Müctəbanı hazır et,
Künci-qürbətdə ölən bikəs Rizanı hazır et,
Cabəca bu saqiyi-Kərbübəlanı hazır et,
Ta qisas alsun, Hüseyn oğlum gərək küffardən.

Məhşərə daxil olan vəqtə büsati-Kərbəla,
Hər şəhidün öz başı dəstində eyləllər səda:

---

* Dur, ey qardaş
** Təəssüflər olsun
*** Vay olsun mənim ümmətimə

Şiəyani-Mürtəzanı əfv elə, Bari Xuda,
Yüz qoyar səf-səf behiştə zayirü zəvvardən.

Qırxatək əlsiz-əyaqsız Əhli-Beyti-dilfikar,
Əsğərün qundağı əldə, Zeynəbi-məhzunü zar,
Ol zəman niyran düşər əl`an min illik yol kənar,
Əmr olar bikəs Hüseynə Xaliqi-qəffardən.

Ya Hüseyn, mizan sənün, duzəx sənün, cənnət sənün,
Hər qədr əfv eyləsən, əfv eylə, bu ümmət sənün,
Huriyü qılman sənün, Kövsər sənün, rəhmət sənün,
İntiqam çək, Şimri-duni-kafərü qəddardən.

Asi olmaq Həqq dərgahində asandur məgər?
Xövfi-məhşərdən olar əhli-bəsirət xuncigər,
Şimri-bidinə Hüseyn nə etmiş axır, şiələr,
Zibh edüb başın, cüda eylüb təni-gülnardən.

Asiyəm, çün etdigim ömri-fənadən Nadiməm,
Çox kənarə düşmişəm əmri-Xudadən, Nadiməm,
Çün cüda oldum bu eyvani-təladən, Nadiməm,
Qəbrdə, ya Rəb, məni hifz eylə murü mardən.

**Ey Xuda**

Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda,
Səndən əlavə qalmayub yarü pənahım, ey Xuda.

Cari edər üzarimə qan-yaşı gözlərim mənim,
Yox gələ bir hərayimə, yarü nə yavərim mənim,

Qaib olub, bilənmirəm, hardadı rəhbərim mənim?
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

Dildə mücəssəm eyləyüb gahi Rəsulə ağlaram,
Gahi əzizi-Müstəfa, sibti-Bətulə ağlaram,
Möhsüni səqt olan, qalan zarü məlalə ağlaram,
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

Yadə düşən zəman pozar məscidi-Kufə halımı,
Arturı* möhnətü sitəm dərdü qəmü məlalımı,
Etdilə qan ilən xizab, ol şəhi-bacəlalımı,
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

Gəh gətürər zəmanədə naləyə ənbiya məni,
Dəhrdə növhəxan edüb möhnəti-övliya məni,
Yadə düşəndə ağladar haləti-Müctəba məni,
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

Kərbübəla müsibəti düşdi xəyalə, ya Hüseyn,
Ağlayaram o Əkbəri-Haşimi xalə, ya Hüseyn,
Eylərəm hər əzadə mən şur ilə nalə, ya Hüseyn,
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

Qəlbimi qan edər mənim, ahü nəvası Zeynəbün,
Kərbübəladə daşdı çün, möhnətü yası Zeynəbün,
Bəxtimi qarə eyləyüb, qanlı qərası Zeynəbün,
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

Ah, o zəman Hüseyn ölüb, zülm ilə yandı xeymələr,
Çöllərə qaçdı itrəti, yandı, talandı xeymələr,

* Artırır

Qaldı yanan çadırda ol Abidi-zarü xuncigər,
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

Nadimi-bikəsəm, məni dövrü zəmanə sinsidir,*
Döndərüb hali-ruzigar qəlbimi qanə, sinsidir,
Çərxi-fələk doyurdı bu ruhumi canə, sinsidir,
Ruzü şəb ərşə övc edər şö`leyi-ahım, ey Xuda.

**Ya Hüseyn (ə)**

Ey olan ismi-şərifi ərşə zinət, ya Hüseyn,
Şafiyi-ruzi-qiyamət, babi-cənnət, ya Hüseyn.

Çün mühərrəm aşikar oldı, gözüm ağlar müdam,
Qarəyə batmış təmam əhli-vilayət, ya Hüseyn.

Xaneyi-Peyğəmbəri bu ayda viran qoydular,
Kərbəladə zülm ilə əhli-şəqavət, ya Hüseyn.

Şimri-bidin yıxdı çün zülm ilə dari-Heydəri,
Hülqüvə çəkdi sitəmlə yeddi zərbət, ya Hüseyn.

Dəstüvi öz saribanun qət` edüb rəhm etmədi,
Olmadı zibh olmağun əzbəs kifayət, ya Hüseyn.

Çün şəhid eylüb səni ə`da cəfadən doymadı,
Əhli-Beyt oldı əsir, bu nə əlamət, ya Hüseyn.

---

* Bur.incidir, sıxır

Nə`şüvi birəhmlər meydanə üryan saldılar,
Xeymәgahə od vırub əhli-şərarət, ya Hüseyn.

Qətlgəhdə Əhli-Beyt əfğan ilən gəldi dilə,
Kərbəladə çün əyan oldı qiyamət, ya Hüseyn.

Kufəvü Şamı gəzən vəqt Zeynəbi-bixaniman,
Eyləyərdi əhli-Kufə eyşü işrət, ya Hüseyn.

Şamdə viranədə bikəs Səkinə sübhü şam,
Ac-susuz viranədə çox çəkdi zillət, ya Hüseyn.

Nadimin Möhsün rəvağında əzadar olmağa,
Qismət eylə, eyləyim bir də ziyarət, ya Hüseyn.

**Bilmirəm nə qədri əcri var...**

Bilmirəm nə qədr əcri var, Xuda, can verüb təmam ənbiya qərib,
Qürbət ölkədə ölməgi qəbul etdilər hamı övsiya qərib.

Kufədə əzəl ibni-Mülcəmi-bihəya töküb qanun Heydərün,
Etməyüb həya ol ləinü dun, nəhyin eylüb əmri-Peyğəmbərün,
Vırdı bir qılıc yərası, alub ixtiyarını fatihi-Xeybərün,
Səcdəgahdə qanə qərq olub, can verən zəman Mürtəza qərib.

Müaviyə ləin cilvələndirüb dari-dəhrdə zülm əsasını,
Saldı birbəbir möhnətü qəmə cövrü zülm ilə Ali-Yasini,

Zəhr içizdürüb Müctəbayə dünyadə qoydı zülmün binasını,
Cövri-zəhrlə çün Mədinədə can verüb Həsəni-Müctəba
qərib.

Bu fələk əcəb dari-dəhrdə eylədi qərib ənbiyaləri,
Qürbət ölkədə möhnətə düçar eylədi təmami-övsiyaləri,
Nari-firqətə, dərdü möhnətə saldı birbəbir övliyaləri,
Kufədə Hüseyn naibi, əzəl öldi Müslimi-binəva qərib.

Sonra Harisi-bihəya edüb zülmini əyan Kufədə, Xuda,
Müslimün sərün əhli-kufəyan eyləyəndən sonra cüda,
Hər iki yetimün xizab edüb qan ilə zülfün, etmədi həya,
Ali-Müstəfa, Ali-Mürtəza birbəbir edüb can fəda qərib.

Zülmün atəşün şö`ləvər edüb, əhli-Kufənün tuf həyasinə,
Bağlı qoydular babi-Heydəri, rəxnə saldılar din əsasinə,
Ah, o vəqtdən sərvəri-cəhan yetdi türbətin Kərbəlasinə,
Təşnələb, qurı yerlər üstə can verdi çün şəhi-Kərbəla qərib.

Kərbəladə ol şahi-Yəsribün öldi, Fəzl ilə Övnü Cə`fəri,
Qasimi yaxub qandən həna, təşnələb ölüb nazlı Əkbəri,
Hərmələ ləin dəsti-şahi-din üstə oxladı hülqi-Əsğəri,
Şövqü zövq ilən qollarun fəda etdi Əbbasi-bavəfa qərib.

Çoxlarun fələk eylədi qərib, qoymadı Hüseyn kimin
bipənah, Yarü yavərün əldən aldılar, qoydular vəhid
düşmən, ah, ah,
Zibh edüb başun Şimri-bihəya, nari-zülmə odlandı
xeyməgah,
Dəstgir olub əhli-kinəyə yeksər itrəti-Müstəfa qərib.

Qürbət ölkədə imtəhan edüb övliyaləri birbəbir Xuda,
Rahi-eşqdə Həqq rizasıçün çəkdilər təmam cürbəcür bəla,

Möhnəti edüb can ilə qəbul, əmri-Xaliqə oldular riza,
Tusdə verüb zillət ilə can, zəhrlə İmami-Riza qərib.

Ağlaram sənə ruzü şəb müdam, göz yaşım dönüb qanə, ya
Hüseyn,
Lütfüvi əgər şamil eyləsən, et nəzər bu nalanə, ya Hüseyn,
Ağlaram qələm əldə Əkbərə, çünki gəlləm əfğanə, ya
Hüseyn,
Yet hərayimə, qürbət ölkədə etsə Nadimin can fəda qərib.

## Mədinədən xaric olma*

Mülki-Əraq məxrəc edir Şahi-cəhan Mədinədən,
Çıxmağa hazır oldular pirü cəvan Mədinədən.

Əmr eyləyüb o vəqtdə cümlə səhabələr gəlüb,
Məhməli-zərnigarlər, zərri kəcavələr gəlüb,
Dideyi-əşkbar ilən Haşimizadələr gəlüb,
Çıxdı səmayə ol zəman, ahü fəğan Mədinədən.

Əkbərə əmr edüb, xəbər vergilən Ali-Haşimə,
Vəqti-zəval yetdi bu cahü cəlali-Haşimə,
Eylə xəbər bu mətləbi, cümleyi-Ali-Haşimə,
Ali-Peyəmbər ayrılur naləkünan Mədinədən.

* "Xarici-Mədinə"

Babi-risalətə baxub, xəlq çox ahü zar ilən,
Gördilə çıxdı bir cəvan, dideyi-əşkbar ilən,
Yəsribün əhli görcək ol mahvəşi o hal ilən,
Hamı xəyal edərdi mah, oldı əyan Mədinədən.

Gördülə kim gəlür Hüseyn, çeşmlərində əşki-qəm,
Daxil edir kəcavəyə düxtərü xahərü hərəm,
Bu səfərün qəmində çox ağladı şahi-möhtəşəm,
İzzətü ehtiram ilən oldı rəvan Mədinədən.

Əmr olunub hərəmsəra babı açıldı ol zəman,
Zeynəbi-məhliqa ilən çıxdı kənizlər təmam,
Sağü solunda Əkbərü Qasimi eyləyür xüram,
Oldı müsafiri-səfər Şahi-zəman Mədinədən.

*Əfrad*

Müsafir oldı o gündə qəribi-Kərbübəla,
Olub kəcavələrün satiri zərü ziba.

Səfər tədarükinə düşdi Ali-Peyğəmbər,
Kəcavələr düzülüb, hazır oldı məhmələr.

Bu növ` daxil olurdı kəcavəyə hərəmeyn,
Nə gördilər ki, gəlür bir məriz şurü şeyn.

Vətəndə, gəl eləmə, ey baba, qərib məni,
Bu feyzdən, babacan, etmə binəsib məni.

Apar Səkinəyə mən, ey baba, kəniz olaram,
Ata, yanunda ölən vəqtə əziz olaram.

*Əlbaqiyi-növhə*

Fatimə ağlayar deyər, Əkbəri-növcəvan gedər,
Yəsribara bu xəstəni eylədi bağrıqan, gedər,
Zeynəbi-məhliqa ilən xahəri-natəvan gedər,
Fatiməni qoyub gedər naləkünan, Mədinədən.

Saldı xəyalə Şahi-din Kərbübəla əzabını,
Zülmü cəfayi-kufəyan artırub iztirabını,
Hörmətü ehtiram ilən Zeynəbi-dilkəbabını,
Məhməli-zərnigar ilən qıldı rəvan Mədinədən.

Qafileyi-İmaməti səmti-Əraqə çəkdilər,
Aşiqi-eşq olanlarun qəlbinə yarə çəkdilər,
Aşiqi vəsli-yardən hicrü fəraqə çəkdilər,
Çıxdı çox ahü zar ilən Şahi-cəhan Mədinədən.

Nadim edər fəğanü ah, Şahi-cəhanə ağlayur,
Zeynəbün ahü va səsi, külli-cəhani dağlayur,
Ağla bu qəmdə, ey könül, cümlə mələklər ağlayur,
Ərşə çıxatdı* naləni mərdü zənan Mədinədən.

**İmam Hüseyn (ə)-ın dilindən**

Əhli-Beytə Zeynəbim giryan olan yerdür bu yer,
Mədfəni-paki-Şəhi-ətşan olan yerdür bu yer.

* Çıxartdı

Kəsməyün qurbanları, yetməz belə qurban mənə,
Yaxşı qurban bəzl edibdür Xaliqi-sübhan mənə,
Çün Həbib ibni-Məzahir töhfə eylər can mənə,
Hürr payimdə əzəl qurban olan yerdür bu yer.

Bəzli-canan etmişəm cananıma bu canları,
Verməyüb su zibh edəllər, su olar öz qanları,
Bu yerün, agah olun, var cürbəcür qurbanları,
Təşnə səqqa qanına al qan olan yerdür bu yer.

Bu Minanun mislüni eylün** bəyan, olsun bu şah,
Dəfn olar əshabım, ənsarım bizə olsun mübah,
Dəstim üstə Əsğərimi oxladılar bigünah,
Südəmər tiflün südi al qan olan yerdür bu yer.

Əhli-Kufə birbəbir zibh eyləyər ətşan bizi,
Əkbərün al qan ilə ləbriz olar şəhla gözi,
Namurad oğlı ölən Leylanun heç gülməz yüzi,
Əhli-Beytün göz yaşı ümman olan yerdür bu yer.

Həsrətü giryan şəhid eyləllə ətşan Qasimi,
Mürği-bipərtək, ədu qolsuz salar Əbbasimi,
Zeynəbim Şimrü Sinan qoymazla dutsun yasimi,
Övnü Fəzlim azimi-rizvan olan yerdür bu yer.

Busəgahi-Müstəfayə Şimri-dun xəncər qoyar,
Əşqiyalər düxtərani-Heydərün rəxtün soyar,

---

** Eyləyin

Əsr vəqti xeymələr yeksər olanda pürşərar,
Abidi-bimarım od içrə qalan yerdür bu yer.

Oxşadılar xırda qızlar göz yaşun dəryalərə,
At döşündə yüz qoyalla ahutək səhralərə,
Bir nəfər rəhm eyləməz, ətfali-Ali-Heydərə,
Bu cəlalü izzətim talan olan yerdür bu yer.

Əhli-kin ətfalımun dəstin tənabə bağlıyar,
Rum əsiritək ədulər cümləsin naqəsəvar,
Nə`şün üstə göz yaşun Zeynəb tökər biixtiyar,
Zeynəbi-biçarə sərgərdan olan yerdür bu yer.

Bu zəmini-Neynəvadə zibh olar qurbanlarım,
Göz önündə can verər cananıma oğlanlarım,
Növhə eylənlər bu çöldə zikr ilə nalanlarım,
Nadimün qəlbi qəmə suzan olan yerdür bu yer.

**Bu gecə**

Bu gecə Kərbübəladə necə tufan olacaq,
Zeynəbün zülmü sitəmdən cigəri qan olacaq.

Bu gecə nalə çəküb Kərbübəla təşnələri,
Bu gecə Şahi-qərib ölməgə bağlar kəməri,
Bu gecə Ali-Rəsulə yetər əfğan xəbəri,
Ki, səbah Ali-Əli qanına qəltan olacaq.

Çəkəcək Şimri-dəğa zülmü sitəm xəncərini,
Kəsəcək cövrü cəfa ilə Hüseyn həncərini,

Qoyacaq Xuli kül üstündə Hüseynin sərini,
Ki, səbah ərzü səma zülm ilə viran olacaq.

Bu gecə əhli-hərəm "va əbəta"[*] söyləyəcək,
Biləsən, çərxi-fələk zülmü sitəm eyləyəcək,

Əkbərü Əsğərini təşnə şəhid eyləyəcək,
Ümmi Leyla görübən zülmi, hərasan olacaq.

Etməyüb gərçi fələk Qasimi-damadə vəfa,
Almayub kam cəhanda o qədər zövqü səfa,
Növərusun başına qəmçi vırar əhli-cəfa,
Toy hənası əlinə Qasimün al qan olacaq.

Bu gecə zülmü sitəmdən geyəcək qarə fələk,
Eylədün bəxti qəra Zeynəbi biçarə, fələk,
Bu gecə nalə yetər Heydəri-Kərrarə, fələk,
Ümməti-Xatəminin didəsi giryan olacaq.

Bu gecə ərşi-Xuda qareyi-matəm[**] geyəcək,
Bu gecə pirü cəvan cümləsi nöhə deyəcək,
Məzlumanü şəhi-biyavərə matəm edəcək,
Şühədalər bədəni xak ilə yeksan olacaq.

Geyəcək qarə bu matəmdə genə pirü cəvan,
Fələkin zülmi bu gün dostlarına oldı əyan,
Qasimə toy dutuban əllərinə yaxdıla qan,
Növərusi bu gecə çaki-giriban olacaq.

---

[*] Vay atamız
[**] Matəm qarası. (Yanlış ifadədir)

Bu nə matəmdi genə qarə geyüb əhli-hərəm,
Zeynəbün zinətini qarə edüb möhnətü qəm,
Kəsdilər abi-Fəratın yolunı qövmi-sitəm,
Əsğərün təşnəcigər ləbləri al qan olacaq.

Nadimi xuni-sitəm içdi neçə kasə bu gün,
Geyinüb rəxti-qəra, çün batacaq yasə bu gün,
Ey gözüm, ağlagilən həzrəti-Əbbasə bu gün,
Gedəcək su gətirə, qanına qəltan olacaq.

**Şami-qəriban**

Ya Hüseyn, Şami-qəribandı, sənə ağlayar Məryəmü Sara bu gecə,
Neçə min yarə yetüb bir bədənə, baş açub həzrəti-Zəhra bu gecə.

Bu gecə Qasimi-gülpirəhənə, ağlayar cümlə zükur ilə ünas,
Bu gecə Əkbəri-şirinsüxənə, saxlayub şahü gəda cümləsi yas,
Bu gecə tə`ziyə saxlalla sənə, geyünüb xəlq hamı qarə libas,
Yaralı cismüvi ağuşə alub, ağlayar Hacərü Həvva bu gecə.

Bu gecə Zeynəbi-xununcigərün cəm` edüb başinə əhli-hərəmi,
Atəşi-zülmə yanub xeymələrün, çoxalıb Zeynəbün ənduhü qəmi,
Bu gecə itrəti-xundidələrün gördülər möhnətü zülmü sitəmi,
Oyanan xeymədə ta sübhə kimin ağlayar Əkbərə Leyla bu gecə.

Xaki-xun üstə qalub gül bədənün, cəm` olub dövrəvə qılman ilə hur,
Təni-sədparəvi yox dəfn edənün, ağlayalla sənə çün vəhşü tüyur,
Yandırar şiələri bu mühənün, bu gecə səcdəgəhün oldı tənur,
Var yeri şiələrün göz yaşını, sübhətək eyləsə dərya bu gecə.

Bu gecə Ali-Əba eylər həras, öldi Əbbasü Əli, yatdı ələm,
Əhli-Beyti-Nəbəvi başladı yas, bu gecə işrət edər əhli-züləm,
Xeymələr qarət olub, getdi əsas, oldı Əbbasun iki dəsti qələm,
Kufədə bir-birinə fəxr eləyər, etdigi zülminə ə`da bu gecə.

Bu gecə şami-qəribandı, Hüseyn, gəlmişux Zeynəbə başsağlığına,
Zülm ilə xeymələrün yandı, Hüseyn, gəlmişux Zeynəbə başsağlığına,
Yarü ənsar hamı doğrandı, Hüseyn, gəlmişux Zeynəbə başsağlığına,
Baş açub, zülfi yolub, nalə edər sübhətək Zeynəbi-Kübra bu gecə.

Neçə il yatmadı əslən gecələr, bəslədi Həzrəti-Zəhra o başı,
Böyüdüb söylədi, ey nuri-bəsər, baturub qanına ə`da o başı,
Ya kül üstündə rəvadur bu, məgər böyüdüb sərvəri-Bətha o başı,
İmdi mətbəxdə tənur içrə o baş, eyləyər Həqq ilə ehya bu gecə.

Bu gecə əldə qələm Nadimi-zar, ağlayar sübhə kimin naləkünan,
Bu gecə olmuş hamu tə`ziyədar, eyləyər şur ilə əfğanü fəğan,
Bizi bundan da bətər eyləmə xar, təngdür şiələrə ömri-cəhan,
Bu gələn il elə qismət bizə sən, dolanaq qəbrüvə, mövla, bu gecə.

### Əbbas əzası gəldi

Oldı mahi-mühərrəm, Əbbas əzası gəldi,
Olsun fədayi-ümmət əldə livası gəldi.

İbni-Ziyadun ol vəqt büğzi edübdi tüğyan,
Eylübdi İbni-Sə`di sərdari-ceyşi-üdvan,
Verdi dübarə Şimrə qətli-Hüseynə fərman,
Şimrün əlində xəncər, yoxdur həyası gəldi.

Şimri-dəni Ömər Sə`di eylüb məzəmmət,
Eylüb cidalı təsdiq, ol mayeyi-şərarət,
Söylərdi Şahi-Yəsrib, başlandı tazə möhnət,
Ali-Əlinin üstə, dəhrün bəlası gəldi.

Zeynəb deyərdi, ya Rəb, başlandı tazə yasim,
Ətrafı aldı düşmən, oldı əyan hərasim,
Tarac olar cəlalım, talan olar libasim,
Əl`an evim yıxıldı, Şimrün sədası gəldi.

Gəldi nidayə Külsum eylərdi şurü şivən,
Söylərdi, ya İlahi, yox çarə, neyləyim mən,
Əbbasımı bu çöldə qolsuz salalla düşmən,
Çün Növfəl ibni Mürrə, əldə cidası gəldi.

Söylərdi Leyla, yaxşı düşdüm kənar elimdən,
Nakam Əli balamı düşmən alar əlimdən,
Va möhnəta sədası düşməz, Xuda, dilimdən,
Xəncər əlində Münqiz, zülmün binası gəldi.

Qasim anası tökdi əşki-bəsər üzarə,
Bikəs iki yetimüm eyləllə parə-parə,
Vəqt oldı növərusi geysün libasi-qarə,
Qanə dönən hənası, ruzi-bükası gəldi.

Gözyaşlı çün Rübabə söylərdi, Əsğərim, yat,
Gəl ki, solan susuzdan ziba güli-tərim, yat,
Gəlməz suya gümanım, səbr eylə, yavərim, yat,
Çün Hərmələ əlində, tiği-cəfası gəldi.

Hərgah Hüseynisən, gəl hər gün fəğanə, Nadim,
Sal "va Hüseyn" sədasın ruyi-cəhanə, Nadim,
Hər gün köçər müsafir, bax karivanə, Nadim,
Əzrailin görərsən bir gün sədası gəldi.

**Dəşti-bəladur Kərbəla**

Kərbəla nə Kərbəla, dəşti-bəladur Kərbəla,
Xaki-möhnət, dərdü qəm, bəzmi-əzadur Kərbəla.

Məhşəri-kərbü bəladür, naləvü əfğan yeri,
Firqeyi-ənsardən ol Şahi-məzluman yeri,
Zeynəbün qəlbi olan cövrü sitəmdən qan yeri,
Əhli-eşqə bəstəri-rahi-vəfadur Kərbəla.

Müstəfa övladını bu Kərbəla nalan edüb,
Qəm verüb, möhnətlərə qərq eyləyüb, giryan edüb,
Şühədayi-gülşəni nari-fəraq suzan edüb,
Sahibi-eşqi bəlayi-intəhadur Kərbəla.

Kərbəladə Əkbəri-gülpirəhən oldı şəhid,
Qaldı axirda o çöldə Şafiyi-məhşər vəhid,
Şadkam oldı bu dəştin macərasından Yəzid,
Qan ilə barəng olub kuhi-Minadur Kərbəla.

Kərbəladə Qasimə toy eylədi Şahi-cəhan,
Əhli-Kufə toy hənasın zülm ilə eylüblə* qan,
Qalmadı heç əqrəbadən Zeynəbə bir pasiban,
Tazə damadə sənün xakun hənadur, Kərbəla.

Zeynəbi-biçarənün həddən ötüb möhnətləri,
Qanına əlvan görən vəqt surəti-Peyğəmbəri,
Xanəviran eylədün biçarə Ali-Heydəri,
Çün Xuda məhbubinə xakun şəfadur, Kərbəla.

Bu Minayi-Kərbəladə Övnü Cə`fər doğranub,
Şahi-dinün dəsti üstə, təşnə Əsğər oxlanub,
Həzrəti-Əbbas ölübdür, məşki qan ilə dolub,
Yaxşı saxla çün onı, sahibdəvadur Kərbəla.

Nadimi-biçarəyəm, canım fəda qurbanuva,
Olsa min canım, fəda verrəm sənün mehmanuva,
İstərəm göz yaşımı bir də səpim ünvanuva,
Hər günahım virdinə çünki dəvadur Kərbəla.

---

* Eyləyiblər

**Gəlüb Zəhra (ə) bu gün Kərbübəlayə**

Gəlüb Zəhra bu gün Kərbübəlayə,
Batub ərzü səma yeksər qərayə.

Bu şəb Ali-Əba eylər çü əfğan,
Olublar qüssədən zarü hərasan,
Anası Fatimə olmuş nəvaxan,
Gözü yaşlı gəlibdür Neynəvayə.

Batubdur qanına şəhzadə Əkbər,
Nişan oldı dəmi-peykanə Əsğər,
Batublar qarəyə yeksər hərəmlər,
Verüblər cümləsi səda-sədayə.

Olub ətşan bu gün şəhzadə Qasim,
Olan dərdü qəmə amadə Qasim,
Susuz nakam ölüb dünyadə Qasim,
Batubdur əlləri qandan hənayə.

Tökər göz yaşını Külsumi-naçar,
Olubdur möhnətü dərdə giriftar,
Su yanında olub ətşan Ələmdar,
Sitəm tə`sir edüb Ali-Əbayə.

Batublar qanına Övn ilə Cə`fər,
Zəbih oldı susuz şibhi-Peyəmbər,
Olublar qarəpuş yeksər mələklər,
Dutublar tə`ziyə növkədxudayə.

Olub qandan xizab şahi-Mədinə,
Tökər göz yaşı rüxsarə Səkinə,
Gərək biz ağlayaq ol Şahi-dinə,
Gərəkdür şiələr batsun qərayə.

Açub başun bu gün Peyğəmbər ağlar,
Hüseynün başı üstə sinə dağlar,
Düşübdür topraq üstə Şahi-əbrar,
Fələk eylər nəva bu macərayə.

Hüseynün hülqünə xəncər qoyublar,
Libasın cismdən yeksər soyublar,
Bacısı Zeynəbi ağlar qoyublar,
Vırublar başını növki-cidayə.

Vəfası yoxdı bu əhli-Əraqun,
Hüseynün pozdular yeksər tifaqun,
Edibdür xeyzəran parə dodağun,
Yetüşdi Şamdə zülm intəhayə.

Təsəvvür et bunı qəlbində, Nadim,
Bu caizdürmi hansı dində, Nadim?
Tapulmaz busəgah cismində, Nadim,
Yəralər sövkəşüb* yeksər yərayə.

**Əhli-Beytün**

Qətlgahdən keçəndə çün qətari Əhli-Beytün,
Saldı Kərbəlayə şivən bu hüzari-Əhli-Beytün.

---

* Söykənib

Naqədən töküldi yeksər Əhli-beyti-zarü giryan,
Hər birisi bir şəhidə eyləyüb nəvavü əfğan,
Qasimün yaralı nə`şin tapdı çün ərusi-nalan,
Ağladı bikəsə çeşmi-əşkbarı Əhli-Beytün.

Zeynəb eyləyirdi nalə, səsləyirdi nuri-eynin,
Axtarırdı dildə ahü nalə Şahi-məşriqeynin,
Bir çuxur yerə yetişdi, tapdı nə`şini Hüseynin,
Ərz edüb, əxa, olubdur biqərari Əhli-Beytün.

Bir oyan, Hüseyn, bəradər, xeyməgahi yandırublar,
Qasimün yaralı nə`şi üstə at dolandırublar,
Əhli-beyti-natəvanun rəxtini soyundurublar,
Çün olubdı tarümar ruzigarı Əhli-Beytün.

Xeyməgahə od vırublar kufəyani-qövmi-üdvan,
Çöllərə dağıldı, qardaş, Əhli-beyti-zarü giryan,
Şimr dəstgir edibdür Ali-Müstəfanı giryan,
Qüssədən olub hərasan biqərarı Əhli-Beytün.

*Əfrad*

Edirdi Zeynəbi-dilxun xəraşi-sinəsini,
Dolandı, axır tapdı Şəhi-Mədinəsini.

Töküldi naqələr üstdən gülüzli əhli-hərəm,
Hər əndəlib o zəman bir gülə dutub matəm.

Görəndə Əkbəri bisər o bağrıqan Leyla,
Yüzüni parələyüb çəkdi ah-fəğan Leyla.

Deyərdi, yoxdur əlacım, nedim məni-külbaş,
Səni bu növ` görməmiş əzəl öleydim kaş.

Göründə oğlunı, doldı misali-əbri-bəhar,
Çəküb cənazəni ağuşə, didəsi xunbar.

Əsir verdün, Əli, ləşkəri-zulamə məni,
Əsir edüb aparur əhli-kinə Şamə məni.

*Baqiyi-növhə*

Leyla axtarırdı əl`an Əkbərini qəlbi suzan,
Çeşmi-əşki ilə ləbaləb zülfini edüb pərişan,
Tapdı Əkbərün yaralı cismini qan ilə əlvan,
Cövrü zülm ilə solubdur gülzarı Əhli-Beytün.

Çün fəğanə gəldi Külsum ərz qıldı, ey Ələmdar,
Dur əyağə, düş qəbağə, olginən bizə pərəstar,
Kərbəladə qalmayubdur bir nəfər müinü qəmxar,
Ol bu vəqtimizdə, bari, qəmküsarı Əhli-Beytün.

Cövri-əşqiyadən ağlar, hər zəman nihan Səkinə,
Möhnətü bəladən axır, oldı bağrıqan Səkinə,
Çün olub əsiri-düşmən, zarü natəvan Səkinə,
Yandı qəm əlində qəlbi-tarümarı Əhli-Beytün.

Necə tab edüb bu zülmə, qəlbi tarümar Zeynəb,
Ağlayub gələr fəğanə, çeşmi əşkbar Zeynəb,
Kufəyə rəvan oldı, ya Hüseyn, qətari-Zeynəb,
Səni dəfn etmək idi intizarı Əhli-Beytün.

Kərbəla müsibəti çün qəlbimi edüb mükəddər,
Eyləyür fəğanü nalə bu müsibətə mələklər,
Nadim, eylə ahü nalə, ağlayur bu gün Peyəmbər,
Zülm ilə soyuldı rəxti-zərnigari Əhli-Beytün.

### Mahi-mühərrəm görünür

Şiələr, qarə geyün, mahi-mühərrəm görünür,
Aləmi qəm bürüyüb, mövsümi-matəm görünür.

Geyinüb qarə hamı, növhə edər mərdü zənan,
Ağlayur, yasə batublar hamı bu əhli-cəhan,
Şahi-din şiələrün qəlbin edüb zülm ilə qan,
Hər könüldə baxasan, möhnətü ya qəm görünür.

Bu mühərrəmdə hamı naləkünan Ali-Əba,
Geyinüb qarə təmam, cümləsi eyləllə səda,
Dari-Peyğəmbəri viran eləyüb Şimri-dəğa,
Qəm sirişki hamı gözlərdə dəmadəm görünür.

Görünür xəlq təmam növhə edüb sinə vurar,
Ağlayub şiələr hər yerdə əzaxanə qurar,
Baxsa kim Şimr, Səkinə yüzinə sillə vurar,
Bu müsibətdə təmam ağlayar aləm, görünür.

Genə bu möhnətü qəm taqətü aramım alub,
Bu mühərrəmdə Peyəmbər qapusu bağlı qalub,
Zeynəbün başinə zülm ilə fələk qarə salub,
Ərşdən qəm yağar, aləm hamı bərhəm görünür.

Ağlayar ruzü şəban Nadimi-biçarə, Hüseyn,
Qələm əldə tökərəm göz yaşı rüxsarə, Hüseyn,
Şəbi-vəhşətdə kömək ol bu diləfkarə, Hüseyn,
Çox günəhkarəm, üzümdə mühənü qəm görünür.

**Mahi-əzadur**

Ta həşrə kimin ağlayasuz, şiə, rəvadur,
Çün mahi-əza, matəmi-Şahi-şühədadur.

Bu ayda batub qarəyə cümlə hamı aləm,
Əfğanə gəlüb növhə edər xəlq dəmadəm,
Tə`sir eləyər gəbrü nəsarayə bu matəm,
Qurbanı bunun layiqi-dərgahi-Xudadur.

Çünki bu mühərrəmdə dutub yer yüzini qan,
Zibh oldı Xuda rahinə yetmiş iki qurban,
Məhv oldı bu ay sətrbəsətr ayeyi-Qur`an,
Bişək özi bu ayda Xuda sahibəzadur.

Bu mahdə bisər qalub övladi-Peyəmbər,
Bu ayda ölüb sahibeyi-saqiyi-Kövsər,
Qarə geyünüb ərşi-Xuda içrə mələklər,
Bu fəsldə qətlə yetişən miri-hüdadur.

Bu fəslü bu mövsümdə o Əbbasi-hünərvər,
Çün gəldi hüzuri-Şəhi-valayə o sərvər,
Söylüb, mənə ver izni-cihad, varisi-Heydər,
Ətşan qala övladi-Peyəmbər, nə rəvadur.

Çox təşnədi, qardaş, yetüşüb canə Səkinə,
Suzi-ətəşindən gəlüb əfğanə Səkinə,
Göz yaşına bax, döndərüb ümmanə Səkinə,
Axır gələr əfğanə bular, Ali-Əbadur.

Əbbas rəvadurmı yata xeymədə rahət,
Övladi-Peyəmbər susuzundan çəkə zillət,
Ver izn, gedim ərseyi-meydanə bu saət,
Rehlət belə ömr eyləməgimdənsə səzadur.

Bu ləşkəri-üdvanı gedüb rə`şəyə sallam,
Səflər dağıdub axırı bir cür`ə su allam,
Ya Əkbəri-nakam kimin təşnələb ölləm,
Bu rahdə ölmək mənə çün xeyli rəhadur.

Çün izni-cihad vermədi ol sərvəri-Bətha,
İzn oldı gedüb təşnələrə su ola cuya,
Əzm eyləməgə rəzmgəhə oldı mühəyya,
Sölüb,* bacı, hicran yetüşüb vəqti-bükadur.

Külsum ilə Zeynəb eləyüb şur ilə əfğan,
Əbbası görən vəqtə olur azimi-meydan,
Sölüblə, əman, qoyma bizi zarü giriban,
Gəl, getmə bu meydanə ki, məmlüvvi-bəladur.

Çün verdi təsəlli o əzizanə Əbülfəzl,
Filfövr yetüb ərseyi-meydanə Əbülfəzl,
Açdı o fəsahət dilün üdvanə Əbülfəzl,
Ey qövm, bu Əbbasi-Əli, kani-vəfadur.

---

* Söyləyib

Mən şiri-Xuda oğluyam, Əbbasdür ismim,
Bu rahi-Xudadə, bəli, qurbandı bu cismim,
Aşiqdi ədu qanını tökməkligə tiğim,
Dəstimdə bu şəmşiri-kəcim tiri-bəladur.

Hər qədr mübariz tələb eylüb o hünərvər,
Binitq o sərdarə baxardı hamı ləşkər,
Axır səfi-ə`dayə özün vırdı o sərvər,
Söylüb, bilün, ey qövm, babam şiri-Xudadur.

Bütxanələri zirü zəbər eylədi yeksər,
Qətlə yetürüb Mərhəbi, fəth eylədi Xeybər,
Ərş üzrə onun vəsfini eyləllə mələklər,
Çün miri-hüda, padşəhi-ruzi-cəzadur.

Qoyduz o şəhün oğlını siz yekkəvü tənha,
Bu qanun hesabun çəkər Allahü təala,
Şimrün dutacaq damənini həşrdə Zəhra,
Sölər, yetişüb vəqti-qisas, ruzi-cəzadur.

Ol vəqtdə ki, istəyəcək Xaliq hesabı,
Həqqə nə olu zalimün ol vəqt cəvabı,
Məhşər güni bu Nadimi-biçarə kitabı,
Hər qədr günah olsa, təmaminə dəvadur.

**Bəzmi-əzayə gəlmuşux**

Bəzmi-əzayə, ya Hüseyn, şurü nəvayə gəlmuşux,
Çünki düçari-möhnətux, dərdə dəvayə gəlmuşux.

Nari-fənayə yanmuşux, misli-səməndər ağlarux,
Ruzi-büka yetüşdi çün, şurlə yeksər ağlarux,
Tutisifət qəfəsdəyux, salı sərasər ağlarux,
Tə`nü cəfa məriziyux, dərdə dəvayə gəlmuşux.

Gəh bizi cövri-Şimri-dun, tə`neyi-Şami ağladar,
Gəh başuvı cidadə, gəh virdi-kəlamı ağladar,
Gahi güruhi-kinənün nəzmü nizamı ağladar,
Dildə nəvayi-"va Hüseyn", bəzmi-əzayə gəlmuşux.

Gahi məlul edər bizi Şafiyi-məhşərün qəmi,
Xətmi-Rəsuli-rəhnüma, yə`ni Peyəmbərün qəmi,
Məscidi-Kufədə batan qanına Heydərün qəmi,
Dəhrdə munis olmağa dərdü bəlayə, gəlmuşux.

Gahi bu qövmi-bihəya babi-Rəsuli bağladı,
Tökdi əzadə göz yaşı, düxtəri-Rəhbər ağladı,
Gahi Həsən cənazəsin zümreyi-kafər oxladı,
Bais odur ki, batmuşux cümlə qərayə, gəlmuşux.

Kaş, kifayət eyləyə ona bu zümreyi-dəğa,
Nazlı başuvı cismdən eyləməyeydilər cüda,
Tazədən artdı möhnətim, düşdi xəyalə Kərbəla,
Dari-fənadə səbr edək əmri-qəzayə, gəlmuşux.

Düşdi xəyalə möhnətün, dillərə riqqət əl verüb,
Şiələrə nə növ`i, gör, dərdi-şəmatət əl verüb,
Şimrsifət şəqilərə tazədən izzət əl verüb,
Möhnətü qəm əsiruyux, payüvə sayə gəlmuşux.

Gözdə sirişki-qəm, yazar əldə risalə Nadimin,
Saxlar əza o Əkbəri-Haşimi xalə Nadimin,
Bir də məzaruvi öpüb yetsə vüsalə Nadimin,
Bir də görək məzaruvin üstə sədayə gəlmuşux.

**Bu gecə**

Yığ, bacı, başıma ətfalımı yeksər bu gecə,
Hələ asudədi ənsarü köməklər bu gecə.

Daşmayub bəhri-bəla, azdı hələ möhnətü qəm,
Açmayub zülm əlini zülmə hələ ceyşi-züləm,
Ölməyüb həzrəti-Əbbasım, hələ yatmub ələm,
Çıxmayub sinəmə ol Şimri-sitəmkər bu gecə.

Bu gecə sübhə kimin nazlı Səkinəm yanacaq,
Sübhi qardaşı ölüb, zülm ilə yasə batacaq,
Ki, sabah Əkbəri-nakaminə matəm dutacaq,
Batmayub yasə hələ Ali-Peyəmbər bu gecə.

Solmayub gülşən hələ, imdi səlamətdi çəmən,
Ölməyüb Qasim hələ, ağlamaz ərvahi-Həsən,
İki şəhzadələrün şövq ilə geymüblə kəfən,
Batmayub qanə hələ, zülfi-müənbər bu gecə.

Əsğərim olmayub əlvan hələ öz qanilən,
Anası sir eləyibdür hələ pəstanilən,
Hülqi məcruh degil Hərmələ peykanilən,
Hələ bidar degil, yuxlayub Əsğər bu gecə.

Hələ Külsum bacım batmayub ənduhü qəmə,
Çünki sahibdi hənuz Həzrəti-Əbbas ələmə,
Verirəm mən də təsəlli hələ əhli-hərəmə,
Hələ baş açmamısan Zeynəbi-müztər, bu gecə.

Hələ soldurmayub ə`da sitəmi güllərimi,
Kəsməyüb Şimri-dəğa xəncər ilən həncərimi,
Saribanım hələ qət` eyləməyüb əllərimi,
Rişim öz qanım ilən olmayub əlvan bu gecə.

Hələ Qur`an oxumaz növki-cidalərdə sərim,
Yanmayub atəşi-suzanə, bacı, xeymələrim,
Çöllərə qaçmaz hələ düxtəri-şəhzadələrim,
Bipərəstar degil nazlı hərəmlər bu gecə.

Olmayub, ağlama, çün dəstlərim bəstə hənuz,
İpə bağlanmayub ol Şamə gedən dəstə hənuz,
Qoymayub Xuli, əziz başımı kül üstə hənuz,
Yatub asudə Nəcəfdə hələ Heydər bu gecə.

Bacı, Zeynəb, get, elə xeymədə sən naz ilə xab,
İstirahət eləyün sübhə kimin, Ali-Turab,
Edəcəksən ki, səbah zülfüvi qan ilə xizab,
Gəlməyüb qətlgəhə Şafiyi-məhşər bu gecə.

Analar, söylə, doyunca eləsün oğlunı did,
Kəsməyüb başlarını zülm ilə bu qövmi-ənid,
Vırmayub ləblərimə çub inad ilə Yəzid,
Ağlayar sübhə kimin Nadimi-nokər bu gecə.

**Bimirəm bu nə mahdür, Xuda...**

Bilmirəm bu nə mahdür, Xuda, şiələr deyər, va Hüseyn,
Hüseyn,
Qarəpuş olub cümlə masiva, şiələr deyər, va Hüseyn, Hüseyn.

Yasə qərq olublar zükurü ünas, qəriblərə matəm qurubdular,
Ya Peyğəmbərün gül dodağını parə eyləyüb daş vırubdular,
Ya ki, Möhsinin səqt edüb, ədu Fatimə dərün yandurubdular,
Göglərə mələklər çəküb qəra, şiələr deyər, va Hüseyn,
Hüseyn.

Ərşdən məgər qəm yağub yerə, əhli-aləmün yası başlanub,
Yoxsa, şiələr, səcdəgahdə rəhnümamız Heydər qılınclanub,
Ya ki, Müctəbanun cənazəsi tazədən cəfa ilə oxlanub,
Yer yüzün neçün doldurub səda, şiələr deyər, va Hüseyn,
Hüseyn.

Pirü həm cəvan, mərdü həm zənan, ağlayar hamı, növhəxan
olub,
Hicrət eyləyübdür Mədinədən şahi-kəmsipah, biməkan olub,
Qəlbimə xütur eylədi bu ay çü Peyğəmbərün darı bağlanub,
Çöllərə düşüb Ali-Müstəfa, şiələr deyər, va Hüseyn, Hüseyn.

Biz mühərrəmi ağlayaq gərək, möhnət  üz verüb Ali-Yasinə,
Qəm qübarı əgləşdi ruyinə, yetcəgin Hüseyn Kərbəlasinə,
Səbr edüb susuz həqq rizasıçün əhli-Kufənün hər bəlasinə,
Aldı dövrəsün ceyşi-əşqiya, şiələr deyər, va Hüseyn, Hüseyn.

Əldən aldı ənsarını ədu, etdilər şəhid Övnü Cə`fəri,
Birbəbir şəhid oldular təmam, qalmadı dəxi yarü yavəri,

Göz önündə can verdi təşnələb şibhi-Müstəfa, nazlı Əkbəri,
Zülfüni xizab etdi qan həna, şiələr deyər, va Hüseyn, Hüseyn.

Əl tapubla xar səhni-gülşənə, etdilər xəzan qönçə güllərün,
Dutdıla[*] yolun, qırdılar elin, kəsdilər hamı çarə yollarun,
Zalim Hərmələ nazlı sinədə oxladı susuz hülqün Əsğərün,
Kaş olaydı bu canımız fəda, şiələr deyər, va Hüseyn, Hüseyn.

Kəsdi başlarun, tökdi qanlarun, etmədi həya əhli-kufəyan,
Göz yaşun töküb, söylədi, əman "mən müinəna"[**] Şahi-insü can,
Canını fəda etdi namurad şövqü zövq ilən Qasimi-cəvan,
Namurad edüb aləmi vida şiələr deyər, va Hüseyn, Hüseyn.

Axırı hücumavər oldular, saldılar Ələmdarunun qolun,
Əsbdən ələm sahibin yerə saldılar, ələm oldı sərnigun,
Baş qılınclanub, qol zəbun olub, sərv qaməti oldı qərq bəxun,
Söylədi, yetiş dadə, ya əxa, şiələr deyər, va Hüseyn, Hüseyn.

Qətlgahdə can verən zəman Şahi-Kərbəla qıldı cüstucu,
Şimr həncərün zibh edən zəman sölədi, verün bircə şürbə su,
Kəsdilər başun təşnələb edüb can verən zəman qan ilən vüzu,
Oldı gül səri cismdən cüda, şiələr deyər, va Hüseyn, Hüseyn.

Qarət etdilər xeyməgahını, xeymələr hamı narə yandılar,
Şamü Kufəni Ali-Bu Türab at döşündə yeksər dolandılar,
Nadimün tökər göz yaşın yüzə, təbahdür mənə ömri-ruzigar,
Hər əzadə ağlar, edər səda, şiələr deyər, va Hüseyn, Hüseyn.

---

[*] Tutdular
[**] Kim mənə kömək edər

## Şimrə lə`nət olsun!

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Öldürüb susuz Hüseyni ol ləinü bimürüvvət,
Ali-Müstəfa çəküblə Şimr əlindən hər əziyyət,
Şiələr odur ki, eylər Şimri-bihəyayə lə`nət,
Əhli-eşqə bu müsibət həşr olunca ibrət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Bir Hüseyni ki, babası cəm`i xəlqə rəhbər olsun,
Atası vəliyyi-Xaliq, həm şəfi`i-məhşər olsun,
Madəri Bətuli-Əzra, biz`eyi-Peyəmbər olsun,
Beylə cismi ta ki sər pa, zəxmlə cərahət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Bu Hüseyn həman Hüseyndür, əmr edüb Xudayi-davər,
Qundağun apardı ərşə ehtiram ilə mələklər,
Bir baxun, necə cəsarət eyləyübdi Şimri-kafər,
Şahi-dinə nə rəvadur belə bir həqarət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Bu necə çıxarmı yaddan, bu Hüseyni-dilşikəstə,
Salmış idi ol zəman ki, Şimri-dun bunı yüz üstə,
Ümmətə dua edərdi can verəndə topraq üstə,
Söylə, varmı beylə rəhbər mayeyi-mürüvvət olsun?

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Bu bir eşqdür ki, feyzin nə bilər ləinü əğyar,
Hər kəs ağlayar Hüseynə, ruzi-həşrdə cəza var,
Baş vırub olallar azim, qəbri-Şahi-dinə zəvvar,
Yox əlavə bir səadət, belə bir səadət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Bu necə çıxarmı yaddan, Şimr zülmi-am edibdür,
Ali-Yasinə Fəratın suyunu həram edibdür,
Ali-Haşimi o çöldə cümlə qətli-am edibdür,
İtrəti əsiri-ə`da xeyməgahi qarət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Mən necə edim fəramuş bu müsibətin şəqilər,
Öldi Övnü Fəzlü Cə`fər, öldi Qasim ilə Əkbər,
Oxlanubdı sinəsindən təşnələb Əliyyü Əsğər,
Hansı dində bu rəvadur, beylə bir ədavət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Öldi yari-cannisarı, qarət oldı xeyməgahi,
Çöllərə dağıldı yeksər Əhli-Beyti-bipənahi,
Belə zülm ilən cəhanda öldürüblər hansı şahi?
Bir tərəf əsiri-düşmən, bir tərəf şəmatət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Qəlbimi gətirdi şurə təzədən genə bu mətləb,
Ağlaram qələm əlimdə çeşmi-əşk ilə ləbaləb,
Ah, o vəqt ki, oldı daxil məclisi-Yəzidə Zeynəb,
Bir zəifə kani-ismət bir belə müsibət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

Bisəbəb degil gəlibdür naləvü fəğanə Nadim,
Döndərüb rəqəm əlində göz yaşını qanə Nadim,
Ağla, va Hüseyn sədasın salgilən cəhanə, Nadim,
İstəsən əgər ki, ruhun qəbr evində rahət olsun.

Ruzi-həşr olunca Şimri-bihəyayə lə`nət olsun!
Hər qərinə, hər zəmanda əşqiyayə lə`nət olsun!

## Gəlün əfğanə

Ey şiələr, gəlün əfğanə yeksər,
Ağlar bu gün cümlə Ali-Peyəmbər.

Bu ay batub qanə Şahi-Mədinə,
Zülm ilə qürub eylüb Mahi-Mədinə,

Qalub gözi yaşlı nazlı Səkinə,
Baba deyüb, ağlar şəhzadə düxtər.

Söylər qəribü zarəm,
Dərdü qəmə düçarəm,
Şimrün cəfası ilə,
Əsiri-ruzigarəm.

Ey şiələr, Kərbübəladə əl`an,
Cari olub zəxmi-Hüseyndən al qan,
Göz yaşıdur zəxmi-Hüseynə dərman,
Tök əşki-qəm hər qədr olsa müyəssər.

Ağla qərib Hüseynə,
Öldürdi əhli-kinə,
Su nuş edən zəmanda,
Lə`n eylə qatilinə.

Ey şiələr, bu gün Şahi-şəhidan,
Ləbtəşnə öz qanına oldı əlvan,
Susuz verüb canın cananə qurban,
Kəsdi susuz başın Şimri-sitəmkər.

Doğranan əzası,
Xunbar olan libası,
Ey kufəyan əlində,
Qarət olan əsası.

Gəlin edək növhə bir namuradə,
İmdad eylər bizə dari-bəqadə,
Kam almamış ətşan öldi dünyadə,
Vay zibh olan ətşan, şahzadə Əkbər.

Nakam ölən, ağam vay,
Gülgunkəfən, ağam vay,
Toy hicləsilə çeşmim,
Həsrət qalan, ağam vay.

Leyla edər əfğan ol növcəvanə,
Gördi batubdı zülfi-mişkini qanə,
Dedi, nə etmiş idim mən kufəyanə,
Qoydı bəni gözyaşlı bu ləşkər.

Ey namurad oğul vay,
Babi-nicat, oğul vay,
Dünyadə olmadım mən,
Bir ləhzə şad, oğul vay.

Düşdi xəyalə bir naşad əzası,
Ətşan olub qurban növkədxudası,
Qanə dönüb zülm ilə toy hənası,
Qalub gözü yaşlu ərusi-müztər.

Söylər, cəvan əmoğlı,
Hənası qan, əmoğlı,
Toy rəxti qan ilə
Əlvan olan əmoğlı.

Səriyyə əşk eylər rüxsarə cari,
Öldi cəvan oğlı, soldı bəhari,
Xuni-əşk ilə pürrəng olmuş üzari,
Məmzuc olub əşk ilə xuni-əhmər.

Vay, şahzadə Qasim,
Övc eylər ərşə ahim,
Ruzi-cəzadə sənsən,
Dadrəsim, pənahim.

Tökər gözüm əşk ilən xun məmzuc,
Düşdi xəyalimə Babül-həvayic,
Qaçub onın xövfindən əhli-xaric,
Düşmiş Fərat üstə qolsız o sərvər.

Kani-həya, Əbülfəzl,
Müşkilgüşa, Əbülfəzl,
Sahibsiz ələmüvə,
Canım fəda, Əbülfəzl.

Gəlün edək növhə bir şirxarə,
Ləbi təşnəligdən olmuşdı parə,
Dili olub ağzında parə-parə,
Qanə olub əlvan qundaği-Əsğər.

Ey şirxarə Əsğər,
Ey növgüli-Peyəmbər,
Hülqün, əxa, nişanə,
Eylübdi qövmi-kafər.

Bisər düşən vəqtə şahi-Mədinə,
Yüz qarətə qoydı ləşkəri-kinə,
Zülfün yolub əfğan edər Səkinə,
Yüz qoydı səhrayə Ali-Peyğəmbər.

Bisər qalan əyalı,
Qarət olan mənalı,
Ey Kərbəla çölində,
Cismi düşən yaralı.

Zeynəb görüb əhli-kinün ədasın,
Səslərdi gözyaşlı bikəs əxasın,
Dedi, qardaş, qarət oldı əsasın,
Nə çarə eyləsün sənsiz hərəmlər.

Sərdarü padşahım,
Sənsən ümidgahım,
Səndən sora, Hüseyncan,
Yoxdur dəxi pənahım.

Ali-Əli yeksər batublar yasə,
Əziz balalarun düşdi hərasə,
Əsir oldux, qardaş, qərq oldux yasə,
Əsiri-kin oldı övladi-Heydər.

Bax ahü vayə, qardaş,
Biz binəvayə, qardaş,
Oldux əsiri-düşmən,
Bir gəl hərayə, qardaş.

Od vırdı xeyməyə əhli-şərarət,
Oldı bu səhradə bərpa qiyamət,
Nar içrə qaldı bimar bamöhnət,
Ağla o əhvalə Nadimi-nokər.

Ver Nadimün cəzasun,
Saxlar həmişə yasun,
Sənsən həkimi-haziq,
Ver dərdimün dəvasun.

**Ruzi-Aşuradı**

Kərbəladə başlanub tazə müsibət, şiələr,
Ruzi-Aşuradı, ya ruzi-qiyamət, şiələr.

Bir baxun, mahi-mühərrəmdür, geyüb aləm qəra,
Göz yaşın cari edər rüxsarinə şahü gəda,
Əldə qarə, növhə eylələr təmamən masiva,
Aləmi məhzun edibdür bu əlamət, şiələr.

Qarəyə batmış cəhan əhli edəllər şurişeyn,
Növhəxan olmuş təmami-masivavü məşriqeyn,
Zibh olub Kərbübəladə zülm ilə bikəs Hüseyn,
Din evin viran qoyub əhli-şərarət, şiələr.

Kərbəla səhrasinə etsən bəsirətlə nəzər,
İnsü cin ağlar bu ayda Şahi-dinə, şiələr,
Qərq olmuş möhnətə ağlar mələklər sərbəsər,
Kəsrəti-qəmdən olubdur nalə adət, şiələr.

Gər cəsarətdür deyəm, Qur`anü minbər odlanub,
Ol günə bənzər bu gün babi-Peyəmbər odlanub,
Yoxsa narə xeyməgahi-Ali-Heydər odlanub,
Ali-Tahanı soyub ceyşi-şəqavət, şiələr.

Ya o gündür ki, Hüseyn aldı səğir oğlun ələ,
O müsibətdən düşübdür ərşə şurü vəlvələ,
Qəhr ilə etdi nişan peykanə tifli Hərmələ,
Yetdi ol hülqi-şərifə çün cərahət, şiələr.

Ya o gündür Əkbərə Leyla özi biçdi kəfən,
Qarəpuş olsun gərək bu möhnətə əhli-zəmən,
Qanına əlvan olubdur növrəsi-gülpirəhən,
Bu necə insafdür, bu nə mə`rifət, şiələr.

Qasimə Şahi-Hicaz toy bəzmi abad eylədi,
İstədi şad etsün, ədu yaxşı naşad eylədi,
Kufəyan toy məclisin zülm ilə bərbad eylədi,
Növərusi-zarə zillət oldı qismət, şiələr.

Getdi Əbbas su gətirsün ləbləri ətşanlara,
Olmadı qismət su içmək sinəsi suzanlara,
Çün nişanə oldı cismi navəkü peykanlara,
Qaldı ləbtəşnə hamı ətfali-itrət, şiələr.

## Öldürə

Bəs, rəvadur Şimr Hüseyni, şiə, ətşan öldürə?
Cismi-məcruhun edə qan ilə əlvan, öldürə.

Həncərün zibh eyləyən vəqtə çox etdi cüstucu,
Sölədi, çox təşnəyəm, ya Şimr, ver bir şürbə su,
Can verəndə etdi öz qanilə təcdidi-vüzu,
Nə rəvadur natiqi-Qur`anı üdvan öldürə?

Şimrdən etsən sual əl`an, müsəlmanəm deyər,
Ümməti-Peyğəmbərəm, çün əhli-Qur`anəm deyər,
İmdi də Şimri danışdusan,* müsəlmanəm deyər,
Şimr bid`ət qoymuş, İslamı müsəlman öldürə.

Dad o gündən Şimr xəncər qoydı ol gül həncərə,
Dinini dünyayə satdı, ağ olub Peyğəmbərə,
Rəxnə saldı ləngəri-ərşi-Xudayi-Əkbərə,
Qəsd edüb bikəs İmamə, qanə əlvan öldürə.

Şimri-bidinün əzabun Həqq özi etsün şədid,
Din İmamun on iki zərbətlə eylübdür şəhid,
Əl-vərəq oldı, pozuldı əmri-Qur`ani-məcid,
Hardadur xəlq öz İmamun beylə giryan öldürə.

Nuri-Həqqi Kərbəladə zülm ilə söndürdilər,
Qarət eylüb xeyməgahun od vırub yandırdılar,
Ələmün sənduqi üstə at çapub sındırdılar,
Əzm edüb biqüsl nə`şün ləşkər üryan öldürə.

---

* Danışdırsan

Bihəyalux eyləyüb zülm ilə kəsdi başını,
Gördi başsuz Zeynəbi-bikəs Hüseyn qardaşını,
Sölədi, "va möhnəta", tökdi yüzə göz yaşını,
Hardadur qurban kəsən qurbanı ətşan öldürə?

Zəhi Həqq qurbanını ə`dalər ətşan qoydular,
Bihəyalux eyləyüb yeksər libasın soydular,
Nə`şini topraqlar üstə başsız üryan qoydular,
Seydi səyyad harda vardur beylə giryan öldürə?

Zeynəb ol vəqt zülfinə kül eyləyüb etdi fəğan,
Xeyməgahi əzmi-qarət eyləyəndə kufəyan,
Söylədi, bir dadrəs yoxdur, Hüseyn, qardaş, əman,
Zeynəbi az qaldı çün ənduhi-tüğyan öldürə.

Nadimün canı fəda olsun Hüseynün canına!
Mədfənündə göz yaşı olsun rəvan eyvanına,
Gər çəharüm mərtəbə yetsəm təla eyvanına,
Növhəxanun şövqi-vəslün istər əl`an öldürə.

**Eylədi**

Ah, o vəqtdən Şimri-dun zülmündə tüğyan eylədi,
Fil-həqiqət, xaneyi-imanı viran eylədi.

Qanə qəltan eylədi, gör fisqini ol kafərin,
Bir vücudi ki, onilə fəxr edər ərşi-bərin,
Ol vücudun xəncərə etdi nişan gül həncərin,
Tökdi bir qan zahirən, batində min qan eylədi.

Xüldidə etdi təzəlzül ruhi-Adəm ağladı,
Baş açub qəsri-cinanda ruhi-Məryəm ağladı,
Həzrəti-Sara behiştdə dutdı matəm ağladı,
Bu şəqi zalimləri zülmündə heyran eylədi.

Rahi-Həqqə gər hədiyyə etdi Yəhya qanını,
Altı ilxı verədi əldə quzı qurbanını,
Qoymadılar qumlar üstə peykəri-üryanını,
Çünki qurbandı bu hər göz çeşməsin qan eylədi.

Şimri-laməzhəb alanda qəhr ilə xəncər ələ,
Qarə yellər əsdi, tar oldı yer etdi zəlzələ,
Katibi-əmri-qəza əfğan ilə gəldi dilə,
Bu necə üsyandi, ya Rəb, əhli-üsyan eylədi.

Gər itirdi Yusifün Yə`qubi-Kən`an, şiələr,
Görmədi cismün xizab eylübdür al qan, şiələr,
Kərbəla Yə`qubi oğlun verdi qurban, şiələr,
Şövq ilə yetmiş iki qurbanı qurban eylədi.

Göndərüb İsmailün Minayə gər Hacər fəda,
Oğlunı tapdı səlamət söylədi, "va möhnəta",
Xeyməgahə Əkbərün gətdi Xəlili-Kərbəla,
Hacəri-Kərbübəlanı zarü giryan eylədi.

Nuh həqqaniyyətün etdi sübut tufan ilən,
Cismi məcruh olmadı şəmşir ilə peykan ilən,
Kərbəla Nuhi alubdur dəstəmazın qan ilən,
Tapmayub su Şahi-dini qan ilə tufan eylədi.

Nizələr başında başı şəms olub İsa kimin,
Tur edüb Kərbübəlanı peykəri Musa kimin,
Kərbəla səhrasın əlvan etdi qan dərya kimin,
Əhmədi-Muxtartək nurun nümayan eylədi.

Gördi din inkar olur şəmşir ilə doğranmasa,
Xeyməgahi atəşi-Nəmrud ilə odlanmasa,
Bir tənabə itrəti-Taha qolı bağlanmasa,
Verdi can cananına ol qanı bürhan eylədi.

Cəzbeyi-eşqi-İlahi saldı şurə başını,
Gahi mişkat eylədi ayati-nurə başını,
Bihəya Xuli qoyub axır tənurə başını,
Şamətək başı cidadə xətmi-Qur`an eylədi.

Gördi din zail olur bəzmi-Yəzidə getməsə,
Şamdə bimarinə rəncü şəmatət yetməsə,
Düxtəri viranələr küncində rehlət etməsə,
Nadimi-məhzuni bu möhnət nəvaxan eylədi.

**Ağlar sənə**

Ya Hüseyn, oldı mühərrəm, insü can ağlar sənə,
Sahibi-qüdrət, Xəlili-laməkan ağlar sənə.

Qadirü Qəhhar özü əl`an olub sahibəza,
Malikani-Həqq çəküblə ərşi-ə`layə qəra,
Rövzeyi-rizvandə matəm dutublar ənbiya,
Zakir olmuş Cəbrəil, eylər fəğan, ağlar sənə.

Maliki-niyranü rizvan cümləsi geymiş qəra,
Həlqeyi-matəm qurublar ənbiya eylər səda,
Va Hüseyna söyləyüb, zəccə edər ərşi-Xuda,
Zikr edər lövhü qələm, huri-cinan ağlar sənə.

Növhə eylələr hamı, əl`an olublar biqərar,
Adəmü Həvva tökər göz yaşını biixtiyar,
Həzrəti-İsanun olmuş imdi çeşmi əşkbar,
Nuh ilə Musa olubla növhəxan, ağlar sənə.

Va Hüseyn söylər Xəlil, eylər nəvayi-şurü şeyn,
Mürtəza söylər, belim oldı xəmidə, ya Hüseyn,
Müstəfa imdi əmamə əldə söylər, nuri-eyn,
Həzrəti-Zəhra olubdur bağrıqan, ağlar sənə.

Müctəbanun ruyinə cari olubdur göz yaşı,
Qan ilən əlvan olub zülm ilə yeddi qardaşı,
Zibh olub ərzi-bəladə Qasimün nazlı başı,
Zəhr ilən məsmum olan Şahi-cəhan ağlar sənə.

Aləmi-zərrdə geymiş qarə cəm`i-masiva,
Batinən rizvandə Tuba geyüb səbz qəba,
Səlsəbil nitqə gəlüb, Kövsər yəqin eylər səda,
Düşmə, nə icz eyləmə, abi-rəvan ağlar sənə.

Ya Hüseyn, icz eyləyüb ə`dayə, ətşanəm demə,
Təşnə zibh olsa da gər, təşnə qurbanəm, demə,
Qərqi-qan olsan da gər, qan ilə əlvanəm, demə.
Mahü xurşidü sitarə, asiman ağlar sənə.

Bu nə hikmətdür ədu doymub cəfadən, ya Hüseyn,
Şimri-dun axır kəsüb hülqün qəfadən, ya Hüseyn,
Şövq ilən keçdün təmamən əqrəbadən, ya Hüseyn,
Başuvı zibh eyləyüb Şimrü Sinan ağlar sənə.

Yazmaram zikri-mühən, eşqə giriftar olmasam,
Gəlmərəm əsla bəyanə, qəlbi xunbar olmasam,
Bu gələn il qəbrüvə müşkildi zəvvar olmasam,
Qəbrdə Nadim yəqin eylər nihan ağlar sənə.

**Mahi-mühərrəmdür, müsibət görsənür**

Şiələr, mahi-mühərrəmdür, müsibət görsənür,
Kərbəladə ruzi-məhşərdən əlamət görsənür.

Bu mühərrəmdə olubdur növhəxan əhli-cəhan,
Bağladı babi-Əlini zülm əlilə kufəyan,
Qan ilə əlvan olub bu ayda sultani-zəman,
Kərbəla dəştində övzai-qiyamət görsənür.

Qəlbimə doldı genə bu ayda min ənduhü qəm,
Bu mühərrəm zahir oldı əşqiyadən hər sitəm,
Göz yaşım, çeşmim, üzarə cari eylə dəmbədəm,
Neynəva dəştində çün fəsli-şəhadət görsənür.

Bu mühərrəmdə dolubdur qan ilə Kərbübəla,
Bu mühərrəmdə batub yasə təmam ərzü səma,
Bu mühərrəmdə hamı şahü gəda geymiş qəra,
Qarəpuş olmaqda aləm vəqti-möhnət görsənür.

Aç bəsirətlə gözün, bax Kərbəla meydaninə,
Ol zəmini-pakdə batmış Hüseyn öz qaninə,
Vermədilər su o şahın Əsğəri-ətşaninə,
Tifli-ətşan Əsğərün hülqində zərbət görsənür.

Ol qəribi-Kərbəlayə olmadı bir dadxah,
Doğranubdur Əkbərü Əbbas, yoxdur bir pənah,
Kərbəladə Şahi-din qaldı vəhidü bisipah,
İtrəti-əthar üçün vəqti-zəlalət görsənür.

Yıxdılar ə`da bu ayda xaneyi-Peyğəmbəri,
Zülm ilə öldürdülər Əbbasü Övnü Cə`fəri,
Münqizi-bidin şəhid eylüb Əliyyü Əkbəri,
Zülfi-mişkini edüb qan ilə ülfət görsənür.

Hansı şahə bu müsibətlər rəvadur, şiələr?
Ya ki, bu zülmə  görək Xaliq rizadur, şiələr?
Bu müsibətdə Əli sahibəzadur, şiələr,
Ağlayar dutmuş əlində qanlı xəl`ət görsənür.

Nadima, hər bəzmdə ağla Hüseynə, dut əza,
Göz yaşun cari edüb rüxsaruva, eylə nəva,
Ruzi-məhşərdə Xuda versün sənə əcri-cəza,
Ağla bu sərdarə çün əcrün şəfaət görsənür.

**Bu gün Kərbübəla viran olubdur**

"Bu gün Kərbübəla viran olubdur,*
Hüseyn öz qanına qəltan olubdur".

Bu gün Şiri-Xuda gəldi nəvayə,
Bu gün çün qəm yetübdür Müctəbayə,
Bu gün Qur`an dağıldı ayə-ayə,
Bu gün ərşi-Xuda əyan olubdur.

Bu gün ləşkər hamı birdən düzüldi,
Bu gün gülzari-Peyğəmbər pozuldı,
Bu gün damad əli əldən üzüldi,
Bu gün toy hicləsi viran olubdur.

Bu gün nalə edüb ağlar ərusi,
Bu gün qərasını bağlar ərusi,
Bu gün sinəsini dağlar ərusi,
Bu gün Qasim hənası qan olubdur.

Bu gün Kərbübəlayə gəlmiş ixlas,
Bu gün bir toy dutuldı Qasimə yas,
Bu gün qolsuz düşüb bir yanda Əbbas,
Adı səqqa, özi ətşan olubdur.

Bu gün nalə yetüb ərşi-bərinə,
Bu gün təşnə ölüb Şahi-Mədinə,

---

* Bu beytə bir çox növhə şairləri müraciət etmişlər. Zənnimizcə, laədridir, yəni müəllifi məlum deyil. Ustad Şəhriyar bu beyti təzmin etmişdir. XIX əsrdə Gəncədə yaşayıb-yaratmış Məşədi Hidayət Xaki də bu beytlə başlayan bir növhə yazmışdır.

Bu gün min dərd gəlüb Zeynəb həzinə
Bu gün ol xeyməsi lərzan olubdur.

Bu gün lə`nət edün Şimri-ləinə,
Bu gün çıxdı Hüseynün sinəsinə,
Bu gün qaldı yetim nazlı Səkinə,
Bu gün çöllərdə sərgərdan olubdur.*

**Yetişüb Ali-Əba qafiləsi Kərbübəlayə**

Yetişüb Ali-Əba qafiləsi Kərbübəlayə,
Şahi-din oldı müsəlləm qəmü ənduhü bəlayə.

Saralub gül yüzi, təğyir tapubdur rüxi-ali,
Qəlbi-məhzuni dönüb qanə, digərgun olub hali,
Qübaraludə olub türbət ilən mahi-cəmali,
Görünüb cilveyi-eşq dideyi-Şahi-şühədayə.

Dutub əshabinə yüz sölədi, eyş axirə yetdi,
Şayidür əmri-qəza çəkdi məni bu yerə gətdi,**
Zeynəbi-zarə deyün, tazə müsibətləri yetdi,
Batacaq yasə bu çöldə, gələcək şurü nəvayə.

Buyurub həzrəti-Əbbasə vəfadari-müəddəb,
Bir çuxur yerdə, əxa, xeymələri eylə mürəttəb,
Başımı zibh eləyən vəqtə ədu, görməyə Zeynəb,
Ahının şö`ləsi lərzə salacaq ərzü səmayə.

---

* Növhə natamamdır
** Gətirdi

Bu biyabanda mənim dövrəmi düşmənlər alallar,
Yarü ənsarımı qan üstünə sədparə salallar,
Xeymələrdə şühəda qızları ləbtəşnə qalallar,
Zülm ilə tazə cəvanlar boyanar xuni-cəfayə.

Kərbəla Şahınun ə`dalər alar cahü cəlalun,
Qan müzəyyən eləyər Qasimimün mah cəmalun,
İtirər madəri çün Əkbərinün Haşimi xalun,
Cövr ilə Ali-Peyəmbər batacaq cümlə qərayə.

Sə`dün oğlı bu Minadə mənə cövrü sitəm eylər,
Altı qardaş ölümi qaməti-rə`namı xəm eylər,
Bu uzun qollaruvı ləşkəri-kinə qələm eylər,
Başımı Şimri-dəğa nəsb eləyər növki-cidayə.

Həncərim nəhr olacaq Şimri-cəfagüstər əlində,
Xeymələr qarət olar zalimi-qarətgər əlində,
Rə`si-pakım gəzəcək Xuliyi-bədəxtər əlində,
Mütəhəmmil ola eşq əhli gərək əmri-qəzayə.

**Bu gün**

Bu gün ol ləşkəri-əşrar Hüseyni,
Edüblər qan ilə gülnar Hüseyni.

Bu gün zülmət olub nurə müqabil,
Olub kami-dili-ə`dalər hasil,
Bu gün əgləşməyün, ey şiə, qafil,
Gərək olsun gözi xunbar Hüseyni.

Bu gün Ali-Əba ətşan qalublar,
Hüseynün dövrini düşmən alublar,
Bu gün Əbbasını qolsuz salublar,
Qoyublar bikəsü biyar Hüseyni.

Bu gün Kərbübəladə ceyşi-üdvan,
Edüblər Əkbəri qan ilə əlvan,
Bu gün eylər mələklər nalə əfğan,
Təmami oxşayub ağlar Hüseyni.

Bu gün Leyla töküb qan yaş üzarə,
Edüblər Əkbərini parə-parə,
Bu gün Zeynəb olubdur bəxti qarə,
Salub qan üstünə əğyar Hüseyni.

Bu gün şahi-Mədinə qaldı yalquz,
Şəhid eylübdülər Əbbası qolsuz,
Bu gün qaldı Hüseyn tənha oğulsuz,
Qoyubla bikəsü biyar Hüseyni.

Bu gün Qasim batub qandan hənayə,
Hüseyn bir toy edüb növkədxudayə,
Bu gün bikəs ərus gəldi nəvayə,
Salun siz yada bir, hüzzar, Hüseyni.

*Əfrad*

Bu gün Hüseynün ədulər cəlalını aldı,
Yaralı peykərini topraq üstünə saldı.

Əliyyü Əkbərinün toy təbağı qan oldı,
Əzizə qızlarına Şimr pasiban oldı.

Bu gün şəhid edüb ə`da rəşid Əbbasın,
Hərəmlə bacıları xeymədə dutub yasın.

Əliyyü Əsğərini oxladı sitəmlə ədu,
Boğazınun qanı oldı ölən zəmandə su.

Bu gündə Qasim əlinün hənası qan oldı,
Ərusi-dərbədəri zarü növhəxan oldı.

*Təmamiyi-növhə*

Bu gün qanə batub qundaği-Əsğər,
Gəlüblər naləyə Ali-Peyğəmbər,
Bu gün qarə çəküb ərşə mələklər,
Şəhid edüb ə`da sərdar Hüseyni.

Bu gün Nadim edər göz yaşı cari,
Xəzan oldı Hüseynün növbəharı,
Bu gün qarə geyüblər bacıları,
Salub qan üstünə küffar, Hüseyni.

**Həzrət Zəhra (ə) dilindən**

Zəhra səni nə növ`i üryan aradə görsün,
Topraqlər üstə nə`şün, başun cidadə görsün.

Asudə olmaram mən heç Neynəva çölündə,
Tənha qalan zəmandan sən Kərbəla çölündə,

Zülfüm ağardı, qəlbim yandı bəla çölündə,
Zəhra səni nə növ`i tənha Minadə görsün.

Tapdım səni dübarə gözyaşlu Əkbər üstə,
Etdim sən ilə şivən şibhi-Peyəmbər üstə,
Qoydum yaralı başun bu qanlı mə`cər üstə,
Zibhi-əzim Xəlilün hansı Minadə görsün?

Bir də sənə yetişdim, qanə batanda Qasim,
Birdür məgər müsibət, oldı həzarə yasim,
Aldım diz üstə başun, qanə batub libasın,
Növhə edən zəmandə ol namuradə görsün.

Verdim səsivə bir də səs nəhri-Əlqəm üstə,
Al qan içində gördüm Əbbası pərşikəstə,
Can tapşıranda başun qoymuşdı sinəm üstə,
Hüccac əşki-çeşmim hansı Səfadə görsün?

Gördüm həvanı oldı tar, əsdi qarə yellər,
Lərzə edüb səmavat, şivən edüb mələklər,
Şimri-dəğanı gördüm almış əlinə xəncər,
Didəm nə növ`i xəncər ol gül qəfadə görsün.

Əğyar yandıranda suzanə xeyməgahi,
Övc eylədi səmayə Ali-Əbanın ahi,
Eylüb əsir düşmən ətfali-bipənahi,
Olmuş əsir əyalın əhli-inadə görsün.

Oldı düçar cismim, cövrü cəfayə sənlən,
Ruhim şəriki-qəmdür, hər cür bəlayə sənlən,

Kərbübəladə dözdüm, əmri-qəzayə sənlən,
İndi nə növ`i başun mətbəxsəradə görsün.

Bəzmi-əzadə ağla, sal şurü şeyni, Nadim,
Şövt eyləsən səbarə qəbri-Hüseyni, Nadim,
Peyğəmbərün məzarın görseydi yə`ni Nadim,
Öz mədfənin rizadır Beyti-Xudadə görsün.

**Həzrət İmam Hüseyn (ə)-la Həzrət Zeynəbün halallaşması**

Gəl, həlal eylə məni, Zeynəbi-müztər, gedirəm,
Bəzmi-canənə ürəkdağlı, mükəddər gedirəm.

Gəl, vida eylə məni, çün hələ fürsətdi, bacı,
Yetişüb mövsümi-qəm, vəqti-şəhadətdi, bacı,
Bu Hüseyn qardaşın imdi ki, səlamətdi, bacı,
Gəl, vida et, yola sal ölməgə, xahər, gedirəm.

Şimri-dun rahımi gözlür* nigəran əldə sinan,
Gözümi bağlayacaq qırmızı dəsmal ilə qan,
Mən öləndən sora çox zülfi yolub, etmə fəğan,
Sənə, ey baci, əmanətdi hərəmlər, gedirəm.

Rəhm elə, qardaş, Hüseyn, gözdən axan qan yaşıma,
Məni həsrət eləmə sən kimi bir qardaşıma,
Çün yəqinimdi mənim imdi kül oldı başıma,
Eyləmə dari-fəna içrə güni qarə məni.

---
* Gözləyir

Tükənüb vəqti-vüsal, mövsümi-firqət yetişüb,
İstirahət kəsilüb, mövsümi-firqət yetişüb,
Ey bacı, kəsmə yolum, vəqti-şəhadət yetişüb,
Olmağa, ey bacı, öz qanıma əlvan, gedirəm.

Bax, Hüseyn, göz yaşıma, eyləmə avarə bizi,
Qorxuram Şimr çəkər kuçəvü bazarə bizi,
Barı, tapşırgilən ol Abidi-bimarə bizi,
Şamdə Şimr çəkər kuçəvü bazarə məni.

Tökülər üstüvə qəm, səbr elə, biçarə bacı,
Çəksələr qolları bağlı səni bazarə, bacı,
Mənsiz icz eyləmə bu ləşkəri-xunxarə, bacı,
Dadxahundı sənün Xaliqi-davər, gedirəm.

Olma razi məni-biçarə cigər dağlamağa,
Qətlgahə gələrəm gözlərüvi bağlamağa,
Nə`şün üstə baş açub naləkünan ağlamağa,
Yaxşı həsrət elədi dəhrdə didarə məni.

Bacı, səbr eyləginən əmri-qəzavü qədərə,
Başımı zibh eləyüb, vırsalar od xeymələrə,
Çəksələr qolları bağlı sizi viranələrə,
Olmağa şiələrə həşrdə rəhbər, gedirəm.

Məni hicrün elədi Nadimi-biçarə, Hüseyn,
Tökərəm göz yaşını səfheyi-rüxsarə, Hüseyn,
Növhəxanun necə gör oldı güni qarə, Hüseyn,
Qoyma bu hal ilə dünyadə güni qarə məni.

## Yaralı

Yaralı cismi-şərifi qalan üryan, yaralı,
Etmisən şiələrün çaki-giriban, yaralı.

Qərq olan çahi-bəla içrə vətənsiz bədəni,
Olmayan üç günədək gül bədənün dəfn edəni,
Kərbəla türbəti kafur, pəs al qan kəfəni,
Cismi-məcruhi olan xak ilə yeksan yaralı.

Kur olaydı gözüm ey kaş, şəhi-təşnəcigər,
Halun heyrətdə qoyub halımı eylübdi digər,
Əbd mövlasın o növ`i görə, asandı məgər?
Yaralı canuva canım ola qurban, yaralı.

Gördi Zəhra səni o növ`i, necə səbr elədi,
Əşkini qətreyi-neysan, gözini əbr elədi,
Başuvı aldı dizi üstə, gözüvi sürmələdi,
Nə`şivün üstə olub zülfi pərişan, yaralı.

Kufəyan qətlə yetirdi çox həqarətlə səni,
Qurı torpağə yüzi üstə salub gül bədəni,
Arxadan kəsdi cəfa ilə başun Şimri-dəni,
Oldı sərsiz bədənün zinəti-meydan, yaralı.

Başuvı vurdı Sinan navəkü şeşpər başına,
Səpdi xakistər ədu xüldidə Heydər başına,
Səni sədparə görüb vurdı Peyəmbər başına,
Bavər oldıq ona biz eylərux əfğan, yaralı.

Tökərəm göz yaşını ruyimə hər şamü səhər,
Haluvı yad edərəm padşəhi-təşnəcigər,
Qəbrdə munis ola bəlkə mənə əşki-bəsər,
Nadimi söylər həmişə şəhi-ətşan, yaralı.

**Bu nə müsibətdi, cəhan ağlayur**

Bu nə müsibətdi, cəhan ağlayur,
Şahü gəda, pirü cəvan ağlayur.

Şiə olan qarə geyüb sinəçak,
Başə səpər əhli-cəhan gah xak,
Sinə giriban, özin eylər həlak,
Xəlqi-cəhan, mərdü zənan ağlayur.

Əmr eləyüb Xaliqi-ərşi-bərin,
Çün oluban qarənişin hurül-eyn,
Bais odur təşnə ölübdur Hüseyn,
Huriyü qılmani-cinan ağlayur.

Nur ilə məmlüv olub Kərbəla,
Cümlə mələklər hamı eylür səda,
Başı açux cümleyi-şahü gəda,
Dutmuş əza xasü əvam ağlayur.

Bu qəmə ağlalla məlaik hər il,
Qarə geyibdür bu zəman Cəbrəil,

Nuhi-nəbi, Adəmü İsa, Xəlil,
Cümləsi bu möhnətə qan ağlayur.

Qıldı nüzul ol çölə cəm` ənbiya,
Hər biri bir növ` ilə eylür səda,
Olmuş əzadar Rəsuli-Xuda,
Əşrəfi-məxluqi-zəman ağlayur.

*Əfrad*

Bu günki gündə əzadar olub Rəsuli-Xuda,
Bu gün o çöldə qılub tə`ziyəsəra bərpa.

Yanında hazır olub cəm`i-ənbiyayi-cəlil,
Başında taci-təqərrüb gəlübdi Cəbrəil.

Bu gündə Kərbübəlayə gəlüblə şivənşeyn,
Budur ki bais, ölüb təşnələb İmam Hüseyn.

Nə bivəfayimiş, Allah, bu əhli-Kufəvü Şam,
Şəhid edüblə Hüseyni bu gün bəzülmi-təmam.

*Baqiyi-növhə*

Şahi-Nəcəf əldə çün əmmaməsi,
Salmış o səhrayə oğul vay səsi,
Ağlar, oğul vay deyüb ol bikəsi,
Nasiri-din, gənci-iman ağlayur.

*Əfrad*

Bu gündə Kərbübəlayə gəlüb Vəliyullah,
Hüseyn, Hüseyn deyüb eylür fəğanü naləvü ah.

Yetəndə Kərbübəlayə o Padşahi-Nəcəf,
Təmam huriyü qılman durub səfəndərsəf.

Biri Hüseyninə ağlar, birisi Əkbərini,
Birisi dəstinə almış Əliyyü Əsğərini.

Gəlüb fəğan ilə çün padşahi-fəthi-Hüneyn,
Deyərdi, Kərbübəla dəştinün qəribi Hüseyn.

Səni kim eylədi bu qanə laləzar, oğul,
Müsibətində məni etdi biqərar, oğul.

O vəqtə cümlə mələklər edərdi nalə, fəğan,
Hüseyn qəmində təmamən edəllə əşk rəvan.

*Baqiyi-növhə*

Fatimə hər vəqtə edər ahü zar,
Möhnəti-üzmayə olubdur düçar,
Qətli-Hüseyn çünki qılub biqərar,
Qəmdən olub qəddi kəman ağlayur.

*Əfrad*

Gəlübdi naləkünan Fatimə edər əfğan,
Deyər, bu haluva olsun, oğul, anan qurban.

Nə haldur bu, nə möhnət, bu nə əlamətdür,
Bu gün bu haluvı görmək mənə qiyamətdür.

Deyər, oğul, səni kim qanə laləzar eləyüb?
Yıxubdı xaneyi-imanı tarümar eləyüb.

Həmişə mən bu müsibətdə ağlaram, ya Rəb,
Əsir şəhrbəşəhr gəzər qızım Zeynəb.

*Baqiyi-növhə*

Çünki qiyamət o gün oldı əyan,
Zeynəbi-nalan edər ahü fəğan,

Nalə edər Abidi-bixaniman,
Qüssəsi çün olmuş əyan ağlayur.

Hökm eləyüb Şimri-ləini-qürur,
Zülmini çün qıldı o çöldə zühur,
Nazlı Səkinə edər əfğanü şur,
Düxtəri-sultani-cəhan ağlayur.

Kərbübəladə necə tufan olub,
Zülm ilə çün yetmiş iki qan olub,
Şahi-Hicaz qan ilə yeksan olub,
Zeynəb edər əşk rəvan ağlayur.

*Əfrad*

Əman o gün ki, çün oldı əsir Zeynəbi-zar,
Hüseyn, Hüseyn deyübən eyləyirdi naləvü zar.

Baxardı nə`şi-Hüseynə, çəkərdi dildən ah,
Yetişdi naləkünan bir çuxur yerə nagah.

Səlam edüb o qəribü şəhidi-biyarə,
Görüb o dəmdə cəvab olmadı o biçarə.

Dedi: məlul məni qılma, dur, səlamımı al,
Fəraq vəqtidi, qardaş, qoluvı boynuma sal.

*Təmamiyi-növhə*

Nazlı Səkinə çün olub zöhrəçak,
Nalə qılar, cismini eylər həlak,
Gördi Hüseyn çün olub aludəxak,
Sölüb, oyan, şahım, əman ağlayur.

Leyla əzadar oluban Əkbərə,
Möhnəti tə`sir qılub göglərə,
Ağlar Əli Əkbəri-qəmpərvərə,
Bais odur, ins ilə can ağlayur.

Tazə ərus imdi olub növhəxan,
Əşk töküb ruyinə eylür fəğan,
Növhə edər şur ilə ol natəvan,
Qasimi-naşadə nihan ağlayur.

Nadimi-biçarə olub növhəxan,
Çün bu müsibətdə olub bağrıqan,
Ağlayun, ey şieyi-mərdü zənan,
Xəlqün olub karı fəğan, ağlayur.

**Ya Rəb, bu necə qəmdi ki, aləmləri dağlar**

Ya Rəb, bu necə qəmdi ki, aləmləri dağlar,
Aləmləri dağlar, dili-Peyğəmbəri dağlar.

Ya Rəb, bu nə möhnətdi batub yasə mələklər,
Qarə geyinüb Məryəmü Sara ilə Hacər,
Zəhra eləyüb "va vəlәda" zikrini əzbər,
Bu fəsli-büka gülşənara gülləri dağlar.

Qanə boyanub ərşü səmavati-İlahi,
Bu möhnət edüb qəmzədə xurşid ilə mahi,
Tə`sir eləyüb şiələrə Zeynəbün ahi,
Ahın şərəri bu dili-xunpərvəri dağlar.

Zeynəblə edər nalə bu gün bir neçə mə`sum,
Məhmələ məni-zarə olubdur belə mə`lum,
Eylüblə Şəhi-dini yəqin kin ilə məzlum,
Ol şahə olan zülm Şəhi-məhşəri dağlar.

Ol çöldə ədu qurdula məkr ilə nizami,
Çəkdi Şəhi-din cəngə o küffari-təmami,
Şimr axırı zibh etdi səri-paki-İmami
Ol şahun o halı dili-qəmpərvəri dağlar.

Oldı bu qəmə didələrim xun ilə pürnəm,
Rüxsarə gözüm yaşı olar cari dəmadəm,
Qəlbim yanar odlar kimi hər mahi-mühərrəm,
Ahım şərəri-suzi bu aləmləri dağlar.

Qoydula susuz itrəti-ətharı bu ayda,
Eylüblə şəhid qolsuz Ələmdarı bu ayda,
Təndən cüda oldı iki qollari bu ayda,
Qəlbimi onun qət` olunan əlləri dağlar.

Oldı o Şəhün təşnə Əli Əkbəri ətşan,
Eylər anası ruzü şəbi naləvü əfğan,
Söylərdi, dəxi vırmayun, ey ləşkəri-üdvan,
Bəsdür mənə bu yarə, babam Heydəri dağlar.

Ey qövm, yəqin eylün, anam qaldı oğulsuz,
Bu yarə məni öldüri* dərdim olu** büruz,
Bikəs anamı imdi yəqin qoyduz oğulsuz,
Görsə məni, bu halım o biyavəri dağlar.

Nadim, elə göz yaşuvı rüxsarə rəvanə,
Ta vardı həyatun, elə növhə o cəvanə,
Sal şuri-Əli Əkbəri bu ruyi-cəhanə,
Vallahi, onun o haləti Peyğəmbəri dağlar.

## Sənün imdi dolanur qəbrüvə zəvvarun, Hüseyn (ə)

Sənün imdi dolanur qəbrüvə zəvvarun, Hüseyn,
Biz də bu dəstə ilə ollux əzadarun, Hüseyn.

Sənə agahdı, Mövla, kəsilübdür yolumız,
Bu ili yetmədi şeşguşə məzarə əlimiz,
Va Hüseyn söylər əzalərdə həmişə dilimiz,

---

* Öldürür
** Olur

Ollux hər vəqfdə şövq ilə nəvakarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Öldürüb əhli-cəfa Övn ilə həm Cə`fərüvi,
Əlün üstündə susuz oxladılar Əsğərüvi,
Gün qabağında susuz doğradılar Əkbərüvi,
Qalmadı bir nəfər əshab ilə ənsarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Tökərux göz yaşını səfheyi-rüxsarə hər il,
Gər əcəldən verə möhlət bizə ol Rəbbi-Cəlil,
Çün düşüblər hamı bu dəstə bu dərgahə dəxil,
Arizu eylərux eyvani-təlakarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Tökərux göz yaşı çün soldurub ə`da gülüvi,
Kərbəladə susuz öldürdülər yeksər elüvi,
Boyuyub xuni-cəfa Qasimi-şirindilüvi,
Başınun qanı xizab eylədi rüxsarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Qəddüvi bükdi sənün həzrəti-Əbbas ölümi,
Söylədün, qardaş, ədu kəsdilə çarə yolumı,
Sən öləndən sora bükdi qəmü möhnət belimi,
Sərnigun oldı ələm, öldi Ələmdarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Öpübən iyləyüb ağlardı Peyəmbər boğazun,
Dad o gündən ki, açub Şimri-sitəmkər boğazun,
Çün iki zərbət ilə kəsdi o xəncər boğazun,

Təşnələb zibh elədi qatili-xunxarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Od vırub əhli-cəfa, şö`lələnüb xeymələrün,
Qaçdılar çöllərə çün itrəti-xundidələrün,
Qaldı nar içrə əyal, Abidi-xunincigərün,
Sinəsin çak eləyüb Zeynəbi-biyarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Zibh edən vəqtə başun ərzü səma ağladılar,
Zeynəbin sinəsin hicran odına dağladılar,
Qol-qola itrəti-Tahanı ədu bağladılar,
Saldılar at döşünə xırda uşaqlarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

Ya Hüseyn, eyləmə sən aləmara xar bizi,
Cəzbeyi-eşqün edər ildə nəvakar bizi,
Hamı bu dəstə ilən sən elə zəvvar bizi,
Gələn il Nadimün olsun genə zəvvarun, Hüseyn.
Doğranub ənsarun, Hüseyn.

**Fatimeyi-Zəhra (ə) dilindən**
**oğlı Hüseynün (ə) başsız bədəninə**

Ey Kərbəla çölündə qurban olan Hüseynim,
Ətfalı təşnəlıqdan ətşan olan Hüseynim.

Bisər düşübdi nə`şün meydanə Kərbəladə,
Əlvan olubdı cismün al qanə Kərbəladə,

Gəlləm, oğul, bu gün mən əfğanə Kərbəladə,
Xun ilə cismi-pakı əlvan olan Hüseynim.

Xun bəstərində yatma, aç çeşmi-əşkbarun,
Dindir bu natəvanı, nalanü dilfikarun,
Döndi xəzanə yeksər gülzari-növbaharun,
Ey Kərbəla çölündə ətşan olan Hüseynim!

Eylər anan bu qəmdə əfğanü ahü nalə,
Düşdi bu dilşikəstə dərdü qəmü məlalə,
Cismün xərab olubdur xun ilə misli-lalə,
Ətfalı Kərbəladə giryan olan Hüseynim.

Aç çeşmi-xunfəşanun, ey varisi-Peyəmbər,
Eylər əsir əyalun Şimri-ləinü kafər,
Ağlar bu macəradə, əfğan edər Peyəmbər,
Sərnizə üstə virdi Qur`an olan Hüseynim.

Qıllam fəğanü nalə qılsam nəzarə cismün,
Zülm ilə kim edübdür bəs parə-parə cismün?
Kim bəs hənutün eylüb, qoyar məzarə cismün,
Zülm ilə xanimanı viran olan Hüseynim.

Aç çeşmüvi nəzər qıl, tufani-Kərbəlayə,
Rəhm et bu binəvavü nalani-Kərbəlayə,
Zinət verübdi qanun meydani-Kərbəlayə,
Ey cismi zəxmi-tirü peykan olan Hüseynim.

Eşqündə qıllam əfğan, ey varisi-Peyəmbər,
Ağlar bu macəradə, əza dutar mələklər,

Əmmaməsi əlində, ağlar bu çöldə Heydər,
Ey rəxti-xabi xaki-meydan olan Hüseynim.

Düşmiş yer üzrə cismün, ey sərvəri-Mədinə,
Baba deyüb bu çöldə zülfün yolar Səkinə,
Yandırdı xeyməgahun bu ceyşi-əhli-kinə,
Ətfalı Kərbəladə giryan olan Hüseynim.

Aç çeşmi-xunfəşanun, ey bimüin, oğul vay,
Dindir bu natəvanı, ey nuri-eyn, oğul vay,
Cari olubdı qanun, bisər Hüseyn, oğul vay,
Ey cismi Kərbəladə üryan olan Hüseynim.

Qan ilə cismi-pakun, əlvan olubdı yeksər,
Oldı əsir əyalun, ey Padşahi-məhşər,
Qarət edüb əsasun Şimri-ləinü kafər,
Ey Əhli-Beyti zarü heyran olan Hüseynim.

Bu möhnətü bəladən Nadim olub hərasan,
Çün ağlaya bu qəmdə ceyşi-süfufi-üdvan,
Saldı səmayə şivən dudi-dili-yetiman,
Baculları əsiri-üdvan olan Hüseynim.

**Həzrət Zəhra (ə) dilindən**

Düşən xaki-xun üstə üryan, oğul vay,
Susuz can verən Həqqə ətşan, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay,

Oğul vay, oğul vay, oğul vay, oğul vay,
Hüseyn vay, Hüseyn vay, Hüseyn vay, Hüseyn vay.

Gəlüb gər mədarun Kərbübəlayə,
Mələklər qarə çəküb ərşi-Xudayə,
Təmam ənbiyalər batub qərayə,
Olan cismi qan ilə əlvan, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

Səni kim bu halə salub, Şahi-məhşər,
Gözi yaşlu qalub təmam Ali-Heydər,
Əzadar olubdur bu çöldə Peyğəmbər,
Olub xanəsi xun ilə viran, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

*Əfrad*

Səni bu halə salan, gör, məni nə halə salub,
Görüb bu növ`i səni, qarə saçlarım ağarub.

Necə rəvadur qala topraq üstə gül bədənün?
Bu çöldə qaməti qəmdən əgildi qəmzədənün.

Buyur görüm mənə, kim xeyməgahı yandırdı?
Libasuvı bədənündən alub soyundurdı.

Bu qanlı gözlərüvi açgilən, müinim, oyan,
Yaralı cismüvə bikəs qalan anan qurban.

Kəsüb başuvı sənün, kim salıbdu səhrayə?
Bu gün qiyamətü məhşər olubdı Zəhrayə.

Əgər sənün başuvı kəsdilər ədavətdən,
Məni-zəbuni zəlil etdilər müsibətdən.

Bu zibh olan başıvun madərün fədası ola,
Kim əllərüvi, görüm, qət` edübdi, söylə, bala.

*Baqiyi-növhə*

Əsibdür nəsimi-sitəm gülzarə,
Vırub əhli-kin bu gül cismə yarə,
Bəs qüsl edüb kim qoyar səni məzarə,
Bu halun etdi məni giryan, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

Qalub nə`şi-pakun, Hüseyncan, aradə,
Yanub xeyməgahun bu möhnətsəradə,
Əzaxanə quraram bu Kərbəladə,
Töküb göz yaşı, qılam əfğan, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

Olub Əhli-Beytün əsir əşqiyayə,
Vırub başın Şimr növki-cidayə,
Gözün aç, nəzər sal mən binəvayə,
Olan qan ilə cismi əlvan, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

Səni, qəbih Şimri-dun bu Minadə,
Salub nə`şi bu gün yaralı aradə,
Gedən başı Şamə cidadə,
Tilavət edən səda Qur`an, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

Salub cismüvi Şimr parə-parə,
Sənə qüsl edüb, bir qoyan yox məzarə,
Dutub zülm ilə xeyməgahun şərarə,
Olan Əhli-Beyti hərasan, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

Qələm əldə Nadim yazar şərhi-möhnət,
Batub yasə, ağlar təmam imdi ümmət,
Edibdür növhəxan mən zarı müsibət,
Deyür Fatimə çünki ətşan, oğul vay.

Ölən Kərbübəladə vətənsiz, Hüseyn vay,
Qalan nə`şi üç gün kəfənsiz, Hüseyn vay.

**Xanım Fatimeyi-Zəhra (ə) dilindən**

Oyan, ey sərvəri-dövran, oğul vay,
Olan gül peykəri al qan, oğul vay.

Tərəhhüm et, oğul, bu dilhəzinə,
Məni gözyaşlı qoydı əhli-kinə,
Töküblər qanuvı ruyi-zəminə,
Salublar cismüvi üryan, oğul vay.

Bu halun canımı azarə saldı,
Əlimdən taqətü aramım aldı,
Əyalü itrətün gözyaşlı qaldı,
Olubdur Zeynəbim giryan, oğul vay.

Xəzanə döndi zülm ilə bəharun,
Solubdur Kərbəladə gül üzarun,
Əsir oldı ə`dayə bacularun,
Oyan, ey xanəsi viran, oğul vay.

Mələklər cümlə geymiş qarə camə,
Dutublar tə`ziyə bikəs İmamə,
Çəkəllər Zeynəbi bazari-Şamə,
Bu qövmi-ləşkəri-üdvan, oğul vay.

Gəlibdür bu çölə gözyaşlı Heydər,
Tökər göz yaşı rüxsarə Peyğəmbər,
Anan Zəhra, başında qarə mə`cər,
Olublar cümləsi nalan, oğul vay.

Qoyub zülmün binasın əhli-kinə,
Salublar ahü va ruyi-zəminə,
Baba-baba deyüb ağlar Səkinə,
Edibdür göz yaşın ümman, oğul vay.

Səmayə övc edər ahi-yetiman,
Olubdur Ali-Heydər zarü giryan,
Səkinə həm olub qəmdən hərasan,
Olundı xeymələr talan, oğul vay.

*Əfrad*

Sənə su vermədi düşmən kəsəndə peykərüvi,
Qiyamətə kimi gözyaşlı qoydı madərüvi.

Edübdi peykərüvi Şimr qan ilə əlvan,
Susuz dodaqlaruva binəva anan qurban.

Başun dalınca, oğul, Şamü Kufəyə gəlləm,
Əsirə qızlaruva mən də pasiban ollam.

Necə rəvadı başun, beylə küllər üstə qala,
Bu nazənin başuvı madərün fədası ola.

*Baqiyi-növhə*

Anava müşkil oldı bu müsibət,
Yetübdi cismüvə zəxmi-cərahət,
Qoyub Zəhranı gözyaşlı bu möhnət,
Edər həşrə kimin əfğan, oğul vay.

Dağılan izzəti Kərbübəladə,
Əsir oldı əyalun Neynəvadə,
Gedən Şamə başın növki-cidadə,
Tilavət eyləyən Qur`an, oğul vay.

Sənə su vermədi bu əhli-ləşkər,
Kəsdi susuz başun Şimri-sitəmkər,
Əldə cami-bülur, saqiyi-Kövsər,
Yolun gözlər deyər, ətşan oğul vay.

Düşübdür möhnətə Nadim nəvaxan,
Olubdur qüssədən zarü hərasan,
Ona fəryadrəs ol, Şahi-dövran,
Dur, eylə dərdinə dərman, oğul vay.

**Fatimeyi-Zəhra (ə) dilindən**

Oyan, ey sərvəri-dövran, Hüseyn vay,
Zəbihi-xəncəri-bürran, Hüseyn vay.

Qalan bu qürbət içrə nə`şi üryan,
Olan gül peykəri xun ilə əlvan,
Bu qanlı gözlərin aç, Şahi-dövran,
Olubdur göz yaşım ümman, Hüseyn vay.

Gəlibdür madərün ahü fəğanə,
Salubdur ahü va ruyi-cəhanə,
Dönüb Ceyhun kimi göz yaşı qanə,
Edəllər Əhli-Beyt əfğan, Hüseyn vay.

Gözün aç, Fatimə gəldi nəvayə,
Tökübləր qanuvı Kərbübəlayə,
Anan şivən salubdur Neynəvayə,
Oyan, ey nasiri-iman, Hüseyn vay.

Oğul, kim tabuvı əldən alubdur?
Səni zülm ilə bu halə salubdur,
Əyalü itrətün bisər qalubdur,
Olubla cümləsi giryan, Hüseyn vay.

Şəhid eylüb səni bu əhli-kinə,
Salublar cismüvi ruyi-zəminə,
Xərab səndən sora oldı Mədinə,
Yetişdi kaminə üdvan, Hüseyn vay.

*Əfrad*

Oğul, Hüseyn, gözün aç, xeyməgahun odlandı,
Yananda xeymələrün, cismim od dutub yandı.

Qəmü mühən bu biyabanda başdan aşdı,
Yanub xiyamlərün, itrətün çölə qaşdı.

Səkinənün cigərün əhli-kinə dağladılar,
Əzizə qızlarıvun qollarını bağladılar.

Ömər cəfası ilə gər mənim qapum yandı,
Həman od ilə bu gün xeyməgahun odlandı.

Bu qəmdə Nadimün oldı nəvaxan,
Çəkər tutisifət əfsusü əfğan,
Yetiş imdadinə, Şahi-şəhidan!
Edibdür möhnətün tüğyan, Hüseyn vay.

**Övladi-Peyəmbər yetişüb Kərbübəlayə**

Övladi-Peyəmbər yetişüb Kərbübəlayə,
Ənduhü qəm yüz verdi o dəm Ali-Əbayə.

Rahət olu sərmənzilinə yetsə müsafir,
Bari-qəmə bu qafilə bais nədür axir,
Ənduhü qəm oldı o bəlakeşlərə zahir,
Qərq oldı o qəm qafiləsi dərdü bəlayə.

Ol dəştə yetən vəqtdə Mövlayi-müəddəb,
Rəftarını tərk etdi rikabındakı mərkəb,
Gətdilər onun məhzərinə bir neçə əşhəb,
Qoymubla* dübarə qədəm ol xaki-bəlayə.

Sultani-mübin qaldı o əsnadə çün heyran,
Fikr aləminə övd eləyüb oldı pərişan,
Bildi həmin əhd eylədigi vəqt olub əl`an,
Atdan enübən qoydı qədəm dəşti-bəlayə.

Söylüb qədəm ol xakə qoyan vəqtdə təkbir,
Tapdı o zəman surəti-məhparəsi təğyir,

---

* Qoymayıblar

Əmr etdi çuxur yerdə edün xeymələr hazir,
Cəm` eyləyün ətfalımi bir yerdə sərayə.

Əbbasi-vəfapərvər edüb icz ilə izhar,
Aya nədi bais, buyurun, ey şəhi-əbrar,
Hər mənzilə yetsəydi babam Heydəri-Kərrar,
Söylərdi, çəkün xeymələri təlli-cəlayə.

Əmr eylə, nədür vəchi bəs, ey şahi-Mədinə,
Məhməlləri çəkməkdə əməngah zəminə,
Qorxum budur ağlar qala şəhzadə Səkinə,
Pabəstə olar zülm ilə zənciri-cəfayə.

Çün verdi cəvab, mövsümi-ənduhü bəladur,
Əhd eylədigim vəqt yetüb, fəsli-əzadur,
Qardaş, belə bilgil ki, bu yer Kərbübəladur,
Bu çöldə gələr əhli-hərəm şurü nəvayə.

Mə`mən yerə çəkməkdə qətari budı mətləb,
Zibh eyləyəcəklər məni çün təşnəcigər ləb,
Başım kəsilən vəqtidə ta görməyə Zeynəb,
Müşkildi bu möhnət çox o banuyi-həyayə.

Bu çöldə batar yasə hamı Ali-Peyəmbər,
Əlvan olacaq qanına nakam Əli Əkbər,
Bu sinəmün üstə çıxar ol Şimri-bədəxtər,
Başım vıracaq Xuli ləin növki-cidayə.

Bu çöldə gərək Qasimə bir toy edəm icad,
Ol toyda xizab etsün əlin qan ilə damad,

Toy hücrəsi qarətgər əlində olu bərbad,
Toy rəxti ərusun dönə zülm ilə qərayə.

*Əfrad*

Bu yer o yerdi, batar qanə Əkbərü Əbbas,
Bu yerdə Ali-Peyəmbər dutar cəvanlara yas.

Bu yerdə Əkbərimi parə-parə doğrallar,
Əlimdə Əsğərimi əhli-kinə oxlallar.

Bu çöldə qanə batar bu Hüseyni-təşnəcigər,
Tökər üzarinə göz yaşı Zeynəbi-müztər.

*Təmamiyi-növhə*

Bu şahi-Hicazın pozar ə`dalər əsasın,
Külsum salacaq başına Əbbas qərasın,
Şimrün özi Xaliq verə məhşərdə cəzasın,
Mane` olu ol ərsədə çün bəzmi-əzayə.

Zəncirə çəkər itrəti-əthari ədulər,
Qolbağlu gələr naləyə gülyüzli hərəmlər,
Üryan dəvələr üstə təmam Ali-Peyəmbər,
Cövlan eləyüb, səbr eləyər əmri-qəzayə.

Çünki özüm əhd eyləmişəm can verəm ətşan,
Bu çöldə kəsilsün mən ilə bir neçə qurban,
Ta şamü səhər növhə edə Nadimi-nalan,
Hər bəzmi-əzadə gələ şur ilə nəvayə.

## Ağlaram bu qəmdə

Ağlaram bu qəmdə, cümlə şiələr qan ağlayur,
Mərdü zən, şahü gəda olmuş nəvaxan, ağlayur.

Şiələr qarə geyüb əllərdə çün qarə ələm,
Bu müsibətdə təmamən ağlayarlar dəmbədəm,
Çün Fərat üstə Ələmdarın qolı oldı qələm,
Görmüş Əbbasın o halın Şahi-mərdan ağlayur.

Əkbəri meydanə göndərdi Şəhidi-Kərbəla,
Parə-parə ol cəvani doğradılar əşqiya,
Bu cəvanın matəmində xəlq hamı geymiş qəra,
Masiva cümlə hamı olmuş əzaxan, ağlayur.

Kərbəladə toy edibdür Qasimə Şahi-zəman,
Toy hənasın zülm ilə əhli-cəfa eylüblə qan,
Çün ərusi-binəva olmuş bu qəmdən növhəxan,
Qəlbi pürxun, çeşmi məhzun, zarü giryan ağlayur.

Kərbəla sultanını öldürdilər əhli-zülam,
Xeyməgahi zülm ilə qarət edüblər əhli-Şam,
Ey könül, göz yaşını rüxsarə cari müdam,
Bu əzayi-qəmfəzadə cümlə insan ağlayur.

Zeynəbi-biçarəni Şimr eyləyibdür dəstgir,
Xeyməgahə od vırublar büğz ilə qövmi-şərir,
Sənə giryan, qəlbi suzan qövmi-dun eylüb əsir,
Ali-Peyəmbər olub zarü hərasan, ağlayur.

Çulğuyub şivən səsi Kərbübəla səhrasını,
Öldürüblər kin ilə ətşanların səqqasını,
Nəhri-Əlqəm üstə qolsuz saldılar Əbbasını,
Çün Ələmdarı ölən Şahi-şəhidan ağlayur.

Sən də ağla bu əzadə, şur ilə eylə səda,
Qanına əlvan olubdur Padşahi-Kərbəla,
Ağla, göz yaşilə bu Şahi özindən et riza,
Ənbiyalər, övliyalər eylüb əfğan, ağlayur.

Nadima, bu qəmdə göz yaşın üzarə qıl rəvan,
Mətləbün etsün rəva aləmdə Sultani-zəman,
Yaz qələm əldə risalə, ruzü şəb, eylə fəğan,
Ya Hüseyn, olmuş sənə Nadim nəvaxan, ağlayur.

**Mədinədə qalan Fatimeyi-Süğra dilindən**

Cəddə, bu gecə xabdə mən Əkbəri gördüm,
Əlvan olub öz qaninə ol yavəri gördüm.

Gördüm çü durub dəşti-biyabandə heyran,
Zülfündən axar qan eləyər ruyini əlvan,
Bu vaqiədən, cəddə, bu gün oldum hərasan,
Qan içrə düşüb Əkbəri-xoşmənzəri gördüm.

Gördüm o biyabandə Ceyhunə dönüb qan,
Ol dəştdə Leyli eləyər naləvü əfğan,
Vallahi, bu qüssə eləyüb qəlbimi viran,
Xak üstə düşüb surəti-Peyğəmbəri gördüm.

Ol dəştdə çün göz yaşı ümmanə dönübdür,
Gördüm ki, o səhranı qızıl qanə dönübdür,
Toy xəl`əti çün Əkbərimün qanə dönübdür,
Parə bədəni, Əkbəri-qəmpərvəri gördüm.

Gördüm babamun dövrini düşmənlər alıbdur,
Ol çöldə babam bikəsü biyar qalıbdur,
Qəmdən babamun gül kimi rəngi saralıbdur,
Tənha qalub ol çöldə Şəhi-məhşəri gördüm.

Qundaği-Əli Əsğəri gördüm olub al qan,
Ağlar əlinün üstə dutub Şahi-şəhidan,
Eylüblə yəqin xaneyi-Peyğəmbəri viran,
Hülqi-dəmi peykannişan Əsğəri gördüm.

Gördüm o biyabanda qiyamət olub icad,
Şövq ilə babam çün eləyüb Qasımi damad,
Döndərdilə yasə o toyi ləşkəri-bidad,
Sədparə düşüb Qasımi-gülpeykəri gördüm.

Gördüm əmimün dövrini düşmənlər alublar,
Qollarını çün abi-Fərat üstə salublar,
Övladi-Əli xeymədə ləbtəşnə qalublar,
Əbbasi-ələmdari-vəfapərvəri gördüm.

Gördüm su yolın bağlayub ol ləşkəri-kinə,
Ağlar ətəşdən yetişüb canə Səkinə,
Hər vəqt təsəlli verür ol mahi-Mədinə,
Qəmxar ona Əbbasi-hünərpərvəri gördüm.

Cəddə, mənim əhvalimə rəhm et, səni Tari,
Bir dut əlimi dışra çıxat, sən məni, bari,
Bir namə yazım göndərim ol Kufəyə sari,
Əfğanə gəlüb Zeynəbi-didətəri gördüm.

Bu vaqiədən çünki alub canımı qəmlər,
Gördüm olub üdvanə əsir Zeynəbi-müztər,
Eylübdi əsir əmmələrim Şimri-sitəmkər,
Gözyaşlı qalub Zeynəbi-bimə`cəri gördüm.

Bu vaqiə, vallahi, alub tabü təvanım,
Bu möhnətü qəmdən çıxar əflakə fəğanım,
Ağlar mənim əhvalıma hər vəqtdə Nadim,
Növhə eləyər Nadimi-qəmpərvəri gördüm.

**Mədinədə qalan, İmam Hüseynin qızı**
**Fatimeyi-Süğra dilindən**

Ey Xuda, qan oldı könlüm, həmzəbanım gəlmədi,
Əkbəri-xoşmənzərü arami-canım gəlmədi.*

Məni-əlili qoydılar gözyaşlı ağlar müttəsil,
Yanmayub nari-qəmə bir kimsə məntək bu qəbil,
Bəs nə çarə eyləyim, ya Rəb, məni-zarü əlil,
Nə babam, nə əmulər, bir mehribanım gəlmədi.

Və`də etmişdi babam dəvət edə mən müztəri,
Məndən ötri göndərə şibhi-Peyəmbər Əkbəri,

---
* Bu beyt təkrardır. Qəzəllərin birində getmişdir. Qəzəldə "Əkbər" yerinə "munis" verilmişdir.

Qalmayub yoxsa babamun kimsə yarü yavəri?
Nari-hicrə yandı məğzi-üstüxanım, gəlmədi.

Bu gecə mən xabdə aşüftəhalət görmüşəm,
Yarü yavərdən nə bir kimsə səlamət görmüşəm,
Zahir olmuş bir biyabanda qiyamət görmüşəm,
Əzm edən mülki-Əraqə karivanım gəlmədi.

Xabdə gördüm babam tənhavü sərgərdan qalub,
Dövrəsin səf-səf təmamən qan tökən üdvan alub,
Gül cəmalı kəhrəbatək möhnətü qəmdən solub,
Bəs səlamətdür, neçün Şahi-cəhanım gəlmədi?

Qəlbimin aramı Əkbər gördüm olmuş qərqi-xun,
Az qalub bu vaqiə, ya Rəb, məni etsün cünun,
Qəlbim oldı qan ələmdən, gözlərəm hər gün yolun,
İntizarəm ağlamaqdan, çıxdı canım, gəlmədi.

Tifl çağımda müsibət qəddimi eylübdi xəm,
Möhnətü dərdü qəmim artar, Xudaya, dəmbədəm,
Gördüm üdvan eyləyibdür Əbbasun dəstin qələm,
Qəm həlak eylər məni, qəmpərvəranım gəlmədi.

Qasimi-naşadı gördüm dəstün eylüb qan xizab,
Şö`ləvər oldı, alışdı mülki-dil misli-kəbab,
Qarə üstdən qarə geymiş əgninə Ali-Türab,
Yox səlamət heç kəsim, axir gümanım gəlmədi.

Əsğərün qundağını gördüm babam almış ələ,
Qan ilə sirab edüb dəstində zülmi-Hərmələ,

Kərbəla səhrasını dutmuş sərasər zəlzələ,
Zeynəbi-biçarəvü bixanimanım gəlmədi.

Nadimi-biçarətək məhzunü giryan olmuşam,
Ruzü şəb Məcnunsifət zarü pərişan olmuşam,
İntizardurlar sənün taqündə dərban olmuşam,
Sahibi-Qur`anü minbər, kamranım gəlmədi.

**Fatimeyi-Süğra dilindən**

Getmə Əraqə, ey baba, qoyma məlal ilən məni,
Getməgün olsa, həmrəh et, əhli-əyal ilən məni.

Getsəz Əraqə, ey baba, mən necə yarsız qalım,
Qət` olu səbrü taqətim, səbrü qərarsız qalım,
Əmmələrim ümum gedüb, əmmü kibarsız qalım,
Həmnişin eylə, barı, ol Haşimi xal ilən məni.

Əkbərimi aparma çox, vardur ona məhəbbətim,
Getsə Əliyyü Əkbərim taq olu səbrü rahətim,
İmdi ki, həmrəh olmağa yoxdı bədəndə taqətim,
Qoy bu vətəndə, Əkbəri-mahcəmal ilən məni.

İmdi ki, getməgi, baba, Əkbərimün olub zərur,
Ta ki, gəlincə Əkbərim eylərəm ahü nalə şur,
Tapşur, əmandı, Zeynəbə, ey baba, əmmərnə buyur,
Qoymaya guşələrdə tək fikrü xəyal ilən məni.

Əmməmi söylüsən, baba, əhli-əyalə yar olar,
Bəs mənə kim bu xanədə munisü qəmküsar olar?

Fikrü xəyal ilən Əlinün gözi müşkbar olar,
Dindürür ağlayanda kim çeşmi-hilal ilən məni.

Barı, bacım Səkinəni, qoy qala, yavərim baba,
Çünki yetiməyəm mənim sağ dəgi madərim, baba,
Rehlət edəndə yox anam bağlaya gözlərim, baba,
Tapşurusan kimə, baba, bəs dili-qal ilən məni.

Cari edüb üzarimə göz yaşı siz gəlincə mən,
Qürbət olar mənə, baba, hicr ilə guşeyi-vətən,
Tapsa əcəl gəlincə siz, kim mənə eyləyər kəfən,
Kim, baba, dəfnü kəfn edər cahü cəlal ilən məni.

Nadim, Hüseynün adını sal hər əmrdə yaduva,
Dari-fənadə Həqq səni ta yetirə muraduva,
Qəbrə düşən zəmandə yetsün əmusi daduva,
Qanlı ələm əlində dərk etsün o hal ilən məni.

**Fatimeyi-Süğra dilindən**

Bu nə dərdü qəmdür eylüb məni bağrıqan, İlahi,
Hanı Əkbərim ki, eylüm qəmimi bəyan, İlahi.

Bu nə dərdü qəmdi, canım şərəri-fəraqə yandı,
Bu yaralı qəlbim, Allah, genə qan ilən boyandı,
Gedüb Əkbərim əlimdən, elə adətim fəğandı,
Kimə dərdimi deyim bəs məni-natəvan, İlahi.

Nə yanımda vardur əmməm, nə bacım nə bir müinim,
Nə yanımda var Səkinə, o əzizi-nuri-eynim,

Eyləyüb vətən qəribi məni Şahi-məşriqeynim,
Bir əlileyi-yetiməm, qurtarubdur can, İlahi.

Hanı bəs vəfalı Əbbas, gəlüb halımı soruşmur,
Bu vətəndə dutmuşam yas, o məlalımı soruşmur,
Gedüb izzətim əlimdən, o cəlalımı soruşmur,
Nə rəvadı yalquz evdə çəkəm əl-əman, İlahi.

Gedüb Əkbərim əlimdən, elərəm fəğanü nalə,
Budur arizum dübarə yetişə əlim vüsalə,
Gələ Əkbərim dübarə yetişəm o xoş məqalə,
Nə ola gələ səlamət o əzizi-can, İlahi.

Məni qoydılar bu evdə hamısı Əraqə getdi,
Gözi yaşlı, qəlbi dağlı, salub əşqiyayə getdi,
Ürəgim alışdı, ya Rəb, şərəri-fəraqə getdi,
Dəxi yoxdı bir pənahım olam həmzəban, İlahi.

Əzəl Əsğərün qundağın gətirüb qucağə allam,
Bəzərəm Əli otağın, sərinə təsəddüq ollam,
Məni öldürür bu firqət özüm öz qəmimi billəm,
Əli Əkbərin qəmində könül oldı qan, İlahi.

Eyləyüb əhatə, ya Rəb, məni yalquz evdə möhnət,
Əriyibdür cismi-zarım, qədimi büküb müsibət,
Budur arzum, ey İlahi, gələ əmmələr səlamət,
Bu libasımı fəqirə verim ol zəman, İlahi.

Bu cəhandə dərd əlindən yetişibdü canə Nadim,
Salu* va Hüseyn sədasın genə asimanə Nadim,
Alışub şərari-narə, gəlüb əl-əmanə Nadim,
Əriyübdi dərd əlindən, qurtarubdı can, İlahi.

**Fatimeyi-Süğra dilindən**

Səfər eyləmə Əraqə, Əli, qardaş, əl-əmandur,
Dözə bilmərəm fəraqə, Əli, qardaş, əl-əmandur.

Gözi yaşlı qoyma, rəhm et, məni-zari, mən əliləm,
Yox anam mənə himayət eyləsün ki, mən zəliləm,
Əlim üzmə damənündən, sənə gəlmişəm, dəxiləm,
Dözə bilmərəm fəraqə, Əli, qardaş, əl-əmandur.

Gedəsən Mədinədən sən, mənə kim edər məhəbbət?
Yanaram şüayi-hicrə, məni yandırur bu firqət,
Məni sənsiz, ey bəradər, bu bəlavü bu müsibət,
Dözə bilmərəm fəraqə, Əli, qardaş, əl-əmandur.

Gedüsən** Əraqə, qardaş, məni də apar yanunca,
Çəkə bilmərəm fəraqun, edərəm fəğan ölüncə,
Tökərəm sirişk üzarə bura ta ki, sən gəlincə,
Dözə bilmərəm fəraqə, Əli, qardaş, əl-əmandur.

Gözümün yaşına rəhm et, məni qoyma bibəradər,
Məni də apar Əraqə, ey əzizi-cani-madər,

---

* Salır
** Gedirsən

Mənə bir də söylə, vəslün olacaq haçan müyəssər?
Dözə bilmərəm fəraqə, Əli, qardaş, əl-əmandur.

Bəli, bacular cəhanda olu qardaşına mahir,
Əli, sən gəlüncə geyməz bu bacun libasi-faxir,
Neçə illər ilə bəs səbr eyləyim fəraqə axır,
Dözə bilmərəm fəraqə, Əli, qardaş, əl-əmandur.

Qələm əldə yaz risalə elə ahü nalə, Nadim,
O əlilənün o halun gətirüb xəyalə, Nadim,
Məni ol yetimün halı gətirür məlalə, Nadim,
Dözə bilmərəm fəraqə, Əli, qardaş, əl-əmandur.

**Seyyidüşşühəda (ə) dilindən**

Ey ana, qoy başımı ahəstə al qan üstünə,
Saxlama sinəndə, qoy bu qanlı meydan üstünə.

Razıyam cəddim məni öz qanıma qəltan görə,
Rəxti-xabım növkü peykan, dəstəmazım qan görə,
Balıcım şəmşirü xəncər, nə`şimi üryan görə,
Öz ridasın çətr edə sədparə qurban üstünə.

Canımı bəzl etmişəm ruzi-əzəl cananıma,
Kərbəla torpağı ta məmzuc ola öz qanıma,
Naz edəm qanə boyanmış Xaliqi-sübhanıma,
Cədvəl olsun ta o qan, dünyadə fürqan üstünə.

Kufəyan oldı mənə yağı misali-qövmi-Lut,
Parə-parə doğranub ta eylərəm Həqqə sübut,

Üç gecə-gündüz  qum üstə qalsa cismim bihənut,
Salsun ə`da cismimi xari-müğilan üstünə.

Nəhrtək qanım rəvan olsun boğazımdan gərək,
Əllərim olsun xizab qan dəstəmazımdan gərək,
Feyz aparsun şiələr razü niyazımdan gərək,
Göz yaşilə eyləsünlər fəxr Qur`an üstünə.

Eylədim Həqqə fəda əshabımı, ənsarımı,
Zibh edəllər əşqiyalər cümlə qurbanlarımı,
Cövr ilə xar əl tapub, soldurdular gülzarımı,
Tökdülər bibalü pər reyhanı reyhan üstünə.

Etmişəm canə qəbul bu ərsədə can verməgi,
Min üç yüz əlli yara bir cismdə san verməgi,
Bu Minadə şövq ilə hər növ`i qurban verməgi,
Töksün ə`dalər, susuz qurbanı qurban üstünə.

İstərəm mən qan ilə əlvan olunmuş vəsli-yar,
Etmişəm ruzi-Ələstdə yar ilə beylə qərar,
Başımı, övladımı, ənsarımı qıllam nisar,
Zivər olsun qanımız xaki-biyaban üstünə.

Razıyam etsə əsir ə`da əgər ətfalımı,
Xeyməgahə od vırub, gər qarət etsə malımı,
Şiələr salsun xəyalə bu susuz əhvalımı,
Cürbəcür möhnət qoyub yüz Şahi-dövran üstünə.

Nadima, bu möhnət eylər qəlbimi, billah, kəbab,
Doymayub cövrü cəfasından Yəzidi-bihicab,

Hər bəlavü möhnətə səbr eyləyüb Ali-Türab,
Xeyzərani-çubi vırdı dürr dəndan üstünə.

**İmam Hüseyn əleyhissəlamdan ləşkərə xitab**

Bu Kərbübəladə batam al qanə, rizayəm,
Bisər salasuz ərseyi-meydanə, rizayəm.

Fikr eyləməyün ki, Hüseyn öz halına ağlar,
Nə başı kəsik bir bölük ətfalına ağlar,
Aşiq yetişən vəqtidə cananına ağlar,
Verməkligə min şövq ilə cananə, rizayəm.

Eşq əhli həmişə rəhi-cananı gözətlər,
Bülbül çəməni, vəsli-gülistanı gözətlər,
Dil qanə dönüb, çıxmağa bu canı gözətlər,
Çox yarə vırun, ta yetirün canə, rizayəm.

Kəssün başımı Şimr ki, mətlubinə yetsün,
Qoy, əhli-cəfa cümləsi məqsudinə yetsün,
Ta ölsün Hüseyn, Xaliqi-mə`budinə yetsün,
Qurbandı bu can Xaliqi-sübhanə, rizayəm.

Bəs harda qalub, gəlmiri ol Şimri-şərarət,
Gəlsün, yetişibdür bu zəman vəqti-şəhadət,
Qan içrə gərək Xaliqimə eylüm ibadət,
Cami-əcəli içməgə məstanə, rizayəm.

Bu çöldə gərək dəstəmaz abım ola al qan,
Fərşim qurı yer, səcdəgəhim xəncəri-bürran,

Mən razü niyaz eyləyirəm qan ilə al qan,
Zeynəb gələ ol vəqtdə əfğanə, rizayəm.

Qoy, cövrü cəfa cümləsi itmamə yetişsün,
Kəssün başımı Şimri-dəğa, kamə yetişsün,
Min doqquz yüz əlli yara bu canə yetişsün,
Qanım qarışa xari-müqilanə, rizayəm.

Qarət eləsün xeymələrim zümreyi-kafər,
Qalsun bədənim ərseyi-meydandə bisər,
Qur`an oxusun növki-cidadə başım əzbər,
Gər nizə başında gələ cövlanə, rizayəm.

Bu sinəmə ol Şimri-dəğa çəkməli çıxsun,
Kəssün başımı, xaneyi-Peyğəmbəri yıxsun,
Mən zibh olunan vəqtə, anam Fatimə baxsun,
Qanım verə zinət bu biyabanə, rizayəm.

Ox yarəsi bu sinəmə üst-üstə vırulsun,
Bu Kərbübəladə bir əzaxanə qurulsun,
Ta Abidimün boynuna qiladə vırulsun,
Gər mindirəsüz naqeyi-üryanə, rizayəm.

Bu çöldə gərək xeymələrim zülm ilə yansun,
Övladi-Əli Kufədə bazarı dolansun,
Kül üstə tənur içrə başım bir gecə qalsun,
Gözyaşlı anam gəlsə o məskanə,* rizayəm.

---

* Məskən

Zülm ilə sinəmdən neçə qan nəhridi cari,
Şamə çəkilüb Zeynəbü Külsum qətari,
Olsa əgər ol düxtəri-şəhzadə məzari,
Ol Şamdə bir guşeyi-viranə, rizayəm.

Ətfalı çəkən vəqtdə ol bəzmi-Yəzidə,
Vallahi, rəvadur tökə xun-əşk hamı didə,
Çubi gətürən vəqtdə deyün, bari, Yəzidə,
Hər qədri vıra bu ləbi-suzanə, rizayəm.

Vallah, bu müsibətdə tökər göz yaşı Heydər,
Əfğanə gəlüb nalə edər Şafiyi-məhşər,
Hər bəzmi-əzadə bu kəlamı edə əzbər,
Nadim qələm əldə gələ əfğanə, rizayəm.

**İmam Hüseyn (ə) Həzrət Zeynəbə xitabən**

Bu zəmini-Neynəvadur, ey bacı, Mina degil,
Ərseyi-Kərbübəladur, vadiyi-Sina degil.

Bu zəminün qissəsin cəddim mənə e`lan edüb,
Çün mənə qismət bu dəşti, Xaliqi-Sübhan edüb,
Məndən ötri burda bir mərqəd Xuda pünhan edüb,
Bu zəmin dəşti-bəladur, Yəsribü Bətha degil.

Burda çün Adəm, qılubdur, xilqəti-əzzəl, nəmaz,
Ənbiyalər burda eylüb Həqq ilə razü niyaz,
Mən də burda qan içində eylərəm Mə`budə naz,
Cümleyi-xaki-bəla bu türbətə həmta degil.

Mən kimin bu Kərbəlanun, ey bacı, qurbanı var,
Həzrəti-Əbbastək qolsuz düşən ətşanı var,
Növhə etməkdən ötəri qırx nəfər nalanı var,
Yəsribü Bətha bu çöldən, ey bacı, ə`la degil.

*Əfrad*

Bu yer o yerdi batar növcəvanlarım qanə,
Bu çöldə xeymələrim yandırallar suzanə.

Bu çöldə qəlbüvi hicran odına dağlallar,
Əziz hərəmlərimin qollarını bağlallar.

Üzarə əhli-əyalım tökər gözindən yaş,
Ərus Fatiməni istər əhli-kin, qardaş.

Kəsik başun gəzəcək qanlı deyrü tərsayə,
Gəhi kül üstə qoyallar, gəhi kəlisayə.

*Baqiyi-növhə*

Hansı gülşən bu çəməndə, ey bacı, nuranidür,
Bu çölə zinət verən bikəs Hüseynün qanidür,
Tifli-nalan Əsğərim bu gülşənün reyhanidür,
Tus gülzari bu səhradən yəqin ə`la degil.

Gər Xəlilullah Minayə göndərüb qurbanını,
Şövq ilə eylüb qəbul Mə`budinin fərmanını,
Olmadı razi Xuda, görsün tökülmüş qanını,
O zəbihullah bu qurbanə yəqin həmta degil.

Zibh ola, baci, gərək bu dəştdə qurbanların,
Eşq Minasında versin can əziz oğlanların,
Qan vıra fəvvarətək bu zəxmi-bidərmanların,
Görgilən Kərbübəla qandan dolan dərya degil.

Gəlmişəm bu Kərbəlayə bir əza icad edəm,
Qasimi-nakamımı bu dəştdə damad edəm,
Bu zəmini-Kərbəlanı həşrətək abad edəm,
Bu çölə gəlməkdə məqsud izzəti-dünya degil.

Nadimin qurban ola sədparə düşmiş canuva,
Bu zəlil olsun fəda, ol Əkbəri-ətşanuva,
Qismət olsa bir də gəlləm rövzeyi-rizvanuva,
Növhə eylər Nadumün, bu ağlamaq bica degil.

**Həzrət İmam Hüseyn (ə)-ın dilindən Kufə əhlinə xitab**

Rəhm eyləyün, vırmun* məni, ey qövm, yarım qalmayub,
Ə`vanü ənsarım gedüb, bir qəmküsarım qalmayub.

Axır neçə min namələr yazduz, şərirani-Əraq,
Tə`kid edüb axır məni gətdüz** bu səhrayə qonaq,
Vəchi nədür salduz bu səhradə inad ilə nifaq?
Qoyduz məni biəqrəba, dildə qərarım qalmayub.

Doğrandı nakam Əkbərim, biqəmküsarəm, ağlaram,
Həm də bəradərlər, qəmü hicrində zarəm, ağlaram,

---

* Vurmayın
** Gətirdiniz

Cuş eyləyibdür qəmlərim çün biqərarəm, ağlaram,
Alduz əlimdən ləşkərim, səbrü qərarım qalmayub.

Tə`kid ilə tapşurmayub aya Rəsuli-Həqq sizə?
Rehlət edən vəqtə buyurmubdı məgər mütləq sizə?
Tapşurmayubdur itrətü Qur`anı həm bərhəqq sizə?
İmdi sizün zülmüzdən əldə ixtiyarım qalmayub.

Axır Rəsuli-Əkrəmə mən nuri-eynəm, vırmayun,
Cəddim Peyəmbərdür, anam Zəhra, Hüseynəm,
vırmayun,
Lakin bu aləmdə İmami-məşriqeynəm, vırmayun,
Gərçi İmam oğlı İmaməm, iqtidarım qalmayub.

Vəchi nədür tökməkligə qanımı eylərsüz şitab,
Aya məni övladi-Peyəmbərdən etmirsüz hesab?
İnsaf edün, Ali-Əli oldı ətəşdən dilkəbab,
Əshabdən, ənsardən xürdü kibarım qalmayub.

Ey dun, yaxamdan əl çəkün, keçdim ölənlər qanını,
Ruzi-cəzadə istəməm Övn ilə Cə`fər qanını,
Müşkildi ki, etsəm həlal, dünyayə Əkbər qanını,
Keçdim keçənlərdən, görürsüz, ixtiyarım qalmayub.

Ətfalımun dəstün dutub yüz döndərim səhralərə,
Nuhi-Nəbitək, ya gedim varid olum dəryalərə,
Ya yol verün Rumə gedim, olam ənis tərsalərə,
Soldı İmamət gülşəni, soldı bimarım qalmayub.

Cəddim nə qoymuş istəməm, ol Yəsribü Bətha sizün,
Bəsrə sizün, Kufə sizün, Məkkə sizün, Mina sizün,

Olsun imamuz ol Yəzid, ol Şimri-bipərva sizün,
Gedim Firəngə, yol verün, bir intizarım qalmayub.

Bu xeyməvü xərgahımı bəzl eylərəm yeksər sizə,
Qətl eylüsüz övladını, neylübdi Peyğəmbər sizə?
Xövf eyləyün məhşər güni, xəsm olmasun Heydər sizə,
Min qan tökən səyyadə seyd oldı şikarım qalmayub.

Bu xeymələrdə ölməmiş Zeynəb dutubdur yasimi,
Alduz əlimdən Əkbəri, həm Əsğəri, həm Qasimi,
Yıxduz ələmtək sərnigun, qolsuz salub Əbbasimi,
Yatdı ələm, sındı belim, ol tacdarım qalmayub.

Ruzi-cəzadə, ya Hüseyn, ol qəmküsarı Nadimin,
Göz yaşı tökməklik olub dünyadə kari Nadimin,
Çox arizu eylər o şeşguşə məzarı, Nadimin,
Dünyavü mafihadə səndən qeyri yarım qalmayub.

**İmam Hüseyn (ə)-ın dilindən**

Əhli-qiblə, mən bura mayeyi-qəm gətürmişəm,
Qətlinə Əkbərim alub əldə rəqəm gətürmişəm.

Küfr bərabərində nəsb eylərəm livasını,
Zibh eyləyəllə bu çölün təşnələb hər fədasını,
Hacəri-Kərbəla dutar burda oğul əzasını,
Tökməgə qanlı göz yaşı əhli-hərəm gətürmişəm.

Gətdi Minayə gər Xəlil zibh edə bir cəvanını,
Zülfünə yaxmağa, Xuda olmadı razı, qanını,

Çün bu Xəlili-Kərbəla nəqd əlində canını,
Zibh edə hülqi-pakını əhli-sitəm gətürmişəm.

Başımun üstə çətr açub kani-vəfa bəradərim,
Var hələ arxam, ölməyüb Övn ilə Fəzlü Cə`fərim,
Sağdı, hənuz ölməyüb Qasimü Əli Əkbərim,
Yetmiş iki şəhidə bir sahibələm gətürmişəm.

Qit`əbəqit`ə doğrayar ləşkəri-Kufə Əkbəri,
Dəstimün üstə oxlayar Hərmələ nazlı Əsğəri,
Şimr nişanə eyləyər xəncərə nazik həncəri,
Etsün əsir əyalımı qövmi-züləm gətürmişəm.

Ruzi-Ələstdə salmışam çünki bəlayə başımı,
Can ilə etmişəm fəda rahi-Xudayə başımı,
Şimr kəsüb Sinan əgər vırsa cidayə başımı,
Nizə başında ağlayan dideyi-nəm gətürmişəm.

Sübhü məsa güni gəlün bu çölə sinə dağlayun,
Nə`şimi dəfnü kəfn edün, başüzə* qarə bağlayun,
Oğlı ölən ana kimin nə`şimün üstə ağlayun,
Qəmli könüllər üstünə möhnətü qəm gətürmişəm.

Zeynəbimün ədulərim əldən alar cəlalını,
Qarət edəllə əşqiya malını həm məlalını,
Eyləyər əhli-Şam əsir, kimsə soruşmaz halını,
Möhnətü qəmdən olmağa qaməti xəm gətürmişəm.

---

* Başınıza

Ya Hüseyn, ağlayar sənə leylü nəharı Nadimün,
Dəhri-fənadə qalmayub səbrü qərarı Nadimün,
Eyləyər arizu o şeşguşə məzarı Nadimün,
Üzrü günahimə, Hüseyn, bircə qələm gətürmişəm.

**Minacati-İmam Hüseyn (ə)**

Xoş gəlmisən bu ərseyi-Minayə, Cəbrəil,
Sal "va Hüseyn" sədasını dünyayə, Cəbrəil.(ə)

Xoşdur mənə yaralı bu xak üstə yatmağım,
İcz etmərəm bu ərsədə ə`dayə, Cəbrəil.

Ruzi-Ələstdə eylədigim əhdimə çatam,
Çoxdandı düşmüşəm bu təmənnayə, Cəbrəil.

Xüldi-bərinə eylə rücu, sölə halımı,
Oğlı ölən o zöhreyi-Zəhrayə, Cəbrəil.

Söylə, Hüseynüvi susuz üryan salubdular,
Gəlsün əlində qarə bu səhrayə, Cəbrəil.

Gəlsün bu çöldə gözlərimi bağlasun özi,
Versün təsəlli Zeynəbü Kübrayə, Cəbrəil.

## İmam Hüseyn (ə) dilindən

Özün sən şahid ol, Mənnan İlahi!
Olubdur dəstəmazım qan, İlahi!

Gedibdür yavərim, yarım əlimdən,
Kənar oldum qəbiləmdən, elimdən,
Oğul vay naləsi düşməz dilimdən,
Kəsəllər başımı ətşan, İlahi!

Ədulər kəsdilər tabü təvanım,
Yaralı cismimə qüsl oldı qanım,
Ki, səndən qeyriyə yoxdur gümanım,
Dodaqimə yetibdür can, İlahi.

Salublar qardaşım Əbbası qolsuz,
Qoyublar ərseyi-meydandə yalquz,
Nə çarə eyləyim bəs mən oğulsuz?
Alubdur dövrəmi üdvan, İlahi.

Susuz doğrandı çün şəhzadə Əkbər,
Əlimdə təşnələb oxlandı Əsğər,
Gözi yaşlu qalub bikəs hərəmlər,
Edərlər naləvü əfğan, İlahi.

Əyalım "va Hüseyn" söylər təmami,
Səkinəm ağlayar əldə su cami,
Şəhid eylər ədu ətşan İmami,
Bu çöldə təşnə verrəm can, İlahi.

Ədu qoymaz hərəmlər ağlasunlar,
Cənazəm üstə sinə dağlasunlar,
Öləndə gözlərimi bağlasunlar,
Verər can Şahi-din giryan, İlahi.

Bəli, əhdim budur ruzi-Ələstdə,
Yüzüm qanlı yatam topraqlar üstə,
Çapallar at yaralı sinəm üstə,
Qoyarlar nə`şimi üryan, İlahi.

İlahi, et nəzər bu bipənahə,
Olubdur mültəci ol padşahə,
Bu kəlmat üzrdür üzma günahə,
Sızıldar Nadimi-giryan, İlahi.

**Həzrət İmam Hüseyn (ə) dilindən**

Susuz öldürmüsüz, ey qövmi-dəğa, Əkbərimi,
Qoymayun təşnə qala, barı, Əli Əsğərimi.

Ərəb içrə bilüsüz şərmü həya, qeyrət olur,
Bihəyalıq sizə bu çöldə neçün adət olur?
Təşnələb qalmağa bu tifldə nə taqət olur?
Soldurubsuz susuzundan bu güli-növbərimi.

Heç rəvadurmı belə laləsifət qönçə sola?
Ətəşindən ləbi-gülbərgi bunun parə ola,
Olmayun razı, bu mə`sumdi, ləbtəşnə qala,
Barı, sirab eləyün siz bu mələkmənzərimi.

Aparun öz əlivüzlə bunı sirab eləyün,
Ya vırun hülqinə ox, cismini bitab eləyün,
Su verün, ya ləbini qan ilə xunab eləyün,
Gətirüb dərdə bu, vallah, dili-xunpərvərimi.

Yüzi gül qönçəsitək suzi-ətəşdən saralub,
Bu gün üç gündi ki, bu xeymədə ləbtəşnə qalub,
Bu qədər zülm eləyürsüz, sizə axır nə olub?
Qolsuz öldürdüz Ələmdari-hünərpərvərimi.

Olmaram şaki bülün xuni-Əli Əkbər ilən,
Kəsməsəz yollarımı əldə Əli Əsğər ilən,
Qoyaram çöllərə yüz itrəti-Peyğəmbər ilən,
Həşrdə istəmərəm xuni-bəradərlərimi.

Salmayun başımı bundan da bətər keşməkeşə,
Gedərəm qoysaz əgər mülki-Firəngü Həbəşə,
Rəhm edün bu ələm üstündə yatan tutivəşə,
Xuncigər eyləməyün itrəti-biyavərimi.

Etmərəm kişvəri sükna mənə qoy olsun həram,
Yox rücuim sizə Şam içrə Yəzid olsun imam,
Niyə tə`cil edüsüz qətlimə, ey qövmi-zülam,
Soldurub cövri-xəzan qönçəsifət güllərimi.

Nadimin canı fəda təşnə Əli Əsğərüvə,
Qanə qəltidə olan Əkbəri-məhpeykərüvə,
Bir nəzər etsən əgər növhə edən nokərüvə,
Rəhmətün zail edər cümleyi-möhnətlərimi.

## Seyyidüşşühəda (ə) Həzrət Zeynəbə xitabən

Ağlama, səbr eylə, ey məhzunü müztər, Zeynəbim,
Çəkməyüb ə`da hələ şəmşirü xəncər, Zeynəbim.

Lüccə vırmaz bəhri-qəm, sakitdi qan dərya hələ,
Ruzi-Aşura degil, Şimr almayub xəncər ələ,
Əsğəri tir ilə sirab etməyübdür Hərmələ,
Dolmayubdur qan ilə qundaği-Əsğər, Zeynəbim.

Əsməyüb badi-sitəm, gülzari-Heydər solmayub,
Xeyməgahun dövrini ceyşi-sitəmkər almayub,
Qanına qəltan Həbib ibni Məzahir olmayub,
Pasibanundur hələ ənsarü yavər, Zeynəbim.

Barişi yağmayubdur, düşməyübdür qan hənuz,
Gün önündə olmayub oğlanlarun ətşan hənuz,
Əşqiyalər kəsməyüb yetmiş iki qurban hənuz,
Düşməyüb pirü cəvan meydanə bisər, Zeynəbim.

İstirahət eylər ənsarım hələ yeksər, bacı,
Bükməyübdür qamətim hicri-Əli Əkbər, bacı,
Yolmayub zülfin hələ Leylayi-biyavər, bacı,
Geyməyüb qanlı kəfən şəhzadə Əkbər, Zeynəbim.

Ey anam, bacı, zəmani-istirahətdür hələ,
Əsğərim yatmış beşikdə, indi rahətdür hələ,
Qolları Əbbasımun əl`an səlamətdür hələ,
Batmayub qanə Ələmdari-hünərpərvər, Zeynəbim.

Olmayubdur əl-vərəq cismim hələ Qur`an kimi,
Kəsməyüblə başımı ləbtəşnə çox qurban kimi,
Ağlama, göz yaşuvı tökmə hələ neysan kimi,
Həncərimə qoymayubdur Şimr xəncər, Zeynəbim.

Cismimi bisər görəndən sonra ağlarsan, bacı,
Başım üstə növhə eylüb sinə dağlarsan, bacı,
Gözlərimi hərgiz ə`da qoysa, bağlarsan, bacı,
Qanım ilə olmayub səqqalım əhmər, Zeynəbim.

Xeyməgahım yanmayub, qorxutmayub ləşkər sizi,
Rəxtə möhtac etməyüb zülm ilə qarətgər sizi,
Salmayub səhralərə bu zümreyi-kafər sizi,
Qol-qola bağlanmayub Ali-Peyəmbər, Zeynəbim.

Sineyi-pürsuzə vırma müsibət daşını,
Ölməmüş mən, qoyma Əhli-Beytim açsun başını,
Nadiməm, əldə qələm töksün yüzə göz yaşını,
Zikri-möhnət söləsün, zarü mükəddər Zeynəbim.

**İmam Hüseyn (ə) Həzrət Zeynəbə**

Ey bacı, ey Zeynəbi-biyavər, Allah saxlasun,
Ali-Taha, itrəti-Peyğəmbər, Allah saxlasun.

Bu vidayi-axərimdür, çün şəhadət vəqtidür,
Gəlməgimə yox gümanım, çünki rehlət vəqtidür,
Qan içində eyləyim, Həqqə ibadət vəqtidür,
Ey qalan gözyaşlı Ali-Heydər, Allah saxlasun.

Ölməmiş mən eyləmə şur ilə əfğan, Zeynəbim,
Baş açub, zülfün yolub, olma hərasan, Zeynəbim,
Əhli-Beyti-bipənahə yar ol hər an, Zeynəbim,
Mehribanım, nuri-eyni-madər, Allah saxlasun.

Göz yaşun tökmə yüzə məhzunü müztər, səbr elə,
Həncərimə Şimr hələ qoymubdı xəncər, səbr elə,
Əzmi-qarət etməyüblər fövci-ləşkər, səbr elə,
Ey bacı, mən ölməmiş açma sər, Allah saxlasun.

Səbr elə, cismim hələ qan ilə ülfət etməyüb,
Əşqiyalər xeyməvü xərgahı qarət etməyüb,
Nizə başında başım Qur`an tilavət etməyüb,
Batmayub qanə şəhi-biyavər, Allah saxlasun.

Salmayublar türbəti-Kərbübəlayə nə`şimi,
Qanıma məmzuc etmübdür ədu göz yaşımı,
Kəsməyüb, bacı, hələ Şimri-sitəmkər başımı,
Açmayub başun hələ hurilər, Allah saxlasun.

Yox anam bu Kərbəladə nə`şüm üstə ağlasun,
Baş açub, zülfün yolub, şur ilə sinə dağlasun,
Başımı alsun diz üstə, gözlərimi bağlasun,
Əhli-Beyti bikəsü biyavər, Allah saxlasun.

Ey bacı, başım olan vəqtə əsir düşmənə,
Qətligahə gəl cənazəm üstə, əfğan et mənə,
Əhli-Beyti-bipənahı, bacı, tapşurdum sənə,
Düxtərani-bisərə ol yavər, Allah saxlasun.

Səbr elə vırsa əgər düşmən cidayə başımı,
Xuliyi-bidin qoya mətbəxsərayə başımı,
Şamdə qoysa Yəzid təşti-təlayə başımı,
Yarun olsun bir Xudayi-davər, Allah saxlasun.

Nadim aləmdə olubdur bu Hüseyn avarəsi,
Şö`ləvər oldı, alışdı narə qəlbi yarəsi,
Zeynəbün ol vəqt aləmdən kəsildi çarəsi,
Söylədi Şahi-şəhidan, xahər, Allah saxlasun.

**Həzrət Fatimeyi-Zəhra (ə) dilindən**

Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Meydanda gördüm cismün, nə sər var,
Nə müinü yar, nə pərəstar var,
Nə əldə əngüştər var, nə sər var,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Almış idim indi nə`şün qucağə,
Sədparə gördüm başdan-əyağə,
Gəl sinəmə, qoy dodağ-dodağə,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Görürəm yanub narə xeyməgahun,
Ağlallar ətfali-bipənahun,
Talan olubdur mal ilə cahun,

Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Görərdim əyalun düşmən soyubdur,
Qundaği-Əsğəri xunbar olubdur,
Söylə görüm, Əkbər nə olubdur,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Görərdim axubdur meydanə qanlar,
Bisər düşübdür tazə cəvanlar,
Məqsudə yetdilər kufəyanlar,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Əhli-cəfalər məqsudə yetdi,
Xuli başuvi tənurə gətdi,
Kül yeri verdi, hörmət etdi,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Başun dalunca gəlləm piyadə,
Qur`an tilavət eylər cidadə,
Gah mənzil eylər mətbəxsəradə,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Bülbül nə lazım qalsun çəmənsiz,
Nə`şün salublar ə`da kəfənsiz,
Başun gəzər hər şəhri bədənsiz,

Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Bu başı bəslər idim dizim üstə,
Gah əlimdə, gah sinəm üstə,
Əl`an töküldi qəmlər qəm üstə,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

Tök əşki-çeşmün rüxsarə, Nadim,
Yaz zikri-möhnət, dilparə Nadim,
Bu virdi yaz, gəl göftarə, Nadim,
Ey bimüinü biyar, Hüseynim,
Mənzil mübarək, sərdar Hüseynim.

**Şami-qəribanda Fatimeyi-Zəhra (ə) dilindən**

Nazlı başı kül üstə mehman olan, Hüseyn vay,
Ətfalı dəstbəstə giryan olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Bərhəm olan cəlalı,
Talan olan mənalı,
Əsir olan əyalı.

Zəhra anan gəlibdür axır matəmsərayə,
Bu baş veribdür zinət axır ərşi-Xudayə,
Xuli qoyub o başı imdi mətbəxsərayə,
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Ey şahi-dilşikəstə,
Ətfalı dəstbəstə,
Yatma oğul kül üstə.

Nəşvü nüma edər çün bülbül müdam gül üstə,
Lazımdı sayə salsun gül bərgi bülbül üstə,
Xuli başın bədənsiz mehman edüb kül üstə,
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Topraqlar üstə bisər,
Biyarü bibəradər,
Harda qalubdur Əkbər.

Yalquz yatubsan axır, söylə, elün nolubdur,
Başdan axub nə qandur, şəhla gözün dolubdur,
Dindirmisən* anavı, şirin dilün nolubdur?
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Ağlar qalan anası,
Zibh olunan qəfası,
Gəl, tellərin fədası.

Mən bəslədim bu başı illərlə sinəm üstə,
İstərdim hər bəlası gəlsün bu didəm üstə,
Tərk eyləgil tənuri, gəl, bari, sinəm üstə,
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Yox taqətü təvanım,
Qəmdən tükəndi canım,
Ərşə çıxub fəğanım.

Kərbübəlayə imdi düşdi, oğul, güzarım,
Görcək yaralı nə`şün, əldən gedüb qərarım,

---

* Dindirmirsən

Gördüm xəzan olubdur cövr ilə növbəharım,
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Ey bikəfən, Hüseyn vay,
Gülpirəhən, Hüseyn vay,
Məzlum ölən, Hüseyn vay.

Gördüm ki, xeyməgahun yeksər, oğul, yanubdur,
Ali-Əba o nari-suzanə odlanubdur,
Gül üzli növcəvanlar meydanda doğranubdur,
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Cismi qalan kəfənsiz,
Başı gəzən bədənsiz,
Üryan qalan vətənsiz.

Cismində yarə gördüm, həddi-şümarə gəlməz,
Mərhəm edən kəs olmaz, cərrahi çarə gəlməz,
Xüşk etməgə əlacsız ol qədri yarə gəlməz,
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.
Edüb bu qövmi-üdvan,
Cismi-şərifi üryan,
Ümmət yolunda qurban.

Zikr eylə zikri-möhnət, dari-fənadə, Nadim,
Əcrün şəfaət olsun ruzi-cəzadə, Nadim,
Zəhra dilincə söylə, bəzmi-əzadə, Nadim,
Nazlı başı kül üstə mehman olan, Hüseyn vay.
Hüseyn vay, Hüseyn vay.

Bərhəm olan cəlalı,
Talan olan mənalı,
Əsir olan əyalı.

**İmam Hüseyn (ə) dilindən**

Şahid ol, ya Rəb, özün, dərdə dəvayə gəlmişəm,
Çün bəlayə talibəm, Kərbübəlayə gəlmişəm.

Talibəm ruzi-əzəl öz etdigim peymanıma,
Kuyi-eşqündə sənün əlvan olum öz qanıma,
Qəbrdə mən Əkbəri-nakamı allam yanıma,
Çün Xəlili-Kərbəlayəm, bu Minayə gəlmişəm.

Raziyəm qüslüm Minayi-eşqdə qan olsa da,
Gər məhasinim, başım qan ilə əlvan olsa da,
Əhli-Beytim baş açub çaki-giriban olsa da,
Ümməti-asilərə, ya Rəb, duayə gəlmişəm.

Getdi Minayə Xəlilullah bir qurban ilən,
Olmadı razı Xuda, qurbanı batsun qan ilən,
Mən bəlayə can dedim yetmiş iki qurban ilən,
Yarü ənsarımla mən Həqqə fədayə gəlmişəm.

Dəstəmazım bu nə növ` eşqdür qan olmasa,
Toy otağı Əkbərün bu qanlı meydan olmasa,
Əsğərün hülqi nişani-tirü peykan olmasa,
Malü canımdan keçüb bəzmi-vəfayə gəlmişəm.

Gəlmişəm damad edim bu çöldə ətşan Qasimi,
Su kənarında susuz qurban verim Əbbasimi,
Ağlayub, Zeynəb bacım qoymazla dutsun yasimi,
Qanımı mülhəq edim nuri-Xudayə, gəlmişəm.

Şimri-dun qəmçi vırar, nazlı Səkinəm ağlasa,
Gəlmərəm hərgiz dilə, qəlbün sitəmlə dağlasa,
Gər tənabə itrəti-Zəhra qolını bağlasa,
Çünki mən səbr etməgə əmri-qəzayə gəlmişəm.

Gəlmərəm hərgiz dilə gər sinəmə ox vırsalar,
Qövmi-Nəmrud xeyməvü xərgahımı yandırsalar,
Bipədər qızlarımı atlar döşündə yorsalar,
Başımı düşmən kəsüb vırsun cidayə, gəlmişəm.

Mən sənə hər növ` ilə eylüm* itaət istərəm,
Gər sənün eşqündə çəksəm hər müsibət, istərəm,
Kufədə mətbəxsəradə cayi-xəlvət istərəm,
Şahid ol, gör, mən kül üstə ahü vayə gəlmişəm.

Ey Xuda, nə eşqdür eşq intəhayə yetməsə,
Nizə başında başım Qur`an tilavət etməsə,
Düxtərim viranələr küncində rehlət etməsə,
Eyləyim həqqi sübut əhli-cəfayə, gəlmişəm.

Ağlamaq məndən sora çün olsun adət Zeynəbə,
Yüz verə hər ruzü hər saətdə möhnət Zeynəbə,
Şamın əhli eyləsün tə`nü şəmatət Zeynəbə,
Ərməğan olsun başım Şimri-dəğayə, gəlmişəm.

---

* Eyləyim

Mən səni verrəm qəsəm, nahəq tökülmüş qanıma,
Xeyzəran zərbilə bu məcruh olan dəndanıma,
Şamil eylə rəhmətün ol Nadimi-nalanıma,
Kərbəlayə talibəm, dərdə dəvayə gəlmişəm.

**Həzrət İmam Hüseyn (ə) dilindən**

Vırmayun yarə dəxi ləşkəri-üdvan, ölürəm,
Çoxdı yarə, yetüşüb ləblərimə can, ölürəm.

Yaralı salmusuz, üdvan, su kənarində məni,
Eylüsüz* Xaliqə qurban su kənarində məni,
Kəsməyün, barı, siz ətşan su kənarində məni,
Bir içüm su mənə, barı, edün ehsan, ölürəm.

Nə olar ki, edəsüz Xaliqi-davərdən həya,
Kəsüsüz** başımı, heç etmüsüz*** Heydərdən həya,
Kəsməyün təşnə, edün, barı, Peyəmbərdən həya,
Bir içüm su eləyün siz mənə ehsan, ölürəm.

Bu cəfa bəsdi ki, öldürdüz Əli Əkbərimi,
Oxladı Hərmələ dəstimdə Əli Əsğərimi,
Qanə əlvan elədüz Qasimi-məhpeykərimi,
Qoyun asudə verəm, barı, özüm can, ölürəm.

Vırmayun yarə, yəqin öldüri Əkbər yarası,
Qəlbimi qan eləyüb şibhi-Peyəmbər yarası,

---

* Eyləyirsiniz
** Kəsirsiniz
*** Etmirsiniz

Mənə lazım dəgi[*]şəmşir ilə xəncər yarası,
Əkbərün hicri edüb qəlbimi al qan, ölürəm.

Tabımı əldən alub nasirü ənsar ölümi,
Övn ilə Fəzl ilə həm Cə`fəri-qəmxar ölümi,
Öldürər yarəsiz Əbbasi-ələmdar ölümi,
Etdi Əbbas ölümi xanəmi viran, ölürəm.

Etmüsüz cari yüzə, əhli-cəfa, göz yaşımı,
Salmusuz Kərbübəla içrə bədənsiz başımı,
Doğraduz Həzrəti-Əbbas kimin qardaşımı,
Eylədüz dari-fənani mənə zindan, ölürəm.

Öldi Əbbasü Əli, yatdı Hüseynün ələmi,
Bəhrtək cuşə gəlüb Zeynəbün ənduhü qəmi,
Salmayun, barı, hərasə hələ əhli-hərəmi,
Tez məni rahət edün, olmuşam ətşan, ölürəm.

Zülm ilən qoyduz əcəb Nadimün ağlar gözüni,
Nigəran qoyduz hamı itrəti-əthar gözüni,
Qanə əlvan elədüz sərvəri-əbrar gözüni,
Vırmayun yarə, yetüb ləblərimə can, ölürəm.

**Həzrət İmam Hüseyn (ə) Kufə əhlinə xitab edir**

Axır məni nahəq yerə, ey kufəyan, öldürməyün,
Məndə, görürsüz, qalmayub tabü təvan, öldürməyün.

Qəmdən bükübsüz qəddimi, öldürmüsüz Əbbasımi,
Bəsdür, əlimdən almısuz Övn ilə Fəzlü Qasimi,

---

[*] Deyil

Zeynəb bacım mən ölməmiş ağlar, dutubdur yasımi,
Əhli-əyalım xeymədə eylər fəğan, öldürməyün.

Qəmdən edübsüz sinəmi siz çak-çak, insaf edün,
Zinət verübdür cismimə xun ilə xak, insaf edün,
Cismin Səkinəm ağlayub eylər həlak, insaf edün,
Qoymub* o tiflin ahü vası məndə can, öldürməyün.

Nə yarü əqvamım qalub, bu çöldə yalquz qalmışam,
Abi-Fərat səhralərə caridi, mən suz qalmışam,
Oğlum Əli Əkbər ölüb, axır oğulsuz qalmışam,
Zülmü sitəmdən oldı bu qəddim kəman, öldürməyün.

Vallah, mənə lazım degil şəmşirü xəncər yarəsi,
Qəlbimdə yaram çoxdı, var altı bəradər yarəsi,
Qövr eyləyür, sinəmdə var şəhzadə Əkbər yarəsi,
Siz vırmasaz da öldürür dərdi-nihan, öldürməyün.

Bəsdür bilürsüz vırmasaz da möhnəti-Əsğər mənə,
Qanimə batmayun nahəq, lazım degil xəncər mənə,
Yeksər tiküblər göz bu gün övladi-Peyğəmbər mənə,
Axır Peyəmbər oğluyam, Şimrü Sinan, öldürməyün.

Axır mükərrər tapşurub məni Nəbi rəhbər sizə,
Söylüb,* əmanətdür bu gün bu itrəti-Heydər sizə,
Rehlət edəndə yad edün, tapşurdı Peyğəmbər sizə,
Mən varisi-Peyğəmbərəm, ey kufəyan, öldürməyün.

Cəddim Peyəmbərdür, anam Zəhra, atam Şiri-Xuda,
Cəddəm Xədicə, qardaşım, kani-səxavət Müctəba,

---

* Qoymayıb
* Söyləyib

Qaldım əcəb biəqrəba, oldum qəribi-Kərbəla,
Əldən alubdur tabımı zəxmi-sinan, öldürməyün.

Əldə qələm, ağlar müdam, halı pərişan Nadimim,
Eylər ölüncə ruzü şəb şur ilə əfğan Nadimim,
Söylər mükərrər bu sözi zarü hərasan Nadimim:
"Axır məni nahəq yerə, ey kufəyan, öldürməyün".

**Həzrət Hüseyn (ə)-ın Kərbəla çölündə yaxınlarına xitabı**

Bu gecə getsün gedənlər, bu Minadə qalmasun,
Talibi-dünya olanlar Kərbəladə qalmasun.

Bu gecə getsün gedənlər, getməgə talibdilər,
Qalsun ol kəslər, mən ilə ölməgə rağibdilər,
Hər o kəslər qalsalar, sübhi qəmə sahibdilər,
Şə`nü şövkət istəyənlər, Neynəvadə qalmasun.

Bu Minayi-eşqdə lazım degil heç kəs mənə,
Təşnə can verrəm özüm, icz etmərəm heç düşmənə,
Payimün altında yatsa Əkbərim, bəsdür mənə,
Canınun qədrün bilən çıxsun, aradə qalmasun.

Mən vəfa etməkligə əhdü vəfayə gəlmişəm,
Çün Xəliltək yüz qoyub kuhi-Minayə gəlmişəm,
Verməgə şövq ilə qurban Kərbəlayə gəlmişəm,
Zərrə nöqsan etdigim əhdü vəfadə, qalmasun.

Neylürəm, lazım degil bu ərsədə qeyri-bəşər,
Qalsa hər kimsə bu çöldə, eyləyərlər xuncigər,

İtrəti-ətharımı ə`da edəllər dərbədər,
Qalsa hər kim qərq olar bəhri-bəlayə, qalmasun.

Qardaş, Əbbas, xamuş et məş`əlləri, sölüb İmam,
Hər kəs istər getməgə muxtardur, getsün təmam,
Getməgə yüz qoydular bir xeylisi binəngü am,
Az qalub tabü təvan Ali-Əbadə qalmasun.

Görcək ol övzanı Ali-Müstəfa xürdü kəbir,
Naləvü əfğanə gəldi, ağladı tiflü səğir,
Şahi-din əshabına e`lan edibdür birbəbir,
Qalsa hər kimsə batar xuni-cəfayə, qalmasun.

Mən özüm yalquz bu səhranun susuz qurbaniyəm,
Əsr vəqtində səbah məhbubimün mehmaniyəm,
Talibəm can verməgə, cananumun cananiyəm,
Bir gecə başum neçün mətbəxsəradə qalmasun.

Ya Hüseyn, istə səyarə nazlı Əkbər qəbrinə,
Ruzü şəb pərvanə et Museyi-Cə`fər qəbrinə,
Nadiməm, dəstim yetə bir də Peyəmbər qəbrinə,
Arizum qəlbimdə heç dari-fənadə qalmasun.

**İmam Hüseyn (ə) dilindən**

Can üstəyəm, çün Heydəri gözlərəm, gözlərəm,
Can vermərəm, Peyğəmbəri gözlərəm, gözlərəm.

Yaram çoxdur, məni saldı nəfəsdən, nəfəsdən,
Ruhum quşı uçmaq istər qəfəsdən, qəfəsdən,

Şimr əl çəkməz axır məni-bikəsdən, bikəsdən,
Oğul anası madərimi gözlərəm, gözlərəm.

Fələk saldı qürbət elə daşımı, daşımı,
Gözüm tökər yüzə qanlı yaşımı, yaşımı,
Anam yox alsun diz üstə başımı, başımı,
Şafiyi-ruzi-məhşəri gözlərəm, gözlərəm.

Ayrı düşdim bu səhradə elimdən, elimdən,
Düşmən ənsarımı aldı əlimdən, əlimdən,
Düşməz Əli Əkbər adı dilimdən, dilimdən,
Şibhi-Peyğəmbər Əkbəri gözlərəm, gözlərəm.

Zülmün şərarəsi gögə dayandı, dayandı,
Rəşid Ələmdarım qanə boyandı, boyandı,
Yeksər köməklərim bir-bir doğrandı, doğrandı,
Ələmdari-qəmpərvəri gözlərəm, gözlərəm.

Şəhid olub Həbib ibn Məzahir, Məzahir,
Qəbrimə bu çöldə olar mücavir, mücavir,
Başım cida üstə olar müsafir, müsafir,
Tənur içrə xakistəri gözlərəm, gözlərəm.

Xəncər ilə zibh olar həncərim, həncərim,
Zülfün yolar nə`şim üstə xahərim, xahərim,
Ağlar qalar ol Zeynəbi-müztərim, müztərim,
Madər, əziz xahəri gözlərəm, gözlərəm.

Bu çöldə xeymələr çəkər şərarə, şərarə,
Əzizə qızlarım düşər fərarə, fərarə,

Hanı bir kəs məni qoysun məzarə, məzarə,
Övn ilə Fəzlü Cə`fəri gözlərəm, gözlərəm.

Çox görəllər Zeynəbə göz yaşın da, yaşın da,
Qaçallar qızlarım atlar döşündə, döşündə,
Qur`an oxur başım cida başında, başında,
Viranədə hərəmləri gözlərəm, gözlərəm.

Nadim, bu zikri ağla, yaz əzadə, əzadə,
Hüseyn yarın olsun ruzi-cəzadə, cəzadə,
Gözi yaşlu ağla hər qəmfəzadə, fəzadə,
Ziyarəti-Peyğəmbəri gözlərəm, gözlərəm.

**Boyanub cismün, Hüseyn, laləsifət qanə bu gün**

Boyanub cismün, Hüseyn, laləsifət qanə bu gün,
Gəlmişəm bais odur naləvü əfğanə bu gün.

Lərzəyə gəldi bu gün növhə edüb ərşi-Xuda,
Çün bu gün Kərbübəla dəşti olub kuhi-Mina,
Rudi-xuntək bu zəman mövcə gəlür Kərbübəla,
Ağlaram ruzü şəb ol Şahi-şəhidanə bu gün.

Bu əzadə gərək aləm eləyə ahü nəva,
Boyanub qanə bu gün Padşəhi-Kərbübəla,
Əkbəri təşnəcigər doğradılar qövmi-dəğa,
Saldılar ləşkəri-dun Əkbəri meydanə bu gün.

Əkbərün boynuna çün saldı kəfən şahi-İmam,
Zülm ilə qırdılar ənsarını ol qövmi-zülam,
Leyliyi-bəxtiqəranun çün olub qəddi kəman,
Saxlayub çünki əza Əkbəri-ətşanə bu gün.

Bu müsibətdə, könül, növhəvü fərd eylə bəyan,
Gözləründən elə rüxsaruva xun əşk rəvan,
Şiələr qarə geyüb cümlə edər ahü fəğan,
Saxlarux tə`ziyə səqqayi-yetimanə bu gün.

Kərbəladə boyanub qanına Sultani-zəman,
Yarü ənsarını eylüblə şəhid Şimrü Sinan,
Bağladı gözlərini qırmızı dəsmaliyə qan,
Yeri var, göz yaşımız gər dönə ümmanə bu gün.

Zeynəbün aldı əlindən fələk hər izzətini,
Soldurub güllərini, əldən alub şövkətini,
Artırub cövrü cəfa ilə qəmü möhnətini,
Zülm ilə oldı səvar naqeyi-üryanə bu gün.

Şimri-dun xaneyi-Peyğəmbəri viran eləyüb,
Çün Hüseyn xeymələrin zülm ilə talan eləyüb,
Həşrətək şiələrin karını əfğan eləyüb,
Yandurub şiələrün qəlbini suzanə bu gün.

Ya Hüseyn, ağlarux ol Qasimi-gülpeykərüvə,
Övn ilə Cə`fərüvə, Əkbəri-xoşmənzərüvə,
Oxlanan dəstivün üstündə Əli Əsğərüvə,
Göz yaşun şiələrün döndərüb al qanə bu gün.

Sənün eşqündə gəlüb Nadimün əfğanə, Hüseyn,
İltifat eylə, nəzər qıl məni-nalanə, Hüseyn,
İstərəm bir də olam qəbrüvə pərvanə, Hüseyn,
Mərhəmət etsən əgər Nadimi-giryanə bu gün.

**Həzrət İmam Hüseyn (ə)-ın hüccəti təmam etməsi**

Get, beylə söylə Şimrə, ya Əbbas,
Həqqi nəhy edüb kafər olmasun.
Allanub bu beş gün rəyasətə,
Baqi duzəxi-azər almasun.

Şahi-Yəsribi görməsün vəhid,
Küfrə fəxr edüb olmasun ənid,
Tarümar olar izzəti-Yəzid,
Səhv edüb özün narə salmasun.

Mən əzizi-Peyğəmbərəm, bilün,
Ərş tağinə ləngərəm, bilün,
Xəlqi-aləmə rəhbərəm, bilün,
Hüccətim budur, məxfi qalmasun.

Baxmasun mənim azdı ləşkərim,
Cabəca durur yarü yavərim,
Yardur mənə yari-davərim,
Şahi-dini biyar bilməsün.

Şayidür bu, Peyğəmbər oğluyam,
Şafiyi-ruzi-məhşər oğluyam,
Var rəşadətim, Heydər oğluyam,
Başını əbəs şurə salmasun.

Ləşkərə baxub olmasun qürur,
Yox bəsirəti, kur oğlı kur,

Qırsam aləmi, vardı məndə zur,
Ömrlər əbəs zail olmasun.

Naibi-şəhi-"Lafəta" mənəm,
Nuri-dideyi-Müstəfa mənəm,
Sureyi-"Züha", "Qül kəfa" mənəm,
Aqqi-Şafiyi-məhşər olmasun.

Mənlə fəxr edər cümlə masiva,
Yardur mənə maliki-Xuda,
Mənlə fəxr edər ərşi-kibriya,
Heç məqamə inkar gəlməsün.

Ya Hüseyn, olub Nadimün dəxil,
Eyləyər bəyan növhə bu qəbil,
Zairün olam istərəm hər il,
Həsrətim dəxi dildə qalmasun.

**İmam Hüseyn (ə) dilindən Əmirəlmö`minin Əli (ə)-a xitabən**

Gülşənimi soldurub qövmi-dəğa, ya Əli,
Yasə batubdur təmam Ali-Əba, ya Əli.

Yazdı neçə namələr əhli-şəriri-Əraq,
Mülki-Əraqə gətürdilə bərəsmi qonaq,
İmdi mənim qətlimə cümləsi etdi tifaq,*
Əhdlərün sındırub əhli-cəfa, ya Əli.

* Burada ittifaq mənasındadır

Etdilə bəstə əzəl ruyimə su yollarun,
Suzi-ətəşdən solub qönçəsifət güllərün,
Təşnə su yanında səqqanun iki qollarun,
Cövr ilə təndən ədu etdi cüda, ya Əli.

Əkbəri-nakamımı aldı əlimdən ədu,
Sağ gətirim xeyməyə, çox elədim cüstucu,
Leyla həman qan ilən eylədi guya vüzu,
Ağladı o halətə ərzü səma, ya Əli.

Əsğərimün qundağın aldım ələ misli-nur,
Zülmini küllən təmam etdi ədulər zühur,
Atdı bir ox Hərmələ, ağladı vəhşü tüyur,
Oldı o qandan hədəf ərşi-Xuda, ya Əli.

Qasimi-damadımun qanə batub əlləri,
Qan ilə yeksan olub parələnüb peykəri,
Gözləmədi əhli-kin hörməti-Peyğəmbəri,
Qandan ərusi ələ yaxdı həna, ya Əli.

Aldı əlimdən ədu Əkbərü Əbbasimi,
Oxladılar Əsğəri, doğradılar Qasimi,
Xeymədə Zeynəb bacım imdi dutub yasimi,
Əhli-əyalım edər ahü nəva, ya Əli.

Cövr ilə xar əl tapub səhni-çəməndə gülə,
Eyni-səadətdi çün gəlmərəm əslən dilə,
Şimr kəsər başımi, tapşurar əldən-ələ,
Mövcə gələr zülmdən bəhri-bəla, ya Əli.

Saldıla dildən məni cövr ilə ləşkər, baba,
Zeynəbə yar ol özün aləmə yavər, baba,
Yansa xiyam, çölə qaçsa hərəmlər, baba,
İtrətün eylər fəğan, ya əbəta, ya Əli.

Əhli-hərəm dəstgir olsa həmə bağrıqan,
Yoxdı yetən dadə bir cümləsi eylər fəğan,
Vırsa Yəzid hər qədr ləblərimə xeyzəran,
Çünki rizayəm budur əmri-qəza, ya Əli.

Rəsmdi bülbül qonar səhndə gül üstünə,
Xuli tənurə qoyar başımı kül üstünə,
Şimr vırar kin ilə silini sil üstünə,
Nazlı Səkinəm edər ahü nəva, ya Əli.

Olsa həyat hər qədr, ağlaram əhvaluva,
Nadimün olsun fəda qanə batan haluva,
Asiyəm, əfv et məni, ol susuz ətfaluva,
Qəbr fişarından et, bari rəha, ya Əli.

**İmam Hüseyn (ə)-ın dilindən ləşkəri-üdvanə xitab**

Mən sizə axır İmamü pişvayəm, vırmayun,
Bir qəribəm mən, vəhidi-Kərbəlayəm, vırmayun.

Bilmirəm mən netmişəm,* ey ləşkəri-üdvan, sizə,
Bir neçə namə yazubsuz, gəlmişəm mehman sizə,
Əhli-Kufə, neyləyibdür Şahi-məzluman sizə?
Bir qəribi-bimüinü binəvayəm, vırmayun.

---

* Nə etmişəm

Bir neçə namə yazub gətdüz* bura mehman məni,
Su kənarında neçün bəs qoymusuz ətşan məni?
Vırmusuz yarə, al-əlvan eyləyibdür qan məni,
Dərdi-üzmayə bu çöldə mübtəlayəm, vırmayun.

Əhli-Kufə, azimi-üqba olanda Müstəfa,
Bu sözi tə`kid ilə tapşurdı Şahi-ənbiya,
Bir sizə Qur`an əmanət, bir də ki, Ali-Əba,
Mən, bilün, nuri-düeyni-Müstəfayəm, vırmayun.

Qırmısuz ənsarımı, ey ləşkəri-gümrahi-Şam,
Ali-Peyğəmbər susuzdan ağlayar əllərdə cam,
Çün həyat oldı mənə Əbbasdən sonra həram,
Bu Ələmdarun qəmində biqərarəm, vırmayun.

Qasimi əlvan edibsüz qanına, ağlar gözüm,
Göz yaşın rüxsarimə cari edüb yannam özüm,
Əkbərü Əbbasdən sonra yəqin gülməz yüzüm,
Mən, bilün, dürdaneyi-Xeyrün-nisayəm, vırmayun.

Bu cəfa bəsdür ki, öldürdüz Əliyyü Əkbəri,
Oxladuz dəstimdə qundaği-Əliyyü Əsğəri,
Qırmısuz ənsarımı, öldürdüz Övnü Cə`fəri,
Mən Hüseynəm, zinəti-ərşi-Xudayəm, vırmayun.

Həm atamdur Heydəri-Səftər, Şəhi-məhşər, İmam,
Müctəbadur qardaşım, ümmətlərə rəhbər, İmam,

---

* Gətirdiniz

Mən özüm də bir nəfər övladi-Peyğəmbər, İmam,
Siz bilürsüz mən İmami-masivayəm, vırmayun.

Öldi Əbbasım bu çöldə zülm ilə, yatdı ələm,
Övc edər ahım səmayə Kərbəladə dəmbədəm,
Bu bəlayi-dəştə getməkdə nəinki Nadiməm,
Rəhm edün, mən bir qəribi-Neynəvayəm, vırmayun.

**Həzrət İmam Hüseyn dilindən**

Aşiq öz mə`şuqinə canın edə qurban gərək,
Can qoyub şövq ilə olsun layiqi-canan gərək.

Həqq ilə əhd etmişəm ruzi-Ələstdə mən əzəl,
Ta edəm öz etdigim əhdilə peymanə əməl,
Canimə dörd min yara yetsün, məni tapsun əcəl,
Həqq yolunda ta olam öz qanıma əlvan gərək.

Canımı məhbubimə şövq ilə mən qıllam fəda,
Qanıma batsun gərək bu xaki-paki-Kərbəla,
Çəkməli çıxsın yaralı sinəmə Şimri-dəğa,
Hülqimə zülm ilə qoysun xəncəri-bürran gərək.

Səbr elə hər cür müsibət yüz verə hərgah sənə,
Qıl təhəmmül, hər qədr zülm eyləsə düşmən sənə,
Bikəfən qallam, nə qüslü nə hənut olmaz mənə,
Qüslüm olsun zülm ilə, ey bacı, alü qan gərək.

Həqqə təslim eylərəm bu çöldə hər qurbanımı,
Şövq ilə verrəm, bacı, canan yolunda canımı,

Tifl Əliyyül-Əsğəri, nakam Əli ətşanımı,
Qanə batmış zibh edə bu bihəya üdvan gərək.

Əsğərün bu Kərbəladə hülqün oxlar Hərmələ,
Əsğərün qundağını allam bu Minadə ələ,
İnsü cinn ağlar o halə, yerlər eylər zəlzələ,
Əsğəri sirab edə ta navəkü peykan gərək.

Oxlanub açsun gözün gülsün, dübarə ağlasun,
Şiələr ta həşr olunca cümlə sinə dağlasun,
Madəri gözyaşlı gəlsün, yarəsini bağlasun,
Əsğərün qundağı olsun qan ilə yeksan gərək.

Qasimi-naşadımı ə`dalər eyləllə şəhid,
Göz yaşım rüxsarimə cari olar, qallam vəhid,
Halimə rəhm eyləməz bu dəştidə zalim pəlid,
Xanimani-Müctəba olsun, bacı, qurban gərək.

Qolların Əbbasımun bu çöldə eyləllə qələm,
Ey bacı, artar bu çöldə dərdü möhnət dəmbədəm,
Öldürüblər bizləri bu dəştidə qövmi-züləm,
Dəstgir etsün sizi bu ləşkəri-üdvan gərək.

Canıma hədsiz yetər bu dəştidə yarə, bacı,
Qanımı cari edəllə misli-fəvvarə, bacı,
Səbr elə, at çapsalar sinəmdə, biçarə bacı,
Qumlar üstə üç gecə-gündüz qalam üryan gərək.

Yandıralla xeyməgahi bu Minadə kufəyan,
Sizləri eylər əsir bu Şimri-dun bipasiban,

Naqə üstündə üsəra göz yaşın eylər rəvan,
Qarət etsün xeyməgahı qövmi-biiman gərək.

*Əfrad*

Bu çöldə Ali-Peyğəmbər təmam ağlallar,
Tənab ilə bacılarvun qolunı bağlallar.

Təmami-Ali-Əba bağlı qol-qola gəzəcək,
Əsir kimi yola alub, Şamü Kufəyə gedəcək.

Səkinənün olacaq Şamdə xərabə yeri,
Cəfa ilə kəsəcək qolların tənabə yeri.

Bu çöldə xeymələrim zülm ilə olar talan,
Babaya həsrət olan qızlarım edər əfğan.

Ədu cəvanlarımı qanə laləzar edəcək,
Hər anı xırdaca qızlar çölə fərar edəcək.

*Baqiyi-növhə*

Salmışam ruzi-Ələst dərdü bəlayə başımı,
Töhfətək bəzl etmişəm rahi-Xudayə başımı,
Şimri-dun vırsun gərək növki-cidayə başımı,
Nizə başında tilavət eyləyim Qur`an gərək.

Canım olsun o yaralı canuva qurban, Hüseyn,
Hər qədr olsa həyatım, eylərəm əfğan, Hüseyn,
Hər əzayi-qəmfəzadə sinəsi giryan, Hüseyn,
Nadimün etsün həmişə naləvü əfğan gərək.

## İmam Hüseyn (ə)-ın dilindən

Ey Xuda, imdadə yet, yox yavərü yarım mənim,
Sən özün agahsən, doğrandı ənsarım mənim.

Dəmbədəm eylər ziyadə əhli-kinə yasimi,
Su kənarında susuz öldürdülər Əbbasimi,
Yalquzam, ədu əlimdən aldı ətşan Qasimi,
Qalmayub bir kimsə də yarü həvadarım mənim.

Əkbəri-nakamımı üdvan əlimdən aldılar,
Zeynəbü Külsumü Leyla yaxşı ağlar qaldılar,
Şahid ol, pirü cəvan bu çöldə qurban oldular,
Yox nə sərdarım, nə salarım, nə eldarım mənim.

Əsğərün ləbtəşnə qaldı, qundağın aldım ələ,
Saldım ağlar çeşmilə tağı-səmayə vəlvələ,
Oxladı hülqün susuz, sinəmdə zalim Hərmələ,
Çün həman qan ilə əlvan oldu rüxsarım mənim.

Sən görürsən, ya Rəb, imdi kimsə yarım qalmayub,
Yarü ənsarım gedüb, bir qəmküsarım qalmayub,
Taqətim getdi əlimdən, ixtiyarım qalmayub,
Nə həvadar Hüseynim var, nə qəmxarım mənim.

Çün sizinlə etmişəm əhd, ey Xudayi-"ləm yəzəl",
Qürbət eldə etdigim əhdə bu gün eylüm əməl,
Parə-parə doğranan əzizlərim tapsun əcəl,
Canı yandırsun qəmində rişü rüxsarım mənim.

Sinəmə xoşdur mənim peykanə amac eyləsəm,
Bu boğazımdan axan qan ləxtəsin tac eyləsəm,
Nizə başında kəsik başımla me`rac eyləsəm,
Kufədə mətbəxsəradur bəzmi-dildarım mənim.

Saəti-də`vətdə gər Ali-Əba etsə fəğan,
Ləblərimdə Zeynəbim gər görsə çubü xeyzəran,
Qollarımda qul Səkinəm topraq üstə versə can,
Razıyam zəncirə bağlansa o bimarım mənim.

**Verən xak üstə can ətşan, yaralı**

Verən xak üstə can ətşan, yaralı,
Düşən gül peykəri üryan, yaralı.

Batubdur qanuva gültək cəmalun,
Bacuvı qoydı gözyaşlı bu halun,
Gəlibdür naləyə əhli-əyalun,
Görüblə nə`şüvi əl`an yaralı.

Gözi yaşlı qalubla Ali-Heydər,
Təmamən başlarında qarə mə`cər,
Tökəllə göz yaşı rüxsarə yeksər,
Edəllə naləvü əfğan, yaralı.

Kəsibdür başuvi əhli-sitəmkər,
Salublar cismüvi xun içrə bisər,
Düşübdi qumlar üstə qanlı peykər,
Bezəxmi-xəncəri-bürran, yaralı.

Səni zibh eyləyibdür Şimri-kafər,
Edibdür cismüvi qan ilə əhmər,
Bu cismün ərseyi-meydanə bisər,
Düşübdür qan ilə əlvan yaralı.

Yetibdür canuva zəxmi-cərahət,
Batubdur qarəyə əhli-vilayət,
Verübsən bu çölə xun ilə zinət,
Batubdur qanuva meydan, yaralı.

Qurub zülmün binasın əhli-kinə,
Töküblər qanuvı ruyi-zəminə,
Görüb bu haluvı ağlar Səkinə,
Olubdur haluva suzan, yaralı.

Vırublar Abidə zənciri-möhnət,
Dizində qalmayubdur tabü taqət,
Edibdür xeyməgahi Şimr qarət,
Oyan, ey qan ilə yeksan, yaralı.

Bu qəmdə könlüm oldı parə-parə,
Qolı bağlı çəkəllə hər diyarə,
Yetişdi vəqti-hicran, eylə çarə,
Olum gül cismüvə heyran, yaralı.

Olubdur qüssədən qəlbim hərasan,
Batubdur qanuva çün xaki-meydan,
Fəraqunda həmişə zarü giryan,
Çün ağlar Zeynəbi-nalan, yaralı.

Əzadarun olub biçarə Nadim,
Tökər əşki-bəsər rüxsarə Nadim,
Qələm əldə, yazar dilparə Nadim,
Olan ümmətlərə qurban yaralı.

**Həzrət Fatimeyi-Zəhra (ə) dilindən**

Ərseyi-meydandə bisər düşən,
Peykəri sədparə, Hüseynim vay.
Yox sənə bir kəs edə qüslü kəfən,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Kərbübəla dəştini rizvan edən,
Xaneyi-Peyğəmbəri viran edən,
Şiələrün çaki-giriban edən,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Kərbübəla qanuva yeksan batub,
Tazə cəvanlar hamı bisər yatub,
Bacılarun cümlə qərayə batub,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Əsğərüvün qundağın aldun ələ,
Eylədi peykanə nişan Hərmələ,
Əhli-cəfa ərşə salub vəlvələ,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Həqqi əyan eyləyüb etdün cihad,
Qırdılar ənsaruvı əhli-inad,
Düşməni-din qəlbləri oldı şad,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Ləşkərüvi qırdıla,* qaldun vəhid,
Doğradılar cismüvi qövmi-pəlid,
Qarətə yüz qoydula qövmi-ənid,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Yasə batub Ali-Əli cümləsi,
Ərşə çıxub naləvü əfğan səsi,
Zeynəbimün qalmayub heç bir kəsi,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Qarəyə batdı bu gün ərşi-Xuda,
Çün boyanub qan ilə Kərbübəla,
Nazlı Səkinə edər ahü nəva,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Şimr kəsəndə başuvı ah, ah,
Ağladı əhvaluva xurşidü mah,
Olmadı bir kimsə sənə dadxah,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

---

* Qırdılar

Şimr kəsən vəqt yaralı peykərün,
Oldı xərab xanəsi Peyğəmbərün,
Bəs, de görüm, kim kəsüb əngüştərün,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

Qəlbdə ah, dildə kəlam, Nadiməm,
Növhə edər əldə qələm Nadiməm,
Qəmdən olub qaməti xəm Nadiməm,
Peykəri sədparə, Hüseynim vay,
Bikəsü biçarə, Hüseynim vay.

**Xanım Zəhra (ə) dilindən**

Ey nuri-eyni-Zəhra,
Mənzil mübarək oğlum.
Yetdi məramə ə`da,
Mənzil mübarək, oğlum.

Lə`nət bu əhli-kinə,
Zülm etdi Şahi-dinə,
Bikəs qalub Səkinə,
Mənzil mübarək, oğlum.

Doğrandı Övnü Cə`fər,
Oxlandı hülqi-Əsğər,
Harda qalubdur Əkbər?
Mənzil mübarək, oğlum.

Zülm ilə axdı qanlar,
Qanə batub cəvanlar,
Harda qalub Ələmdar?
Mənzil mübarək, oğlum.

Qarət olub əsasun,
Zeynəb dutubdı yasun,
Sölə, hanı libasun?
Mənzil mübarək, oğlum.

Ətfal dəsti bəstə,
Ey Şahi-dilşikəstə,
Yatma, oğul, kül üstə,
Mənzil mübarək, oğlum.

Kəsmişdim imdi yanun,
Yaxdım yüz üstə qanun,
Gəldi öz saribanun,
Mənzil mübarək, oğlum.

Çox çəkmisən əziyyət,
Bir ləhzə yuxla rahət,
Fərşün tənuri-xəlvət,
Mənzil mübarək, oğlum.

Ey Nadimi-diləfruz,
Ağla Hüseynə hər ruz,
Zəhra dalınca dilsuz,
Mənzil mübarək, oğlum.

**Yerlər ağladı, göglər ağladı**

Şahi-möhtəşəm zibh olan zəman,
Yerlər ağladı, göglər ağladı.
Tirələndi, tar oldı asiman,
Yerlər ağladı, göglər ağladı.

Kərbəladə ol ləşkəri-ənid,
Şahi-Yəsribi qoydular vəhid,
Təşnələb onı etdilər şəhid,
Cümleyi-məlayiklər ağladı.

Kəsdi peykərün Şimri-bihəya,
Cismdən sərün eyləyüb cüda,
Lərzə eyləyüb dəşti-Kərbəla,
Dəsti-Şimrdə xəncər ağladı.

Şimri-bihəya kəsdi həncərün,
Qan ilə xizab etdi peykərün,
Sariban qət` eylüb əllərün,
Fatimə olub müztər, ağladı.

Lə`nəti-Xuda əhli-kinəyə,
Vırdılar başun növki-nizəyə,
Yetdi bu xəbər çün Səkinəyə,
Xahəri-Əli Əkbər ağladı.

Can verən zəman Şahi-biniyaz,
Xaliqə edüb qan içində naz,
Qan ilən alan vəqtə dəstəmaz,
Ruhi-paki-Peyğəmbər ağladı.

Qanə qərq olub Şahi-bisipah,
Qalmamışdı ol vəqtə bir pənah,
Mülki-din xərab oldı ah, ah,
Cənnət içində hurilər ağladı.

Oldı qaninə Şahi-din hədəf,
Bəstəri olub xakü xun ələf,
Va oğul dedi, çün Şəhi-Nəcəf,
Növhə eyləyüb Heydər ağladı.

Ağlasun gərək şiələr təmam,
Saxlasun əza hər səbah-axşam,
Can verən zəman Şahi-təşnəkam,
Cəbrəil vırub şəhpər, ağladı.

Qaninə batan vəqtidə İmam,
Etmədi həya ləşkəri-zülam,
Qətligahə yüz qoydular təmam,
Ali-Müstəfa yeksər ağladı.

Xeymələr dutan vəqtidə şərar,
Düxtərani-tifl etdilər fərar,
Yüzdə əşki-tər, qəlbi biqərar
Oldı Şafiyi-məhşər ağladı.

Vırdılar başın növki-nizəyə,
Etdilər rəvan Şamü Kufəyə,
Nadim, ağla Şahi-Mədinəyə,
Bu bəzmdə hər gözlər ağladı.

**Olan gül cismi qan ilə gülnar, Hüseynim**

Yaralı başuva qurban bu dilşikəstə,
Olan gül cismi qan ilə gülnar, Hüseynim.
Gəl sinəmə, yaralısan, yatma kül üstə,
Ey ənvəri-eyni-Heydəri-Kərrar, Hüseynim.

Söylə, yalquz yatubsan, bəs elün nə olubdur?
Gülzari-eşqdə yeksər gülün solubdur,
Çox qəmlisən, oğul, yoxsa Əkbər ölübdür?
Hanı bəs Əkbəri-mələkrüxsar, Hüseynim?

Nə olub, kənar oldun qəbiləndən, elindən,
Bülbül rəva degil ayrı düşsün gülündən,
Alublar Əbbas oğlumı yoxsa əlündən?
Susuz, cananə can verüb sərdar Hüseynim.

Görcək yaralı başuvı, artdı hərasım,
Neçün səs vermisən, rəva qıl iltimasım,
Yoxsam* ki, namurad ölub şəhzadə Qasım?
Çapublar nə`şin üstə at əğyar, Hüseynim.

Məhasinin gözün yaşı rəvan olubdur,
Sirişki-didən ağlamaqdan qan olubdur,
Yoxsam Əsğər balan oxa nişan olubdur?
Qundağı qan ilə olubdur xunbar, Hüseynim.

Axır, oğul, söylə, nə olub cahü cəlalun?
Yoxsa qarət edüb düşmən malü mənalun?

---

* Yoxsa

Aç gözlərün, axır qalub başsız əyalun,
Əsir edüblər Zeynəbi küffar, Hüseynim.

Gördüm yaralı cismüvi Kərbübəladə,
Bifərşü bibəsər düşüb üryan aradə,
Nazlı başun gəh kül üstə, gahi cidadə,
Gəzdirər hər şəhri qövmi-xunxar, Hüseynim.

Danış mənlən, təsəlli ver mən naümidə,
Bacun Zeynəb əsir olub ceyşi-Yəzidə,
Müsibətdən dönübdür qanə əşki-didə,
Yetibdür Əhli-Beytə çox azar, Hüseynim.

Olubdur Nadimün yüzə göz yaşı cari,
Yazar zikri-Möhsin, ağlar Leylivü Bimari,
Məhşər güni nəvaxanə rəhm eylə, bari,
Olan gül cismi qan ilə gülnar, Hüseynim.

### Cənab Seyyidüş-şühədanun razü niyaz məqamında minacatı*

Ey Əli, bala, Səkinəmi sariban yerə salubdı,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

Ta ki, gəlməsə Səkinə, mən nizə qoymaram rəvan ola,
Olmaram riza bu tirə şəb övliyətimdən bağrıqan ola,
Mən gedim, necə qoyum balam bu xətərli çöldə tək qala,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

---

* “Minacati-cənab Seyyidüş-şühəda (ə) dər məqami-razü niyaz”

Razıyam əgərçi eylədi zibh ceyşi-kufəyan məni,
Gəlmədim əgərçi mən dilə incəndə[**] sariban məni,
Səslir hərayə xövfdən ol səğir, kufəyan, məni,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

Eylədi kəbabdil məni ol səğirin ağlamaq səsi,
Gətdi naləyə mələkləri düxtərimin ahü naləsi,
Mən gedim əgər, bu dəştidə yadə kim salar o bikəsi,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

Nəhrtək ədu rəvan edə qanımi cəhanə, razıyam,
"Va əxa" sədası Zeynəbim salsa asimanə, razıyam,
Dəgsə ləblərimə xeyzəran, çubü taziyanə, razıyam,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

Şamə razıyam gedəm, oğul, Əhli-Beyti-bağrıqan ilə,
Qollaruvı bağlasa ədu, naqə üstə risman ilə,
Olmaram riza qala qızım çöldə naləvü fəğan ilə,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

Şimrə söylə, naqədən salub sariban balam Səkinəni,
Şami-şumə olmaram rəvan, qoymaram güli-Mədinəni,
Xövf əgər edəm, həlak edər tirə şəbdə ol həzinəni,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

Sübhü şam, Hüseyn, fəğan edər bu qəmü məlalə Nadimün,
Oxşayub zəbani-hal ilən ağlayar o halə Nadimün,

---

[**] İncidəndə

Çün sənün dilincə cəm` edir əldə bir risalə Nadimün,
De bu bihəyalərə, oğul, getmərəm, balam qalubdı.

**Ya Hürr**

Aç gözlərün, gəldim imdadə, ya Hürr,
Adı azad, özi azadə, ya Hürr.

Anan adlandırub azadə ismün,
Bəli, azadədür üqbadə ismün,
Fəna olmaz fəna dünyadə ismün,
Həmişə hürrsən üqbadə, ya Hürr.

Qutardım can verüb xəcalətündən,
Səd heyf, məhrum oldum söhbətündən,
Cövrü cəfa xoşdur məhəbbətündən,
Hər qədr yetsə bu naşadə, Mövla.

Qəmdən qutardun, cismün oldı xunbar,
Səni aldı əlimdən ceyşi-xunxar,
Eylə bəyan hərgah vəsiyyətün var,
Əyan et bu evi bərbadə, ya Hürr.

Əgər lütf eyləsən, ey Şahi-biyar,
Cənazəm qoyma ə`da eyləsün xar,
Tapşur, mənə ətfalun ağlasunlar,
Anam, bacım yox bu səhradə, Mövla.

Cənazən qoymaram xar etsün əğyar,
Qəm etmə, nə`şün üstə ağlayallar,

Töküb göz yaşı, sinə dağlayallar,
Gələr Ali-Əba fəryadə, ya Hürr.

Tərəhhüm et, Şəhi-ətşan, qəribəm,
Edüblə qanıma əlvan, qəribəm,
Su tapson, et mənə ehsan, qəribəm,
Susuz qurbanuvı sal yadə, Mövla.

Məni əfv et, suya gəlməz gümanım,
Susuzdan od dutubdur üstüxanım,
Sənüntək təşnəyəm, yanar zəbanım,
Degil mümkin su bu səhradə, ya Hürr.

Həmişə Nadimün leylü nəhari,
Olubdur ağlamaq dünyadə kari,
Məni çox qorxudur qəbrün fişari,
Yox səndən özgə yetsün dadə, Mövla.

**Vay, Şəhi-məzlum, Hüseyn vay, vay***

Peykəri öz qanına əlvan olan,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay.
Gül bədəni günlərə suzan olan,
Bikəsü məğmum, Hüseyn vay, vay.

Rahi-vəfadə kəsilən Əkbəri,
Tir ilə sirab olunan Əsğəri,
Bağladı ə`da dəri-Peyğəmbəri,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

---

* "Sinəzəni-Aşura"

Qoydula tənha səni qövmi-dəğa,
Ağladı əhvaluva ərzü səma,
Qanə batub türbəti-Kərbübəla,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

Saldıla qolsuz, yerə Əbbasuvi,
Qarət edüblə hamı mirasuvi,
Olmadı bir kimsə duta yasuvi,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

Ali-Əli cümləsi talandılar,
Şö`lələnüb xeymələrün yandılar,
Atəşi-hicran ilə odlandılar,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

Tuş olu gəh Şimri-dəğayə başun,
Gah dolanar növki-cidayə başun,
Gahi enər təşti-təlayə başun,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

Ərşə salub Zeynəbün əfğan səsün,
Zəccə edüb ağlayar ol bikəsün,
Başun oxur nizədə "Nur" ayəsin,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

Dutmış əza əldə qəra şiələr,
Şur ilə eyləllə səda şiələr,
Söyləyür hər sübhü məsa şiələr,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

Əldə qələm Nadimün eylər nəva,
Növhə edər, ey Şəhi-gülgunqəba,
Qasimi-nakami yaxan qan həna,
Vay, Şəhi-məzlum, Hüseyn vay, vay,
Bikəsü məğmum, Hüseyn vay, vay.

**Əfrad**

Qoyma bu çöldə Zeynəbi avarə, ya Hüseyn,
Bir çarə et bu bikəsü biyarə, ya Hüseyn.

Getmə bu çöldə rəzmgahə, əl-əman, əxa,
Bir baxgilən şəqavəti-küffarə, ya Hüseyn.

Olma riza ki, qollarımı bağlaya ədu,
Rəhm eylə sən bu didəsi xunbarə, ya Hüseyn.

Bu çöldə bircə sənsən həvadarı Zeynəbün,
Getmə, bu cismüvə yetüşər yarə, ya Hüseyn.

Getmə bu rəzmgahə Əbülfəzl gəlmədi,
Oldı şəhid o sərvəri-məhparə, ya Hüseyn.

Hicri o sərvərün eyləyüb qəddimi kəman,
Çeşmim qalub həsrət o sərdarə, ya Hüseyn.

Rəngi uşaqlarun saralub kəhrəba kimi,
Bir baxgilən Səkineyi-naçarə, ya Hüseyn.

Şimrün nə həddi var ki, məni eyləsün əsir,
Eşqün çəkər sənün məni bazarə, ya Hüseyn.

Zənciri-kin vurarla zəmanə İmaminə,
Çox zülm edərlər Abidi-bimarə, ya Hüseyn.

Nadim həmişə növhə edüb ağlayar səni,
Saxlar əza o qolsuz Ələmdarə, ya Hüseyn.

**Əfrad**

Rəhm etgilən bu hali-pərişanə, ey baba,
Gəl, getmə həqq rizasinə meydanə, ey baba.

Vallahi, bircə gün çəkə bülməm fəraquvi,
Salma bu tifli möhnəti-hicranə, ey baba.

Getsən, səni şəhid eləyər Şimri-bihəya,
Rəhm eyləməzlə Şahi-şəhidanə, ey baba.

Getdi mənə su gətirməgə namdar əmüm,
Batdı su üstə cismi qızıl qanə, ey baba.

Əhli-cəfa uzun qolunı  etdilər qələm,
Döndi bu qəmdə göz yaşım ümmanə, ey baba.

Vallah, ölüncə istəmərəm su, yanam əgər,
Sənsiz gərək degil su bu ətşanə, ey baba.

Allah rizasinə bizi qaytar Mədinəyə,
Mən dəstgir olmayım üdvanə, ey baba.

Ləbtəşnə batdı qanə bu gün nazlı Əkbərim,
Su vermədilər Əkbəri-ətşanə, ey baba.

Öldürsələr səni, bizi eylərlə dəstgir,
Qolbağlı gəzdirəllə zəlilanə, ey baba.

Səndən sora bu xeymələri yandırar ədu,
Bu əhli-kinə atəşi-suzanə, ey baba.

Ahu kimi bu Ali-Əli Şamə yüz qoyar,
Qaçmağlıq ilə kuhü biyabanə, ey baba.

Eylər əsir bu ləşkəri-üdvan əyaluvı,
Qolbağlı gəzdirəllə zəlilanə, ey baba.

Axır çəkəllə bizləri Şamə cəfa ilən,
Məskən olar əyaluva viranə, ey baba.

Məhşər güni şəfaət edən vəqtə ümmətə,
İmdad elə o Nadimi-nalanə, ey baba.

**İmam Hüseyn (ə)-la Həzrət Zeynəbün xudahafizləşməsi**

Şəhadət mövsümi yetdi,
Əlündən izzətün getdi,
Bacı, Zeynəb, xudahafiz,
Bacı, Zeynəb, xudahafiz.

Mənə rəhm et, əman, qardaş,
Tökər çeşmim yüzə qan-yaş,
Nedim axır məni-külbaş,
Hüseyn, qardaş, xudahafiz.

Bu çöldə cuş edər qəmlər,
Yolum gözlər Əli Əkbər,
De, gəlsün Ali-Peyğəmbər,
Bacı, Zeynəb, xudahafiz.

Əxa, getsən yəqin ölləm,
Dalunca ağlayub gəlləm,
Əsiri-əşqiya ollam,
Hüseyn, qardaş, xudahafiz.

Mübariz istəyir ləşkər,
Alublar əllərə xəncər,
Mənə həm madərü xahər,
Bacı, Zeynəb, xudahafiz.

Səkinə eyləyür nalə,
Düşüb qəmdən yəman halə,
Əxa, rəhm eylə ətfalə,
Hüseyn, qardaş, xudahafiz.

Qəmü möhnətlərün artdı,
Qəraye masiva batdı,
Xanımlıq günlərün getdi,
Bacı, Zeynəb, xudahafiz.

Əgər getsən, səni ətşan
Şəhid eylər yəqin üdvan,
Bacun ol haluva qurban,
Hüseyn, qardaş, xudahafiz.

Çəməndə güllərün soldı,
Bəla ətrafuvı aldı,
Əsirligün yəqin oldı,
Bacı, Zeynəb, xudahafiz.

Səni gər öldürə ləşkər,
Əsir eylər bizi yeksər,
Nə etsün Ali-Peyğəmbər?
Hüseyn, qardaş, xudahafiz.

Xəbər ver Fatimə gəlsün,
Əlinə bir qəra alsun,
Qərami başına salsun,
Bacı, Zeynəb, xudahafiz.

Qəravı başimə sallam,
Əlimə saçlarım allam,
Cənazən üstə gəlləm,
Hüseyn, qardaş, xudahafiz.

Az ağla, ey bacım Külsum,
Hələ ölmüb Şəhi-məzlum,
Dolubdur qan ilə könlüm,
Bacı, Zeynəb, xudahafiz.

Bacun Külsum sənə qurban,
Əxa, səbr etgilən bir an,
Ölüncə eylərəm əfğan,
Hüseyn, qardaş, xudahafiz.

Səkinəm binəva oldı,
Bəlayə mübtəla oldı,
Əsiri-əşqiya oldı,
Bacı, Zeynəb, xudahafiz.

Bu şərhi Nadimi-naçar,
Qələm əldə yazub ağlar,
Ona rəhm et, Şəhi-əbrar,
Hüseyn, qardaş, xudahafiz.

**Həzrət Zeynəbün dilindən**

Sərvəri-dövran vay, Şəhi-ətşan, vay, Hüseyn vay,
Şahi-məzluman, ümmətə qurban, vay, Hüseyn vay.

Kim səni, qardaş, zülm ilə şəhid eyləyüb dəşti-Kərbəladə?
Yaralı cismün xakü xunalud, çün düşüb bisər Neynəvadə,
Zibh olub yetmiş iki qurbanun, ey Xəlili-Həqq, bu Minadə,
Kim səni edüb zülm ilə bu gün qanuva əlvan, vay, Hüseyn vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

Mən gərək daim bu müsibətə ağlayım, qardaş, zarü giryan,
Çün səni gördüm, Şimri-bihəya zülm ilə edüb qanə əlvan,
Bir oyan, qardaş, Zeynəbi-zarun qüssədən olub zarü giryan,
Dəstgir edüb bacılaruvı ləşkəri-üdvan, vay, Hüseyn vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

Bu müsibətdə çün mələklər qarəpuş olub yeksər ağlar,
Vay Hüseyn deyüb, göz yaşı tökər bu əzadə, Peyğəmbər ağlar,
Dildə ahü va, gözdə əşki-tər, nalə eyləyüb Heydər ağlar,
Ali-Müstəfa göz yaşı töküb, eyləyər əfğan, vay, Hüseyn vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

Şiələr gərək bu müsibətdə qarəpuş olub ağlasunlar,
Ruzi-həşrətək növhə eyləyüb, suz ilən cigər dağlasunlar,
Nə rəvadı bu əhli-kufəyan Zeynəbün qolun bağlasunlar,
Qarət eyləyüb xeyməgahımı ceyşi-kufəyan, vay, Hüseyn vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

Növhə eyləyüb ruzi-həşrətək, ya Hüseyn, gərək ağlayam mən,
Şimri-bihəya qoymadı nedim, gözlərüvi çün bağlayam mən,
Qoymadı ədu tə`ziyə dutub, bir sənə əza saxlayam mən,
Necə tab etsün min müsibətə bir zəif can, vay, Hüseyn vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

Bu müsibətdə Kə`beyi-Xuda qarəyə batub, qardaş, əl`an,
Çünki zülm ilə dari-imanı qövmi-kufəyan qoydı viran,
Qarət eyləyüb hər əsasımı cövr ilə bu gün ceyşi-üdvan,
Bizləri əsir eyləyüb təmam əhli-kufəyan, vay, Hüseyn vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

Bizləri qolı bağlı əşqiya zülm ilə çəkər hər diyarə,
Zeynəbün gərək ağlasun müdam, gördi cismüvi parə-parə,
Vermiri fürsət ləşkəri-ə`da, cismüvi qoyaydım məzarə,
Bikəfən qalan xaki-xun üstə peykəri üryan, vay, Hüseyn vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

Çün qələm əldə ağlayub gələr, hər mühərrəm əfğanə Nadim,
Bu müsibətdə döndərübdi çün, əşki-çeşmün ümmanə Nadim,
Yaz risalə, hər vəqfə göz yaşun tök yüzə zəlilanə, Nadim,
Ey susuz olan dəşti-Minadə ümmətə qurban, vay, Hüseyn
vay.

Vay Şəhi-məzlum, ey bəradər,
Bikəsü məğmum, ey bəradər,
Çün əsirligə oldı əl`an,
Zeynəbə mə`lum, ey bəradər.

**Həzrət Zeynəbün dilindən**

Qalan ətfalı avarə,
Hüseynim vay, Hüseynim vay.
Düşən gül cismi sədparə,
Hüseynim vay, Hüseynim vay.

Salublar cismüvi üryan,
Edüblə qanuva əlvan,
Bacun Zeynəb sənə qurban,
Hüseynim vay, Hüseynim vay.

Solubdur güllərim, qardaş,
Daşıbdur qəmlərim, qardaş,

Oyan, qəmpərvərim, qardaş,
Hüseynim vay, Hüseynim vay.

Qəribi-biməkan oldum,
Əsiri-kufəyan oldum,
Qəmində növhəxan oldum,
Hüseynim vay, Hüseynim vay.

Solub zülm ilə gülzarım,
Dəxi yox bir pərəstarım,
Düşən sədparə sərdarım,
Hüseynim vay, Hüseynim vay.

Əsiri-əşqiya Zeynəb,
Bəlayə mübtəla Zeynəb,
Sənə olsun fəda Zeynəb,
Hüseynim vay, Hüseynim vay.

Əsir eylüb məni üdvan,
Ölüncə eyləyər əfğan,
Gözün aç, ey Şəhi-dövran,
Hüseynim vay, Hüseynim vay.

Gələ lə`nət bu əyyamə,
Yetirdi zülmün itmamə,
Necə sənsiz gedim Şamə?
Hüseynim vay, Hüseynim vay.

Əsirəm ceyşi-küffarə,
Bu çöldə qaldım avarə,

Oyan, qıl dərdimə çarə,
Hüseynim vay, Hüseynim vay.

Bu çöldə doğranub Əkbər,
Ölübdür zülm ilə Əsğər,
Yıxıldı dari-Peyğəmbər,
Hüseynim vay, Hüseynim vay.

Ələmdarım ölüb, qardaş.
Gözüm xunbar olub, qardaş,
Bacun başsız qalub, qardaş,
Hüseynim vay, Hüseynim vay.

Bu qəmdə Nadimi-şeyda,
Edər bəzmi-əza bərpa,
Gözün aç, ey Şəhi-vala,
Hüseynim vay, Hüseynim vay.

**Əfrad***

Saldı fələk nə möhnəti-hicranə Zeynəbi,
Yandırdı dərdü möhnəti-suzanə Zeynəbi.

Çün eyləyüb zəmanədə avareyi-vətən,
Saldı piyadə kuhü biyabanə Zeynəbi.

Kərbübəlanı məskən edüb ol əliləyə,
Çün saldı Qadisiyyədə tufanə Zeynəbi.

---

* Orijinalda dübeyt kimi getmişdir

Öldürdülər bu dəştidə yeddi bəradərin,
Suzi-dil ilə gətdilər əfğanə Zeynəbi.

Aldı əlindən izzətü cahü cəlalını,
Verdi əsir ləşkəri-üdvanə Zeynəbi.

Əvvəl Mədinədən çıxarub ehtiram ilən,
Etdi səvar naqeyi-üryanə Zeynəbi.

Gətdi o dəştə məhməli-zərrinnigar ilən,
İmdi müsafir etdi zəlilanə Zeynəbi.

Təqsim edüb fələk qəmi Ali-Peyəmbərə,
Axırda çəkdi guşeyi-viranə Zeynəbi.

Qəmnak çeşmi çəkdi fələk hər vilayətə,
Yandırdı çün şəmatəti-biganə, Zeynəbi.

Bəzmi-əzadə, Nadim, əza saxla hər zəman,
Gətdi Hüseyn müsibəti əfğanə Zeynəbi.

**Həzrət Zeynəbün dilindən**

Zeynəbəm, yaxşı fələk eylədi avarə məni,
Cigəri dağlı, gözi yaşlı, güni qarə məni.

Dili-Zeynəb qəmü ənduhimə munisdi müdam,
Çün süruri-dil olub Zeynəbə aləmdə həram,
Gözümün yaşı üzə caridür hər sübh və şam,
Qəmü ənduhü mühən tuş edər azarə məni.

Halımi, bari, Hüseyn, qardaş, özün al nəzərə,
Sən öləndən sora kim yar olu bu dərbədərə?
Od vırar Şimri-dəğa zülm ilə bu xeymələrə,
Firqətün yandıracaq həşrə kimi narə məni.

Cismi-məcruhüvi qan üstə susuz salsala* gər,
Xeyməni qarət edüb, rəxtimizi alsala** gər,
Bu səfərdə balalar zülfü sərün yolsala*** gər,
Çəkəcək Şimri-dəğa kuçəvü bazarə məni.

Qoydı ağlar gözümi dəhridə Əbbas ölümi,
Soldurub cövri-xəzan səhndə yeksər gülümi,
Risiman ilə ədu bağlayacaqlar qolumı,
Zülm ilə çərxi-fələk etdi günü qarə məni.

Bizi üryan dəvəyə mindirə gər ləşkəri-dun,
Sürəcək qətlgəhə Şimri-dəğa naləkünun,
O kəsik başuvı ədulər elür qərq bəxun,
Sənün eşqün çəkəcək Kufədə bazarə məni.

Tökələr üstümə hər növ`i müsibət, dözərəm,
Başımun mə`cərini etsələ qarət, dözərəm,
Eyləsə ibn Ziyad tə`nə, şəmatət, dözərəm,
Çox çətindür çəkələr məclisi-əğyarə məni.

Bacun ölsün, hamı möhnətdən əşəddür bu bəla,
Salalar Şamə tərəf Zeynəbi qolbağlı yola,

---

* Salsalar
** Alsalar
*** Yolsalar

Dura dərvazeyi-saətdə hərasan üsəra,
Çəkəcək qəlbi sınıq, məclisi-küffarə məni.

Şamdə tə`nə edər zadeyi-Mərcanə bizə,
Gəlübən cümlə nəzər eyləyə biganə bizə,
Olu məskən o zəman guşeyi-viranə bizə,
Ya Hüseyn, tapşur özün, bari, o bimarə məni.

Ya Hüseyn, Pənctəni-Ali-Əba hörmətinə,
Zeynəbi-xuni-cigər, bəxti qəra hörmətinə,
Qırxadək əlsiz-ayaqsız üsəra hörmətinə,
Nadiməm, bir də yetir rövzeyi-sərdarə məni.

**Payi-minbər**

Nə edim bəs mən bağrıqan, əmməcan,
Olar göz yaşım çün rəvan, əmməcan.

Yüzüm gültək ənduhü qəmdən solub,
Gözüm yaşı viranədə qan olub.
Məni nə oldı bais gözdən salub,
Şahi-insü can, əmməcan, əmməcan.
Əman, əl-əman, əmməcan, əmməcan,

Əman, əmmə, söylə, hanı Əkbərim?
Şibhi-Peyğəmbər, mələkmənzərim,
Düşər yadə hər dəm əziz günlərim,
Mənim hər zəman, əmməcan, əmməcan,
Əman, əl-əman, əmməcan, əmməcan.

Səkinəm fəğan etməz öz başinə,
Qalub həsrət aləmdə qardaşinə,
Öləndə yazun qəbrimin daşinə,
Qolunda tənab verdi can, əmməcan,
Əman, əl-əman, əmməcan, əmməcan.

Əsirlik dəxi qoymayub məndə tab,
Əman, əmmə, qəribəm, oldum kəbab,
De Şimrə, gətürsün qolumdan tənab,
Verəm, bari, asudə can, əmməcan,
Əman, əl-əman, əmməcan, əmməcan.

**Payi-minbər Zeynəb dilindən**

Qərib əmmən sənə qurban, Səkinə,
Az ağla, eyləmə əfğan, Səkinə.

Cəfa çəkdün zibəs viranələrdə,
Baba-baba dedün çox bu səfərdə,
Yatubsan, var aradə bircə pərdə,
Baban gəlmiş sənə mehman, Səkinə.

Qərib əmmən sənə qurban, Səkinə,
Az ağla, eyləmə əfğan, Səkinə.

Bir aram ol, neçün çoxdur hərasın,
Başımdan açmamış qardaş qərasın,
Budur qorxum, dutam qürbətdə yasın,
Qolunda ip, verərsən can, Səkinə.

Qərib əmmən sənə qurban, Səkinə,
Az ağla, eyləmə əfğan, Səkinə.

Yanımda yox, nedim, qövmü qəbiləm,
Əsirəm ruzigarə, dəstgirəm,
Ölüb qardaşlarım, xarü zəliləm,
Sənüntək olmuşam giryan, Səkinə.

Qərib əmmən sənə qurban, Səkinə,
Az ağla, eyləmə əfğan, Səkinə.

**Gəldi əman Zülcənah**

Əmmeyi-biçarə, dur, gəldi əman Zülcənah,
Qanə boyanmış gəlür, şeyhəkünan Zülcənah.

Qanə boyamış əyərbəndi, licamin qırub,
Oldı yəqinim, ədu zülm binasın qurub,
Yoxsa babamı mənim əhli-cəfa öldürüb?
Şur ilə eylər yüzə əşki-rəvan Zülcənah.

Titrədi yerlər, qəra yellər əsər bihesab,
Əmmə, bu halət dəxi qoymadı heç məndə tab,
Bircə, kənarə çıxun xeymədən, Ali-Türab,
Siz də deyün, noldı bəs Şahi-cəhan, Zülcənah.

Gördi ki, şeyhə səsün Zeynəbi-müztər, gəlür,
Qəlbinə ilham olub, üstünə qəmlər gəlür,
Beylə güman eylədi, varisi-Heydər gəlür,
Xaric olub xeymədən söylədi, can Zülcənah.

Gördi gəlür Zülcənah yalı batub qaninə,
Bildi ki, asib yetüb Şahi-şəhidaninə,
Bais olub Zeynəbün naləvü əfğaninə,
Gördi ki, qəmdən edir əşki-rəvan Zülcənah.

Etdi sual Zeynəbi-bikəsü mahi-liqa,
Məndən edüblər ədu yoxsa Hüseyni cüda,
Qanə batub zülm ilə yoxsa Şəhi-Kərbəla,
Bəzl eləyüb Xaliqə şövq ilə can, Zülcənah.

Harda Hüseyni salub, eylə bəyan, gəlmisən,
Yaluvı əlvan edüb qırmızı qan, gəlmisən,
Söylə, nolub sahibün, şeyhəkünan gəlmisən,
Yoxsa evimi yıxub Şimrü Sinan, Zülcənah?

İzni-Xudayilə, bir söylə, nolub qardaşım?
Qan ilə islanmısan, harda qalub qardaşım?
Söylə, səlamətdi, ya yoxsa ölüb qardaşım?
Övc eləyür xeymədən ərşə fəğan, Zülcənah.

Müntəzirəm, vergilən sərvəri-dindən xəbər,
Qəlbimün aramı ol nuri-düeyndən xəbər,
Bikəs, oğulsuz qalan təşnə Hüseyndən xəbər,
Vəz`ini et Zeynəbi-zarə bəyan, Zülcənah.

Nadimi-bikəs yazar bu sözi əfğan ilən,
Nazlı Səkinə çıxub, Zeynəbi-nalan ilən,
Kakilü yalın, xizab eyləmiş al qan ilən,
Qanə boyanmış gəlür şeyhəkünan Zülcənah.

## Həzrət Zeynəb Seyyidüş-şühədayə xitabən

Rəhm etgilən, əmandur, mən binəvayə, qardaş,
Bu Ali-Müstəfanı salma bəlayə, qardaş.

Cəddim xəbər veribdür var xatirində axir,
Gəl, Kərbəla çölünə etmə bizi müsafir,
Zəhra məzari üstə, qoy, mən olum mücavir,
Çəkmə bu qəm qətarın Kərbübəlayə, qardaş.

Cəddim Mədinəsindən salma bizi kənarə,
Ağlar gözün fədası olsun bu bəxti qarə,
Ölsən əgər vətəndə, vardur qoyan məzarə,
Hazır olar qəbilən bəzmi-əzayə, qardaş.

Olma riza, əmandur, ey Şahi-dilşikəstə,
Töksün üzarə əşki-çeşmin bu zarü xəstə,
Qorxum budur ki, Xuli qoysun başun kül üstə,
Olsun əsir əyalun Şimri-dəğayə, qardaş.

Olma riza Mədinə qalsun xərabə, qardaş,
Rəhm eylə Əhli-Beyti-zarü həzinə, qardaş,
Göz yaşını üzarə töksün Səkinə, qardaş,
Rəhm etgilən, əmandur, ol binəvayə, qardaş.

Aya rizasən Əkbər öz qaninə boyansun?
Nari-fəraqə Leyla, Əkbər qəmində yansun,
Zülm ilə xeyməgahun qarət olub talansun,
Yansun xiyamə, dudi yetsün səmayə, qardaş.

Vallahi, bu səfərdən çoxdur mənim hərasım,
Qorxum budur ki, qardaş, talan ola əsasım,
Batsun sitəmlə qanə ol şahzadə Qasim,
Etsün xizab əlini qandan hənayə, qardaş.

*Əfrad*

Əmandı, etmə səfər səmti-Kərbəlayə, Hüseyn,
Bacuvı salmagilən möhnətü bəlayə, Hüseyn.

Rizasən, eyləyələr parə-parə gül bədənün,
Tökə sirişkin üzarə bu zarü qəmzədənün.

Özün bilürsən, əxa, xeyməgahım odlanacaq,
Əzizə bacılarun nari-firqətə yanacaq.

Bu Kərbəla səfərün, tərk elə, əman, qardaş,
Tərəhhüm et bacuva, Şahi-insü can, qardaş.

Gəl, etmə mürğsifət həsrət aşiyanə məni,
Əsir verməgilən Şimrlə Sinanə məni.

*Baqiyi-növhə*

Getsən yəqin vətəndən, hicrində ağlaram mən,
Talan olar əsasun, çox sinə dağlaram mən,
Başə Hüseyn qərasın, gözyaşlı bağlaram mən,
Zibh etsə başun ə`da, vırsa cidayə, qardaş.

Olma riza, Hüseyncan, bu Zeynəbün talansun,
Ali-Əli sitəmlə nari-fəraqə yansun,
Əsğər necə rəvadur öz qaninə boyansun?
Bikəs Rübabə gəlsün neytək nəvayə, qardaş.

Əzm eyləmə Əraqə, salma bəlayə başun,
Qorxum budur ki, batsun xuni-cəfayə başun,
Zibh etsə Şimr, vırsa növki-cidayə başun,
Zənciri-kin vırallar Ali-Əbayə, qardaş.

Soysa libasun üdvan, qalsa cənazən üryan,
Övc eylər ərşə ahi-dudi-dili-yetiman,
Bimar od içrə qalsa misli-Xəlili-Rəhman,
Kim eyləyər himayət sən binəvayə, qardaş?

Çəksə biz Əhli-Beyti qolbağlı Şamə üdvan,
Eylər başun tilavət növki-cidadə Qur`an,
Tə`nü şəmatət eylər Ali-Əbayə üdvan,
İcz eyləyim nə növ`i Şimri-dəğayə, qardaş.

Viranə məscid içrə yer versə əhli-kinə,
Topraqlar üstə rehlət, etsə qızun Səkinə,
Sölə, nədür əlacım, ey Sərvəri-Mədinə,
Verməkligə təsəlli sən, gəl hərayə, qardaş.

Aç dideyi-bəsirət, yaz, getmə huşə, Nadim,
Təb`ün gələn zəmanda bu qəmdə cuşə, Nadim,
Bu beytlər olallar dəstündə tuşə, Nadim,
Zeynəb dilərdi, rəhm et, Ali-Əbayə, qardaş.

**Ey qumlar üstə bikəfən**

Ey qumlar üstə bikəfən
Cismi düşən üryan, baba.
Ey Kərbəladə zülm ilən,
Cismi olan al qan, baba.

Qanə batub gül peykərün,
Gültək solubdur ləblərün,
Oldı bu çöldə Əkbərün,
Ümmətlərə qurban, baba.

Talan edüb əsasuvı,
Öldürdilər Əbbasuvı,
Saxlar bu bikəs yasuvı,
Olsa həyat hər an, baba.

Mən mürği-bağі-Heydərəm,
Şibhi-Rəsulə xahərəm,
Dindür, əzizə düxtərəm,
Zəvvaruvam əl`an, baba.

Tökdi ədu göz yaşımı,
Öldürdilər qardaşımı,
Yollam qəmündə başımı,
Çox eylərəm əfğan, baba.

Gər zibh edüb ə`da sərün,
Qanə batub gül peykərün,
Bəs kim kəsibdür əllərün?
Qəlbim olub viran, baba.

Soldurdular gülzaruvı,
Öldürdilər sərdaruvı,
Əldən alub ənsaruvı,
Bu ləşkəri-üdvan, baba.

Düşdüm cəhandə möhnətə,
Dərdü bəlayi-firqətə,
Yoxdur dəvamım zillətə,
Dərdim edüb tüğyan, baba.

Gəldi büruzə qəmlərim,
Ağlar həmişə gözlərim,
Nakam ölübdür Əkbərim,
Çeşmim olub giryan, baba.

Ey naibi-şiri-Xuda,
Ey yadigari-Müstəfa,
Eylübdi bu qövmi-dəğa
Göz yaşımı ümman, baba.

Ağlar gözüm, ağlar müdam,
Saxlar əza hər sübhü şam,
Sədparədür cismim təmam,
Qanə olub əlvan, baba.

*Əfrad*

Gözüm yaşinə baxub rəhm elə, səni Tari,
Əyağə dur, məni bir al qucağuva, bari.

Səni şəhid eyləyüb, kainatı dağladılar,
Əsiri-Rumü Həbəştək qolumı bağladılar.

Səkinə gördi düşüb Şahi-Kərbəla bisər,
Zəbanə gəldi bu növ`i əsir olan düxtər.

Dedi, əyağə dur, ey dadxahımız, babacan,
Çıxubdı göylərə fəryadü ahımız, babacan.

Özün, dur eylə nəzər halıma, olub məhşər,
Batubdı qanına kam almamış Əli Əkbər.

Gözüm, baba, eyləyür çox sirişki-xun cari,
Piyadə Şamə çəkəllər məni-diləfkari.

Nə növ`i Şamə gedim başaçux məni-müztər,
Bu çöldə qanə boyanmış yatub Əli Əkbər.

Xəyal eyləmə sənsiz Dəməşqə mən gedərəm,
O qanlı başə cidadə baxub fəğan edərəm.

*Baqiyi-növhə*

Bu düxtərün həsrət sənə,
Bax bir cəfayi-düşmənə,
Səndən sora, vallah, mənə,
Dünya olub zindan, baba.

Ey Padşahi-insü cin,
Ey rəhnümayi-məşriqeyn,

Qardaş deyib ölləm yəqin,
Qürbətdə mən nalan, baba.

Fəsli-əzadə Nadimə,
Bax qəmfəzadə Nadimə,
Ruzi-cəzadə Nadimə,
Ver mənzili-rizvan, baba.

Mən Nadimi-xar olmuşam,
Göz yaşıtək car olmuşam,
Bu çöldə bikəs qalmuşam,
Qıl dərdimə dərman, baba.

**Yaxşı evim yıxıldı, oldum düçar bəlayə**

Yaxşı evim yıxıldı, oldum düçar bəlayə,
Qardaş, bu yer nə yerdür, könlüm gəlüb nəvayə.

Bu sərzəmin həvası çox bədhəvadı, qardaş,
Mən bu yerə yetəndən virdim nəvadı, qardaş,
Yoxsa bu xaki-möhnət dəşti-bəladı, qardaş,
Oldı əyan müsibət mən zarü binəvayə.

Səbr eylə, bacı, Zeynəb, var başımın bəlası,
Qəmlən olub mücəssəm bu Neynəva həvası,
Ali-Əba geyəllə bu çöldə qəm libası,
Qardaş qəmində ağlar, bacı gələr sədayə.

Qardaş, bizi, əmandur, qaytar Mədinəyə sən,
Rəhm eylə bu qəribü nalan Səkinəyə sən,
Et mərhəmət, əmandur, bu dilhəzinəyə sən,
Bənzər bu dəşti-Mina Minayi-Kərbəlayə.

Mən bu çölə gələndən viran olubdı könlüm,
Çoxdur qəmü müsibət, al qan olubdı könlüm,
Ağlar gözüm həmişə, giryan olubdı könlüm,
Bu bəxti qarə Zeynəb oldı düçar bəlayə.

Qardaş, Hüseyn, bu şərhi mən zarə eylə izhar,
Burda nüzul edəndən qəlbimdə iztirab var,
Qıl müttəli bu qəmdən mən zarı, Şahi-əbrar,
Döndi süruri-qəlbim bu yerdə ahü vayə.*

### Cənab Zeynəbün dilindən

Qardaş, əmandı, eyləmə Zeynəbi illər həsrəti,
Ali-Əbanı eyləmə qəbri-Peyəmbər həsrəti.

Etmə ziyadə, ya Hüseyn, Zeynəbün ahü zarını,
Axırı bu müsafirət əldən alar qərarını,
Burda ziyarət eylərəm Fatimənin məzarını,
Zeynəbi, həqq rizasinə, eyləmə madər həsrəti.

Burda babam Peyəmbərə eylərəm ərzi-halımı,
Zail edər o rövzənün vəsli, qəmü məlalımı,
Qorxuram əhli-kufəyan, əldən ala cəlalımı,
Bülbüli-Müstəfanı, gəl, eyləmə illər həsrəti.

Leyli çəkibdür Əkbərün bir neçə ildi zəhmətin,
Olma riza fəraq ilə arturalar müsibətin,
Qövmi-dəğa xizab edər qan ilə sərvqamətin,
Leylini Həqq rizasinə, eyləmə Əkbər həsrəti.

---

* Növhə natamamdır

Mürğvəş aşiyanə, gəl, sən məni həsrət eyləmə,
Məskənimi fəğan ilə guşeyi-qürbət eyləmə,
Tərki-səfər eylə məni, zarü məlamət eyləmə,
Bu səfər eyləyər məni yeddi bəradər həsrəti.

Olma riza açux başım, düşmən içində ağlayım,
Şivən edüb fəğan ilən, başimə qarə bağlayım,
Nə`şivün üstə baş açub, şur ilə sinə dağlayım,
Zeynəbi bəsdi bu fələk, eyləyüb Heydər həsrəti.

Tazə başımdan açmışam, qardaş, Həsən qərasını,
Kərbübəla diyarinə çəkmə bu Ali-Yasini,
Qasimün eyləyər ədu, zülm ilə qan hənasını,
Madərin etmə Qasimün ol məhi-mənzər həsrəti.

Yaduva gər atan düşüb, ağlama sən, mən ağlaram,
Hansı əzizüvi desən, ləhni-Hicazi oxşaram,
Bəzmi-əza qurub özüm, şur ilə sinə dağlaram,
Rə`süvi olmaram riza etsünlə peykər həsrəti.

Cəzbeyi-eşq edüb əgər, azimi-Kərbəla səni,
Dəşti-bəladə gözləyür, firqeyi-əşqiya səni,
Rəhm et əmuyə, dutmuşam çün məni-binəva səni,
Nadimi eyləmə, əxa, qəbri-Peyəmbər həsrəti.

### Xanım Zeynəb dilindən

Ey bəradər, şəhri-Bəthadən kənar etmə məni,
Xanəmi viran edüb, aləmdə xar etmə məni.

Göz yaşımla, qoy silim, bari, Peyəmbər qəbrini,
Qoymaram olsun qübaraludə madər qəbrini,
Zeynəbün şövt eyləyür, iylür* Peyəmbər qəbrini,
Salma Yəsribdən kənarə, biqərar etmə məni.

Qorxuram yəğmayə getsün bu cəlalun, ya Hüseyn,
Tuş ola qarətgərə malü mənalun, ya Hüseyn,
Bu səfərdə qarəpuş olsun əyalun, ya Hüseyn,
Möhnəti-üzmayə, rəhm eylə, düçar etmə məni.

Qorxuram düşsün cüzam Kərbübəla səhrasinə,
Növcəvanlar qərq ola Minadə qan dəryasinə,
Əhli-Beytün baş açub batsun ölənlər yasinə,
Çöllərə salma, Hüseyn, biqəmküsar etmə məni.

Cəddimiz və`də verən əyyami-Xatəmdür məgər?
İzzətün itmamə yetdi, eyş bərhəmdür məgər?
Hali et, qardaş, məni mahi-mühərrəmdür məgər?
Mülki-dil odlandı, qəlbi tarümar etmə məni.

Macərayi-Kərbəladən sən özün agahsən,
Çün İmami-əsrsən, mülki-Hicazun şahisən,
Zeynəbün müşkil günündə bircə sən sirxahisən,
Ağladub hicründə çeşmi-əşkbar etmə məni.

---

* İyləyir

Olma azim Kufəyə, kufilərün yox bavəri,
Qanə əlvan etdilər mehrab içində Heydəri,
Öldürəllə həsrətü nakam Əliyyü Əkbəri,
Salma ənduhü bəlayə, xarü zar etmə məni.

Əhli-Kufə, qorxuram, qət` etsün Əbbas əllərün,
Qasimün nakam ölüb, doğransun Övnü Cə`fərün,
Busəgahi-Müstəfayə, Şimr qoysun xəncərün,
Nə`şün üstə baş açub biixtiyar etmə məni.

Olma razi xeyməgahim narə odlansun mənim,
Qəlbi-pursuzim şərari-hicr ilə yansun mənim,
Rum əsiritək qolum zəncirə bağlansun mənim,
Seydvəş səyyadi-xunxarə şikar etmə məni.

Olma razi Nadimim töksün əzadə göz yaşun,
Çox çətindür mehriban bacı itürsün qardaşun,
Kufəvü Şamı gəzər tənsiz cidalərdə başun,
Şam bazarində xari-ruzigar etmə məni.

**Həzrət İmam Hüseyn (ə)-la Həzrət Zeynəbün vidalaşması**

Çün Hüseyn etdi nəzər Zeynəbi-nalan yüzinə,
Gördi göz yaşı tökər çeşmi-pərişan yüzinə.

Dedi, gəl yanıma, ey qəmlərimün yarı, bacı,
Et vida, sal yola bu bikəsü naçarı, bacı,
Baxəbər eyləgilən itrətü ənsarı, bacı,
İstərəm bir də baxam düxtəri-nalan yüzinə.

Yetişüb axıra ömrüm, gedirəm, eylə həlal,
Gəl, vida eylə doyunca bu qəribi yola sal,
Vəqti-hicran yetişübdür, budur axirkı vüsal,
Get, gətür, bari, baxım Əsğəri-ətşan yüzinə.

Tökdi göz yaşın üzə, Zeynəbi-məhzunü həzin,
Gəldi göftarə o biçarə dedi, şivənişin,
Bizi gözyaşlı qoyub getmə, əman, qardaş, Hüseyn,
Qoyma həsrət gözini Şahi-şəhidan yüzinə.

Ey bacı, səbr elə, mən bivətəni etmə kəbab,
Məndə Əbbas ölümi qoymayub heç zərrəcə tab,
Söylə, ətrafimə cəm` olsun hamı Ali-Türab,
Hamı kamınca baxa natiqi-Qur`an yüzinə.

Başaçux qoymaram əsla bu güni qarələri,
Çün sənə tapşururam bikəsü biçarələri,
Çağır ol hifz elə hər yerdə bu məhparələri,
Məni sədparə salandan sora meydan yüzinə.

Ya Hüseyn, etdi fələk yaxşı güni qarə məni,
Gözi yaşlı, başaçux, eylədi avarə məni,
Çəkəcəklər bilürəm kin ilə bazarə məni,
Nə rəvadur baxalar Zeynəbün üdvan, yüzinə.

Bacı, səbr eyləgilən əmri-qəzavü qədərə,
Başımı zibh eləyüb vırsala* gər nizələrə,
Mən öləndən sora od vırsa ədu xeymələrə,
Ali-Heydər dağılan vəqtə biyaban yüzinə.

* Vursalar

Səni Nadim kimi kamımca əgər ağlamasam,
Nə`şün üstündə yolub zülf, cigər dağlamasam,
Əfv elə, qardaş, əgər gözlərüvi bağlamasam,
Edərəm zülfimi satir Şəhi-ətşan yüzinə.

**Cənab Zeynəb Həzrət Seyyidüş-şühədanı (ə) dadə çağırır**

Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi,
Səndən əlavə axır yox Zeynəbün pənahi.

Verrəm qəsəm Xudayə, yet dadə, ölməyübsən,
Ətfaluvı, Hüseyncan, sal yadə, ölməyübsən,
Rəhm eylə bu qəribü naşadə, ölməyübsən,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

Qardaş, gözüm önündə, gəl, xeymələr talandı,
Odlandı aşiyanəm, dudi gögə dayandı,
Qur`ani-natiq öldi, süknası narə yandı,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

Gərçi sənün əlündən düşmən cəlalun aldı,
Düşmənlərün əlindən bikəs bacun soyuldı,
Odlandı xeyməgahim, Bimar od içrə qaldı,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

Nazlı başun gəzər gər Şimrü Sinan əlində,
Mən zarü dəstgirəm, bu kufəyan əlində,
Qanə boyandı Əsğər tutizəban əlində,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

Göz yaşımız dönübdür zülm ilə qanə sənsiz,
Qolbağlı eylər ə`da, Şamə rəvanə sənsiz,
Gahi vıralla qəmçi, gah taziyanə sənsiz,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

Başun cida başında, qardaş, səyahət eylər,
Öz qaninə boyanmış, Qur`an tilavət eylər,
Ali-Əbayə düşmən tə`nü şəmatət eylər,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

Sənsiz, Hüseyn, bəradər, odlandı aşiyanım,
Ahım çıxar səmayə, övc eyləyər fəğanım,
Rəxtim talandı, gəlməz bir mə`cərə gümanım,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

Yaz Zeynəbün dilindən, gəl şurü şeynə, Nadim,
Sal "va Hüseyn" sədasın ruyi-zəminə, Nadim,
Zeynəb deyərdi guya nə`şi-Hüseynə, Nadim,
Düşmənlər aldı, qardaş, yet dadə, xeyməgahi.

**Qardaşım Əkbər hanı bəs?**

Baba, qurbanun olum, qardaşım Əkbər hanı bəs?
Gözümi yolda qoyan şibhi-Peyəmbər, hanı bəs?

Axır imdi çağırırdı, baba, fəryadə səni,
Bəs neçün gəlmədi, qoydı gözi yollardə məni?
Könlüm istər ki, dübarə görüm ol gül bədəni,
Mənim arami-dilim, munisi-xahər, hanı bəs?

Salub hicran oduna Haşimi xal ilə məni,
Getdi meydanə, qoyub dərdü məlal ilə məni,
Gəlmədi şad edə çün imdi vüsal ilə məni,
Eyşimün mayəsi şəhzadə bəradər, hanı bəs?

Şühədalər bədəni gül kimi gülşəndə solub,
Xəm olub sərv kimin qəddin, Ələmdarun ölüb,
Söylə, nuri-bəsərün Əkbərə axır nə olub?
Səri-giysuyi-siyəh, zülfi-müənbər hanı bəs?

Ya ki, Leylanun ədu qoydular ağlar gözini,
Yoxsa topraqlara düşmən salub Əkbər yüzini,
Eşidə Əkbər ölüb, öldüri* Leyla özini,
Elə bir sərvərə sərmayeyi-madər hanı bəs?

Mənə Əkbər ölümi oldı əyan imdi, baba,
Əkbərim ölməsə, beylə eləməz tərki-vəfa,
Xeyməgahə gələr, etsün bacısun bir də vida,
Söylə, can rişəsi ol mahi-münəvvər hanı bəs?

Nə özi gəldi Əli Əkbərimün, nə xəbəri,
Qorxuram qanə bata xalü xətü türrələri,
Nigəran qoydı yol üstündə bu xundidələri,
Eləyən madəri Leylanı mükəddər hanı bəs?

Gətdi bu halətün əl`an, baba, fəryadə məni,
Sağdı Əkbər, niyə bəs salmadı heç yadə məni?
Qoydı hicran ilə gözyaşlı bu dünyadə məni,
Könlümi qan eləyən qəddi-sənubər hanı bəs?

---

* Öldürür

Onun ənduhi-fəraqi məni divanəmisal,
Necə ki, gül sola gülşəndə, edər bülbüli lal,
Dili-məhzunimi heyrətdə qoyub Haşimi xal,
Tağı-əbruyi-hilalı gülə bənzər hanı bəs?

Rüxi-xurşidvəşün əbri-siyah etdi nihan,
Boyuyub yoxsa siyəh zülflərün qırmızı qan,
Qorxuram qollarımı bağlayalar Şimrü Sinan,
Məni dünyadə qoyan Nadimi-müztər hanı bəs?

**Yetiş dadə, Hüseyn, qardaş, həray**

Xeymələr yandı, yetiş dadə, Hüseyn, qardaş, həray,
Bir nəfər yox yetə imdadə, Hüseyn, qardaş, həray.

Vermisən* səs səsimə, yoxsa kəsüblər sərüvi?
Salmusan, söylə, nəzərdən niyə bu xahərüvi?
Badi-zülm etsə xəzan, qönçəsifət güllərüvi,
Yox salan Zeynəbi bir yadə, Hüseyn, qardaş, həray.

Şühədalər bədəni dövrü bəründə sərilüb,
Görürəm nazlı başun növki-cidayə vırulub,
Baş açub nə`şlər üstə bacun axır yorulub,
Tuş olan xəncəri-fuladə, Hüseyn, qardaş, həray.

Xeymələr üstünə yüz qoydı, gəlür səflər hamı,
Kimi əllərdə dutub nizə, kimi xəncər hamı,
Aldılar xeymələrün dövrini qarətgər hamı,
Dur, özin gəl bizə fəryadə, Hüseyn, qardaş, həray.

---

* Vermirsən

Qoymadı məndə yetimə balalar səbrü qərar,
Səndən özgə ola bir kimsənə yoxdur bizə yar,
Hamı çöllərdədi, ahu kimi eylüllə* fərar,
Zöhrəçak oldula səhradə, Hüseyn, qardaş, həray.

Rəxtimi qarət edüb odladılar xeymələrün,
Saldılar at döşünə düxtəri-xundidələrün,
Aldılar mə`cərimi, yoxsa yoxundı xəbərün?
Et nəzər bu evi-bərbadə, Hüseyn, qardaş, həray.

Var həyatım nə qədər, zülf yolub sər açaram,
Qanlı göz yaşı, Hüseyn, qardaş, üzarə tökərəm,
Gözümün yaşinə, rəhm eylə mənim, kani-kərəm,
Nəhr olan ərseyi-Minadə, Hüseyn, qardaş, həray.

Bilürəm firqətün eylər, əxi, divanə məni,
Qolı bağlı çəkəcək əhli-kin hər yanə məni,
Şamdə tə`neyi-üdvan doyurar canə məni,
Yar olar kim məni-naşadə, Hüseyn, qardaş, həray.

Nadiməm, rəhm elə, şad et şəbi-vəhşətdə məni,
İki dünyadə, Hüseyn, qoyma zəlalətdə məni,
Bir də alsan nəzərə ruzi-qiyamətdə məni,
Gəldi Zeynəb belə fəryadə, Hüseyn, qardaş, həray.

---

* Eyləyirlər

**Həzrət Zeynəb dilindən İmam Hüseynə (ə)**

Qardaş, dağılub kuhü biyabanə əyalun,
Çün oldı əsir ləşkəri-üdvanə əyalun.

Səndən sora bu Zeynəb edər naləvü əfğan,
Çün eylüb əsir xahərüvi ləşkəri-üdvan,
Zeynəb necə bəs tab edə bu zülmə, Hüseyncan?
Ahu kimi yüz qoydı biyabanə əyalun.

Bu Kərbübəla dəşti qızıl qan olub imdi,
Mən qəmzədənün möhnəti tüğyan olub imdi,
Cismün sənün al qan ilən yeksan olub imdi,
Bu bais olub çün gəlüb əfğanə əyalun.

Dur, eylə əlac, bu qəmi-tüğyanimə, qardaş,
Çün vardı səbəb naleyi-əfğanimə, qardaş,
Hicranun odı şö`lə salub canıma, qardaş,
Hər vəqtə yanar atəşi-hicranə əyalun.

Qanə bələşüb cismi-şərifün sənün əl`an,
Dur, eylə nəzər halimə, ey Şahi-şəhidan,
Bu qətligaha ahu kimi dolmuş əsiran,
Ağlar hərə bir qan ilə yeksanə əyalun.

Eylibdür əsir Şimri-dəğa Ali-Əbanı,
İtmamə yetürdi bu gün hər cövrü cəfanı,
Qolbağlı çəkər Kufəyə yeksər üsəranı,
Çün oldı səvar naqeyi-üryanə əyalun.

Ol vəqtə səni zibh elədi Şimri-sitəmgər,
Yandırdı cəfa narinə çadirləri yeksər,
İmdi nədi bəs çarə mənə, əmr elə sərvər,
Göz yaşını döndərdilə ümmanə əyalun.

Dur, bir məni-biçarəni dindir, səni Tari,
Vəqt oldı çəkə Kufəyə üdvan qətari,
Başsız bədən ilə bizi, dur sal yola, bari,
Dərdü qəm əlindən yetişüb canə əyalun.

Sultanı rəvadur yata bisər qurı yerdə?
Başsız görürəm cismüvi mən məddi-nəzərdə,
Dur, vəqti-fəraq oldı, danışdır məni bir də,
Qurban olalar sən kimi qurbanə əyalun.

Şamə çəkəcək Şimr bizi billəm, Hüseyncan,
Məskən olacaqdur bizə bir guşeyi-viran,
Vallahi, əşəddür hamıdan tə`neyi-üdvan,
Dözsün necə bəs tə`neyi-üdvanə əyalun?

Hər şamü səhər növhə edər Nadimi-naçar,
Bu möhnəti çün əldə qələm eyləyür izhar,
Ol vəqtə kimi xeyməni yandırdıla küffar,
Yüz qoydı gözi yaşlı biyabanə əyalun.

**Qardaşı ölən bacı hərasan olar, olmaz?**

Qardaşı ölən bacı hərasan olar, olmaz?
Ənduh ilə əşki-təri al qan olar, olmaz?

Bir şəxsin əlindən gedə zülm ilə cəlalı,
Qarətgər əlində qala mal ilə mənalı,
Axır nolar ol vəqtdə ol bikəsün halı,
Şahı ölənün qəlbi pərişan olar, olmaz?

Nə kül sovurum başimə mən zari-cigərxun,
Qardaş ölümi eylədi halımi digərgun,
Göz yaşı töküb ruyimə mən didəsi pürxun,
Əhvalimə bir rəhm edən əl`an olar, olmaz?

Ənsarlərim cümləsi qan ilə boyandı,
Sultanım ölüb, xeymələrim cümlə talandı,
Odlandı hamı xeymələrim atəşə yandı,
Bir kimsə edə dərdimə dərman olar, olmaz?

Gülzari-Əli zülm ilə bu çöldə solubdur,
Ətfali-Hüseyn cümləsi dilparə olubdur,
Qanə boyanub, həzrəti-Əbbas ölübdür,
Baci bu yəman gündə nəvaxan olar, olmaz?

Kam almamış, al qanə batubdur Əli Əkbər,
Əlvan eləyüb qan ilə qundağını Əsğər,
Yox dadrəsim, çünki ölüb Övn ilə Cə`fər,
Şəhzadə hərəmlər işi əfğan olar, olmaz?

*Əfrad*

Gedüb əlimdən Hüseynim qərarımı aldı,
Əyali-dərbədəri Şimrə dəstgir oldı.

İki bəradərim həm bir atam imam olsun,
Rəvadur zülm ilə imdi başım açux qalsun?

Hüseynim öldi, əcəb xari-ruzigar oldum,
Əsiri-Rumü Həbəştək qəmə düçar oldum.

Hüseynim öldi, əcəb qollarımı bağladılar,
Yaralı qəlbimi hicran oduna dağladılar.

Əziz qardaşımun başı üstə ağlamadım,
O Şimr mane` olub, gözlərini bağlamadım.

Hüseyn gətürdi məni bu çölə cəlal ilən,
Nə növ`i imdi gedim Şamə yüz məlal ilən.

*Baqiyi-növhə*

Zeynəb dolanub qətlgəhi didəsi giryan,
Gördi ki, düşüb bir yaralı qan ilə qəltan,
Yox cismdə başı, kəsilübdür, bədən üryan,
Başsız bədənə bacısı qurban olar, olmaz?

Ərz eylədi, qurban yaralı canuva, qardaş,
Cismün boyanub zülm ilə öz qanuva, qardaş,
Dur, eylə nəzər xahəri-nalanuva, qardaş,
Qardaş bacınun halına suzan olar, olmaz?

Başun kəsüb ə`da səni topraqlarə saldı,
Biçarə bacun, gör, nə yəman günlərə qaldı,
Ətfalın, əxa, zülm ilə əllərdə soyuldı,
Sərdarı ölən xanəsi viran olar, olmaz?

Nadim, tök yüzə göz yaşun, hər bəzmi-əzadə,
Zülm həddən ötüb, daşdı bəla, Kərbübəladə,
Sal Zeynəbi-biçarənün ol halını yadə,
Bu qəmdə, görüm, göz yaşın ümman olar, olmaz?

**Bu çöldə, qoy, gəlim mən fəğanə**

Bu çöldə, qoy, gəlim mən fəğanə, əmanə,
Qəlbi şikəstə qardaş.
Salım şivən sədasın zəmanə, cəhanə,
Sən dəsti bəstə, qardaş.

Hüseyn, qardaş, sinəndə, kəmanə nişanə
Oldı biçarə Əsğər.
Olub əlvan bu çöldə, bəradər, o yavər
Zülm ilə qanə Əkbər.
Edər əşkin rəvanə üzarə Səkinə,
Ol zarü bibəradər.
Aç bir bu qanlı çeşmün, Hüseyncan, ləbətşan,
Yatma qum üstə, qardaş.

Şəhzadə düxtər ağlar,
Yeksər hərəmlər ağlar,
Gördi cənazən üryan,
Biçarə xahər ağlar.

Bu çöldə Ali-Taha təmamən
Zülm ilə qaldı bisər.
Yandı nari-cəfayə xiyamın təmamən,
Ey yadigari-Heydər.
Əsir eylüb əyalun ədulər sitəmlə,

Yox bir müinü yavər.
Özün razi olubsan qəzayə, bəlayə
Ruzi-Ələstdə, qardaş.

Ey bikəfən, bəradər,
Şahi-zəmən, bəradər,
Məcruhü zarü xəstə,
Məzlum ölən, bəradər.

Yox əldə ixtiyarım, qəribəm, əsirəm,
Çün həddən ötdi möhnət.
Du,* sən yola sal Ali-Əbanı,
Yatma qum üstə rahət.
Gəlməz cismün yarası şümarə,
Çün çox yetüb cərahət.
Aç bir bu qanlı çeşmün, oyan, bir
Səs ver ahəstə, qardaş.

Ədu bu cismi-pakun bədənsiz,
Qardaş, salub türabə.
Oldum əsiri-düşmən, yox əldə əlacım
Bu ceyşi-bihicabə.
Bu çöldə həddən ötdi müsibət, bəradər,
Gəlməz qəmim hesabə.
Baş açdım, zülf yoldum, soyuldum,
Çün oldum xəstə, qardaş.

* Dur

**Həzrət Zeynəb dilindən**

Ey dilşikəstə qardaş,
Məcruhü xəstə qardaş,
Qalsun necə rəvadur,
Cismün qum üstə qardaş.

Gələndə mən bu dəştə, sağ idi Əbbasım, ey Padşahi-əbrar,
Təmami-xişü əqvam solumda, sağımda yox imdi bircə
qəmxar,
Talan olub cəlalım, mənalım, əsasım, ətşan ölüb Ələmdar,
Düzüb düşmən tənabə təmamən əyalun, ağlalla bəstə, qardaş.

Etsün nə çarə Zeynəb?
Bu bəxti qarə Zeynəb,
Xeymələrim talandı,
Qaldı biçarə Zeynəb.

Sənə kim qüsl edüb, bəs məzarə qoyar bu Neynəvadə mənsiz,
Yerdə qalubdur əl`an, Hüseyncan, ləbətşan, gül peykərün
kəfənsiz,
Cida başında başun yaralı, çəkəllər düşmənlərün bədənsiz,
Qoyar mətbəxsəradə yaralı başuvı Xuli kül üstə, qardaş.

Zeynəb gələr fəğanə,
Cismün batanda qanə,
Lə`ni-İlahi olsun,
Birəhm saribanə!

Göz yaşını qan ilə üzarə əzadə eylə həmişə, Nadim,
Əldə qələm fəğan et, düşübdür müsibət, ağla həmişə, Nadim.
Əldə ruzi-cəzadə yəqindür kim, olar göz yaşı tuşə, Nadim,
Dedi gözyaşlı Zeynəb, Hüseyncan, ləbətşan, yatma qum üstə,
qardaş.

**Əzm etmə ərseyi-meydanə, qardaş**

Əzm etmə ərseyi-meydanə, qardaş,
Rəhm eylə Zeynəbi-nalanə, qardaş.

Yox hicrüvə səbr etməgə dəvamım,
Əflakə övc edər sənsiz fəğanım,
Qardaş, sənə bircə gəlür gümanım,
Qıl bir nəzər mən biməkanə, qardaş.

Müşkildi Zeynəbə, qardaş, fəraqun,
Billəm yəqin, sinəmdə qaldı dağun,
Qoy, bir öpüm, qardaş, susuz dodağun,
Təskini-qəlbdür bu canə, qardaş.

Tapdı bəla məni Kərbübəladə,
Getsən, əsir ollam əhli-inadə,
Gözüm yaşı olar qan Neynəvadə,
Bax bir bu dideyi-giryanə, qardaş.

Yoxdur mənim bu firqətə dəvamım,
Axır sənsən mənim virdi-zəbanım,
Qardaş, Hüseyn, qoy, başuva dolanım,
Edim göz yaşımı rəvanə, qardaş.

Səf-səf durublar ceyşi-əhli-kinə,
Tökəllər qanuvı ruyi-zəminə,
Baba deyüb, zülfün yolar Səkinə,
Bacun Zeynəb doyubdur canə, qardaş.

Yandırdı qəlbimi qeydi-məlalun,
Gözi yaşlı qalub əhli-əyalun,
Sənə çün göz tiküblər bacılarun,
Gəlüblər cümləsi əfğanə, qardaş.

Sən ölsən, ya Hüseyn, əhli-şərarət,
Edəllər xeyməgahi cümlə qarət,
Olar bu ərsədə bərpa qiyamət,
Dönər göz yaşımız ümmanə, qardaş.

Səni zibh eyləyər Şimri-bədəxtər,
Qoyallar hülqüvə zülm ilə xəncər,
Əsir eylər bizi ceyşi-sitəmkər,
Olar məskən bizə viranə, qardaş.

Yetibdür bülbülə həsrət həvası,
Başıma salmışam qardaş qərası,
Talandı Zeynəbün rəxti, əsası,
Yox rəhm edən mən biməkanə, qardaş.

Qalar bu qəmdə bəxti qarə Nadim,
Tökər göz yaşını rüxsarə Nadim,
İcz ilə ərz edər dilparə Nadim,
Rəhm etgilən ol növhəxanə, qardaş.

## Cənab Zeynəb dilindən

Baş gətür məzardən, gəlüb Yəsribə qətarım, ey ana,
Kərbəladə badi-zülm əsüb, soldı gülzarım, ey ana.

Çəkmişəm piyadə Şamdən çox cəfa, səlamə gəlmişəm,
Əfv eylə, Hüseyndən sənə yox əlimdə nalə gəlmişəm,
Cövri-ruzigardən yetüb qəmlərim təmamə gəlmişəm,
Növrəsidə güllərim gedüb, soldı növbəharım, ey ana.

Bülbülani-qəmkəşidəni xar edübdi güllərə həsrət,
Mürği-pərşikəstətək olub bu qətari-qəm pürhəsrət,
Şimr ilə Sinan edibdir Zeynəbi bəradərə həsrət,
Can verəndə Şahi-Kərbəla, qalmadı qərarım, ey ana.

Qollarım tənabə bağlayub, əhli-kinə Şamə çəkdilər,
Bağlayub tənabə kufəyan, düzdülər nizamə çəkdilər,
Şamdə Yəzid bəzminə Zeynəbi səlamə çəkdilər,
Ağlamaqdan özgə qalmadı əldə ixtiyarım, ey ana.

Gər Hüseyni eyləsən soraq, saldı min bəlayə başını,
Rahi-eşqdə susuz fəda eylədi Xudayə başını,
Kufədən Dəməşqə vırdılar əhli-kin cidayə başını,
Şö`ləlləndi nari-möhnətə qəlbi-tarümarım, ey ana.

Xeymələr yananda odlanub yandı qəlbi narə Zeynəbün,
Yığdı çün səğir uşaqlarun birbəbir kənarə Zeynəbün,
Qətlgahə xeymədən übur etdi bəxti qarə Zeynəbün,
Çün xəmidə oldı qamətim, yandı dilfikarım, ey ana.

Şimr əlində xəncəri görüb xövfə düşdüm, ağlayammadım,
Başını əlimdən aldılar, gözlərini bağlayammadım,
Dəfnü kəfn edüb, cənazəsi üstə sinə dağlayammadım,
Möhnəti-Hüseyn ağartdı bu zülfi-mişkibarım, ey ana.

Qarət etdi xeyməni ədu, Zeynəbün əsası qalmadı,
Örtməgə nə başda mə`cəri, cismdə libası qalmadı,
Görcəgin Hüseyn cənazəsin, çeşmimün ziyası qalmadı,
Bir nəfər tapılmadı ola yarü qəmküsarım, ey ana.

Nadimün vəfası yoxdı, gər nari-möhnətündə yanmasa,
Şövt edüb o qəbri-pakuvi, dövrinə əgər dolanmasa,
Zeynəbün dilincə zikr edüb, ağlayub qəmə boyanmasa,
Baş gətür məzardən, gəlüb Yəsribə qətarım, ey ana.

**Səndən sora, Hüseyncan**

Səndən sora, Hüseyncan, bu bəxti qarə Zeynəb,
Odlandı aşiyanı, seyd oldı xarə Zeynəb.

Sən zibh olan zəmandan sonra bu Kərbəladə,
Bir kəs yox idi salsun, biz Əhli-Beyti yadə,
Gül cismüvi kəfənsiz, üryan qoyub aradə,
Təşyi`cənazə etsün, tapmazdı çarə Zeynəb.

Zülm ilə xeyməgahım qarət olub talandı,
Şö`lə çəküb təmamən nari-cəfayə yandı,
Ol vəqti ki, rə`si-pakun öz qanuva boyandı,
Çeşmün şəbih edibdür əbri-bəharə Zeynəb.

Bikəslərün qolını Şimri-şərir bağlar,
Bir yanda Ümmi Leyla suz ilə sinə dağlar,
Bir yanda baş açmış bikəs Səkinə ağlar,
Versün necə təsəlli, bu biqərarə Zeynəb?

Bir yanda növərusun dərdi edübdi tüğyan,
Bir yanda qəlbi məhzun, eylər Səriyyə əfğan,
Damad həna yerinə yaxmış əlinə al qan,
Cari edər gözündən qan yaş üzarə Zeynəb.

Əkbər batubdı qanə, Leyla geyübdi qarə,
Ali-Əli gəlibdür şur ilə ahü zarə,
Mümkin degil, qoyardux, barı, sizi məzarə,
Dur, nari-hicrə yandı, gör, aşikarə Zeynəb.

Gül cismüvə baxanda qəlbim çəkər şərarə,
Gültək yara açılmış, göz-gözdi, parə-parə,
Heç qəlbim olmaz aram, söylə, edim nə çarə,
Çün bəstədür bilürsən qeydi-qətarə Zeynəb.

Nadim, qələm əlündə, gəl şurü şeynə, ağla,
Göz yaşı tök üzarə, şur ilə sinə dağla,
Zeynəb dilincə zikr et, bikəs Hüseynə ağla,
Odlandı aşiyanı, seyd oldı xarə, Zeynəb.

## Bu kufəyan əlindən

Bu kufəyan əlindən səd ah, ah, bəradər,
Ağlar bu macərayə mehr ilə mah, bəradər.

Ey xaki-xun içində üryan qalan, yaralı,
Şimrü Sinan əlində ətşan ölən, yaralı,
Gəl, qardaşım Hüseyncan, ey bivətən, yaralı,
Səbrim tükəndi dillən, ey padşah, bəradər.

Dindir məni, əmandur, sən mayeyi-qəmimsən,
Qəmgin günümdə yarım, qəmxarım, həmdəmimsən,
Yasə batubdı Zeynəb, sən ümdə matəmimsən,
Qarət olub cəlalun, yəğmadı cah, bəradər.

Verrəm səlam, neçün pəs rədd etmisən* səlamım,
Qardaş, sözüm qutardı, qət` oldı hər kəlamım,
Bundan ziyadə yoxdur səbr etməgə təvanım,
Səbr eyləyim nə növ`i mən bipənah, bəradər.

Qardaş, təkəllüm eylə, dindir bu natəvanı,
Övc eylər ərşə şəksiz, mən bikəsün fəğanı,
Bu Zeynəbün yanubdur bülbültək aşiyanı,
Eylüm nə çarə bəs mən bidadxah, bəradər.

Zülm ilə əhli-kinə mən zarı saldı dildən,
Talandı xeyməgahım, yandırdı narə düşmən,
Axır başım bəladən bir ləhzə olmaz eymən,
Yandı gözüm önündə çün xeyməgah, bəradər.

---

* Etmirsən

Bisər salubla cismün toprağə parə-parə,
Verməzlə fürsət ə`da, nə`şün qoyam məzarə,
Qolbağlı düzdi düşmən, ətfaluvi qətarə,
Şamə bizi çəkəllə başlandı rah, bəradər.

*Əfrad*

Tərəhhüm et, məni dindirgilən səni Tarı,
Əyağə dur, yola sal Əhli-Beytüvi, barı.

O vəqt olubdı Dəməşqə tərəf köçüm, qardaş,
Səkinənün necə mən nazını çəküm, qardaş?

Cənazən üstə doyunca mən etmədim əfğan,
Yaralı peykərüvə Zeynəbün ola qurban.

Qoyammadım, yox əlacım, Hüseyn, məzarə səni,
Qolum tənabilə bağlı çəkəllə Şamə məni.

*Baqiyi-növhə*

Getsün necə kənarə bu bəxti qarə sənsiz,
Sədparə cismi-pakun üryan qalub vətənsiz,
Başun gəzər mən ilə səhraləri bədənsiz,
Yox çarə neyləyim mən bidadxah, bəradər.

Üryan qalubdı cismün başsız aradə, qardaş,
Bacun çəkəllə bəzmi-ibni-Ziyadə, qardaş,
Mən bikəsi salan yox bu gündə yadə, qardaş,
Başun qoyalla deyrə, tənurə gah, bəradər.

Bikəs Hüseyn batanda zülm ilə qanə, Nadim,
Şur ilə gəldi Zeynəb ahü fəğanə, Nadim,
Gözyaşlı, ağla, sölə əhli-cəhanə, Nadim,
Bu kufəyan əlindən səd ah, ah, bəradər.

**Zeynəbün**

Aç gözüvi, halını gör, bu güni qarə Zeynəbün,
Qardaş, Hüseyn, özün dur, et dərdinə çarə Zeynəbün.

Soldı bu çöldə güllərim, cövrü cəfayi-xar ilən,
Munis olubdı Zeynəbün möhnətü ahü zar ilən,
Xüşk edərəm yarələrün dideyi-əşkbar ilən,
Olma riza, əmandı sən, icz edə xarə Zeynəbün.

Qövmü qəbiləmi, Hüseyn, zülm ilə əldən aldılar,
Ali-Əbanı kin ilə nari-fəraqə saldılar,
Nazlı hərəmlərün, Hüseyn, gözləri yaşlı qaldılar,
Didələri şəbih olub əbri-bəharə Zeynəbün.

Şimr kəsəndə başuvı xeymələrün talandılar,
Çəkdi şərarə xeymələr, nari-cəfayə yandılar,
Xırdaca qızlarun düşüb at döşünə dolandılar,
Düzdi əgər desəm, əxa, yandı o narə Zeynəbün.

Qanun axanda mən həman, qanun ilə boyanmışam,
Xeymələrün yanan zəman, nari-cəfayə yanmışam,
Xeymədə gah baş açub, gahi çöli dolanmışam,
Xırda uşaqlarun alub, gahi kənarə Zeynəbün.

Nə`şivün üstə ağlayub şur ilə, xəstə olmuşam,
Zülfi yolub, səda edüb, sinə vırub yorulmuşam,
Yoxdı başımda mə`cərim, qardaş, Hüseyn, soyulmuşam,
Oldı əsiri-əşqiya, bu güni qarə Zeynəbün.

*Əfrad*

Hüseyn, bəradər, oyan, xeyməgahım odlandı,
Təmam xeymələrim, hətta mə`cərim yandı.

Oyan, bəradər, hələ bir mən ilə ver əl-ələ,
Yoxımdı bircə nəfər yavərim hərayə gələ.

*Baqiyi-növhə*

Kufəyə qəm qətarını eylədilər rəvan, gedər,
Zeynəbi-natəvan ilə bir neçə bağrıqan gedər,
Bircə əlil Abidün Zeynəbə pasiban gedər,
Qoymadı cismi-pakuvi, barı, məzarə Zeynəbün.

Nə`şivün üstə baş açub, şur ilə ağlayammadım,
Bəzmi-əza qurub sənə, tə`ziyə saxlayammadım,
Qoymadı Şimri-bihəya, çeşmüvi bağlayammadım,
Bağladı risiman ilə dəsti-qətarə Zeynəbün.

Zülm binasın əhli-kin, dəşti-bəladə qurdular,
Oldum əsir düşmənə, başimə kül sovurdular,
Abidi-bipənahıvin payinə kündə vırdılar,
Munis ola xərabədə Abidi-zarə Zeynəbün.

Kufəvü Şamdə ədu gəzdiri bu həzinəni,
Solduri möhnətü sitəm, qönçə güli-Mədinəni,
Dəfn eləyər xərabədə, xahərün ol Səkinəni,
Zair olar dübarə bu tozlı məzarə Zeynəbün.

Əldə qələm fəğan edüb zikri-müsibət, ağlaram,
Tozlu məzaruvi edəm bir də ziyarət, ağlaram,
Ruzi-cəzadə almasam feyzi-şəfaət, ağlaram,
Söylə, şəfaət eyləsün Nadimi-zarə Zeynəbün.

**Şimr əlindən**

Axır nə növ`i gəlmüm* fəryadə Şimr əlindən,
Ömrüm yetüb təmamə dünyadə Şimr əlindən.

Verməz məgər babamun hicri mənə kifayət,
Eylər bu əhli-kinə hər növ`i çox müsibət,
Əmmə, əşəddi, vallah, hər dərdidən şəmatət,
Olmaz yetimə cismüm azadə Şimr əlindən.

Məntək bu Şam içində, əmmə, bir ac qalan yox,
Leylün-nəhar ənisü ahü fəğan olan yox,
Qövmü qəbilədən bu viranəyə gələn yox,
Seyd olmuşam cəfacu səyyadə Şimr əlindən.

Bir mən kimi cəhandə yox nari-hicrə yanmuş,
Qolbağlı naqə üstə səhraləri dolanmuş,
İmdi babamı gördüm, öz qanına boyanmuş,
Çox eylədüm şikayət hər cadə Şimr əlindən.

---

* Gəlməyim

Verdi mənə təsəlli ol Şahi-biqərinə,
Söylədi, et təhəmmül, nazlı qızım Səkinə,
Səbr eylə dərdü rəncə, yalvarma əhli-kinə,
Keçməz o qədr olarsan azadə Şimr əlindən.

Çün Əhli-Beyt o tiflün halinə cümlə yandı,
Eylüblə şurü şivən, nalə gögə dayandı,
"Va möhnəta" sədası qalxub, Yəzid oyandı,
Gördi olub qiyamət icadə Şimr əlindən.

Etdi sual o zalim, nə şurü nə nəvadur,
Bədxab edər məni çox, bilməm nə macəradur,
Get gör, qulam, əsirlər içrə nə ahü vadur,
Ərşə çıxub sədası fəryadə Şimr əlindən.

Getdi xərabə içrə nagah qulami-dilxun,
Görcək qulam o halı, halı olub digərgun,
Eylüb fəğan olartək, sölüb: Yəzidi-məl`un,
Nə zülmlər edübsən icadə Şimr əlindən.

Sölüb qulam Hüseynün bir tifl nuri-eyni,
Rö`yadə çün görübdür Sərdari-məşriqeyni,
Sölər ki, əmmə, Zeynəb, göstər babam Hüseyni,
Bir çarə eyləsün mən naşadə Şimr əlindən.

Verdi Yəzid Hüseynün başını bir qulamə,
Gətdi xərabə içrə verdi əsir İmamə,
Görcək o başı Zeynəb, açdı zəban səlamə,
Ey tuş olan qəfası cəlladə Şimr əlindən.

Qardaş, Hüseyn, vüsali-cananə, xoş gəlübsən,
Etdün əsirnəvazlıq məstanə, xoş gəlübsən,
Əfv et, gedüb əsasım talanə, xoş gəlübsən,
Gəlməz dəxi gümanım bir zadə Şimr əlindən.

Yox simü zər, bəradər, eylüm nisar sərüvə,
Olsun fəda bu bikəs, yaralı peykərüvə,
Dodağımı qoyum, qoy, o qanlı ləblərüvə,
Çox öpmədim o qanlı səhradə Şimr əlindən.

*Əfrad*

Gedün o Şimrə deyün, əhli-Şam, sizi Tarı,
Səkinəm öldi, gəlüb qollarun aça, barı.

Peyəmbərün balası hardadur, ey əhli-cəhan,
Həsir də olmaya, topraqlar üstə versün can.

Mədinə əhli deyün, burda gəlsün ağlamağa,
Yoxumdur bircənə dəsmal gözüni bağlamağa.

Gər ölməseydi Hüseynim, bu halə qalmazdım,
Vətənqərib olub, zülm ilə soyulmazdım.

Olubdı cari yüzə imdi qanlı göz yaşım,
Vətənqərib, qırılub cümlə qövmü qardaşım.

Səkinəm öldi, deyün, yarü yavərim gəlsün,
Hənutü dəfninə şəhzadə Əkbərim gəlsün.

Dübarə əhli-hərəm Şamdə dutubdula yas,
Qəmim ziyadə olub, gəl harayimə, Əbbas.

Əsirnəvazlıq edüb, bir gəlüb-gedən yoxdı,
Səkinəm öldi, gəlüb bircə dəfn edən yoxdı.

Əzəl bu gündən, İlahi, özüm öleydim kaş,
Balan aradə qalub, hardasan, Şəhid qardaş?

Xərabəni bu yetimə fələk məkan verdi,
Qolunda ip, bu bala topraq üstə can verdi.

*Təmamiyi-növhə*

Öpdi o başı Zeynəb, verdi o məhliqayə,
Bikəs Səkinə yetdi sultani-Kərbəlayə,
Qoydı dodaq-dodağə, gəldi bu cür sədayə,
Qoydux səni kəfənsiz səhradə Şimr əlindən.

Sölüb, baba, əmandur, ey varisi-Peyəmbər,
Ömrüm yetüb təmamə, ölürəm mən bibəradər,
De, barı, qollarımı açsun o Şimri-kafər,
Boynumi ip kəsüb, həm qiladə Şimr əlindən.

Gördülə düşdi dildən, ol bülbüli-xərabə,
Əkbər adını yazdı əngüşt ilə türabə,
Bu möhnəti nə növ`i çəksün qələm hesabə,
Can verməgə olubdur amadə Şimr əlindən.

Zeynəb görüb o halı, çün gəldi ahü zarə,
Olmaz cəhandə, ya Rəb, mən kimi bəxti qarə,

Öldi balam Səkinə, yoxdur qoyan məzarə,
Viranədə verüb can şəhzadə, Şimr əlindən.

Olsa nə qədr həyatun dəhri-fənadə, Nadim,
Sərf et qələm əlində bu macəradə, Nadim,
Göz yaşı tök üzarə bəzmi-əzadə, Nadim,
Yaz bu müsibəti, gəl fəryadə Şimr əlindən.

**Həzrət Zeynəblə İmam Hüseyn (ə)-ın dilindən**

Rəhm eylə mənim halıma, Hüseyn,
Bağrım oldı qan, qardaş, ağlaram.
Qətlüvə durub səf-səf əhli-kin,
Eyləyüb fəğan, qardaş, ağlaram,
Getmə, əl-əman, qardaş, ağlaram.

Doğranub hamı qardaşım, elim,
Damənindən heç üzmərəm əlim,
Rəzmgahə mən sənlə qoy gəlim,
Bağrım oldı qan, qardaş, ağlaram.
Getmə, əl-əman, qardaş, ağlaram.

Sal yola bu sərdarı sən, bacı,
Eyləmə fəğan, barı, sən bacı,
Əhli-Beytimün yarısan, bacı,
Ey anam-bacım, Zeynəb, ağlama,
Bağrıqan bacı, Zeynəb, ağlama.

Əldə Zeynəbün ixtiyarı yox,
Zində bir nəfər qəmküsarı yox,
Səndən özgə bir tacdarı yox,

Bağrım oldı qan, qardaş, ağlaram,
Getmə, əl-əman, qardaş, ağlaram.

Üstümə fələk bəhri-qəm töküb,
Möhnətü sitəm qəddimi büküb,
Ruhum ölməmiş cismdən uçub,
Ey anam-bacım, Zeynəb, ağlama,
Bağrıqan bacı, Zeynəb, ağlama.

Bu fələk edüb xarı Zeynəbi,
Möhnətə giriftarı Zeynəbi,
Tapşır oğluva, barı, Zeynəbi,
Bağrım oldı qan, qardaş, ağlaram.
Getmə, əl-əman, qardaş, ağlaram.

Gəl, Hüseynüvi bir də et vida,
Düşmənim baxır, eyləmə səda,
Səbr elə, sənə yardur Xuda,
Ey anam-bacım, Zeynəb, ağlama,
Bağrıqan bacı, Zeynəb, ağlama.

Zeynəbi, Hüseyn, qoyma biqərar,
Sənsiz od dutar xeymələr yanar,
Qollarım cəfa ilə bağlanar,
Bağrım oldı qan, qardaş, ağlaram.
Getmə, əl-əman, qardaş, ağlaram.

Dəstgir olan vəqtə ləşkərə,
Xırda qızlarım qaçsa çöllərə,
Ver təsəlli sən Ali-Heydərə,
Ey anam-bacım, Zeynəb, ağlama,
Bağrıqan bacı, Zeynəb, ağlama.

Şimri-dun məni qoymaz ağlayam,
Nə`şün üstə mən sinə dağlayam.
Qanlı gözlərün, barı, bağlayam,
Bağrım oldı qan, qardaş, ağlaram,
Getmə, əl-əman, qardaş, ağlaram.

Tirü xəncərə peykərim amac,
Nizədə başım eyləsə me`rac,
Olsa gər başun mə`cərə möhtac,
Ey anam-bacım, Zeynəb, ağlama,
Bağrıqan bacı, Zeynəb, ağlama.

*Əfrad*

Tərəhhüm et mənə, çeşmim tökər yüzə qan-yaş,
Bu Zeynəbün sənə qurban ola, Hüseyn, qardaş.

Az ağla, ey bacı, Zeynəb, qəzayə səbr eylə,
Əgər başım keçə tənsiz cidayə, səbr eylə.

*Təmamiyi-növhə*

Yoxdı bir kəsim, söylə, mən nedim,
Qüssədən ürək qanını yedim,
Sənsiz, ey Hüseyn, mən hara gedim?
Bağrım oldı qan, qardaş, ağlaram,
Getmə, əl-əman, qardaş, ağlaram.

Möhnətin fələk tapşurub bizə,
Nadimim tökər göz yaşın yüzə,

Tə`nə etsələr kufəyan sizə,
Ey anam-bacım, Zeynəb, ağlama,
Bağrıqan bacı, Zeynəb, ağlama.

**Həzrət Zeynəb dilindən**

Şamə gedirəm Zeynəbi, dur, sal yola, qardaş,
Düşməz belə didar dəxi bir də ələ, qardaş.

Qəlbim olub ənduhü məlal ilə ləbaləb,
İstəkli bacı-qardaşıdux, kani-müəddəb,
Qolbağlı müsafirdi, gedər Kufəyə Zeynəb,
Sənsiz gələrəm naləyə bundan belə, qardaş.

Hülqün kəsilüb, peykərün al qanə boyandı,
Zülmün şərəri, sö`ləsi əflakə dayandı,
Rəxtim soyulub, xeymələrim cümləsi yandı,
Gül bərgi sınub, qönçə dağıldı çölə, qardaş.

Qardaş, qəmimi ərz eləsəm, gəlməz hesabə,
Qəlbim yanub hicran oduna döndi kəbabə,
Qəlbim yaralı, başım açux, bağlı tənabə,
Dəfn etməgə yox möhlətim, etmə gilə, qardaş.

Başun kəsilüb, didələrün qan ilə doldı,
Çeşmündən uzaq, ərz edə bilməm nələr oldı,
Bişərmlər hətta başımun mə`cərin aldı,
Yox rəhm eləyən Zeynəbi-xunindilə, qardaş.

Qardaşı ölən bacıya lazımdı ki, hörmət,
Hörmət yerinə Zeynəbə eylüllə* şəmatət,
Kufilər edər bacuva hər növ`i əziyyət,
Çarəm nədi mən bəxti qərayə, sölə, qardaş.

Badi-sitəm əsdi, saralub soldı çəmənlər,
Bir mə`cərə möhtac olub ismətli hərəmlər,
Başsuz tökülüblər yerə gülyüzli bədənlər,
Bənzəllə** gülistandə saralmış gülə, qardaş.

Pəjmürdə düşüblər bu gülistan arasında,
Üryan bədən ilə hamı meydan arasında,
Naz ilə yatublar yaralı qan arasında,
Göz yaşım əgər dönsə rəvadur selə, qardaş.

Əlbət bu imiş əmri-Xuda ruzi-Ələstdə,
Əfv eylə, edüblər hər iki dəstimi bəstə,
Dəfn eyləməmiş sizləri yollandı bu dəstə,
Azimdi yola Şamə gedən silsilə, qardaş.

*Əfrad*

Diyari-Kufəyə oldım, Hüseyn, rəvan, gedirəm,
Cəfayi-Şimrdən oldı qədim kəman, gedirəm.

Əsüb səmumi-sitəm, qönçeyi-gülüm soldı,
Gözüm önündə bu gün yeddi qardaşım öldi.

---

* Eyləyirlər
** Bənzəyərlər

Hüseynim öldi, ədu aldılar əsasımızı,
Bizi əsir eyləyüb, soydular libasımızı.

*Baqiyi-növhə*

Əfv eylə, başun üstə cigər dağlamadım mən,
Kamımca, bəradər deyübən ağlamadım mən,
Başun dizim üstündə, gözün bağlamadım mən,
Çarəm yox idı, eyləmə məndən gilə, qardaş.

Yandı cigərim, bir də qələm al ələ, Nadim,
Gəl, Zeynəbi-biçarə dilincə dilə, Nadim,
Söylə, düzülüb qafileyi-qəm yola, Nadim,
Dur, itrəti-ətharı özün, sal yola, qardaş.

**Cənab Zeynəb dilindən**

Ey gözüm nuri, "zəbihən min qəfa",* qardaş, Hüseyn,
Qəlbimün aramisən gülgun qəba, qardaş, Hüseyn.

Yaxşı qoydun bu bəlalı çöldə bisər Zeynəbi,
Eylədün nari-fəraqə şö`lə müztər Zeynəbi,
Aç gözüvi, dəstgir eylüblə ləşkər, Zeynəbi,
Qəlbi-arami-dili-Xeyrün-nisa, qardaş, Hüseyn.

Ey bəradər, bacular qardaşı başıyla tanur,
Cismini üryan görə, başilə, qaşilə tanur,
Görsə başun zibh olunmuş, rəxti-faşilə tanur,
Neyləyim başun olub təndən cüda, qardaş, Hüseyn.

---

* Başı kəsilmiş

Nov libasilə geyindirdim səni, saldım yola,
Nə rəvadur imdi cismün bəs belə üryan qala?
Bu yaralı cismüvə Zeynəb bacun qurban ola,
Yetdi məqsudinə ceyşi-əşqiya, qardaş, Hüseyn.

Bir dəqiqə başım olmaz qüssədən eymən, hanı,
Cövri-xar ilə solubdur mən görən gülşən hanı?
Rəxtün atdan* geydigün ol köhnə pirahən hanı,
Zeynəbün ol haluva olsun fəda, qardaş, Hüseyn.

Mən səni bu növ` görməkdən qalaydım kaş, əxi,
Görməmiş bu haluvı piş əz öleydim kaş, əxi,
Nə yaralı cismüvi üryan göreydim kaş, əxi,
Bu yaralı cismüvə ruhim fəda, qardaş, Hüseyn.

Dur, əxa, gör, firqətündə mən nə növ`i yanmışam,
Xeyməgahə od vıranda əşqiya, odlanmışam,
Sayəban etməkligə yox mə`cərim, talanmışam,
Zülfilə sayə salım yoxdur rida, qardaş, Hüseyn.

Qəlbi-pürsuzim müsibətdən yanub oldı kəbab,
Xeyməni yandırmağa düşmənlərün eylüb şitab,
Çöllərə qaçdı əyalun qoymayublar məndə tab,
Qaldı bimarun od içrə rəhnüma, qardaş, Hüseyn.

Gül budağın sındırub xar, əl tapublar güllərə,
Bənzərux səyyad əlində seyd olan ahulərə,
Xeyməgahun od dutub, qaçdı hərəmlər çöllərə,
Qalmuşux bimunisü biəqrəba, qardaş, Hüseyn.

---

* Altından

Rə`si-pakun zibh edüb nə`şüvi üryan qoydular,
Nə deyə bilməm ki, düşmənlər cəfadən doydular,
Nazpərvər qızlarun yeksər libasın soydular,
Bağlayublar Əhli-Beytün qol-qola, qardaş, Hüseyn.

Aparullar Şami-şumə didəgiryan Zeynəbin,
Möhnətü qəmdən edüblə bağrını qan Zeynəbin,
Nə`şün üstə etmədi kamınca əfğan Zeynəbin,
Aziməm Şamə, məni, dur, sal yola, qardaş, Hüseyn.

Nadimi-biçarəyəm, göz yaşımı qıllam səbil,
Ya Hüseyn, bəhəqqi-Zeynəb əd-dəxil, əd-dəxil,
Bu gələn ili ərbəini sən məni eylə dəlil,
Vəslün üçün hə sözüm bir şərt ola, qardaş, Hüseyn.

**Sərvəri-dövran, oyan**

Yatma xak üstə yaralı, sərvəri-dövran, oyan,
Gəldi başun üstə, qardaş, Zeynəbi-nalan, oyan.

Xaki-xun üstə düşüb cismi-rəvanım, ya Hüseyn,
Nəhrtək cari olub mehrabə qanım, ya Hüseyn,
Aç bu qanlı gözlərün, bir al səlamım, ya Hüseyn,
Xeyməgahə od vırubdur ləşkəri-üdvan, oyan.

Zülm ilə cismi-şərifin qanuva əlvan olub,
İzzətü cahü cəlalun, ya Hüseyn, talan olub,
Xövfdən ətfali-Peyğəmbər hamı gültək solub,
Ey olan malü məlalı, şövkəti talan, oyan.

Bir nəzər qıl halimə, ey Padşahi-Kərbəla,
Rəhm elə əhvalimə, ey dadxahi-binəva,
Dur, bu çöldə Zeynəb oldı dəstgiri-əşqiya,
Ey olan Kərbübəladə itrəti nalan, oyan.

Bu müsibətdən, əxa, gəlləm fəğanə hər zəman,
Zeynəbün ağlar bu qəmdə, göz yaşın eylər rəvan,
Xun əhdadın olub nazlı Səkinən bağrı qan,
Ey olan bu halət ilə xanəsi viran, oyan.

Rəhm elə, qardaş, Hüseyn, bu zarü giryan Zeynəbə,
Lütf ilə qıl bir nəzər halı pərişan Zeynəbə,
Oldı səndən sonra dünya guşəzindan Zeynəbə,
Bu müsibətdən olubdı Zeynəbin giryan, oyan.

Al səlamım Həq rizası, ya Hüseyn, dindir məni,
Yox dəvamım qanə batmış görməgə bisər səni,
Lütf elə, sən bir danışdır Zeynəbi-biçarəni,
Dur, olaq bir qol-boyun, bacun sənə qurban, oyan.

Dur, təmamən bağlanıbdur Əhli-Beytün qol-qola,
Baclaruvı bir, oyan, qardaş, özün dur, sal yola,
Yox güman ki, bir də dəştə Zeynəbi-nalan gələ,
Dur, vida eylüm səni, ey dərdimə dərman, oyan.

Çün qolı bağlı olubdur Əhli-Beyt Şamə rəvan,
Dərdimi, bari, edim, qardaş, sənə bir-bir bəyan,
Nadimi-biçarə bu beyti yazıb eylər fəğan,
Yatma xak üstə Şəhidi-sərvəri-dövran, oyan.

## Həzrət İmam Həsən (ə)-ın dilindən

Gözün aç, bikəsü biçarə bacı, Zeynəb, oyan,
Verdilə zəhr bu sərdarə, bacı, Zeynəb, oyan.

Gözün aç, şur ilə gəl naləvü əfğanə, bacı,
Verdilə zəhri-həlahil Şəhi-dövranə, bacı,
Parə-parə tökülər, döndi cigər qanə, bacı,
Dur, əlac eylə bu biyarə, bacı, Zeynəb, oyan.

Ey bacı, dur, elə ol Qasimi-naçarə xəbər,
Ta gedüb eyləyə sərdari-vəfadarə xəbər,
Yoxdı bir kəs edə Əbbasi-ələmdarə xəbər,
Olan aləmdə güni qarə, bacı, Zeynəb, oyan.

Gözün aç, Zeynəb, oyan, möhnətü qəm həddin aşub,
Parə-parə cigərim qanə dönüb ləxtələşüb,
Ləblərim parələnüb zülm ilə qanə bələşüb,
Kərbəladə qalan avarə, bacı, Zeynəb, oyan.

Müctəba qardaşuva verdilə çün zəhri-cəfa,
Dur, bacı, səbr elə, əlbət buyimiş əmri-qəza,
Saxla göz yaşuvi, aşura güni eylə nəva,
Odlanan xeymələri narə, bacı, Zeynəb, oyan.

Sizlərə mümkin olan vəqtə, bacı, Kərbübəla,
Cismdən qolları Əbbasun olan vəqtə cüda,
Yaxacaq Qasimim ol vəqt əlinə qandan həna,
Analıq et o gün ol zarə, bacı, Zeynəb, oyan.

Kərbəladə toy edər Qasimə Sərdari-Hicaz,
Qoş o gün Fatiməyə qanlı otaq, bacı, cəhaz,
Olmaz ol vəqtidə bir kimsənə Qasim edə naz,
Ol ana ol gün o biyarə, bacı, Zeynəb, oyan.

Aç gözün, bircə oyan xabdən, ey mahliqa,
Verdilə qardaşuva zəhri-cəfa, eylə səda,
Ey bacı, növhə edüb, şurə gəlüb, saxla əza,
Ey dönən ruzı şəbi-tarə, bacı, Zeynəb, oyan.

Bir oyan, ey bacıcan, qardaşuva eylə həlal,
Ayrılıq vəqtidür, dur, qollaruvı boynuma sal,
Düşdi üqbayə yolum, qardaşuvı, dur, yola sal,
Çün xəzan yetdi bu gülzarə, bacı, Zeynəb, oyan.

Nadiməm, ağlayaram həşrə kimi şamü səhər,
Yüzə cari edərəm əbr kimi əşki-bəsər,
Çün rəvadur tökə göz yaşı hamı cinnü bəşər,
Sən də tök göz yaşı rüxsarə, bacı, Zeynəb, oyan.

**Olmaz**

Meydanə baxub tökdi yüzə göz yaşı Zeynəb,
Sölüb ki, bu sədparələri dəfn edən olmaz.
Bu qanlı bədənlərmi müsəlman degi, ya Rəb?
Bunları edən qüslü hənutü kəfən olmaz.

Hər yan görürəm qan tökülüb başdı, bədəndi,
Bu peykəri sədparə düşən Şahi-zəməndi,
Lalə kimi hər zəxm açılub misli-çəməndi,
Heç sahəti-Mina kimi ziba çəmən olmaz.

Leylayi-Əli Əkbər edüb çaki-giriban,
Məcnun kimi səhravü biyabanidə heyran,
Vay şibhi-Peyəmbər, deyübən eyləyür əfğan,
Leyla kimi heç kimsə cəlayi-vətən olmaz.

Əbbasə olur tə`ziyədar bacısı Külsum,
Gördi ki, düşüb peykəri qolsuz yerə mə`mum,
Sölüb ki, əxa, olmadı heç kəs belə məzlum,
Nə kül savurum başıma, əlsiz bədən olmaz.

Əbbas ölümi eylədi Külsumi nəvaxan,
Gördi ki, düşüb peykəri öz qaninə əlvan,
Ərz eylədi, aç qanlı gözün, mən sənə qurban,
Sən kimi rəhi-Həqqdə bir əncümən olmaz.

Çün gördi Səriyyə boyanub qanına Qasim,
Can bəzl eləyüb şövq ilə cananına Qasim,
Yaxmış qan həna zülfi-pərişanına Qasim,
Sölüb ki, belə zülm eləyən əhrimən olmaz.

Görcək yaralı Qasimi biçarə ərusi,
Göz yaşı töküb səfheyi-rüxsarə ərusi,
Zülfündən atub gül yüzinə sayə ərusi,
Ərz etdi, əmoğlı, mənə bir rəhm edən olmaz.

Ahu kimi Əsğər anası gəldi fəğanə,
Gördi ki, batub təşnə Əli Əsğəri qanə,
Gözyaşlı, oğul, qoydı məni dövrü zəmanə,
Gül qönçəsi səntək, Əli, zibi-çəmən olmaz.

Yaz cövri-xəzan yetdi çəməndə gülə, Nadim,
Xar etdi cəfa ilə sitəm bülbülə, Nadim,

Gəl, Zeynəbi-biçarə dilincə dilə, Nadim,
Bu peykəri sədparələri dəfn edən olmaz.

### Bu qəlbi viran Zeynəbün

Ya ana, ya Fatimə, gəldi pərişan Zeynəbün,
Kufəvü Şamı gəzən qolbağlı giryan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Ayrılan vəqtimdə səndən çox cəlalım var idi,
Azuqəm, rəxtim, əcəb malü mənalım var idi,
Övnü Fəzlü Cə`fərim, hər qəmküsarım var idi,
İmdi, gör, nə halə qalmış xanəviran Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Köç edəndə sağ tərəfdə Əkbər eylərdi xüram,
Ali-Haşim dövrəmi almışdılar yeksər təmam,
İzzətim, rəxtim, hüzurimdə kəniz ilə qulam,
Gör, necə kari olubdur imdi əfğan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Qoymadı Kərbübəladə nuri-eynün məndə tab,
Başınun qanilə səqqalun Hüseyn eylüb xizab,
Gər xəbər alsan Hüseyni, mən, ana, verrəm cəvab,
Nə`şün üstə getdi gördi cismün üryan, Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Qolların eylüb qələm öldürdülər Əbbasimi,
Həsrətü nakam ədu zibh etdi ətşan Qasimi,
Tökdülər yas üstünə əhli-cəfalər yasimi,
Baş açub, zülfün yolub oldı nəvaxan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Yeddi qardaş nə`şi üstə baş açub etdim fəğan,
Xeyməgahi yandıranda nari-zülmə kufəyan,
Möhnəti-qəmdən, ana, sərvi-qədim oldı kəman,
Soydular ə`da libasın zarü giryan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Şami-şumə başaçux çəkdi bizi əhli-inad,
Zeynəbi-biçarəyə tə`nə edüb ibni-Ziyad,
Şamdə viranədə heç kəs bizi etməzdi yad,
Ağlamaqdan göz yaşı olmuşdı al qan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Bil bu qədr, ey ana, biyarü yavər gəlmişəm,
Kərbəladə qoymışam yeddi bəradər gəlmişəm,
Var nə Əbbasü Hüseyn, Qasim nə Əkbər gəlmişəm,
Baş gətür bir qəbrdən, dindir hərasan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Kərbəladə Şimri-dun kəsdi Hüseynün başını,
Qəlbimə vırdı ədu büğz ilə möhnət daşını,
Zeynəbün zülfün yolub, tökdi yüzə göz yaşını,
Zülfi-mişkini ağardı, oldı nalan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

Barilahə, təng dutma ruzgarun Nadimün,
Şövqi-vəslün çün alub əldən qərarun Nadimün,
Qismət et, şövt eyləsün Zəhra məzarun Nadimün,
Qəbrini eylüm təvaf ol zarü giryan Zeynəbün.
Bu qəlbi viran Zeynəbün.

## Yaralı, yaralı

Ey cismi bidəfnü kəfən yaralı, yaralı,
Ey sərvəri-gülpirəhən yaralı, yaralı.

Ənsaruvi ə`da əldən alublar, alublar,
Gül cismüvi topraqlara salublar, salublar,
Ali-Əba gözi yaşlı qalublar, qalublar,
Bir çarə et, Şahi-zəmən yaralı, yaralı.

Neyləyim, yox ixtiyar əlimdə, əlimdə,
Əzbər olub "va möhnəta" dilimdə, dilimdə,
Qanə batdım qardaşlarım, elimdə, elimdə,
Əsir oldum mən bivətən yaralı, yaralı.

Səngi-cəfayə tuş olub vuruldum, vuruldum,
Nə`ş üstə baş açub, yoruldum, yoruldum,
Rumü Həbəş əsiritək soyuldum, soyuldum,
Dildən məni saldı mühən yaralı, yaralı.

Şö`lə çəküb xeymələrim odlandı, odlandı,
Soyuldı itrətim, xeyməm talandı, talandı,
Qollarımız tənab ilən bağlandı, bağlandı,
Oldı xəzan mihəni-çəmən yaralı, yaralı.

Gəlməz şümarə gül cismivün yarası, yarası,
Zeynəb yaralı nə`şüvün fədası, fədası,
Ərşə çıxub "va möhnəta" sədası, sədası,
Yox cismüvi bir dəfn edən yaralı, yaralı.

Bisər yüzi üstə nə`şün salublar, salublar,
Ə`da libasuvı təndən soyublar, soyublar,
Övladi-Müstəfa bisər qalublar, qalublar,
Yoxdur bir himayət edən yaralı, yaralı.

Sən öldün üstümə qəmlər töküldi, töküldi,
Müsibətdən rə`na qəddim büküldi, büküldi,
Qətarımız Şamə tərəf çəkildi, çəkildi,
Bir Zeynəbün dindirgilən yaralı, yaralı.

Nadim şivən səsin salub səmayə, səmayə,
Əldə qələm gəlüb şurü nəvayə, nəvayə,
Zair olmaq istər Kərbübəlayə, Kərbübəlayə,
Ey sərvəri-gülpirahən yaralı, yaralı.

**Əfrad**

Rəhm et, əmandı, bikəsü biyarə, ya Hüseyn,
Bir baxgilən bu Zeynəbi-naçarə, ya Hüseyn.

Sənsiz nə növ`i səbr eləyim dərdi-möhnətə,
Qoyma əyaluvi belə avarə, ya Hüseyn.

Bu çöldə bircə sənsən həvadarı Zeynəbün,
Getmə, bu cismüvə yetüşər yarə, ya Hüseyn.

Getdi bu rəzmgahə Əbülfəzl, gəlmədi,
Oldı şəhid o sərvəri-məhparə, ya Hüseyn.

Hicri o sərvərün eləyüb qəddimi kəman,
Külsum qalubdı həsrət o sərdarə, ya Hüseyn.

Qıldun Mədinədən məni avarəvətən,
Etdün bu qəmli Zeynəbi avarə, ya Hüseyn.

Rəngi uşaxlarun saralub kəhrəba kimin,
Bir baxgilən Səkineyi-naçarə, ya Hüseyn.

Nadim qələm əlində edər nalə hər zəman,
Göz yaşı çıxdı qüssədən aşkarə, ya Hüseyn.

### Göz yaşım qanə dönüb

Göz yaşım qanə dönüb həsrəti-didar olalı,
Ey Hüseyn, qardaş, üzün qan ilə gülnar olalı.

Kəsilən vəqtə başun, xeymələrim yandı mənim,
Qardaş, ol halı görüb, qəlbim alovlandı mənim,
Sən ölən gündən, Hüseyn, adətim əfğandı mənim,
Pasiban Zeynəbi-biçarəyə əğyar olalı.

Başun üstə baş açub, gahi cigər dağlamışam,
Gahi üryan bədənün yerdə görüb ağlamışam,
Qan çəkən gözlərüvi zülfüm ilə bağlamışam,
Yanmışam hicr oduna hicrə giriftar olalı.

Mindirüb sənsiz ədu naqeyi-üryanə məni,
Qolı bağlı, başaçux, çəkdilə hər yanə məni,
Saldı eşqün sənün, axırda biyabanə məni,
Halımı bir soruşan yoxdı belə xar olalı.

Eşqün avarə edüb Zeynəbi-xunincigəri,
Gah gəzüb Kufədə gözyaşlı bacun kuçələri,

Eşqün axırda çəküb, Şamə məni-dərbədəri,
Ağarub zülfüm, Hüseyn, daxili-bazar olalı.

Seydvəş saldı ədu damə məni, səbr elədim,
Çəkdilər başım açux Şamə məni, səbr elədim,
Gətdilər məclisi-püramə məni, səbr elədim,
Ali-Taha  qəmü ənduhə pərəstar olalı.

Salmısan* yadə neçün Zeynəbi-biyavəri sən?
Bükdi sənsiz qədimi bu qəmü ənduhü mühən,
Gah təsəlli verərəm itrəti-Peyğəmbərə mən,
Bu Səkinə gətirüb naləyə bimar olalı.

Nadimi-bikəsün əhvalın, Hüseyn, al nəzərə,
Mərhəmət eylə bu məhzunü dili xuncigərə,
Guşeyi-çeşmilə bir eylə nəzər növhəgərə,
Olmuşam zarü məlul, qəbrüvə zəvvar olalı.

**Ey verən bu səhradə təşnə can, xudahafiz**

Ey verən bu səhradə təşnə can, xudahafiz,
Qüsli dəşti-Minadə qan olan, xudahafiz.

Bir oyan, Hüseyn, qardaş, Zeynəbün sənə qurban,
Bu yaralı gül cismün qanuva olub əlvan,
Gər mənim Hüseynimsən, dur, oturgilan bir an,
Dur, mənlə ol bir də həmzəban, xudahafiz.

---
* Salmayırsan

Bu zəmini-Minadə qəmlərim əyan oldı,
Bacularuva, qardaş, Şimr pasiban oldı,
Qafileyi-qəm səmti-Kufəyə rəvan oldı,
Bəs hanı Ələmdari-mehriban, xudahafiz.

Zülm ilə dolub dəşti-Kərbəla, Hüseyn, qardaş,
Qanuva batub xaki-Neynəva, Hüseyn, qardaş,
Zeynəbi əsir eylüb əşqiya, Hüseyn, qardaş,
Kufəyə rəvan oldı karivan, xudahafiz.

Rəhm eylə, səni Tarı, Zeynəbi-dilfikarə,
Dur, bir et nəzər, qardaş, sən bu çeşmi-xunbarə,
Dəstgir olub Zeynəb imdi ceyşi-küffarə,
Dur, əlac eylə, qardaş, əl-əman, xudahafiz.

Zibh edüb səri-pakun Şimri-duni-bədəxtər,
Tökdi əhli-İslamın başlarına xakistər,
Çün əsir edüb, qardaş, Əhli-Beytüvi ləşkər,
Xun ilə dolan aç gözlərün, oyan, xudahafiz.

Şahi-din nə layiqdür qan içində xab etsün,
Qətlinə Şəhi-dinün Şimri-dun şitab etsün,
Həq o Şimri-bidinün xanəsin xərab etsün,
Ali-Heydəri qodı* biməkan, xudahafiz.

*Əfrad*

Dolandı Zeynəbi-məhzun təmami-meydanı,
Çün axtarırdı o Şahi-zəbihi-ətşanı.

---

* Qoydu

Yetişdi bir yerə nagah, o Zeynəbi-dilxun,
Nə gördi, bir təni-bisər düşüb yerə pürxun.

Edüb nəzarə o cismə, o dilfikarü həzin,
Yəqin oldı odur, qardaşı İmam Hüseyn.

Dedi, cəfa ilə, ey cismi-paki qanə hədəf,
Səni qəsəm verürəm həqqi-padşahi-Nəcəf.

Əzizi-Fatiməsən, aç gözün, səni Tari,
Yaralı hülqin öpüm, səndən ayrılım, bari.

Əcəb fəraqun əlimdən qərarımı aldı,
Biri-birimizi görmək qiyamətə qaldı.

Dəməşqə getməliyəm bir bölük əyalunilə,
Əyağə dur, yola sal bacuvı bu halun ilə.

Yanımda vardı bu sübhi yeddi qardaşım,
Olub cəfa ilə imdi rəvanə göz yaşım.

Nə edim ki, qoymurı Şimr, ağlayım doyunca sənə,
Hənutü qüslü kəfən eyləyim bu gül bədənə.

Yaralı nə`şünilə dur, otur, səni Tari,
Bu qollarımı kəsik boynuva salım, bari.

*Təmamiyi-növhə*

Mən gələndə bu dəştə, çox cəlal ilən gəldim,
Əkbər ilə Əbbasi-məhcəmal ilən gəldim,
Övnü Cə`fərü Qasimi-növcəvan ilə gəldim,
İmdi yox mənlə bir həmzəban, xudahafiz.

Neyləyim, əlacım yox, qarət oldı əsasım,
Nəhri-Əlqəm üstündə doğranubdur Əbbasım,
Öldı Övn ilə Cə`fər, öldi növcəvan Qasim,
Qalmayublar olsunlar pasiban, xudahafiz.

Bu qətari-qəm əl`an, səmti-Şamə azimdür,
Bu solmuş ətfalə pasiban nə lazimdür,
Pasibanımız, qardaş, imdi zəcri-zalimdür,
Gedirəm gözi yaşlı, bağrıqan, xudahafiz.

Bir də mümkin olsa bu qəbrün üstünə gəlləm,
Qəbrüvin, əxa, zülfümlə qübarını silləm,
Yatmaram gecə-gündüz, va əxa, deyübölləm,
Ey gedən səri Şamə ərməğan, xudahafiz.

Şimri-bihəya verməz möhlət, ey Hüseyn, qardaş,
Ağlayım sənə, bari, bir doyunca mən külbaş,
Dəfnü kəfn edim, gözdən cari eyləyim qan-yaş,
Qüsl verməgə qoymaz kufəyan, xudahafiz.

Ağlamaq mənə, qardaş, gərçi olmadı mümkin,
Bu ümid ilə daim qəlbimə verim təskin,
Şiələr sənə matəm saxlayub olar qəmgin,
Nadimin olar hər il növhəxan, xudahafiz.

## Sənün olsun

Qardaş, boyanan qanuva meydan, sənün olsun,
Qanə bələşən pirü cəvanan, sənün olsun.

Mən getməliyəm Kufəvü Şamə, nigəranəm,
Qardaş, bu zəman Kufəyə qolbağlı rəvanəm,
Üdvanə əsirəm, qəm əlindən yarı canəm,
Qan üstə, qurı yerdə yatan can sənün olsun.

Bu silsileyi-qəm düzülüb türfə nizamə,
Çün oldı əsir Ali-Əli ceyşi-zülamə,
Biz getməliyux Abidi-bimar ilə Şamə,
Əbbasi-vəfapərvərü ətşan sənün olsun.

Üryan dəvələr üstə bizi asiyi-millət,
Şamə çəkübən eyləyəcəklər min əziyyət,
Mən səbr edərəm gər çəkim hər növ`i müsibət,
Səbr eyləməgə cənnəti-rizvan sənün olsun.

Mehmandı sənə həsrətü nakam Əli Əkbər,
Munisdi sənə Qasimü Əbbas ilə Əsğər,
Mənlən gedəcək Şamə hamı nazlı hərəmlər,
Bu nəhri-Fərat üsti biyaban sənün olsun.

Göz yaşımı mən cari edim ruyimə hər ruz,
Hər şamü səhər ağlayuban, qoy, edim əfsus,
Bu Ali-Əba didəsi giryan, hamı mə`yus,
Bular da mənim, Əsğəri-nalan sənün olsun.

*Əfrad*

Diyari-Şamə məni əhli-kin çəkər, qardaş,
Yoxımdı dadrəsim imdi bir nəfər, qardaş.

Bu Kərbəla çölini tapşurub sənə gedərəm,
Kəramət et, məni dindir, sən imdi kani-kərəm.

Yanında saxlagilən Əkbər ilə Qasimi sən,
Səkinəni alaram yanıma xərabədə mən.

Yanında saxlagilən sən vəfalı Əbbası,
Ölüncə mən ona Külsum ilə dutum yası.

*Təmamiyi-növhə*

Leylayi-cigərsuzi, Hüseyn, ver mənə yoldaş,
Viraneyi-Şam içrə mən ilə açacaq baş,
Munis olu viranələr içrə mənə, qardaş,
Yetmiş birədək qanına qəltan sənün olsun.

Bu əlsiz-ayaqsızlar ilə eylərəm ülfət,
Gər başımıza töksələr hər növ`i müsibət,
Saxlar bu hərəm qafiləsin Zeynəb əmanət,
Ol Qasimi-şəhzadeyi-ətşan sənün olsun.

Cəddün kimi başun eləyər nizədə me`rac,
Gülgun bədənün xəncərü şəmşir ilə tarac,
Mən Şamı gəzim başım açux, mə`cərə möhtac,
Balış yerinə xari-müğilan sənün olsun.

Əhli-hərəmi Şimr düzər türfə nizamə,
Qolbağlı, zəlilanə çəkər kuçeyi-Şamə,
Şam əhli təmaşayə çıxar qürfəvü bamə,
Mən səbr elərəm, qanlı bu meydan sənün olsun.

Nadim eləyər ruyinə göz yaşını cari,
Növhə eləyər, ağlayar hər leylü nəhari,
Məhşər günü əfv et onı bu Zeynəbə, bari,
Eyvani-təladə o nəvaxan sənün olsun.

**Həzrət Zeynəblə İmam Hüseyn (ə)-ın dilindən**

Axır nə qədər əşk töküm gül yüzə, qardaş,
Sən ölsən, edər kufi şəmatət bizə, qardaş.

Bir saxla atun, var sənə bircə sözüm axır,
Hicranuva illərlə nə növ`i dözüm axır?
Qoy, faş eləyim, bari, bu sirri özüm axır,
Vəslün olumı* ruzi dübarə bizə, qardaş.

Biçarə, əziz günlərüviz axıra yetdi,
Qəm başdan aşub, dərdü bəla həddidən ötdi,
Əkbər balam öz qanını topraqlarə qatdı,
Asudəlik olmaz sizə bundan belə, Zeynəb.

Qardaş, elə öz rə`yüvi e`lan məni-zarə,
Bu xeymələrə bir də gələrsənmi dübarə?
Sən gəlməsən, axır nə edim mən güni qarə,
Müşkildi əlin Zeynəb əlindən üzə, qardaş.

---

* Olurmı

Yox bir də güman, bikəs Hüseynün gələ, baci,
Gözlər yolumı Şimr, tiküb göz yola, baci,
Hifz eyləsün Allah sizi bundan belə, baci,
Ə`da başımı tapşurur əldən-ələ, Zeynəb.

İmdi ki, məni yandıracaq nari-fəraqun,
Zülm ilə kəsər xeymədən ə`dalər əyağun,
Qoy, batmamış al qanə, öpüm qönçə dodağun,
Tuş olmamış ol Şimri-şəqi dinsizə, qardaş.

Qol boynuma sal, bacı, məni eylə ziyarət,
Zeynəb, sən ilə eyləyər ənduhü qəm ülfət,
Gər əhli-cəfa eyləsələr xeyməni qarət,
Səbr eyləgilən, gəlmə heç əslən dilə, Zeynəb.

Əkbər qəmi, qardaş, belüvi bükdi, xəm etdi,
Ə`da sənə hər cövrü cəfavü sitəm etdi,
Ənduhü mühən, qardaş, Hüseyn, həddidən ötdi,
Qoydı fələk axır gözüm həsrət sizə, qardaş.

*Əfrad*

Yəqinim oldı bu gündən belə yüzüm gülməz,
Gedənlərim, görürəm, bir də xeyməyə gəlməz.

Günüm qəra, işim əfğan, tökər gözüm qan-yaş,
Buyur, görüm, gələcəksənmi xeyməyə, qardaş?

Doyunca eylə vida zarü bəxti qarə məni,
Olur ki, görməsən* hərgiz, bacı, dübarə məni.

Qılıclar ilə məni parə-parə doğrallar,
Mənim bu halətimə əhli-kinə ağlallar.

Sutək edəllə susuz qanımı rəvanə, bacı,
Xizab olar bədənim zülm əlilə qanə, bacı.

Bacı, cəfa oduna odlananda xeymələrim,
Qoyalla çöllərə yüz Əhli-Beyti-dərbədərim.

Əsir əyalımı yığ birbəbir yanan çadıra,
Səğir uşaxlarıma qoyma Şimr sili vıra.

Çox ağlayanda, bacı, başlarunı al dizüvə,
Özün də ağlama çox, ver təsəllini özüvə.

*Təmamiyi-növhə*

Səbr eyləgilən növhə edüb, ağlama, baci,
Göz yaşı töküb qəlbimi çox dağlama, baci,
Vəqtim keçüb axır bu qədər saxlama, baci,
Kamınca məni eylə vida, sal yola, Zeynəb.

Qardaş, sənə qoy ərz eləyim cani-kəlami,
Bu övrət-uşaxlar səni gözləllə təmami,
Sayəndə sənün sayələnüblər bular hami,
Tikmiş hamısı göz bu saralmış yüzə, qardaş.

---

* Görməzsən

Hər bəzmi-əzadə tök üzə göz yaşı, Nadim,
Yansun gərək ənduh ilə qəlbün başı, Nadim,
Çün Zeynəbə söylərdi Hüseyn qardaşı, Nadim,
Asudəlik olmaz sizə bundan belə, Zeynəb.

**Bisər yaralı**

De, düşən gül bədəni zülm ilə bisər yaralı,
Sənə qurban ola bu Zeynəbi-müztər, yaralı.

Səni kim aldı əlimdən mənim, ey kani-kərəm,
Cismi-məcruhüvi sədparə salub qövmi-züləm,
Üstümə oldı hücumavər, əxa, möhnətü qəm,
Ağlaram həşrə kimin mən sənə illər, yaralı.

Sən öləndən sora qarət olunub xeymələrün,
Baş açub zülf yolar xahəri-xundidələrün,
Gəlməz heç həddi-şümarə, baxıram, yarələrün,
Yaralı başı verən nizəyə zivər, yaralı.

Cismi-məcruhüvi görcək, məni qəm etdi kəbab,
Batub ağ səqqalun öz qanun ilə misli-xizab,
Bəs neçün eyləmədi Şimr, Peyəmbərdən hicab,
Başuvi kəsdi susuz Şimri-sitəmkər, yaralı.

Sərüvi Şimr xizab eylədi al qanə susuz,
Zinət oldı bədənün ərseyi-meydanə susuz,
Canuvı bəzl elədün şövq ilə cananə susuz,
Gözləyür imdi yolun Saqiyi-Kövsər, yaralı.

Bacun ölsün, gözün aç, gör, necə bu Şimri-dəni,
Bağlayub qol-qola ahu kimi əhli-hərəmi,
Söylə, Əbbasi-ələmdar ələ alsun ələmi,
Bibəradər gedərik Şamə, bəradər, yaralı.

Kufəvü Şamə, bəradər, demə sənsiz gedərəm,
Mənlə başun gedəcək Şamə bədənsiz, gedərəm,
Qoyuban nə`şüvi səhradə kəfənsiz, gedərəm,
Xarü xaşak kəfənün oldı, bəradər yaralı.

Xeymələr yandı, əxa, qarət olub cahü cəlal,
Gözün aç, ayrılırıq, Zeynəbüvi eylə həlal,
Ali-Tahanı özün, qardaş, Hüseyn, dur, yola sal,
Aparullar bizi də Şamə bu ləşkər, yaralı.

Bikəsü bivətənəm, qalmayub ənsarım, elim,
Nə edim, yox əlacım, qoy səni ağuşə alum,
Nə`şüvi dəfn eləyüb qəbrüvə pərvanə olum,
Dur, mənə yar ol özün, aləmə yavər, yaralı.

Mültəcidür bilüsən can verən haldə sənə,
Ağlayar bəzmi-əzadə, gəh ibadətdə sənə,
Var ümidim, Şəhi-din, ruzi-qiyamətdə sənə,
Zakir olmuş sənə bu Nadimi-nokər, yaralı.

**Yüz qoyub xeymələrə ləşkəri-kafər, yerisün**

Yüz qoyub xeymələrə ləşkəri-kafər, yerisün,
Soymağa Ali-Əlini hamı səflər yerisün.

Şimri-dun izn verüb bir neçə məl`unə o dəm,
Ta gedüb xeymələri qarət edə əhli-züləm,
Ali-Peyğəmbərə ta eyləyələr zülmü sitəm,
Hamısı əldə dutub nizəvü xəncər, yerisün.

Neçə bidinü ləin xeymələrə oldı rəvan,
Gördülər xeymədən əflakə çıxar ahü fəğan,
Gördülər nazlı Səkinə deyir, ey əmmə, əman,
Qoyma bu xeymələrə zümreyi-kafər yerisün.

Söylə bu ləşkərə, incitməyələr, əmmə, məni,
Verirəm, əmmə, qəsəm hörməti-Zəhrayə səni,
Batmayubdur babamun qanə əgər gül bədəni,
Bu nə halətdi xiyam üstə ələmlər yerisün.

Tökülüb xeymələrə ləşkəri-küffar o zəman,
Ravi söylər, ucalub ərşə o vəqt ahü fəğan,
Yüz qoyub çöllərə ətfali-Hüseyn naləkünan,
Rahi-səhranı dutub Ali-Peyəmbər, yerisün.

*Əfrad*

Çü hökm olub soyalar Əhli-Beyti-Tahanı,
O vəqt ki, zibh eyləyüblər Şəhi-şəhidani.

Qoyubla qarətə yüz bihəya bu əhli-zülam,
Hüseyn hərəmlərini saldılar hərasə təmam.

Görüb o halı o dəm Zeynəbi-firiştəliqa,
Dedi, kənarə durun, ey güruhi-qövmi-dəğa.

Xiyamə gər qədəmin qoysa bir ləin bəşər,
Yəqin bilün ki, yıxar ərşi Ali-Peyğəmbər.

Soyulmağımıza bu növ` ilə riza ollam,
Hüseyn hərəmlərinün rəxtini özüm alam.

Hüseyni-təşnələbün qarət oldı hər malı,
Əsiri-Rumü Həbəştək soyuldı ətfalı.

Hüseynə ağlamağun çox cəzası var, qardaş.
Həmişə ağlagilən, tök yüzə gözindən yaş.

Mən ağlaram bu Hüseynə, çün ağlayan yoxdı,
Vücudi başdan-əyağə cərahəti-oxdı.

*Baqiyi-növhə*

Dəstgir etdi ki, zülm ilə o naçarləri,
Çəkələr qətlgəhə həsrəti-didarləri,
Qarətə getmiş idi xeyməvü xərgahləri,
Nə rəvadur başaçux nazlı hərəmlər yerisün.

Gərdişi-çərxi-fələk gər belə tapmışdı qərar,
Dəstgir eyləyələr Zeynəbi ol ləşkər, zar,

Ali-Peyğəmbər ola zülm ilə çün naqəsəvar,
Şami-şumə başaçıq Zeynəbi-müztər yerisün.

Bu müsibətdə, Xuda, şö`lələnüb yandı dilim,
Ya Hüseyn, eylə nəsib qəbrüvə pərvanə olum,
Ömr başə yetişüb rusiyəhəm, boşdur əlim,
Nadimin zikri-müsibət edüb əzbər, yerisün.

**Söylə, ey Bəşir**

Söylə, ey Bəşir, Kərbəlayə sən bu qətarı çək, Həq rizasinə,
Əcri var, əlim gər Hüseynimün yetsə türbəti-Kərbəlasinə.

Bülbülani-qəm yetsə şövq ilə dəşti-Kərbəla gülüzarinə,
Göz yaşı töküm, zülfümi sərim, qardaşım Hüseynün
məzarinə,
Xeyli vəqtidür qutəvər olub qəbri-Şahi-din qəm qübarinə,
Ərbəinidür, əgləşəm gərək qəbri üstünə, qəm əzasinə.

Can verən zəman Şahi-məşriqeyn, başı üstə bir
ağlayammadım,
Başımı açub, zülfümi yolub, şur ilə cigər dağlayammadım,
Dildə həsrətim qoydı Şimri-dun, gözlərini bir
bağlayammadım,
Çün gözüm önündə kəsüb ədu, vırdılar başun öz cidasinə.

Birbəbir bəyan eyləyim gərək Şahi-Yəsribə ərzi-halimi,
Qarət eyləyən vəqtə əşqiya Kərbəladə cahü cəlalimi,
Şimr ilə Sinan eylədi ziyad möhnətü qəmü dərd-məlalimi,
Bir əlilə can səbr edüb necə əşqiyalərün hər bəlasinə.

Qardaşım səri zibh olub əgər, mən də zülm əlilə soyulmuşam,
Gah baş açub, gah ağlayub, sinəçak olub zülf yolmuşam,
Nə`şi üstünə zülfümi sərüb, ağlayub o qədr yorulmuşam,
Eylədim nəzər, bağrım oldı qan nizə zəxminə, ox yərasinə.

Ərz edəm gərək, cövr ilə məni çəkdi Kufəyə ləşkəri-inad,
Bircə əhli-din olmadı məgər, Ali-Heydəri eyləsün azad,
Bəzmi-alidə tə`nə eylədi Ali-Yasinə zadeyi-Ziyad,
Taridən həras etmədilə, çün əhli-Kufənün, tuf həyasinə.

Soldı zülm ilə qönçə güllərim,
Qanə qərq olar sonra Əkbərim,
Şamə çəkdilə bağlı qollarım,
Xeyli zülm olub Ali-Yasinə.

Cari eylərəm əşki didədən,
Həşrətək məni-zarü qəmzədən,
Ol Səkineyi-zarü bivətən
Öldi, ağlaram tazə yasinə.

Ağla, Nadimi-zarü bamühən,
Zeynəb əşki-qəm tökdi didədən,
Kərbəlayə çək bu qətarı sən,
Söylə, ey Bəşir, Həqq rizasinə.

**Şəhi-dövran, oyan, qardaş**

Əsiri-əşqiya oldum,
Şəhi-dövran, oyan, qardaş.
Soyublar mə`cərü rəxtim,
Bu qövmi-kufəyan, qardaş.

Çəməndə gülsifət soldum,
Qəribü dəstgir oldum,
Ağarmış zülfümi yoldum,
Məni-nalan, Hüseyn, qardaş.
Nedim axır məni-külbaş.

Bu cismün xəncərə amac,
Kəsik başun edər me`rac,
Bacun bir mə`cərə möhtac,
Edər əfğan, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

O yanda xeymələr yandı,
Bu yanda Əsğər oxlandı,
Bacun Zeynəbün talandı,
Qalub heyran, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

Gözümdən rizeyi-əlmas,
Axar əşkim, dutubdur yas,
Veribdür qollarun Əbbas,
Sənə qurban, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

Əli Əkbər ölüb ətşan,
Qoyub Leylanı sərgərdan,
Yaralı cismüvə qurban
Ola bu can, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

Əlində oxlanub Əsğər,
Olub laləsifət əhmər,
Bu yanda Ali-Peyğəmbər,
Olub giryan, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

Bu gün bəhri-bəla daşdı,
Müsibət həddən aşdı,
Hərəmlər çöllərə qaşdı,
Hərə bir yan, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

Nə əqvamım, elim yoxdur,
Çəməndə sünbülüm yoxdur,
Deyəm qardaş, dilim yoxdur,
Məhi-taban, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

Geyibdür Nadimin qarə,
Qələm dəstində, dil parə,
Qalub dünyadə avarə,
Edər əfğan, Hüseyn, qardaş,
Nedim axır məni-külbaş.

**Səd ah, ah bəradər, cövri-zəman əlindən**

Səd ah, ah bəradər, cövri-zəman əlindən,
Zeynəbdə qalmayub can Şimrü Sinan əlindən.

Şimr eylədi evimi viranə Kərbəladə,
Əlvan edüblə cismün al qanə Kərbəladə,
Getdi əsasü rəxtim talanə Kərbəladə,
Eylüm nə çarə, qardaş, bu kufəyan əlindən?

Gülzarımı bu çöldə soldurdı əhli-kinə,
Hər növ` qəm verüb yüz, bu bikəsü həzinə,
Sölər, Əli bəradər, ağlar qızun Səkinə,
Ömrüm tükəndi axır ahü fəğan əlindən.

Göz yaşımı üzarə qıllam rəvanə, qardaş,
Çünki batubdı cismün zülm ilə qanə, qardaş,
Bilməm nə etmiş idim mən sarbanə, qardaş,
Qət` oldı hər dü dəstün ol sarban əlindən.

Yandırdı xeyməgahun bu əhli-kinə narə,
Çün gördü Əhli-Beytün xeymə çəküb şərarə,
Yeksər əsir əyalun düşdi, Hüseyn, fərarə,
Talan olub əsasım bu şamyan əlindən.

Şimri-dəğa səni çün, ol vəqt yüz üstə saldı,
Qarət edüb əsasun, əldən libasun aldı,
Bimar Əli yetimün, yanan çadırda qaldı,
Girdim oda, yapışdım o natəvan əlindən.

Zeynəb bacuvı qəlbün zülm ilə dağladılar,
Görcək yaralı nə`şün ətfalun ağladılar,
Nazlı hərəmlərüvi qol-qola bağladılar,
Bir kəs yox imdi dutsun mən bağrıqan əlindən.

Olsa nə qədr həyatun, ağla Hüseynə, Nadim,
Ləbtəşnə kəsdi başın çün əhli-kinə, Nadim,
Üqbadə yarun olsun Şahi-Mədinə, Nadim,
Gəlmə dilə cəhandə dərdi-nihan əlindən.

**Zeynəb doyubdı canə**

Zeynəb doyubdı canə Şimrü Sinan əlindən,
Hər ləhzə şikvə qıllam cövri-zəman əlindən.

Ol gündə keçdi sənsiz Ali-Əba çırağı,
Əhli-cəfa sitəmlə çəkdi dağ üstə dağı,
Məcruh edübdi qəlbim Əbbasın iştiyağı,
Qan oldı könlüm axır dərdi-nihan əlindən.

Nari-qəmə alışmış, çəkdi şərarə Leyla,
Neytək nəvayə gəldi, ol bəxti qarə Leyla,
Sənsiz, Əli, oğul, bəs etsün nə çarə Leyla,
Yox busəgah yüzündə zəxmi-sinan əlindən.

Ali-Əba yetişcək qolbağlı qətlgahə,
Yüz verdi dərdü möhnət Külsumi-bipənahə,
Eylüb nigah baxardı gözyaşlı rəzmgahə,
Qan oldı əşki-çeşmi acı fəğan əlindən.

“Va möhnəta” deyərdi, yağmış mühən qəm üstə,
Göz yaşını tökərdi, rüxsari-pürnəm üstə,
Düşdi güzarı axır, çün nəhri-Əlqəm üstə,
Gördi düşübdi bihiss Əbbasi qan əlindən.

Ərz eylədi, bəradər, Əbbas, oyan, əmandur,
Dildə fəğanü nalə, göz yaşımız rəvandur,
Bu Nadimin həmişə, bu qəmdə növhəxandur,
Şikvə edər həmişə cövri-zəman əlindən.

**Həzrət Zeynəbün dilindən**

Ey bəradər, Hüseyn, dur əyağə,
Möhnətə giriftarəm, ağlaram.
Dəstgir edüb əşqiya məni,
Ruzigardə xarəm, ağlaram.

Gülzardə güllərim solub,
Qüssədən könül qan ilən dolub,
Altı qardaşım təşnələb ölüb,
Bir qəribü biyarəm, ağlaram.

Əkbərim ölüb, ağlayar gözüm,
Kəhrəbasifət soldı gül yüzüm,
Lal olub dilim, qurtarub sözüm,
Qarəpuş əzadarəm, ağlaram.

Zibh edüb səni vermədilə su,
Qan ilən bu gün eylədün vüzu,
Xeyməgahımı yandurub ədu,
Çün qəribü naçarəm, ağlaram.

Olmuşam əsir, bağlanub qolum,
Dəstgir edüb ləşkəri-zəlum,
Cismi-pakuva mən fəda olum,
Gör nə növ`i naçarəm, ağlaram.

Ey Hüseyn, olub Zeynəbün əsir,
Şimri-nabəkar etdi dəstgir,
Ay kimin başun nizədə gəzir,
Başuva necə zarəm, ağlaram.

Eşqün eyləyüb dərbədər məni,
Kufəyə çəkər xuncigər məni,
Yaxşı eylədün bəxtəvər məni,
Ruzigardə xarəm, ağlaram.

Eyləmə, Xuda, xar Nadimi,
Bimüinü biyar Nadimi,
Öldürür yəqin ar Nadimi
Asiyəm, günəhkarəm, ağlaram.

**Səlam olsun sənə, sədparə qardaş**

Səlam olsun sənə, sədparə qardaş,
Əsir oldı bacun əğyarə, qardaş.

Sən öldün gülşənim soldı, pozuldı,
Qətarım Kufəvü Şamə düzüldi,
Hüseyn, qardaş, əlim səndən üzüldi,
Qalubdur Zeynəbün avarə, qardaş.

Sənün sinəndə var Əbbas dağı,
Məni də odlayur Əkbər fərağı,
Bu çöldə keçdi Peyəmbər çırağı,
Sitəmlə seyd olub gül xarə, qardaş.

Sənün Əsğər əlində batdı qanə,
Məni dərdü mühən gətdi fəğanə,
Vırar başimə Şimr taziyanə,
Rəvandur göz yaşım rüxsarə, qardaş.

Sənə gər yardür şəhzadə Qasim,
Hüseyncan, var mənim çoxlı hərasim,
Sən öldün, tazədən başlandı yasim,
Əsirəm ləşkəri-xunxarə, qardaş.

Səni tənha qoyub gər Övnü Cə`fər,
Tiküblər göz mənə nazlı hərəmlər,
Soyub yeksər bizi Şimri-sitəmkər,
Misali-gül əsirəm xarə, qardaş.

Sən öldün, şövkətim, malım talandı,
Təmamən xeymələr suzanə yandı,
Bu bikəslər sənün axır balandı,
Olublar xövfdən dilparə, qardaş.

Sən öldün rövnəqim sənsiz pozuldı,
Qətarım Kufəvü Şamə düzüldi,
Əyağə dur, əlim əldən üzüldi,
Təsəlli ver məni-biyarə, qardaş.

*Əfrad*

Gözüm yaşı yüzümə caridür, cigər dağlı,
Əyağə dur, gedirəm Kufəyə qolum bağlı.

Ürək yəralı, gözi yaşlı, bağrıqan gedirəm,
Mənə olubdur Hüseyn dərdi pasiban, gedirəm.

Yoxumdı çarəm, Hüseyncan, müaf eylə məni,
Edüb hənutü kəfən, qoymadım məzarə səni.

Sənə doyunca edüb növhə, qardaş, ağlamadım,
Verəndə can, bacun ölsün, gözüvi bağlamadım.

*Təmamiyi-növhə*

Əsir oldum, Hüseyn, əhli-inadə,
Rəvanəm Kufəyə sənsiz piyadə,
Yaralı başuvı növki-cidadə,
Görüb gəlləm, mən ahü zarə, qardaş.

Qələm əldə yaza şərhi-müsibət,
Cəhandə qüssədən olmaz fərağət,
Çəkər cəm`i ziyarətgəh şəmatət,
Nəzər qıl Nadimi-biyarə, qardaş.

## Həzrət Zeynəb dilindən

Ey Hüseyn, qardaş, mənə rəhm eylə, giryan olmuşam,
Al səlamım, gör, necə zarü hərasan olmuşam.

Altı qardaşım ölüb, qardaş, ürəkdən dağlıyam,
Dəstgirəm, acizəm, qeydi-tənabə bağlıyam,
Şimri-kafər qoymadı, bari, gözüvi bağlıyam,
Odlanub nari-bəlayə, qəlbi suzan olmuşam.

Təngə düşdüm cövr əlindən, zülm edər hər kəs mənə,
Səndən özgə, ey bəradər, yoxdı dadirəs mənə,
Ağlamaqdan göz yaşım qan oldı, bir ver səs mənə,
Seydvəş çün dəstgiri-ceyşi-üdvan olmuşam.

Xeyməgahun od dutan vəqtə, Hüseyncan, yanmışam,
Abidi-bimarun ilən bir oda odlanmışam,
Halimə et bir nəzər, zəncir ilə bağlanmışam,
Başun üstə baş açub, dur gör, nəvaxan olmuşam.

Ərşə çıxdı ağlamağlıqdan fəğanım, ya Hüseyn,
Bəs neçün dillənmisən,* arami-canım, ya Hüseyn,
Səndən özgə bir kəsə gəlməz gümanım, ya Hüseyn,
Qətligahunda sənə gözyaşlı mehman olmuşam.

Kufəvü Şamə rəvan oldı qətarım bağlanub,
Xişü əqvamım ölüb, zülm ilə sinəm dağlanub,
Sən özün agahsən, babi-Peyəmbər bağlanub,
Qürbət eldə bir kəsim yox, xanəviran olmuşam.

---

* Dillənmirsən

Az qalub qəmdən həlak olsun, Hüseyn, canım mənim,
Döndərüb al qanə əşkin çeşmi-giryanım mənim,
Şimri-laməzhəb olub imdi necə yanım mənim,
Baş açub, zülfüm yolub, sinə giriban olmuşam.

Vadiyi-eymәndә qüslün olsa qan, sәnlәn varam,
Kufәyә tәnsiz başun olsa rәvan, sәnlәn varam,
Görmәgә gül lәblәrindә xeyzәran, sәnlәn varam,
Çün әzәl sәnlәn şәriki-әhdü peyman olmuşam.

Əfv elә, gәr gәlmәsәm mәtbәxdә Zәhra didinә,
Sәndәn ayrıllam gedәndә deyrә İsa didinә,
Sәn dә gәl viranәdә biz Ali-Taha didinә,
Gör, necә başsız qalan әtfalә dәrban olmuşam.

Xeyli müşkildür, Hüseyn, bәzmi-Yәzidә gәlmәgim,
Ardür İslamә bәzmi-ammdә xar olmağım,
Mümkin olsa bu mәzarun üstә bir dә gәlmәgim,
Ərz qıllam, gör, necә mәhzuni-dövran olmuşam.

Dildә bu bәhri-bәla daşdı genә dәrya kimi,
Ağlaram әldә qәlәm, dürdaneyi-Zәhra kimi,
Göz yaşım cari olubdur Zeynәbi-Kübra kimi,
Nadimi-mәhzunü xarәm, zarü giryan olmuşam.

## Cənab Zeynəb dilindən

Gözlərim sənsiz tökər rüxsarimə qan-yaş, Hüseyn,
Mən necə Şamə gedim baş açux, qardaş, Hüseyn?

Mə`cərin möhtaciyəm, bais budur talanmışam,
Xeyməgahun odlananda mən baxub odlanmışam,
Qalmayub tabü təvanım, nari-hicrə yanmışam,
Kufəyə ə`da qolum bağlı çəkür birbaş, Hüseyn.

Hər bəla çəksəm sənün eşqündə rahətdür mənə,
Pa-piyadə Kufəyə getsəm, səadətdür mənə,
Kərbəla övzaini görmək qiyamətdür mənə,
Sinsidir* Ali-Əbanı qan tökən fərraş, Hüseyn.

Rəhm edən yox sənsiz, ey qardaş, bu Ali-Heydərə,
Qalmayub bir qəmküsar bu itrəti-Peyğəmbərə,
Danələndi birbəbir əhlün, dağıldı çöllərə,
Xakə yeksan oldılar çün daneyi-xaşxaş, Hüseyn.

Dəstgirəm, bağlıyam zəncirə, xarəm, neyləyim,
Altı qardaşım ölüb, biqəmküsarəm, neyləyim,
Seydtək seyd olmuşam, Şimrə düçarəm, neyləyim,
Başimə saldı mənim cövri-zəmanə daş, Hüseyn.

Çox çətindür, bacun ölsün, mən görüm bisər səni,
Xaki-xun üstə susuz üryan salub ləşkər səni,
Sayəbürd eylüm, başımda yoxdı bir mə`cər, səni,
Başuva göz yaşımı, qoy eyləyim, şabaş, Hüseyn.

---
* İncidir

Əsli mə`nadə yəqin arami-canımsan mənim,
İmtəhanə çəksələr, sən imtəhanımsan mənim,
Bu yaralı can ilən sirri-nihanımsan mənim,
Eyləyim qoy imdi mən sirri-nihanı faş, Hüseyn.

Sənlə mən əhd etmişəm hər möhnətə səbr eyləyim,
Vəslimiz cövr ilə dönsə firqətə, səbr eyləyim,
Gər başun getsə tənuri-xəlvətə, səbr eyləyim,
Başun olsa deyrdə deyraniyə yoldaş, Hüseyn.

Ali-Tahayə, Hüseyn, düşmənlər oldı pasiban,
Başaçıx başun dalınca Şamətək oldux rəvan,
Mən necə səbr eyləyim, görsəm ləbündə xeyzəran,
Bacun ölsün, mən əzəl gündən öleydim kaş, Hüseyn.

Yox dəxi bir dadxahım, zarü biyar olmuşam,
Möhnətü qəmdən cəhanda çeşmi-xunbar olmuşam,
Nadimi-biçarəyəm, göz yaşıtək xar olmuşam,
Gözlərim daim tökər rüxsarimə qan-yaş, Hüseyn.

**Kərbəlayə azim oldı Şamdən qətari-Zeynəb**

Kərbəlayə azim oldı Şamdən qətari-Zeynəb,
Getdi tazədən əlindən səbrü ixtiyari-Zeynəb.

Naqə üstə eyləyərdi sübhü şami təyyi-rahil,
Arizuyi-bişümarə oldı Əhli-Beytə hasil,
Katibi-qəza yazubdur səhl ola vüsali-müşkil,
Tazədən ola münəvvər tirə ruzigari-Zeynəb.

Karivani-qəm yetişdi bir zəman səri-dürahə,
Söyləyüb Bəşiri-Həzləm Əhli-Beyti-bipənahə,
Zeynəbə deyün, çəkim mən bu qətarı hansı rahə?
Söylədi, gərək keçilsün Kərbəlayə sarı, Zeynəb.

Çəkdi çün Bəşiri-məhzun Kərbəlayə qəm qətarın,
Neytək Əhli-Beyti-nalan arturubdı ahü zarın,
Ah, o vəqt tapdı Zeynəb qardaşı Hüseyn məzarın,
Topraq üstə sərdi zülfün, görcək ol məzarı Zeynəb.

Söylədi, Hüseyn, bəradər, toz basub neçün məzarun?
Şami-şumdən gəlüblər bəxti qarə bacularun,
Söylə bir, görüm, Hüseyncan, yaxşıdırmı yaralarun?
Səndən ayrılan zəmandan qaldı intizar Zeynəb.

Səndən ayrılan zəmanı, sinə dağlayammadım mən,
Baş açub cənazən üstə, qardaş, ağlayammadım mən,
Gözlərüvi can verəndə, barı, bağlayammadım mən,
Ağlar hər zəman bu qəmdə qəlbi tarümar Zeynəb.

Şikvə qıllam hər zəman mən Şimr ilə Sinan əlindən,
Qanə döndi əşki-didəm möhnəti-nihan əlindən,
Gahi şikvə eylərəm birəhm sariban əlindən,
Sənsiz, ey Hüseyn, bəradər, gəzdi hər diyari Zeynəb.

Gah kəsik başun cidadə gördüm, ağlamaqdan öldüm,
Nə`şün üstə növhə eylüb şur ilə sərimi yoldum,
Gəh başun dalınca, qardaş, məclisi-Yəzidə gəldim,
Hər bəlayə dözdi sənlən çeşmi əşkibari-Zeynəb.

*Əfrad*

Kəsəndə Şimr başun ağlayammadım, qardaş,
Verəndə can, gözüvi bağlayammadım, qardaş.

Yəqin eylə ki, sənsiz dəxi yüzüm gülməz,
Qəribü xuncigərəm, kimsə halımı bilməz.

Səkinəni xəbər alsan, məni salub dərdə,
Ölübdi ac-susuz, can verüb qurı yerdə.

Qərib idi, yanına nə gəlüb-gedən oldı,
Nə bir xişü nə qəbilə, nə dəfn edən oldı.

*Təmamiyi-növhə*

Gər Səkinəni soruşsan, bax, Hüseyn, bu rəngi-zərdə,
Qoymayubdı can, görürsən, mən qəribü dərbədərdə,
Qolda ip, boyunda zəncir, can verüb xərabələrdə,
Cövr ilə dönüb xəzanə Şamdə bəhari-Zeynəb.

Ağla Zeynəbün dilincə, söylə bəxti qarə Nadim,
Ağlamaq səni yetirsün bəlkə vəsli-yarə, Nadim,
Yaz bu beyti sən mükərrər zikr elə dübarə, Nadim,
Kərbəlayə azim oldı Şamdən qətari-Zeynəb.

## Kərbəlayə azim oldı Şamdən qətari-Zeynəb

Kərbəlayə azim oldı Şamdən qətari-Zeynəb,*
Çün gedüb dübarə əldən səbrü ixtiyari-Zeynəb.

Ali-Müstəfa çəkübləŞamdə zibəs şəmatət,
Müjdeyi-vüsali-canan aldı banuvani-möhnət,
Şamdə Səkinə qəbrün bir də eylədi ziyarət,
Azimi-Əraq olubdur qəlbi tarümar Zeynəb.

Vəsl üçün çün Ali-Taha eyləyərdi təyyi-mənzil,
Sübhi-ərbəin olubdur arizuyi-mətləb hasil,
Türbəti-Hüseynə yetcək gəldi niskil üstə niskil,
Gəldi ney kimin nəvayə çeşmi-əşkibari-Zeynəb.

Qəbri-Şahi-dinə Zeynəb çün döşəndi misli-sayə,
Tökdi göz yaşın üzarə, gəldi ney kimin nəvayə,
Söylədi, Hüseyn, bəradər, lə`nət olsun əşqiyayə,
Sənsiz oldı bu cəhanda tirə ruzigari-Zeynəb.

Mən gedəndə Şamə, gördüm yerdə parə-parə cismün,
Etmədim doyunca nalə, almadım kənarə cismün,
Mümkin olmadı qoyaydım qüsl edüb məzarə cismün,
Çünki qalmamışdı əldə, qardaş, ixtiyari-Zeynəb.

Zeynəbün neçün bəs ölməz, toz basub, Hüseyn, məzarun,
Bəs nə növ`idür, Hüseyncan, söylə, bari, yaralarun,

---

* Beyt təkrardır.

Xüşk edər yaralaruvi göz yaşilə bacılarun,
Mən deyəndə va Hüseyna sən də söylə, bari, Zeynəb.

Dözdi bəxti qarə Zeynəb hər bəlayə bu səfərdə,
Tab qoymayub Səkinə, bu qəribi-dərbədərdə,
Qolda ip, boyunda zəncir, verdi can xərabələrdə,
Saldı asimanə suziş ahi-pürşərari-Zeynəb.

Qəbri-Əkbər üstə Leyla yoldı zülfün, etdi şivən,
Dəstgir edüb anavı çəkdi Şami-şumə düşmən,
Şamdə, xərabələrdə nalə eyləyən zəman mən,
Eyləyüb mən ilə şivən, oldı qəmküsari-Zeynəb.

Şühəda məzarı üstə Qasimə dutubla matəm,
Oldı Əsğərün qəmində Əhli-Beytün halı bərhəm,
Oldı cümlə Ali-Taha azimi-kənari-Əlqəm,
Oldı zairi-Əbülfəzl, çeşmi əşkibari-Zeynəb.

Yetdilər məzari-Əbbas üstə Əhli-Beyti-məğmum,
Anası yerinə başun qəbr üstə açdı Külsum,
Gördülər şəhid olubdur, qolsuz eyləyüblə məzlum,
Göz yaşın töküb üzarə, əbr çün bəhari-Zeynəb.

Göz yaşım olar üzarə cari böylə xar əlindən,
Eylərəm fəğanü nalə qövmi-xunfikar əlindən,
Nadimün doyubdı canə ömrü ruzigar əlindən,
Qəlbimi gətürdi dərdə çeşmi-əşkibari-Zeynəb.

## Yet imdadə, qardaş, ya Hüseyn

Xeymələr odlandı, yet imdadə, qardaş, ya Hüseyn,
Bir nəfər yoxdur gələ fəryadə, qardaş, ya Hüseyn.

Aç gözün, ətfaluvi, gör, cümlə sərgərdan qalub,
Bacun ölsün, gör kənari-xeyməni üdvan alub,
Övnü Cə`fər doğranublar, bəs Ələmdarun nolub?
Dadrəs yox Zeynəbi-naşadə, qardaş, ya Hüseyn.

Sə`din oğlu etdigi cövrü cəfadən doymadı,
Başuvı Şimri-dəğa kəsdi qəfadən, doymadı,
Qasimi eylüb müzəyyən qan hənadən doymadı,
Nə`şüvi üryan qoyub səhradə, qardaş, ya Hüseyn.

Xeyməmi yandırdılar, əldən əsasım aldılar,
Sən özün agahsən, yeksər libasım aldılar,
Xeymələr yandı, uşaxlar nar içində qaldılar,
Sər verəndən sora sən cəlladə, qardaş, ya Hüseyn.

Batdı qanə, Əkbərü Əbbasü Qasim qalmadı,
Xeymələr yandı təmamən, bir əsasım qalmadı,
Soydular ə`da, bəradər, can libasım qalmadı,
Xarü məhzun olmuşam dünyadə, qardaş, ya Hüseyn.

Hərmələ peykan ilə su verdi ətşan Əsğərə,
Laməhalə, imdi rəhm etməzlə Ali-Heydərə,

Yüz qoyub ahusifət Ali-Peyəmbər çöllərə,
Ahutək seyd olmuşam səyyadə, qardaş, ya Hüseyn.

Nami-qəm çün səbt olub ruzi-əzəldən adimə,
Qan olur könlüm keçən günlər düşəndə yadimə,
Abidün qaldı yanan çadırda, yet fəryadimə,
Zeynəbi bir kəs salan yox yadə, qardaş, ya Hüseyn.

Dəstgir oldum, qolum bağlandı, sərdarım, həray,
Tacdarım, qəmküsarım, qəm günü yarım, həray,
Ya Hüseyn, yox səndən özgə bircə qəmxarım, həray,
Şamə oldum getməgə amadə, qardaş, ya Hüseyn.

Nadimi-biçarə bu qəmdə cigər dağlar müdam,
Ruzü şəb hər vəqfdə, qardaş, əza saxlar müdam,
Kim edər zikri-müsibət, şur ilə ağlar müdam,
Şəbi-vəhşətdə onı sal yadə, qardaş, ya Hüseyn.

**Həzrət Zeynəb dilindən**

Səbr eylə, bu qədər ağlama, qızım, var güman səbah Əkbərim gələ,
Didüvə sənün bu xərabəyə, var ümid mələkmənzərim gələ.

Ağlama bu qəd,* tökmə göz yaşun, eyləmə fəğan, mehriban bala,
Tapşurub səni Zeynəbə baban, pasibanunam hər zəman bala,
Eylədün zibəs naləvü fəğan, göz yaşun sənün oldı qan, bala,
Qoy, harayimə səsləyim, qızım, bu xərabəyə Heydərim gələ.

* Qədər

Tökmə göz yaşun rəngi-zərdüvə, qəmli haluva Zeynəbün fəda,
Kəhrəbasifət gül yüzün solub, gül cəmaluva Zeynəbün fəda,
Ağlamaq səni nitqdən salub, qəm məlaluva Zeynəbün fəda,
Sənlə eylərəm ahü nalə mən, cuşə bəhrtək qəmlərim gələ.

Səbr elə, bala, məndə çarə yox, badi-zülm əsüb, güllərim solub,
Yəsribə əlim çatmaz, ey qızım, xanimanımız çox uzaq qalub,
Mən də qarəpuş olmuşam, görürsən, budı səbəb qardaşım ölüb,
Zində bir nəfər xişü əqrəba, qalmayub hanı yavərim gələ.

Mən də sən kimin sinədağlıyam, gah müsibəti-Əkbər ağladur,
Qanlı qundağı yadıma düşür, tifli-bizəban Əsğər ağladur,
Gah vırur bizə tə`neyi-zəban, Şamdə bu düşmənlər ağladur,
Bu gecə güman var iyadətə, bu xərabəyə yavərim gələ.

Dərdü möhnətün gər olub məzid, ağlama bu qəd əldə çarə yox,
Dadə səsləyim dadrəs kimi, dadrəs məni-biqərarə yox,
Bu xərabəyə var kimim gələ, dadxah bu biixtiyarə yox,
Mürği-könlümə balü pər verən, qanə qərq olan şəhpərim gələ.

Ey qızım, sənün qan olan dilün, eyləyür əgər Əkbər arizu,
Hasil olmaz heç vəsli Əkbərün, eylər Əhli-Beyt yeksər arizu,
Qardaşım Hüseyn intizarıyam, mən də eylərəm illər arizu,
Mən də, qoy, edəm sənlə şurü şeyn, ol Hüseyni-gülpeykərim gələ.

Ya Hüseyn, düşüb Nadimin genə, tozlı qəbrivün iştiyaqinə,
Mürği-növbəhar arizu edər, bir də əl qoya gül budağinə,
Asi zakirəm, xəlq nə`şimi nəql edən zəman qəbr əyağinə,
İstiğasə et, mərhəmət üçün, dadə Şafiyi-məhşərim gələ.

**Xanım Zeynəbün dilindən**

Hüseyn, qardaş, məni Şamə çəkir üdvan, gedim, getmim?
Qolum bağlı, cigər dağlı, Şahi-dövran, gedim, getmim?

Gözüm yaşı dönüb qanə, düzülüb şişə mərcantək,
Könül bəhri-bəla olmuş, dönüb al qanə ümmantək,
Yazubdur cismüvi şəmşir, nə xətdür sətri-Qur`antək,
Buyur, əmrin nədür axır, məni-nalan gedim, getmim?

Sənün bu cismi-məcruhün təmamən nizəvü oxdur,
Əgər sənsiz gedim Şamə, bilürsən məndə can yoxdur,
Ölübdür Əkbərü Əbbas, bizə bir pasiban yoxdur,
Mənə səndən sora viran olub zindan, gedim, getmim?

Sən öldün, xeymələr yandı, soyuldum, xarü zar oldum,
Talandı xeymələr hamı, əsiri-ruzigar oldum,
Əzəl xatun idim, qardaş, sən öldün, imdi xar oldum,
Olub sənsiz gözüm giryan, işim əfğan, gedim, getmim?

Dutub bihədd bəla indi, müsibət həddini ötdi,
Cəfa üstdən cəfa gəlmiş, firavan günlərim bitdi,
Hərasan ahutək xırda uşaxlar çöllərə qaçdı,
Qoyub başsız yaralı cismüvi üryan, gedim, getmim?

Özün agahsən, nə ərz edim, zülm ilə talandım,
Yanan çadırda Səccadın qalanda mən də odlandım,
Sözüm düzdür deyim, qardaş, oda-oddan keçüb yandım,
Olubdur indi bir naqə mənə mehman, gedim, getmim?

İşıqlı gündüzüm Əbbas öləndən şam oldı,
O vaxtı ki, Əkbərin şəhla gözü al qan ilən doldı,
Əlavə sənsiz aləmdə mənə şadlıq həram oldı,
Başun ardınca bir baş Kufəyə əl`an gedim, getmim?

Səkinə dərdini çəkmək demə aləmdə asandur,
Deyim, dur ki, bu can o can ilə, vallahi, bir candur,
Mənim başımda mə`cər yox, sənün də nə`şün üryandur,
Kəfəndür xaki-səhra, qüslün oldı qan, gedim, getmim?

Sənün tacü başun növki-cidalərdə edər me`rac,
Yaralı peykərün yerdə xədəngü nizəyə amac,
Mənim də qollarım bağlı, başım bir mə`cərə möhtac,
Şəmatət eylər ol zadeyi-Mərcan, gedim, getmim?

Xəyal etmə ola hərgiz, Hüseyn, səndən cüda Zeynəb,
Gəlürsən Kufəyə, getsün sənünlə binəva Zeynəb,
Dodağundan dəgəndə çub, söylər, va əxa, Zeynəb,
Səri-mətbəxsəradə etdigi əfğan, gedim, getmim?

Əsirü dəstgirəm mən, görürsən, qövmi-ə`dayə,
Kəsik başun sənün mehman gedər deyrü kəlisayə,
Mənim də qanlı göz yaşım əlimdə vardı sərmayə,
Olar Şam içrə cüm`ə məscidi viran, gedim, getmim?

Bu möhnət qeyri möhnətdür, çətindür əhli-İslamə,
Hüseynün bacısı Zeynəb qolı bağlı gedir Şamə,
Əli övladı bimə`cər çəkilsün məclisi-amə,
Təmaşayə durar ali-Əbu Süfyan, gedim, getmim?

Bu il şövt etmədim, ya Rəb, Nəcəfdə Mürtəza qəbrin,
Könül bitabdür, istər qəribi-Kərbəla qəbrin,
Dübarə ruzi et, ya Rəb, öpüm bir də şəfa qəbrin,
Əlim boş, Nadimi-məhzun, könül viran, gedim, getmim?

**Bacuvı Şamə, Hüseyn, Simri-sitəmkar aparur**

Bacuvı Şamə, Hüseyn, Simri-sitəmkar aparur,
Şamə gözyaşlı, dili-xun, necə naçar aparur.

Çün əsüb badi-sitəm, gülşəndə soldı gülim,
Gözümün yaşı dönüb qanə, gedüb əldən elim,
Yox güman, qardaş, Hüseyn, bir də bu Minayə gəlim,
Qolı bağlı, başaçux ləşkəri-xunxar aparur.

Səni öldürdülə, qardaş, cigərim dağladılar,
Bacın ölsün, bacıvun qollarını bağladılar,
Başaçux, mə`cərə möhtac, özümüz naqəsəvar,
Necə, gör, ahusifət zarü giriftar aparur.

Sənə agahdı, qardaş, od alub xeymələrün,
Dağılub çöllərə bu itrəti-xundidələrün,
Soydular rəxtimizi, yoxsa yoxundur xəbərün,
Dur ayağə, necə gör, didəsi xunbar aparur.

Qalmayub, qardaş, Hüseyn, bircə həvadar bizə,
Sən olardun bilüsən, qəm günü qəmxar bizə,
Gözün aç, Şaha, sərün oldu cüda, vay bizə,
Bizə düşmənlər olub imdi nigahdar, aparur.

Pişvaz eylə qabağımda Əli Əkbərimi,
Qoş nigahban bizə ol Qasimi-məhpeykərimi,
Göndər imdadə sən Əbbasi-vəfapərvərimi,
Bizi düşməndən edə hifz ki, azar aparur.

Nə ələm var, nə Ələmdar, Ələmdarım ölüb,
Nə oğul var, nə bəradər, hamı ənsarım ölüb,
Necə mən ağlamayım, sən kimi qəmxarım ölüb,
Mən ki, xatun idim, indi necə, gör, xar aparur.

Kufəvü Şamə, bəradər, axı sənsiz gedirəm,
Qoyuban gül bədənün yerdə kəfənsiz, gedirəm,
Gedəcək mənlə başun Şamə bədənsiz, gedirəm,
Sənün eşqün məni hər məclisə naçar aparur.

Bu biyabanda qalub bir neçə qurban sən ilən,
Qasimü Əkbərü Əbbas verüb can sən ilən,
Şühədalar yatacaq, Şahi-şəhidan, sən ilən,
Qalgilən burda, bizi Abidi-bimar aparur.

Tapşur bacıva bu itrəti, qalma nigaran,
Bu Səkinə bala viranədə gər etsə fəğan,
Versə can, gözlərini bağlayaram naləkünan,
Məni yanınca balan Şamə əzadar aparur.

Gözümün yaşını mən sərf edərəm zər yerinə,
Bu mürəkkəb, bu qələm sərf olu gövhər yerinə,
Tifli-xunxarnişin qəlbimə xəncər yerinə,
Nadimi-qəmzədənin didəsi xunxar aparur.

**Rəhm et mənə, əmandur, ey mehriban bəradər**

Rəhm et mənə, əmandur, ey mehriban bəradər,
Əzm etmə rəzmgahə, səbr et, dayan, bəradər.

Axır, Hüseyn, görürsən yoxdur əyal, qəbiləm,
Çeşmim tökər üzarə göz yaşı, çün zəliləm,
Gəl üzmə damənindən əl, payüvə dəxiləm,
Oldı üzarə əşki-çeşmim rəvan, bəradər.

Göz yaşını edəllər rüxsarə cari sənsiz,
Ağlar bacun sən ölsən leylü nəhari sənsiz,
Şamə olar rəvanə Zeynəb qətari sənsiz,
Bağlar qolumı sənsiz Şimrü Sinan, bəradər.

Getsən, səni ədulər eyləllə parə-parə,
Söylə, nə çarə etsün, qardaş, bu bəxti qarə,
Ədu yaralı nə`şün qoymaz alım kənarə,
Həşrə qalar əyalun biaşiyan, bəradər.

Olma riza bu Zeynəb gözyaşlı dəsti bəstə,
Olsun əsiri-düşmən, bu zarü dilşikəstə,
Kəsik başun tənurə ədu qoyar kül üstə,
Gözyaşlı Ali-Taha etsün fəğan, bəradər.

Olma riza, əmandur, Zeynəb bacun talansun,
Bu xeymələr şərirə keçsün, sitəmlə yansun,
Axsun sirişki-didəm, ahım göyə dayansun,
Rəhm eylə Əhli-Beyti-zarə, əman, bəradər.

Yox bircə qəmküsarım, Əbbas ölübdi, qardaş,
Badi-sitəm əsibdür, gülşən solubdı, qardaş,
Ali-Əba təmamən giryan olubdı, qardaş,
Sən ölməmiş olubdur karım fəğan, bəradər.

*Əfrad*

Əmandur, salma özündən, Hüseyn, kənarə məni,
Çəkər ədu başaçux sənsiz hər diyarə məni.

Nə bircə dadrəsim var, Hüseyn, ölüb Əbbas,
Gəlüblə naləyə Ali-Əli, dutublar yas.

Ölüncə naləkünan ağlaram ürəg dağlı,
Nə növ`i Şamə gedim başaçux, qolı bağlı.

Əgər sən ölsən, Hüseyn, xanimanmız odlanacaq,
Qolum tənab ilə, gəh zəncir ilə bağlanacaq.

Şəhid edüblər ədu cümlə yarü yavərimi,
İtirmişəm, görürsən, Qasim ilə Əkbərimi.

Tərəhhüm et mənə, ey yarü yavərim, qardaş,
Müsibət həddin ötüb, gözlərim tökər qan-yaş.

*Baqiyi-növhə*

Yox bir kəsim, həmişə gəlləm fəğanə sənsiz,
Getsən, əsir olaram Şimrü Sinanə sənsiz,
Zeynəb kimi kim ağlar mən natəvanə sənsiz,
Sənsiz olar həmişə virdm fəğan, bəradər.

Zeynəb nə növ`i çəksün axır Səkinə nazın,
Sənsiz çəkəmməz* heç kəs, mahi-Mədinə nazın,
Getsən edəllə, qardaş, qan ilə dəstəmazın,
Ali-Əba qalallar biaşiyan, bəradər.

Yox bir kəsim o vəqtə, qardaş, hərayə gəlsün,
Sən ölməmiş dutum yas, biçarə Zeynəb ölsün,
Olma riza sər açub Zeynəb başını yolsun,
Qalmubdı məndə, vallah, tabü təvan, bəradər.

Bəsdi mənə bu möhnət Əkbər batubdı qanə,
Leyla geyübdi qarə, ağlar o növcəvanə,
Qoyma məni dübarə gözyaşlı yanə-yanə,
Rə`na qədi edəllə sənsiz kəman, bəradər.

Getsən, Hüseyn, bəradər, dözməm, dalınca gəlləm,
Sən can verəndə mən də şur ilə zülfi yollam,
Sədparə nə`şün üstə zülfümi sayə sallam,
Olmaz o vəqti məndə çün sariban, bəradər.

Qəmdən doyubdı canə bu bəxti qarə Nadim,
Dərdə, qəmə tapılmaz dünyadə çarə, Nadim,
Şeşguşə qəbrün alsa bir də kənarə Nadim,
Zeynəb dilincə söylər, ey mehriban bəradər.

---

* Çəkə bilməz

**Həzrət Zeynəb və İmam Hüseyn (ə) dilindən**

Söylə, Hüseyn, qardaş, görək, sənsiz kimim vardur mənim?
Yıxdı evimi bu fələk, sənsiz kimim vardur mənim.

Mən binti-Zəhra, əmmeyi-Əkbər deyəllə adimə,
Sənsiz yuxı gəlməz, Hüseyn, bu dideyi-naşadimə,
Sən də əgər getsən əlimdən, kim yetər imdadimə,
Əhvalimə əncam çək, sənsiz kimim vardur mənim.

Gəlmə fəğanə, səbr elə, ey bikəsü müztər, bacı,
Axır mübariz istəyür bu zalimü kafər, bacı,
Ənsar yox, əsbab yox, yox Qasimü Əkbər, bacı,
Səbr et qəzayə Zeynəbim, biçarə xahər, ağlama.

Sənsiz, Hüseyn, qardaş, buyur, mən bəxti qarə neyləyim,
Gül cismüvi ədulər etsə parə-parə, neyləyim,
Od vırsa ədu, xeymələr çəksə şərarə, neyləyim,
Qardaş, bizi bir yanə çək, sənsiz kimim vardur mənim.

Ruzi olubdur göz yaşım hər vəqt əfğan eylərəm,
Qardaş deyüb, əfğan edüb, bu mülki al qan eylərəm,
Sənsiz fəna dünyadə mən cahü cəlalı neylərəm,
Yıxdı evimi bu fələk, sənsiz kimim vardur mənim.

Kərbübəlanın toprağı məmlüvv olar al qanimə,
Qanlı yüzüm öz canımı bəzl eylərəm Cananimə,
Gər xeyzəran vırsa, Yəzidi-bihəya dəndanimə,
Səbr et qəzayə, Zeynəbi-biçarə, xahər ağlama.

Gər naümidəm candan, səndən fəqət can istərəm,
Mən Nadiməm, şeşguşə qəbrin vəslin hər an istərəm,
Səndən rəzalət dərdinə gözyaşlı dərman istərəm,
Yıxdı evimi bu fələk, sənsiz kimim vardur mənim.

### İmam Həsən (ə) növhəsi

Ləblərində bu nə qandur belə, qurbanun olum,
Haluvı eylə bəyan, gəl dilə, qurbanun olum.
Can belə qurbanun olum.

Bu nə möhnətdi ki, mən özgə bir halət görürəm,
Ləbi-gül bir gün edüb qan ilə ülfət görürəm,
Qətlüvə yoxsa ədu tapdıla fürsət, görürəm,
Ağlayub eyləsün əfğan belə, qurbanun olum.
Can belə qurbanun olum.

Yoxsa kim, zəhr verüblər, cigərün parələnüb,
Zeynəbi-qəmzədənün başına küllər ələnüb,
Bu nə halətdi ki, qardaş, dodağun parələnüb,
Düşüsən* quş kimin əldən-ələ, qurbanun olum.
Can belə qurbanun olum.

Evimi kim yıxub, axır səni bu halə salub,
Əxi, zəhrün əsəri taqətüvi əldən alub,
Ləblərün parələnüb, qan tökülüb, təşt dolub,
Sənə kim zəhr veribdür, sölə, qurbanun olum.
Can belə qurbanun olum.

---

* Düşürsən

Çün yəqin oldı qəra üstə qəra bağlamağım,
“Va Həsən” söyləyübən illər ilən ağlamağım,
Baş açub, zülf yolub, bir də cigər dağlamağım,
Gözümün yaşı dönübdür selə, qurbanun olum.
Can belə qurbanun olum.

Rəngüvi halbəhal eylüri* zəhrün əsəri,
Səfheyi-ruyimə çeşmim tökər əşki-bəsəri,
Qoydı başsız, de görüm, hansı ləin şiələri?
Əl tapub xar çəməndə gülə, qurbanun olum.
Can belə qurbanun olum.

Hansı zalim elədi Nadimi-dilparə məni,
Eylədi həsrəti-qardaş, qoyub avarə məni,
Şərəri-firqət, əxa, yandıracaq narə məni,
Əzmi-rizvan eləmə, səbr elə, qurbanun olum.
Can belə qurbanun olum.

**Həzrət Zeynəb dilindən Hindəyə xitabən**

Mənə etcək nəzər, etdün neçün ahü fəğan, Hində,
Mənəm axtardığun Zeynəb, olub qəddim kəman, Hində.

Verəndə Kufədə can, Heydərün mən bağladım çeşmin,
Tökərdi Müctəbanun nə`şün üstə gözlərim əşkin,
Hüseynimlə həmişə mən verərdim qəlbimə təskin,
Onı da aldılar əldən bu ceyşi-kufəyan, Hində.

---

* Eyləyir

Yəqin etsən kiməm mən, bil, mənəm bixaniman Zeynəb,
Hüseynün nə`şün üstündə edən ahü fəğan Zeynəb,
Əzəl xatun idim, imdi əsirəm, biməkan Zeynəb,
Ölübdür yeddi qardaşım, olub qəddim kəman, Hində.

Hüseynim təşnə can verdi, əlimdən izzətim getdi,
Talandı xeymələr yandı, əsasım, şövkətim getdi,
Əbülfəzlim zəbun oldı, əlimdən qüdrətim getdi,
Əsiri-ruzigar eylüb məni cövri-zəman, Hində.

Əli Əkbər ölüb ətşan, qoyub Leylanı sərgərdan,
Xizab eylübdi qan cismin, anası eyləyür əfğan,
Minayi-Kərbəladə zibh olub yetmiş iki qurban,
Qoluma vırdılar zəncir mənim Şimrü Sinan, Hində.

Bu qədri bil ki, aləmdə əzizlik günlərim getdi,
Əzəl xatun idim, imdi əsir oldum, zərim getdi,
Boyandı qaninə, Övn ilə Fəzlü Cə`fərim getdi,
Xərabə guşəsində oldum imdi növhəxan, Hində.

*Əfrad*

Əziz idim, vəli imdi əsirü xar oldum,
Hüseynim öldi, qəmü möhnətə düçar oldum.

Minayi-Kərbübəla içrə güllərim soldı,
Cənab Qasimimün toy təbağı qan oldı.

Əliyyü Əkbəri-nakamı öldürüb düşmən,
Zəmanədə başım olmaz bəladən heç eymən.

Minayi-Kərbübəla içrə badi-zülm əsdi,
Hüseynimün başını Şimr təşnələb kəsdi.

Susuz, su üstə şəhid oldı həzrəti-Əbbas,
Xərabələrdə dutub Əhli-Beyt o sərvərə yas.

*Təmamiyi-növhə*

Sual etsən, Əbülfəzlin qolı təndən zəbun oldı,
Su üstündə batub qanə, ələmtək sərnigun oldı,
Hüseyn qardaşımun qüsli Mina dəştində xun oldı,
Kəsüblər əllərin axır sitəmlə sariban, Hində.

Xiyamım odlanub yandı cəfayi-kufəyan ilə,
Əliyyü Əkbərün dəstin xizab eylüblə qan ilə,
Batub öz qanına Əsğər balam tiri-kəman ilə,
Qalublar itrəti-əthar bu gün biaşiyan, Hində.

Məni-biyavərə ağlar həmişə növhəxan Nadim,
Geyər qarə mühərrəmdə, edər ahü fəğan Nadim,
Görəndə Hindəni Zeynəb olub göz yaşı qan, Nadim,
Dedi, bil ki, mənəm Zeynəb, olub qəddim kəman, Hində.

**Əldə, ey dil, daməni-Əbbasi möhkəm dutgilən**

Əldə, ey dil, daməni-Əbbasi möhkəm dutgilən,
Ağlayub hər vəqtə ol sərdarə matəm dutgilən.

Aqil ol, göz yaşuvi rüxsaruva eylə səbil,
Et dəmadəm növhəvü əfğanü şivən müttəsil,

Hər il ol mahi-mühərrəmdə bu Əbbasə dəxil,
Ömri-dünyadən bu övzani müqəddəm dutgilən.

Növhə eylüb hər əzayi-qəmfəzadə qıl səda,
Ağlayar çün bu əzadə mərdü zən, şahü gəda,
İstəsən səndən riza olsun Şəhi-Kərbübəla,
Matəmi-Əbbasi sən hər vəqtə ə`zəm dutgilən.

Kərbəladə bu müsibət qıldı nalan Zeynəbi,
Qətli-Əbbas eylədi çaki-giriban Zeynəbi,
Sən də razi et özündən xanəviran Zeynəbi,
Zəxminə ol sərvərin göz yaşı mərhəm dutgilən.

Düşgilən payi-Əbülfəzlə çü sayə icz ilə,
Dərdüvi izhar elə müşkilgüşayə icz ilə,
Mültəci ol sən Şəhi-Kərbübəlayə icz ilə,
Bu Əbülfəzlə əza hər il mühərrəm dutgilən.

Kərbəladə, şiələr, zülm ilə bir sərdar ölüb,
Gülşənə xar əl tapub, gülzardə güllər solub,
Bu müsibətdə təmamən şiələr giryan olub,
Çünki bu kani-vəfadur, qəlbin ə`ləm dutgilən.

Kərbəla bülbülləri suzi-ətəşdən soldular,
Növcəvanlar qan içüb qan ilə sirab oldular,
Xeymələrdə itrəti-Peyğəmbər ətşan qaldular,
Göz yaşında şişə-şişə barişi-qəm dutgilən.

Bu əzayi-qəmfəzadə cari qıl göz yaşuvi,
Ey könül, bu qüssədə ar eyləmə, yol başuvi,

Ağla, tök rüxsaruva hər vəqtdə göz yaşuvi,
Bu ələmdarun əzasın sən dəmadəm dutgilən.

Nadim, ağla, tök üzarə əşki-çeşmün sübhü şam,
Dut əza mahi-mühərrəmdə bu Əbbasə müdam,
Şiələr, şadlux olub Əbbasdən sonra həram,
Nadima, hər ruzü şəb, gəl, şurü matəm dutgilən.

**Əbülfəzlim, oyan, qardaş**

Gözün aç, xabi-naz etmə,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyub getmə,
Məni yalquz qoyan, qardaş.

Sərasər peykərim qandı,
Məgər hicranun asandı?
Görüb qəlbim alovlandı,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Mənə çox bir yəman gündi,
Səni qolsuz görüm imdi,
Belə görcək belim sındı,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Oğul yox dərdimi bilsün,
Kömək yox dadimə gəlsün,
Oğulsuz qardaşun ölsün,

Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Deyim, dutmaz dilim, Əbbas,
Dur, ey arxam, elim, Əbbas,
Sınub sənsiz belim Əbbas,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Başın Zeynəb yolar, qardaş,
Mənə düşmən gülər, qardaş,
Hüseyn sənsiz ölər, qardaş,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Hərəmlər təşnədür hamı,
Səkinə əldə su camı,
Yolun gözləllər itmamı,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Oyan, mahi-Bəni Haşim,
Mənim istəkli qardaşım,
Dönübdür qanə göz yaşım,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Əcəb möhnətlərim atdı,*
Müsibət həddidən ötdi,
Belim sındı, ələm yatdı,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Qapım bağlandı dağlandım,
Şərari-hicr ilə yandım,
Səsimə səs ver, odlandım,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

Gəlibdür Nadim əfğanə,
Müsibətdən doyub canə,
Yazar, ağlar zəlilanə,
Əbülfəzlim, oyan, qardaş.
Məni yalquz qoyan, qardaş.

**Yet özün hərayimə, ya Hüseyn**

Məni saldılar yerə kufəyan,
Yet özün hərayimə, ya Hüseyn.
Ələm oldı sərnigun, əl-əman,
Yet özün hərayimə, ya Hüseyn.

Olu mə`yus, olmasa əl-bədən,
Xəcil oldum imdi Səkinədən,
Yox əlim, vırar bu gəlüb-gedən,
Yet özün hərayimə, ya Hüseyn.

---

* Artdı

Sağımı kəsüb yerə saldılar, sol ilə cidal edərəm hənuz,
Solumı da etdilə napədid, qəmi-dil dəmadəm edər büruz,
De Səkinəyə, su tədarüki eyləmədim, qalacaq susuz,
Zəbun oldı qollarım əl-əman, yet özün hərayimə, ya Hüseyn.

De Səkinədən ki, xəcalətəm, dəxi xeyməgahə gəlmərəm,
Bədənim olub qanə qutəvər, qan içində qan ilə əhmərəm,
Su gətürməgə hanı əllərim, ləb hanı, bəyanə gəlmərəm,
Qan ilə ləbaləb olub dəhan, yet özün hərayimə, ya Hüseyn.

Bilürəm, əxa, qırulub elün,
Bu səda ilən sınacaq belün,
Ölürəm, yetir əlimə əlün,
Yet özün hərayimə, ya Hüseyn.

Gəlü* cuşə möhnətü qəmlərim,
Boyanubdı qan ilə peykərim,
Kəsilüb, əxa, iki əllərim,
Yet özün hərayimə, ya Hüseyn.

Ey əxa, bu ləşkəri-bihəya, kəsüb imdi səbrü qərarımı,
Bu sədayi-qülqülə qoymırı biləsən bu ah ilə zarımı,
Bu ədu mübəddəl edibdülər sitəmü xəzanə bəharımı,
Bədənimdə qalmadı taqətim, yet özün hərayimə, ya Hüseyn.

*Əfrad*

Yetiş hərayimə, ey Şahi-Kərbəla, qardaş,
Gəlüncə sən, tökərəm ruyimə gözümdən yaş.

---

* Gəlir

İşim təmamdı, tez gəl, qucaqlaşaq, bari,
Ölən zəmandə doyunca bir ağlaşaq, bari.

Fələk arayə əcəb çəngi-təfriqə saldı,
Biri-birimizi görmək qiyamətə qaldı.

Özin yetir mənə, ey dərdimin şəriki, əxa,
Öləndə, olma riza, həsrətim gözümdə qala.

*Baqiyi-növhə*

Budur arizum ki, ölən zəman o cəmaluvı görüm, ey əxi,
Eyləyim vəsiyyətimi sənə, qəmü dərdimi deyim, ey əxi,
Necə razisən ki, ölən zəman səni görməmiş ölüm, ey əxi,
Gözüm intizar səni gözlərəm, yet özün hərayimə, ya Hüseyn.

Sölə Zeynəbə onu dəstgir eyləyəndə ləşkəri-kufəyan,
Üsəra qətarını qətlgahdən əşqiya gətürən zəman,
De, cənazəm üstə gəlüb bacım analar kimi eyləsün fəğan,
Gəlüb axır ömrdə et vida, yet özün hərayimə, ya Hüseyn.

Bu əzadə, Nadiməm, ağlaram bu vəfalı sərvərün halinə,
Bataram məlalü müsibətə, olaram şərik məlalinə,
Budur arizum ki, ölən zəman yetişəm xüsus vüsalinə,
Yazaram bu beyti fəğan ilən, yet özün hərayimə, ya Hüseyn.

**Əfrad**

Qardaş, Hüseyn, yıxılmışam atdan, hərayə gəl,
Dad etməgə bu sərvəri-biəqrəbayə, gəl.

Çoxdur cərahətim, yetiş imdadə, ya Hüseyn,
Görməkligə bu bikəsi rəzmi-bəlayə gəl.

Qolsuz salubla toprağə, fəryadimə yetiş,
Qurban verən Xudayə, dayanma, Minayə gəl.

Qurbanuvı qəbul eylədi Xaliqi-əzim,
Qur`an tilavət etməgə bəzmi-əzayə gəl.

Su və`də etmiş idim əgərçi Səkinəyə,
Hasil edəmmədim su mən ol binəvayə, gəl.

Çoxdur yaram, əlimdən alub ixtiyarımı,
Qanım töküblə ərseyi-Kərbübəlayə, gəl.

Zibh etməmiş başımı ədu, gəl hərayimə,
Şahım, əmandı, durma, bu matəmsərayə gəl.

Əbbasə ağla, göz yaşuvı tök üzarüvə,
Nadim, bu qəmdə şur ilə ahü nəvayə gəl.

**Ölürəm, yaralıyam mən**

Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən,
Gəl hərayə, qan içində necə, gör, bəlalıyam mən.

Çəkərəm çox intizarun, edərəm çox arizulər,
Ki, görüm yüzün dübarə, ey əzizi-cani-Heydər,
Məni, gəl, vida edüb sal yola, varisi-Peyəmbər,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

Dolı qan piyaləsitək, dolub imdi qanə didəm,
Ədu halətək arayə məni aldı, mən vəhidəm,
At ilən ayaxladılar bədənimi, xürd-xürdəm,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

Məni öldürüb ədulər, fəxr eləllə bir-birinə,
Birisi alubdı şəmşir, biri xəncər əllərinə,
Yox əlim, nedim, bəradər ki, verəm qılıc dəminə,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

Eylədi kəmin düşmən, iki qollarımı saldı,
Dolı kasətək dəhanım, başımun qanilə doldı,
Yüzümün ətini, qardaş, sürüdilə topraq aldı,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

Sitəm ilə sındırubdur belimi əmudi-düşmən,
Odı səslərəm hərayə səni, ey əzizi-can-mən,
Bu bəla çölündə olmaz, başım heç bəladən eymən,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

Bu çəməndə çün üzüldi əli bülbülün gülindən,
Səni dərk edəmmərəm mən, yaralanmışam belimdən,
Sitəm ilə əhli-kinə əlim üzdülər əlindən,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

Məni öldürüb, tapallar sənə əl bu əhli-kinə,
Bilürəm sənün də qanun tökəcəklə bu zəminə,
Dolanar çöli ölüncə, baba vay, deyər Səkinə,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

Ver icazə, Nadim etsün gözinün yaşını cari,
Bu gələn ili mühərrəm qələm əldə növhəkari,
Deyim ol qərib Hüseynə ki, sənün dalunca bari,
Yet özün hərayə, qardaş, ölürəm, yaralıyam mən.

**Qardaş, Hüseyn, yetiş hərayə**

Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

Yüzüm al qan ilə, qardaş, müzəyyən oldı,
Başım qanı axub gözüm qan ilə doldı,
Qardaş, ə`da əldən tabü təvanım aldı,
Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

Lütf eyləsən əgər məni-naşadə, qardaş,
Seyd olmuşam min qan tökən səyyadə, qardaş,
Can verməmiş özin yetiş imdadə, qardaş,
Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

Oldı xəzan, soldı gülün səhni-çəməndə,
Vırublar bir əmud, əxa, atdan düşəndə,
Alublar tabımı, yoxdur rəməq bədəndə,
Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

Yetiş imdadə, ya əxa, sərdarun öldi,
Boyandı qanına, susuz qəmxarun öldi,

Axub qanım, şəhla gözüm qan ilə doldı,
Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

Gərək pişvaz edəydim, qardaş, sən gələndə,
Bağışla, yox çarəm, durmaz başım bədəndə,
Vırublar bir əmud, atdan yerə düşəndə,
Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

Düşmən kəmin edüb axır saldı qolumı,
Mə`yus edüb əldən, ə`da sağü solumı,
Səkinə su camı əldə gözlər yolumı,
Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

Nadimün müşkilin həll et, müşkilgüşasən,
Lütf ilə mərhəmət eylə, kani-vəfasən,
Qələm əldə, gözi yaşlı zikr eylərəm mən,
Yalquzladı, ləşkər məni aldı arayə,
Yalquz qalan, qardaş, Hüseyn, yetiş hərayə.

**Qəsideyi-Həzrət Əbbas**

Gəlibdür tutiyi-təb`im nitqə, sölər bavəfa Əbbas,
Qəməryüz, şirsurət, səfşikən, bərqi-bəla Əbbas.

Qalanda yekkəvü tənha Hüseyni-təşnə biyavər,
Hüzuri-Şahi-valayə gəlüb Əbbasi-qəmpərvər,
Tököb göz yaşı rüxsarə, dedi, ey varisi-Heydər,
Doyubdur canə, ya Mövla, qəribi-Kərbəla Əbbas.

Yetüşdi, çün hüzuri-Şahi-dinə, eylədi izhar,
Bu gün tə`nü şəmatətdən həyat oldı mənə zinhar,
Mənə ver rüxsəti-də`va bəhəqqi-Heydəri-Kərrar,
Hüseyn, qardaş, saralmış rəngüvə olsun fəda Əbbas.

Bu yanda əl-ətəş söylər təmamən Ali-Peyğəmbər,
Deyər Leyla, alan yox qanuvı nakam Əli Əkbər,
Vıralla təbli-şadlıq bir tərəfdə ləşkəri-kafər,
Olub qəmdən, Hüseyn, qardaş, səhi qəddi düta Əbbas.

Mənə ver rüxsəti-də`va, çıxım bircə Üqab üstə,
Görüm, qardaş, qalırmı bu qoşundan sınmamış dəstə,
Gətirrəm payüvə ibni-Ziyadi mən yüzi üstə,
Əli fərzəndidür, səflərşikən, müşkülgüşa Əbbas.

Çəküb ahi-cigərsuz ol Hüseyni-şahi-məzluman,
Görərsən səfbəsəf durmuş təmamən ləşkəri-üdvan,
Mənim arami-qəlbüimsən, sənə aləm ola qurban,
Çəküblər qətlüvə xəncər güruhi-əşqiya, Əbbas.

Bilürsən yox mənə səndən əlavə yavərü qəmxar,
Mənə sənsən ələmdarü həmi sərdarü həm salar,
Əgər getsən, gözi yaşlı qalalla itrəti-əthar,
Gərək səndən sora olsun işim ahü nəva, Əbbas.

Riza olma qəyur Əbbasuvı, qardaş, bata nami,
Bəradər, görmüsən,* xırda uşaxlar ağlayur hamı,
Deyəllə, əl-ətəş xırda uşaxlar əldə su camı,
Olanmaz xeymədə bundan sora, qardaş, rəha Əbbas.

---

* Görmürsən

Xülasə, verdi rüxsət Şahi-din ol şiri-qürranə,
Qədəm qoydı rikab üstə, Üqabı gətdi cövlanə,
Əlində nizeyi-cansuz, yetişdi səddi-meydanə,
Zəban açdı fəsih nitq ilə ol miri-hüda Əbbas.

Rəcəz eylüb bəyan ol, özini xəlqə nişan verdi,
Əl atdı qəbzeyi- şəmşirə, Heydərtək təkan verdi,
Sinan ilə cəhimin rahın ol, xəlqə nişan verdi,
Dağıtdı fövci-ə`dani çün ol bərqi-bəla Əbbas.

Ələm yatdı, qoşun qaçdı, dağıldı dəstələr sındı,
Minayi-Kərbəla əhmər olub qan rudinə döndi,
Ömər Sə`di-ləin odlandı, nari-qüssədən yandı,
Dedi, ey qövm, tənhadur, qalub biəqrəba Əbbas.

Güruhi-əşqiya, qaçmun, durun, şərmü həya eylün,
Təmamən izdiham ilə dönün, səf-səf, vəfa eylün,
Salun atdan bu sərdarı, qoşun xəlqün rəha eylün,
Gəlüb qəhrə ac əslantək əzizi-Mürtəza Əbbas.

O vəqtə Maridi-bidin edibdür hərzəvü hədyan,
Sizə aya nolub yeksər qaçursuz, boş qalub meydan,
Əli oğlun bu saət eylərəm öz qaninə əlvan,
Əlimdə ta görün məğlub olur gülgunqəba Əbbas.

Olub çün qərqi-fulad, ol sitəmkər yetdi meydanə,
Özin tə`rif edəndən sora gətdi atı cövlanə,
Edüb rast, nizəsin atdı əzizi-Şahi-mərdanə,
Dutub üz ərsəyə şəmşir alub miri-şüca Əbbas.

Çəküb bir nə`reyi-"Əllahu Əkbər" varisi-Heydər,
Əzəl əsbin nişan eylüb piyadə qaldı bədəxtər,
Dübarə Maridin hülqün nişanə etdi ol sərvər,
Cəhimə Maridi etdi rəvan kani-həya Əbbas.

Olubdur Nadimin, Əbbas, həqiri-ruzigar, ağlar,
Sirişkim barişi-neysan, gözüm əbri-bəhar, ağlar,
Qələm əldə yazar zikri-müsibət, biqərar ağlar,
Məni qurtar bu müşkil əmrdən, müşkilgüşa Əbbas.

**İmam Hüseyn (ə) dilindən Həzrət Əbülfəzlə xitabən**

Aç bircə qanlı çeşmün, ey bavəfa Əbülfəzl,
Yaxşı evimi yıxdı əhli-cəfa, Əbülfəzl.

Bülbültək ayrı düşdüm bu səhndə gülimdən,
Bir dadrəs tapılmaz ənsardən, elimdən,
İcma edüb ədulər, aldı səni əlimdən,
Bir qəmküsarım olmaz səndən sora, Əbülfəzl.

Aldı əlimdən ə`da qəbiləmi, elimi,
Təll üstə Ali-Taha gözlər hamı yolumı,
Qardaş müsibətində sındırdılar belimi,
Aç gözlərün doyunca eylüm vida, Əbülfəzl.

Səndən sonra kimim var, Əbbas, hərayə gəlsün,
Dərdimə çarə etsün, dərdi-dilimi bölsün,
Bel bağlamaz cəhanə sənsiz, Hüseynün ölsün,
Verməz Hüseynə möhlət Şimri-dəğa, Əbülfəzl.

Yetdi xəzan bəharə, gül qaldı xar əlində,
Çün seydvəş dutuldun axırda sar əlində,
Bikəs Hüseynün imdi yox ixtiyar əlində,
Bu zəxmi-peykərüvə etsün dəva, Əbülfəzl.

İmdi yəqinim oldı Zeynəb bacım talandı,
Odlandı xeyməgahım, nari-cəfayə yandı,
Qardaş, səsimə səs ver, batdı səsim, əmandı,
Qoydun məni bu çöldə biəqrəba, Əbülfəzl.

Nadim həmişə ağlar bu qəmfəzadə, qardaş,
Yaxşı evim yıxıldı Kərbübəladə, qardaş,
Düşmüş yaralı cismün məcruh aradə, qardaş,
Karım olubdur əfğan səndən sora, Əbülfəzl.

**Əbülfəzlim, oyan**

Oyan, ey qan ilə gülnarım, Əbülfəzlim, oyan,
Gözün aç, qolsuz ələmdarım, Əbülfəzlim, oyan.

Qırılub Kərbübəladə hamı ənsari-Hüseyn,
Qalmayub bircə nəfər yavərü həm yari-Hüseyn,
Yüz qoyub qarətə ləşkər, dur, ələmdari-Hüseyn,
Ağlayur düxtəri-naçarım, Əbülfəzlim, oyan.

Yoxdı fəryadə gələn, cümlə köməklər qırılub,
Bu gün əshablərim cümləsi yeksər qırılub,
Gedüb əldən köməgim, Ali-Peyəmbər qırılub,
Yoxdı bir kəs ola qəmxarım, Əbülfəzlim, oyan.

Öldürüb qövmi-cəfa Övn ilə həm Cə`fərimi,
Zülm ilə doğradılar Qasimi-məhpeykərimi,
Əlimün üstə susuz oxladılar Əsğərimi,
Oxlanub Əsğəri-növbarım, Əbülfəzlim, oyan.

Hökm edüb Şimri-dəğa, ləşkəri-küffar yeriyür,
Soymağa bacılarım, qövmi-sitəmkar yeriyür,
Cümləsi almış ələ nizəvü xəncər, yeriyür,
Dur, yetiş dadimə, sərdarım, Əbülfəzlim, oyan.

Ali-Heydər nə rəvadur belə fəryad eləsün,
Qalmayub bircə nəfər Zeynəbə imdad eləsün,
Şimri-dun din evini istiri* bərbad eləsün,
Ağlaya Zeynəbi-biyarım, Əbülfəzlim, oyan.

Zeynəbün eylər həras ərseyi-Minadə bu gün,
Yox ona eyləyən imdad bu səhradə bu gün,
Qüvvətim yoxdı yetəm Zeynəbə imdadə bu gün,
Qalmayub bir nəfər ənsarım, Əbülfəzlim, oyan.

Qumlar üstündə salublar yaralı peykərimi,
Sinəm üstündə susuz oxladılar Əsğərimi,
Çün şəhid eylədilər nazlı Əli Əkbərimi,
Zülm əlilə yıxılub darım, Əbülfəzlim, oyan.

Nadima, saxla əza bu Şəhi-ətşanə müdam,
Zülmini Şimri-dəğa etdi o səhradə təmam,
Ağla, rüxsaruva tök əşki-bəsər sübh ilə şam,
Yazgilən, qolsuz ələmdarım, Əbülfəzlim, oyan.

---

* İstəyir

**İzn alub rəzmə Əbülfəzl ki, qürran yeridi**

İzn alub rəzmə Əbülfəzl ki, qürran yeridi,
Xeybəri almağa guya Şəhi-mərdan yeridi.

Geyinüb əsləheyi-cəngü cədəl mahi-münir,
Sədri-zin oldı Üqab üstə çün ol pənceyi-şir,
Söylədi, kimdi mənə car edə aləmdə nəfir,
Ki, babam eylədi bütxanəni viran, yeridi.

Ali-Süfyanı təmam qan ilə əlvan elərəm,
Beydəqi-küfri yenüb, qan ilə yeksan elərəm,
İzn versən, Şahi-din, Kufəni viran elərəm,
Beldə şəmşiri-bəla, naibi-İmran yeridi.

Yüz qoyub rəzmgəhə qeyzlə şəhbazi-hünər,
Gördi qardaşı gedüb Padşəhi-təşnəcigər,
Ahi-pürsuz çəküb tökdi yüzə əşki-bəsər,
Gözi yaşlı dalısınca Şəhi-ətşan yeridi.

Söylədi, en bir atundan, qoyan avarə məni,
Yox ümid bir də səlamət görəm aləmdə səni,
Taparam qanə batandan sora bu gül bədəni,
Qoluvı boynuma sal, eyləyək əfğan, yeridi.

Əl-qərəz, etdi dübarə Şahi-ətşanı vida,
Yetişüb ərseyi-meydanə çün ol kani-vəfa,
Zərbi-tiğindən həras eylədilər əhli-cəfa,
Pozulub səfləri çün misli-bir arslan yeridi.

Səf sınub, tip dağılub, dəstələr eylüblə fərar,
Çoxı münşəqq olub, bə`ziləri pa bəfərar,
Neçə baş düşdi, bədən dutdı cəhənnəmdə qərar,
Boyanan qanə olub azimi-niyran yeridi.

Çün Ömər Sə`d elədi Maridi-bidini səda,
Görmüsən* sındı qoşun yatdı, aşıb-daşdı bəla,
Et bunun dəf`inə çarə, qoşunı eylə rəha,
Qaçdılar, oldı qoşun əhli hərasan yeridi.

Qərqi-ahən olub ol Maridi-kafər o zəman,
Dutdı əsb üstə qərar, rəzmə girüb nə`rəkünan,
Dedi, ar olsun əgər versəm o sərdarə əman,
Rəzmgahə qoyub üz tabe`i-Mərvan, yeridi.

Əl atub nizeyi-fuladə çün ol kəlbi-səqər,
Fərqi-Əbbası nişan eylədi ol mayeyi-şər,
Verməyüb möhlət Ələmdari-Hüseyn, kani-hünər,
Nizəsün aldı əlindən məhi-taban, yeridi.

Özünün hülqini öz nizəsinə etdi nişan,
Naibi-Şahi-Nəcəf verdi dəliranə təkan,
Keçdi hülqündənü kətfində cida oldı əyan,
Yüzi üstə yıxılub qan ilə əlvan, yeridi.

Bu zəman Şahi-şəhid təlldə durmuş nigəran,
Gördi Əbbas elədi Maridi niyranə rəvan,
Coşdı səflər hamı, qalxub ələmlər o zəman,
Qətli-Əbbas üçün ol ləşkəri-Süfyan yeridi.

---

* Görmürsən

## Müşkilgüşa Əbbas

Alub çün rüxsəti-meydan o gün müşkilgüşa Əbbas,
Vida eylibdür övladi-Əlini bavəfa Əbbas.

Geyindi aləti-də`va Əmiri-fəthi-Xeybərtək,
Çü hail eylədi miğfər bəsani-şiri-davərtək,
Ələm əldə qoyub yüz rəzmə çün Mövlayi-Qənbərtək,
Belinə bağladı şəmşir çün bərqi-bəla, Əbbas.

Qədəm qoydı kənarə xeymədən ol Sərvəri-dövran,
Nə gördi, Ali-Peyğəmbər təmamən ağlayar qan,
Su camı dutmuş əllərdə, edərlə naləvü əfğan,
Rikab üstə qədəm qoydı əzizi-Mürtəza Əbbas.

Görüb Külsum üzin sölərdi ki, qardaş, əman, getmə,
Şəhid eylər səni getsən bu əhli-kufəyan, getmə,
Fəraqində olar Ali-Peyəmbər bağrıqan, getmə,
Səni öldürməgə səf-səf durub əhli-cəfa, Əbbas.

Səkinə ərz edüb, getmə, əmandur, Sərvəri-dövran,
Qalub yalquz görürsən bu Minadə Şahi-məzluman,
Əmucan, əmmələr eylər qəmində naləvü əfğan,
Yəqin getsən əsir eylər bizi bu əşqiya, Əbbas.

Necə səbr eyləsün hicründə bu qəddi kəman Zeynəb,
Tökər göz yaşı rüxsarə qəmində bağrıqan Zeynəb,
Yəqin sənsiz olar axır əsiri-kufəyan Zeynəb,
Dutubdur Kərbəla səhrasını qövmi-dəğa, Əbbas.

Vida eylüb hamı bikəslərə ol dəştin arslanı,
Əlində tiği-bürran, kəsdi qürran sədri-meydanı,
Hərasü vəhşətə saldı təmamən ceyşi-ə`danı,
Rəşadət mülkinə sultan, əzizi-"Lafəta" Əbbas.

Dedi Əbbasi-məhtəl`ət, bilün, ey ləşkəri-küffar,
Hüseynə nokərəm, əmma atamdur Saqiyi-Kövsər,
Şücaət irsidür bizdə, babamdur Fatehi-Xeybər,
Neçə yüz başı təndən eyləyüb ol dəm cüda Əbbas.

Bu qəmdə ağlayar Nadim edər növhə, çəkər əfsus,
Nəsib olsun səbarə, asitanı eyləyüm pabus,
Bəhəqqi-Şahi-məzluman, məni sən eyləmə mə`yus,
Bu müşkil fe`ldən qurtar məni, müşkilgüşa Əbbas.

**İzn alub rəzmə çün Əbbasi-dilavər yerisün**

İzn alub rəzmə çün Əbbasi-dilavər yerisün,
Şirtək pəncə açub, varisi-Heydər yerisün.

Çün hüzuri-Şəhi-valayə gəlüb verdi səlam,
Söylədi mövsümi-hicrandı, vüsal oldı həram,
"Əl-ətəş" söylər uşaxlar, mənə ömr oldı təmam,
Ol Şəhə etdi vida, istədi sərvər, yerisün.

Yüz qoyub ərseyi-meydanə Ələmdari-dəlir,
Şiri-qürrantək ələ nizə alub bəççeyi-şir,
Gördi ol vəqt dalıdan bircə həzin sövt gəlür,
Çün rəva görmədi ol mahi-münəvvər yerisün.

Pa-piyadə olub Əbbas, iki qardaş o zəman,
Qol-boyun eylədilər hər ikisi ahü fəğan,
Cümləsi xeymədə ətfali-Hüseyn naləkünan,
Dedilər, istəyü* meydanə Qəzənfər yerisün.

Əl-qərəz, etdi vida itrəti-Tahanı təmam,
Rəzmgahə yetişüb söylədi, ey ləşkəri-Şam,
Olun agah, eşidün bu sözi, ey qövmi-zülam,
Cəng üçün rəzmimə bir sahibi-xəncər yerisün.

Gəlmişəm ta ki, dəliranə bu gün cəng edərəm,
Vüs`əti-aləmi siz qövmə bu gün təng edərəm,
Qan ilə Kərbübəla dəştini barəng edərəm,
Nəhri-qan Kərbübəlanı edüb ənvər yerisün.

Hər qədr etdi mübariz tələb ol mahi-cəmal,
Nitqdən xamuş olubdur o zəman ceyşi-zilal,
Qəhr ilə aldı Ələmdar ələ şəmşiri-hilal,
Ləşkərün qətlinə yüz qoydı hünərvər, yerisün.

Bir qədər qəhr ilə də`va edüb ol şiri-jəyan,
Nəhri-Ceyhun kimi qan oldı bu səhradə rəvan,
Yüz qoyub qaçmağa səhrayə o ləşkər o zəman,
Sərnigun oldula xak üstə ələmlər yerisün.

Çün Ömər Sə`di-ləin riş yolub, qıldı səda,
Qaçmayun, qeyrət edün, bir dayanun, əhli-cəfa,
Ar ola sizlərə, ey ləşkəri-bişərmü həya,
Bir dəlirün qabağında hamı səflər yerisün.

---

* İstəyir

O zəman Maridi-bidinə edüb qeyrət əsər,
Geyinüb rəxti-kəzəl əgninə, ol mayeyi-şər,
Mərkəb üstündə qərar dutdı o kəlb misli-səqər,
Yüz qoyub rəzmə Əbülfəzlə o kafər, yerisün.

Yetişüb ərseyi-meydanə o dəm məsti-qürur,
Lə`nət eylərdilə ol kafərə vəhş ilə tüyur,
Qəhrlə verdi təkan nizəyə ol kəlbi-əqur,
Vermədi möhlət Əbülfəzl o sitəmgər yerisün.

Nizəni dutdı əlindən çıxarub misli-pələng,
Dedi, bu əldən al, ey kafəri-dun, tə`limi-cəng,
Ömri-dünyanı Əbülfəzl edüb ol kafərə təng,
Səmti-narə qoyub yüz, ol səgi-əbtər yerisün.

Mərhəba söylədi ol şəstə ədu, dusti-təmam,
Salub ol zalimi atdan çün Ələmdari-İmam,
Ömri-dünyanı edüb Maridi-bidinə həram,
Yüz qoyub Əlqəmə ol varisi-Heydər, yerisün.

Çün Əbülfəzl elədi Maridi-napakı həlak,
Cismi-napakını əlvan eləyüb xun ilə xak,
Qüssədən oldı Ömər Sə`di-ləin sinəsi çak,
Hökm edüb şiri-jəyan üstünə səflər yerisün.

Zərrə bak etməyüb ol yavəri-sərdari-Nəcəf,
Şirtək xəşm ilə at saldı Fərat üstə tərəf,
Yol verüb ol məhi-tabanə, ədu çəkdilə səf,
Söylədi, rəzmimə hər kəs verəcək sər, yerisün.

Dövri-Əbbası o səflər həmə yeksər bürüdi,
Haləsün mahvəşün zümreyi-kafər bürüdi,
O qərib haləsini cümleyi-səflər bürüdi,
Ruyimə çünki sirişki-tərim istər yerisün.

Düşdi çün xatirinə təşnələb əhvali-İmam,
Dedi, vallahi, onun təşnədi ətfalı təmam,
İçmərəm mən bu suyı, çün mənə su oldı həram,
Su deyüb xeymədə gözyaşlı hərəmlər yerisün.

Çün Üqabun çevirüb xeymələrə sarı sərün,
Bu idi niyyəti sirab eləyə təşnələrün,
Nəxldən sağ qolunı eylədi çün şumi-kəmin,
Sol qolun salmağa bir digəri istər yerisün.

Dedi, ey qövmi-dəğa, guş verün bu sözimə,
Məşkimə vırmayun ox, oxları vırun gözimə,
Dəgdi çün məşkinə ox, su tökülüb yer yüzinə,
Söylədi, qətlim üçün imdi kim istər, yerisün.

Ya Əbəlfəzl, özün Nadimüvə eylə nəzər,
Növhəxanun olub ağlar sənə hər şamü səhər,
Şəbi-vəhşətdə mənim qəbrimə bir eylə güzər,
Mənə rənc eyləməgə qoyma mələklər yerisün.

**Əbbas, oyan, Əbbas, oyan**

Ey qanına əlvan olan,
Müşkilgüşa Əbbas, oyan.
Ey ümmətə qurban olan,
Əbbas, oyan, Əbbas, oyan.

Kim taqətün əldən alub?
Toprağə gül cismün salub,
Ümmülbənin ağlar qalub,
Əbbas, oyan, Əbbas, oyan.

Ağlar gözüm əhvaluva,
Qanə boyanmış haluva,
Qurban olum qollaruva,
Əbbas, oyan, Əbbas, oyan.

Taladılar malımızı,
Təlx etdilər halımızı,
Bağlubla qollarımızı,
Əbbas, oyan, Əbbas, oyan.

Qalmubdı bir ənsarımız,
Yox bir nəfər qəmxarımız,
Sənsən bizim sərdarımız,
Əbbas, oyan, Əbbas, oyan.

Gör, başıma gəldi nələr,
Külsum olubdur xuncigər,

Oldum əsirü dərbədər,
Əbbas, oyan, Əbbas, oyan.

Qarət olubdur sərvətim,
Əldən gedibdür izzətim,
Artar dəmadəm möhnətim,
Əbbas, oyan, Əbbas, oyan.

Qəm eyləmə yoxdur anan,
Əhvaluva vardur yanan,
Həşrə kimin qıllam fəğan,
Əbbas, oyan, Əbbas, oyan.

Ta key sənə mən ağlaram,
Suz ilə sinə dağlaram,
Hər il əzavı saxlaram,
Əbbas, oyan, Əbbas, oyan.

Bu çöldə bu qövmi-zəlum,
Qoymaz nedim, zülfüm yolum,
Gül cismüvə qurban olum,
Əbbas, oyan, Əbbas, oyan.

Neytək gələr qəlbim dilə,
Şamə gedər bu qafilə,
Qardaş, xudahafiz hələ,
Əbbas, oyan, Əbbas, oyan.

Nadim edər ahü nəva,
Eylə nəzər kani-vəfa,
Ver mətləbün, müşkilgüşa
Əbbas, oyan, Əbbas, oyan.

**Gəl, nuri-eynim, ya əxa**

Düşdüm Üqab üstən, əman,
Gəl, nuri-eynim, ya əxa.
Aldı arayə kufəyan,
Gəl, nuri-eynim, ya əxa.

Şəhbaz idim sındı pərim,
Məcruh olubdur peykərim,
Şahəm, kəsildi əllərim,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Sübh olmamış batdı qəmər,
Cismim yəradur sərbəsər,
Batdı ələm, yandı cigər,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Ə`da dutub axır yolum,
Qət` oldı həm sağü solum,
Zərbi-əmud bükdi belim,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Aç gözlərün, gəldim, oyan,
Qardaşını yalquz qoyan,
Rə`na qədim oldı kəman,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Pak etgilən qandan yüzüm,
Qanə batub şəhla gözüm,
Axır vidamızdur bizim,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Ə`dalər əl tapdı sənə,
Məqhur oldum düşmənə,
Sə`d oğlı rəhm etməz mənə,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Tabım alub qövmi-dəni,
Qardaş, Hüseyn, əfv et məni,
Pişvaz edə bilməm səni,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Virdi-dilim, Əbbas, oyan,
Arxam, elim, Əbbas, oyan,
Sındı belim, Əbbas, oyan,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Ə`vanım öldi birbəbir,
Oldı yəqin Zeynəb əsir,
Eyləllə düşmən dəstgir,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

Bu Nadimi-şirinsüxən,
Ağlar sənə Şahi-zəmən,
Öpsəm məzarun bir də mən,
Gəl, nuri-eynim, ya əxa,
Bikəs Hüseynim, ya əxa.

**Yetiş imdadimə, sərdarım, əxa**

Yaralandım, yetiş imdadimə, sərdarım, əxa,
Səndən özgə, bilüsən, yoxdı mədədkarım, əxa.

Sərnigun oldı ələm, düşdi qolum, sındı belim,
Xeyməyə gəlməgə yox çarəm, ədu kəsdi yolum,
İntizarun çəkərəm, gəl, əxi, qurbanun olum,
Səsimə ver səs, əman, munisü qəmxarım, əxa.

Hər iki qollarımı əhli-cəfa etdi zəbun,
Ya Hüseyn, gəl, gör, Ələmdarun olub qərq bəxun,
De Səkinə qızuva, kəsdilər ə`da su yolun,
Boyanub qanimə məşkim ilə qollarım, əxa.

Seyyidim, mərhəmət et, lütf ilə sal yadə məni,
Tap əcəl tapmamış, ey Şaha, bu dünyadə məni,
Sərfəraz eyləgilən ərseyi-Minadə məni,
Seyyidim, padşəhim, munisim, ənsarım, əxa.

Olma razi cühəlalər məni tənha görələr,
Xeyməyə nəqli-məkan eyləmə, ə`da görələr,
Doğranub sərviqədim, parədi sərpa görələr,
Üstüvə düşmən hücumavər olar, yarım, əxa.

Budı məqsud, görüm ol gül yüzüvi, rahət olum,
Məclisi-eşqdə Canan ilə həmülfət olum,
Olma razi ki, ölən vəqt üzüvə həsrət olum,
Müntəzir rahuvı gözlər gözi xunbarım, əxa.

Müntəzirdür, başım üstündə durub Şahi-Nəcəf,
Qanım ilə eyləyüb riş ilə rüxsarun hədəf,
Məni mehman aparur məclisi-Canană tərəf,
Sənə, gəl, ərz eləyim kəlmeyi-əsrarım, əxa.

Bu yəman gündə hamı yadə salar qardaşını,
Yox yanımda anam açsun başım üstə başını,

Abi-neysan kimi töksün yarama göz yaşını,
Yaradur başdan-əyağə təni-gülnarım, əxa.

Nadiməm, ağlamasam yox səməri, fayidəsi,
Qalmayub səndən əlavə dəxi bir dadrəsi,
Gözünün yaşıdı tuşə səfəri-rahiləsi,
Olar hər mahi-mühərrəmdə əzadarım, əxa.

**Əbülfəzlül-Əbbas dilindən**

Ey bəradər, mənə ver rüxsəti-meydan, yola sal,
Gətirüb təngə məni tə`neyi-üdvan, yola sal.

Yox dəvamım eşidim əhli-şərarət səsini,
Ceyşi-küffar vıran təbli-bəşarət səsini,
Xeymədə zəccə edən banuyi-ismət səsini,
Rəhm elə, qəlbim olub qüssədən al qan, yola sal,

Şühəda qızlarınun naləvü əfğanına bax,
Bir tərəf tazə cəvanlar boyanub qanına, bax,
Saralub gül kimin Əsğər, ləbi-ətşanına bax,
Oldı bu vüs`əti-dünya mənə zindan, yola sal.

Məndə yox tabü təvana, çəkim Əkbər qəmini,
Qanə əlvan olunan Övn ilə Cə`fər qəmini,
Əl-ətəş söyləyən övladi-Peyəmbər qəmini,
Gəl, çevir başuva, qardaş, məni əl`an yola sal.

Qoy, Üqab üstə çıxım, rə`şə salım dəstələrə,
Eylərəm firqeyi-ə`danı rəvanə səqərə,
Zərbi-şəmşirim ilən su alaram təşnələrə,
Qoymaram itrəti-Taha qala ətşan, yola sal.

Bir-birə murü mələxtək vıraram bu qoşunı,
Tökərəm bərgi-xəzantək yerə ə`da başını,
Olmaram razi tökə, Ali-Əli göz yaşını,
Zərbimə tab eləməz firqeyi-Süfyan, yola sal.

Bihünər sanma, babam Xaliqi-Sübhan əlidür,
Xeybəri fəth eləyən Şafiyi-üsyan, Əlidür,
Əb Döüddi eləyən qanına əlvan, Əlidür,
İzn versən edərəm Kufəni viran, yola sal.

Neçə yüz ləşkər ilən Maridi qanə boyaram,
Kim qılınc çəksə mənə, madərin ağlar qoyaram,
Zərbi-şəstimdən olar xövfdən ə`da mənə ram,
"Həl mübariz"* deyər üdvan, Şəhi-ətşan, yola sal.

---

* Savaşan varmı?

Qasimü Əkbər ölüb, möhnət edüb qəddimi xəm,
Razıyam əhli-cəfa qollarımı etsə qələm,
Su alım ya bu ləbətşanlara, ya yatsun ələm,
Müntəzir rahimi gözlər Şəhi-mərdan, yola sal.

Varam öz eylədigim əhd ilə, peymanım ilən,
Xaki-payində fəda olmağa bu canım ilən,
Şühədalər kimin əlvan olam öz qanım ilən,
Saralan rəngüvə canım ola qurban, yola sal.

Nadimin var bu təmənnadə, Hüseyn, sübh ilə şam,
Sənə şeşguşə məzarunda verəm bir də səlam,
Fani ömrüm ola ol səhni-rəvaqində təmam,
Asiyəm, əfv elə, et azimi-rizvan, yola sal.

**Külsumun dilindən Həzrət Əbbasə**

Səlam olsun sənə, sədparə Əbbas,
Susuz məğlub olan əğyarə, Əbbas.

Səni aldı əlimdən qövmi-üdvan,
Salublar cismüvi səhrayə üryan,
Ölüncə eylərəm şur ilə əfğan,
Tapılmaz dərdi-hicrə çarə, Əbbas.

Sən öldün, xahərün gəldi fəğanə,
Əsir oldum mən ceyşi-kufəyanə,
Məni qoydun ölüncə yanə-yanə,
Töküm, qoy, göz yaşın rüxsarə, Əbbas.

Sən öldün, peykərün qanə boyandı,
Sitəmlə mə`cərim, rəxtim talandı,
Od aldı xeyməvü xərgahım yandı,
Qalubdur xahərün avarə, Əbbas.

Şərari-hicr ilə yandım, bəradər,
Sən öldün, mən də odlandım, bəradər,
Yolar başın bacun Külsum, bəradər,
Gülüm seyd oldı rəmzi-xarə, Əbbas.

Gələr sənsiz müdam əfğanə Külsum,
Qalub dünyadə yanə-yanə Külsum,
Əsir oldı əcəb üdvanə Külsum,
Gümanım bir gəlür Bimarə, Əbbas.

Yaralı başuva pərvanə ollam,
Başun hər bəzmə getsə, sənlə gəlləm,
Yaralı nə`şün üstə zülf yollam,
Yanınca gəlləm hər bazarə, Əbbas.

Əsir ollam, əxa, əhli-inadə,
Yaralı peykərün qaldı aradə,
Başun ardınca mən gəlləm piyadə,
Əcəb qoydun məni avarə, Əbbas.

Cəhanda yaxşı oldı xar Nadim,
Vəhidü bikəsü biyar Nadim,
Genə olsa sənə zəvvar Nadim,
Səlam eylər sənə, sədparə Əbbas.

## Sinəzəni-Həzrət Əbbas

İşim oldı müşkil, hərayə gəl, Şəhi-tacdarım, əxi, əxi,
Bilüsən ki, səndən əlavə yox dəxi qəmküsarım, əxi, əxi.

Dəxi tə`xir eləmə, ya əxi, dəxi tə`xir etməgə yox yeri,
Su üçün yolladığun bədən eylə parə-parədi çox yeri,
Bədəni sərhəm olub təmamilə nizə və elə ox yeri,
Çox o gül cəmaluva talibəm, kəsilür qərarım, əxi, əxi.

Sağ əlimi kəsüb yerə saldılar, sol əlimlə çox edərəm də`va,
Sol əlimi də mənə çox görüb bədənimdən eylədilər cüda,
Başımun əmud ilə üstüxanını xürd-xürd edüb əşqiya,
Ki, dolubdı kaseyi-çeşmimə qan, gedüb ixtyarım, əxi, əxi.

Demirəm ki, qollarımı mənim eyləyüb ədu qələm ağlaram,
Kəsilüb əlim, bükülüb belim, yıxılub yerə ələm, ağlaram,
Məni öldürüb sənə əl tapalla bu ləşkəri-sitəm, ağlaram,
Bu çəməndə döndi xəzanə, gör, elə növbəharım, əxi, əxi.

Məni eyləyüblər Səkinədən sitəm ilə əhli-cəfa xəcil,
Görüb əlsizəm, mənə əl tapub bu çəməndə qatil,
Yet özin hərayimə, ya Hüseyn, məni əlsiz olmaq edüb zəlil,
Bu Minadə səndən əlavə yox dəxi qəmküsarım, əxi, əxi.

Eşidüb sədasın Əbülfəzlin çü xiyamdə Şahi-tacdar,
Dedi, ey anam, bacım, qardaşım səs eylədi məni, biqərar,
Yetüşüb hüzurinə Zülcənah, ola bilmədi Şəhi-din səvar,
Dedi, sındırur belimi o səs çağırur ki, yarım, əxi, əxi.

Çün olub rəvaneyi-rəzmgah o Şəhi-Mədinə nə hal ilən,
Çağırurdı hardasan, ey əxi, dolanurdı dərdü məlal ilən,
Yetişdi bir yerə gördi ki, iki qol düşübdi nə hal ilən,
Basub hər iki qolı bağrına, dedi yadigarım, əxi, əxi.

Yetişüb nə gördi ki, dövrəsin bürüyüb əduləri halətək,
Eyləyüblər cismini qərqi-xun, boyuyublar qaninə lalətək,
Eyləyüblə parə dodaqların, dolub ağzı qanlı piyalətək,
Necə çıxmaz ərşə, bu cür görən səni, ahü zarım, əxi, əxi.

Gözün aç, hərayuva gəlmişəm, mən olum fədası bu göz yaşın,
Özün öldürər hər o kəs ola, görə bu növ` ilə qardaşın,
Gətürüb qoyubdı fəğan ilən dizi üstə yaralı başın,
Dedi, var nəsihətin, et mənə, məhi-ruzigarım, əxi, əxi.

Səni verrəm, ey Şəhi-Kərbəla, o əziz bəradərüvə qəsəm,
Sitəm ilə qaninə qərq olan o yaralı Əkbərüvə qəsəm,
Elə ruzi bir də məzarun üstə deyəm, Nadimi-bikəsəm,
Deyəm ol rəvaqidə, izn ver, Şəhi-tacdarım, əxi, əxi.

**Ey Şəhənşəhi-Kərbəla, həray**

Əldən, ey əxa, tabü taqətim aldı ləşkəri-əşqiya, həray,
Getdi səhm ilə həm səlabətim, ey Şəhənşəhi-Kərbəla, həray.

Əldən aldılar ixtiyarımı imdi zümreyi-bihəya mənim,
Qollarım, əxa, zərbi-tiğ ilə cismdən olubdur cüda mənim,
Sərnigun olan cövrü zülm ilə napədid olan bu liva mənim,
Gəl, özün gətür dəstüvə özün, bari, yatmasun bu liva, həray.

Tək görüb məni qövmi-bihəya,
Qanımı tökər ləşkəri-cəfa,
Görməsəm yüzün olmaram rəha,
Ey Şəhənşəhi-Kərbəla, həray.

Oldı çün zəbun sağ ilə solum,
Saldılar yerə hər iki qolum,
Qövmi-bihəya kəsdilər yolum,
İntizaruvı et rəha, həray.

Dadə yet, Şəhənşahi-kamran,
Eylədi xizab qardaşuvı qan,
Gəl, edim sənə dərdimi əyan,
Nuri-dideyi-Müstəfa, həray.

Yox əlim, alam dəstimə ələm,
Çün əmud ilə ləşkəri-züləm,
Eylədi səhi qamətimi xəm,
Varisi-Şəhi-"Lafəta", həray.

Qan axub dolub qan ilə gözüm,
Topraq ilə yeksan olub yüzüm,
Axır ömrdür, var sənə sözüm,
İntizarım, ey əxa, həray.

Görsən halımı, ey əxa, özün,
Xəm olar belün, qurtular sözün,
İstərəm görəm bir də gül yüzün,
Gözləyür səni gözlərim, həray.

Gər yaralarım kari caridür,
Cismim zəxmdən biqərardur,
Rahidə gözüm əşkbardur,
Cuş edüb, əxa, qəmlərim, həray.

İstərəm olam zairi-sərün,
İyləyüb öpüm parə ləblərün,
Zair eylə gözyaşlı nokərün,
Nadimi, Şəhi-Kərbəla, həray.

**Yetiş imdadimə, qardaş, Hüseyn**

Bir yetiş imdadimə, qardaş, Hüseyn,
Çoxdı yaram, gəl, aparur qan məni.
Gəl yüzüvi bir də görüm, nuri-eyn,
Zibh eləsün qatilim ətşan məni.

Parələnüb tiri-cəfadən sərim,
Zülm ilə qanə boyanub peykərim,
Qalmamış həsrət yüzüvə gözlərim,
Gəl, elə bir şadü xuraman məni.

Əfv elə, su olmadı mümkin, əxa,
Dutdı Fəratun yolını əşqiya,
Gəl, sərimi təndən edəllər cüda,
Saldılar atdan yerə üdvan məni.

Dildə olub ismi-şərifün umud,
Aldı əlindən məni qövmi-yəhud,
Xakə salan vəqtə vırublar əmud,
Eylədilər halı pərişan məni.

Çoxdı yaram, ruhimi basmış məlal,
Gəl, məni bu haldə bir yadə sal,
Mövsümi-hicrandı məni, et həlal,
Gəl, özün et azimi-rizvan məni.

Aldı qərarımı əlimdən səsün,
Səslə, gəlür daduva dadirəsün,
Yox dəxi imdadı məni-bikəsün,
Qoydun əcəb xanəsi viran məni.

Nadimi-biçarəvü xunrizdil,
Vəqf eləyüb canı əzadə hər il,
Əldə qələm növhə edər müttəsil,
Əfv eləsün Xaliqi-Sübhan məni.

**Səlam olsun sənə, ətşan Əbülfəzl**

Səlam olsun sənə, ətşan Əbülfəzl,
Olan ümmətlərə qurban, Əbülfəzl.

Bəzl eylədün rahi-fənadə canun,
Axıb mərcan kimi rüxsarə qanun,
Ola kül başına sənsiz cəhanun,
Olubdur karımız əfğan, Əbülfəzl.

Əgər sə`y eylədün su olsun hasil,
Məramə yetmədün heç, oldı müşkil,
Kəmin eylüb səni bir həmlə qatil,
Səni mə`yus edüb üdvan, Əbülfəzl.

Necə ərz eyləyim, saldı qoluvı,
Kəsiblər səfbəsəf dəstə yoluvı,
Zəbun etdi ədu sağü soluvı,
Xizab edüb səni al qan, Əbülfəzl.

Yıxıldun gülsifət al qan içində,
Düşüb sərvqədün meydan içində,
Görüb yalquz ədu üdvan içində,
Sənə əl tapdılar üdvan, Əbülfəzl.

Yıxub atdan ədu ətrafun aldı,
O şəhla gözlərün qan ilə doldı,
Təmam Ali-Əba gözyaşlı qaldı,
Edibdür cümləsi əfğan, Əbülfəzl.

Yetişdi kamə cümlə əhli-kinə,
Təmamən fəxr edirdi bir-birinə,
Su camilə susuz qaldı Səkinə,
Edüb göz yaşını əfşan, Əbülfəzl.

Sitəmlə gül yüzün qanə boyandı,
Sən öldün, xeymələr odlandı, yandı,
Soyuldı Zeynəbün müztər, talandı,
Olubdur didəsi giryan, Əbülfəzl.

Həmişə Nadimi-biçarə ağlar,
Tökər göz yaşını rüxsarə, ağlar,
Mənə yox səndən özgə yarü qəmxar,
Yetiş imdadimə, ətşan Əbülfəzl.

**Oyan, ey sərvəri-dövran, Əbülfəzl**

Oyan, ey sərvəri-dövran, Əbülfəzl,
Şəhidi-ləşkəri-üdvan, Əbülfəzl.

Necə səbr eyləsün hicranə Zeynəb?
Alışdı möhnəti-suzanə Zeynəb,
Oyan, oldı əsir üdvanə Zeynəb,
Olubdur xahərün giryan, Əbülfəzl.

Bu çöldə xeyməgahım çün talandı,
Təmamən xeymələr suzanə yandı,
Əli Əkbər bu gün qanə boyandı,
Olubdur göz yaşım ümman, Əbülfəzl.

Qəribəm, yox mənim tabü təvanım,
Dəxi heç kimsəyə gəlməz gümanım,
Gedüb əldən Əli, növrəs cəvanım,
Olublar xak ilə yeksan, Əbülfəzl.

Bu qəmdə Zeynəbi-dilparə ağlar,
Tökər əşki-bəsər rüxsarə, ağlar,
Əbəlfəzli deyüb, sərdarə ağlar,
Edibdür qəmlərim tüğyan, Əbülfəzl.

Gəlüb Nadim fəğanə, bax bu halə,
Gözüm əşkin tökər çün misli-lalə,
Bu dəmdə düşmüşəm dərdü məlalə,
Həmişə eylərəm fəğan, Əbülfəzl.

## Oyan, sərdar Əbülfəzl

Mənə rəhm et, oyan, sərdar Əbülfəzl,
Olan öz qanına gülnar, Əbülfəzl.

Ölüb qardaşlarım, zarü qəribəm,
Dolub qan ilə könlüm, dəstgirəm,
Qolı bağlı, gözi yaşlı əsirəm,
Olubdur gözlərim xunbar, Əbülfəzl.

Qəribəm, bikəsəm, yox bir pənahım,
Müsibətdən çıxar əflakə ahım,
Cəfavü zülm ilə doğrandı şahım,
Əzizi-Heydəri-Kərrar, Əbülfəzl.

Əsir eylər bizi bu əhli-kinə,
Tökər göz yaşını, ağlar Səkinə,
Ölübdür zülm ilə mahi-Mədinə,
Şəbihi-Əhmədi-Muxtar, Əbülfəzl.

Sənə bircə gəlür, qardaş, gümanım,
Çıxıbdur göglərə ahü fəğanım,
Müqəvvayəm, uçub ruhi-rəvanım,
Şəhid oldı Şahi-əbrar, Əbülfəzl.

Solubdı gülşəni-Ali-Peyəmbər,
Xəzan yetdi, saraldı, soldı güllər,
Qalub bibağban səhni-çəmənlər,
Solubdı zülm ilə gülzar, Əbülfəzl.

Salublar bikəfən Şahi-Hicazı,
Alub bu çöldə qanla dəstəmazı,
Xaşü xaşak olub cayi-nəmazı,
Qalıbdur cismi-paki xar, Əbülfəzl.

Gözüm ağlar, ölübdür padşahım,
Dəxi yox bir pənahım, dadgahım,
Yanub nari-cəfayə xeyməgahım,
Qalub nar içrə ol bimar, Əbülfəzl.

Yoxumdur bir kəsim gəlsün hərayə,
Verüb Ali-Əba səda-sədayə,
Yetər əfğanımız övci-səmayə,
Bizə yox bir nəfər qəmxar, Əbülfəzl.

Gözün aç, bir oyan, qolsuz dilavər,
Gözi yaşlı qalub əhli-hərəmlər,
Əsir eylüb bizi qövmi-bədəxtər,
Qolumı bağlayub küffar, Əbülfəzl.

Vırub qiladə düşmənlər İmamə,
Qolı bağlı çəkəllə səmti-Şamə,
Gözündə əşki-tər, əldə əmamə,
Tökər göz yaşını bimar, Əbülfəzl.

Gözün aç, ya əxa, bax Kərbəlayə,
Batublar növcəvanlar qan hənayə,
Vırublar başları növki-cidayə,
Bu qövmi-kafərü xunxar, Əbülfəzl.

Olub bu qissədən dilparə Nadim,
Tökər göz yaşını rüxsarə Nadim,
Qələm əldə yazar biçarə Nadim,
Bu şərhi eyləyər izhar, Əbülfəzl.

**Qəlbimi qəmi-fəraqun odladı, əman, Əbülfəzl**

Qəlbimi qəmi-fəraqun odladı, əman, Əbülfəzl,
Yuxlama, bu xabi-qəmdən aç gözün, oyan, Əbülfəzl.

Bu bəla çölində, qardaş, kim səni əlimdən aldı?
Tez vüsalın oldı firqət, həsrətim dilimdə qaldı,
Bükdi qəddimi fəraqun, əllərim belimdə qaldı,
Yox mənə bu çöldə səndən özgə mehriban, Əbülfəzl.

*Əfrad*

Əyağə dur, mən ilə bir qucaqlaşaq, qardaş,
Yetişdi mövsümi-firqət, dur, ağlaşaq qardaş.

*Baqiyi-növhə*

Sərsəri-sitəm əsibdür, soldı imdi gülizarım,
Çün xəzanə döndi, qardaş, zülm əlilə növbəharım,
Çəkməz ol qədr olallar dəstgir bu bacılarım,
Söylə, bəs kimə gətirsün Zeynəbim güman, Əbülfəzl.

*Əfrad*

Səni bu halə salan, gör, məni nə halə salub,
Əziz bacılaruvun gözləri yolunda qalub.

*Baqiyi-növhə*

Əkbərim gedüb əlimdən, rəhm elə bu zarə, qardaş,
İcz edim, riza sən olma Şimri-nabəkarə, qardaş,
Firqətündə, gör, nə növ`i çəkmişəm şərarə, qardaş,
Yandı mülki-din sərasər, qalmadı nişan, Əbülfəzl.

*Əfrad*

Qızım, bacım, hərəmim sinə dağlayan gündür,
Səkinəmin qolunı Şimr bağlayan gündür.

*Baqiyi-növhə*

Çəkməz ol qədr, bəradər, qəm yemə, dalunca gəlləm,
Qurtarub məni bu halun, mən özüm qəmimi billəm,
Şimri-dun cəfası ilə təşnələb şəhid ollam,
Nə`şim üstə səntək olmaz eləyən fəğan, Əbülfəzl.

*Əfrad*

Mənim bu halıma rəhm eylə, əl-əman, qardaş,
O qan dolan gözüvi bircə aç, oyan, qardaş.

*Baqiyi-növhə*

Növhə etməyim nedim bəs ayrı düşmüşəm elimdən,
Va əxa sədası düşməz can verincə ta dilimdən,
Əndəlibi-bipər ayrı düşsə səhndə gülündən,
Qan sirişki cari olmaz məgər hər zəman, Əbülfəzl.

*Əfrad*

Qiyamətimdi görəm bir də parə-parə səni,
Fələk nişan elədi navəki-bəlayə məni.

*Baqiyi-növhə*

Səsləyəndə sən hərayə, qamətim kəmanə döndi,
Soldı gülşəni-İmamət, cövr ilə xəzanə döndi,
Axdı göz yaşum üzarə, qəm sirişki qanə döndi,
Yetdilər muradə əl`an Şimr ilə Sinan, Əbülfəzl.

*Əfrad*

Yəqinim oldı bu gün xeyməgahım odlanacaq,
Şərareyi-qəmə şəhzadə qızlarım yanacaq.

*Baqiyi-növhə*

Mən gələn zəman hərayə, ey əzizi-can, bəradər,
Qollaruvı yerdə gördüm, yandım, əl-əman, bəradər,
Yerdə parə-parə mişkin gözlərində qan, bəradər,
Lərzə etdi görcək halun məğzi-üstüxan, Əbülfəzl.

*Əfrad*

Qoluvı gördüm ədu cismdən salub, qardaş,
Buyur görüm mənə, şirin dilün nolub, qardaş.

*Baqiyi-növhə*

Eyləmə güman əlindən dəstimi, əxa, üzəm mən,
Sənsiz aləmi-fənadə dərdi-firqətə dözəm mən,
Üzmə dəstüvi əlimdən, rəhm elə, oğulsızam mən,
Ömr edəm dübarə sənsiz, eyləmə güman, Əbülfəzl.

*Əfrad*

Həmişə feyz aparardım o gül cəmalundan,
Əlimi üzdi ədular sənün vüsalundan.

*Təmamiyi-növhə*

Səbr elə fəna cəhanda hər qəmü bəlayə, Nadim,
Aşiqi-bəlasən hərgah ver riza qəzayə, Nadim,
Tabe` ol qələm əlində Şahi-Kərbəlayə, Nadim,
Qəlbimi qəmi-fəraqun odladı, əman, Əbülfəzl.

**Aç gözlərün, ey qəmküsarım Əbbas**

Aç gözlərün, ey qəmküsarım Əbbas,
Tar oldı əl`an ruzigarım, Əbbas.

Ə`da səni axır əlimdən aldı,
Yatdı ələm, sındı belim xəm oldı,
Zeynəb bacım başsız aradə qaldı,
Əsir olallar bacılarım, Əbbas.

Əlim yoxdur dutaydı damənündən,
Öpeydim payün ilə əlləründən,

Əmud ilə vırub ə`da sərimdən,
Yox taqətim, ey tacdarım, qardaş.

Sən öldün, üstümə qəmlər töküldi,
Sındı belim, rə`na qəddim büküldi,
Bəlalı qəlbimə dağun çəkildi,
Övc eylər ərşə ahü zarım, Əbbas.

Sənə məndən vəsiyyətdür, bəradər,
Yüzün görsəm kifayətdür, bəradər,
Mənə eyni-səadətdür, bəradər,
Vardur sənüntək qəmküsarım, qardaş.

Qan ilə gözlərün müzəyyən oldı,
Əyalü itrətim gözyaşlı qaldı,
Əldən bu halun ixtiyarım aldı,
Xəzan oldı gülü bəharım, Əbbas.

Mən ölsəm, nə`şim üstə ağlayarsan,
Bu qanlı gözlərimi bağlayarsan,
Sən ölsən, kimlə ağlar Şahi-ətşan,
Bu qeyd alubdur ixtiyarım, qardaş.

Ali-Peyğəmbərün keçdi çirağı,
Aldı gözüm nurin bəradər dağı,
Mənə düşmən, sən öldün, oldı yağı,
Sənsiz gəlmir səbrü qərarım, Əbbas.

Batub qanə, əhli-səadət oldum,
Bəli, dünya qəmindən rahət oldum,
Qızun Səkinədən xəcalət oldum,
Su və`də etmiş idim, sərdarım qardaş.

Bu Nadimün dünyadə yox pənahı,
Müsibətdən çıxar əflakə ahı,
Siyəhrudür əgər çoxdur günahı,
Ümidim var sənə, qəmxarım Əbbas.

**Aç qanlı gözlərün, sərdarım Əbbas**

Aç qanlı gözlərün, sərdarım Əbbas,
Munisü yavərim, qəmxarım Əbbas.

Sən öldün, üstümə qəmlər töküldi,
Xəm oldu qamətim, qəddim büküldi,
Yaralı sinəmə dağun çəkildi,
Pozuldı rövnəqi-gülzarım, Əbbas.*

Edim, qoy, nalə mən zarü diləfruz,
Bu qanlı çöllər içrə qaldım yalquz,
Nə eyləyim mən biçarə oğulsuz,
Gedüb əldən hamı ənsarım, Əbbas.

Çəməndə güllərim zülm ilə soldı,
O şəhla gözlərün qan ilə doldı,
Danış, şirin dilün axır nə oldı?
Gedüb əlimdən ixtiyarım, Əbbas.

Gedüb Əkbər kimi oğlum əlimdən,
Oğul vay-naləsi düşməz dilimdən,
Qəribəm, rəhm elə, yapış əlimdən,
Gözüm nuri, mələkrüxsarım Əbbas.

---

* Bu bənd təkrardır. Az fərqlərlə bundan qabaqkı növhədə getmişdir.

Saldılar cismüvi meydanə, qardaş,
Əcəb qəltan oldun al qanə, qardaş,
Nə növ`i gəlməyim əfğanə, qardaş,
Gözüm yolda qalub, bimarım Əbbas.

Yetüb dövri-xəzan gülzari-dinə,
Talallar xeyməgahım əhli-kinə,
Atasız qaldı binəva Səkinə,
Əzizi-Heydəri-Kərrarım, Əbbas.

Yaralı peykəri qolsuz salublar,
Qərarü səbrimi əldən alublar,
Əyali-Müstəfa ətşan qalublar,
Susuzdur itrətü ənsarım, Əbbas.

Səndən sonra məni ətşan qoyallar,
Kəsəllər başımı, üryan qoyallar,
Ədular Zeynəbin rəxtin soyallar,
Çatar məqsudinə əğyarım, Əbbas.

Yaxşı düşmənlərün yetdi məramə,
Müsibətlər çatdı yeksər təmamə,
Çəkəllər Zeynəbi bazari-Şamə,
Tökər göz yaşı bacılarım, Əbbas.

Əldə qələm Nadim gələr fəğanə,
Salar şivən sədasın asimanə,
Tərəhhüm et, nəzər qıl növhəxanə,
Səndən özgə yoxumdur yarım, Əbbas.

## Həzrət Əbbas növhəsi

Bir saxla qədəm, ey mənə qəmxar, atam oğlı,
Sənsən mənə bu çöldə mədədkar, atam oğlı.

Gözdən tökərəm səfheyi-rüxsarimə qan-yaş,
Gəldim sənə bu kəlmeyi-pünhanı edəm faş,
Gəl, bircə həmağuş olaq əl`an iki qardaş,
Düşməz ələ bir də belə didar, atam oğlı.

Sal qollaruvı boynuma, vardur hələ fürsət,
Lazımdı ki, bilmək belə fürsəti qənimət,
Aç qollaruvı, bəndin öpüm, mehri-şücaət,
İmdi ki, səlamətdi bu qollar, atam oğlı.

Qollaruvı öpməkdə budur mətləbi-talib,
Yəqin bu Ələmdar olar düşmənə qalib,
Əlbət yetəcəkdür bu uzun qollara asib,
Qəmdən olacaq qan ilə xunbar, atam oğlı.

Billəm bu uzun qolları təndən salacaqlar,
Çün taqətü aramuvı əldən alacaqlar,
Ətfali-Əli xeymədə ətşan qalacaqlar,
Su məşkin olar qan ilə xunbar, atam oğlı.

Asib yetişən vəqtdə həm də qəmə, qardaş,
Ənduhü məlal munis olar bülbülə, qardaş,
Düşməz, bilürəm, bir də vüsalün ələ, qardaş,
Qoy, mən də öpüm xaluvı, sərdar, atam oğlı.

Bir kimsə bu çöldə mənim əhvalıma yanmaz,
Bu Şimr ilə Sə`d oxlayacaq, səndən utanmaz,
Biganə bilər bizləri, ədl ilə dolanmaz,
Bu sirri sənə eylədim izhar, atam oğlı.

Əbbasi-ələmdar olub mətləbə agah,
Baxdı çü Sə`din ruyinə, suz ilə çəküb ah,
Axır necə razi olasan, ləşkəri-gümrah
Qolsuz bədənün eyləyəcək xar, atam oğlı.

Axır necə razi olasan Şahi-Mədinə,
Ətşan qala bu ərşdə biçarə Səkinə,
Mən ölsəm onı eylər əsir ləşkəri-kinə,
Şam əhli edər Zeynəbə azar, atam oğlı.

Əbbasə bəyan eylər idi Zeynəbi-məhzun,
Qardaş, sənə qurban ola bu Zeynəbi-dilxun,
Halun nə üçün oldı o saətdə digərgun,
Axır sənə nə söylədi, sərdar atam oğlı?

Qardaşımun əmri belədür, ey bəni ismət,
Də`va eləməklik dəxi mənzur nə niyyət,
Təbl ilə də fövt olmaya ta vəqti-şəmatət,
Baş verməyə rağibdür Ələmdar, atam oğlı.

Əbbas ilə həmağuş olan vəqt Şəhi-məzlum,
Çün vəqti gəlübdi o zəman Zeynəbü Külsum,
Bu xeymələrün yanmağı oldı bizə mə`lum,
Göz yaşı qoyubdur bizi naçar, atam oğlı.

Bu Nadimi-biçarənün et vəqfini guya,
Çün aləmi-məhşərdə onı eyləmə rüsva,
Meydanə gedən vəqtə Əbbas, özi Mövla,
Söylərdi qədəm saxla, vəfadar, atam oğlı.

**Cənab Külsumun dilindən**

Rəhm et bu zarü nalanə, qardaş,
Məni-binəvayə, qəmxar Əbülfəzl.
Əzm etmə rəzmi-meydanə, qardaş,
Çoxdur bu qövmi-xunxar, Əbülfəzl.

Ağlar bu qəmdə qəmnak didəm,
Bu Kərbəladə çün naümidəm,
Cahü cəlalım, gəl, etmə bərhəm,
Külsumə rəhm et, sərdar Əbülfəzl.

Ərşə çıxıbdur fəryadü ahım,
Tənha qalıbdur çün padşahım,
Yox səndən özgə bir dadxahım
Çeşmim olubdur xunbar, Əbülfəzl.

Beş qardaşım bu çöldə ölübdür,
Gülzari-Heydər yeksər solubdur,
Şahi-Mədinə bikəs qalubdur,
Getdi əlindən ənsar, Əbülfəzl.

Bu Kərbəladə oxlandı Əsğər,
Çü Şəhrəbanu olmuş mükəddər,
Əshabü ənsar, Ali-Peyəmbər,
Qan ilə oldı gülnar, Əbülfəzl.

Qanə batubdur əsir cəvanım,
Övc eylər ərşə ahü fəğanım,
Əbbas, sənə bir vardur gümanım,
Hicründə qallam naçar, Əbülfəzl.

Bisər düşübdür Övn ilə Cə`fər,
Meydanə getsən sən də bəradər,
Sən, bircə yalquz, çoxdur bu ləşkər,
Nalan bu çöldə, biyar Əbülfəzl.

Qoy rəzmgahə sənlə gedim mən,
Sən can verəndə əfğan edim mən,
Qanunla zülfün yeksan edim mən,
Sənsən mənə bir qəmxar, Əbülfəzl.

Gəlləm, bəradər, getsən dalınca,
Ölləm, yəqin bil, ta sən gəlincə,
Sölər bu Nadim Külsum dalınca,
Eylər bu qəmdə təkrar, Əbülfəzl.

**Ey sərvərü sərdarım, oyan**

Gözün aç, nitqə gəl, ey sərvərü sərdarım, oyan,
Məni-qardaşsıza rəhm eylə, ələmdarım, oyan.

Belimi bükdi əlimdən, əxi, kim aldı səni,
Boyuyub qanə türab üstə susuz saldı səni,
Yox gözüm görməgə xak üstə bu ziba bədəni,
Oldı səndən sora zəcr eyləməgim karım, oyan.

Xakü xun ilə edüb kim belə yeksan yüzüvi,
Baş sınub, qanun axub, eyləyüb əlvan yüzüvi,
Bir də görməz, bilüsən, Şahi-şəhidan yüzüvi,
Əl tapub xar, xəzan eylədi gülzarım, oyan.

Evimi yıxdılar axır kəsüb ə`da yolumı,
Su kənarında susuz kəsdilə axır qolumı,
Bir də, gəl nitqə, danış, şad elə xunin dilimi,
Qalmayub səndən əlavə dəxi ənsarım, oyan.

Səpdi xakistər ədulər bu oğulsuz başına,
Rəhm edən yox bu qəribün, görüsən,* göz yaşına,
Könlümün şişəsini vırdıla möhnət daşına,
Qanü yaş cari edər dideyi-xunbarım, oyan.

Gül yüzün görməgilə qaməti-sərvim bükülüb,
Yarü ənsar hamı qan ilə yeksan tökülüb,
Yetişüb ləblərüvə can, ala gözlər sökülüb,
Səndən özgə biləsən, yox dəxi qəmxarım, oyan.

Gözün aç möhnətü ənduh ilə, gəl, bükmə belim,
Ey atam naibi, kəskin qılıcım, arxam, elim,
Gözümün nuri idün, mayeyi-arami-dilim,
Olu səndən sora əfğanü nəva karım, oyan.

Nadimi-zari nolar bir də ki, zəvvar edəsən,
Bargahında qələm əldə nəvakar edəsən,
Şəbi-vəhşətdə gəlüb qəbrini gülzar edəsən,
Yazaram zikri-mühən bir də, ələmdarım, oyan.

---

* Görürsən

**Arxam, elim, Əbülfəzl**

Aç qanlı gözlərün, arxam, elim, Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Yaralı qəlbimə qardaş dağı çəküldi,
Sən öldün, üstümə sənsiz qəmlər töküldi,
Soldı qamətim, qardaş, qəddim büküldi,
Aç qanlı gözlərün, arxam, elim Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Sən razisən, əya əlim əldən üzüm mən,
Görürsən Kərbəladə imdi yalquzam mən,
Rəhm elə halıma, Əbbas, oğulsuzam mən,
Aç qanlı gözlərün, arxam, elim, Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Ölüm qübarı görsənür ziba yüzündə,
Dutubdur ləxtə-ləxtə qan qarə gözində,
Səsimə səs ver, ağlaşaq, bari, özün də,
Aç qanlı gözlərün, arxam, elim, Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Salub səni qolsuz, ə`da topraqlar üstə,
Durublar qətlüvə hazır dəstəbədəstə,
Çəkməz o qədr, Şimr çıxar sinəmin üstə,
Aç qanlı gözlərün, arxam, elim, Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Yəqin olmaz bacım Zeynəb dünyadə rahət,
Soyallar mə`cərün, rəxtün qövmi-şərarət,

Edərlər xeyməsin ədu zülm ilə qarət,
Aç qanlı gözlərün, arxam, elim, Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Atam oğlı, sənsiz qəmim gəlməz hesabə,
Qəlbim yandı qəmdən, qardaş, döndi kəbabə,
Əyali-Müstəfanı bağlarlar tənabə,
Aç qanlı gözlərün arxam, elim Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Vırarlar başımı növki-cidayə sənsiz,
Bihəd zülm eylərlə Ali-Əbayə sənsiz,
Qoyar Xuli başım mətbəxsərayə sənsiz,
Aç qanlı gözlərün, arxam, elim, Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

Başım cidalərdə Qur`an tilavət eylər,
Ləbimə çubi-xeyzəran əziyyət eylər,
Bir də bu zikri, Nadima, sölə mükərrər,
Aç qanlı gözlərün, arxam, elim, Əbülfəzl,
Kəsildi taqətim, sındı belim, Əbülfəzl.

**Həzrət Əli Əkbər növhəsi**

İcazə aldı Yə`qubdən ol Yusifi-Kən`an,*
Buyurdı, get, vida et Ali-Tahanı, oğul, əl`an.
Qoyub yüz xeyməgahə şövq ilə ol Əkbəri-ətşan,
Buyurdı, gəl, gedir axır əlündən Əkbərün, madər.

Babamı çün qoyublar əhli-Kufə yekkəvü tənha,
Necə bəs ki, qalım rahət xiyam içrə, ana, Leyla,
Alıbdur Əkbərün rüxsət, gedüb ta eyləsün də`va,
Vida etməkligə gəldim sizi, ey Ali-Peyğəmbər.

Uçub ruhim, müqəvvayəm, bu gül cismimdə canım yox,
Dəxi sağ gəlməgə bu xeyməgahə heç gümanım yox,
Bu dünyadə həyat etməkligə tabü təvanım yox,
Həlal eylün məni, axır vidadur, itrəti-Heydər.

O vəqt Leylayi-biyavər çəküb bir şur ilə nalə,
Dedi, Əkbər, anan qurban ola, ol Haşimi xalə,
Əcəb saldun bu qəmli çöldə Leylanı yəman halə,
Məni qoyma, əmandı, bu xətərnak dəştidə bisər.

Mənə rəhm et, qoyub gözyaşlı meydanə, əman, getmə,
Ola Leyla fəda ol cismüvə, bircə dayan, getmə,
Yəqin getsən, şəhid eylər səni bu kufəyan, getmə,
Olubla qətlüvə hazir, Əli, bu ləşkəri-kafər.

Dedi Əkbər, ana, Leyla, təhəmmül eylə bir saət,
Necə Hacər verüb İsmailə bəs şövq ilə zinət,

* Növhənin əvvəli yoxdur

Tərəhhüm et, gətür sən də mənə bircə kəfən xəl`ət,
Necə göndərdi öz oğlun Minayə şövq ilə Hacər.

Çəküb Leylayi-biyavər, cigərdən ah edüb əfğan,
Dedi bu bəxti qarə, ey Əli Əkbər, sənə qurban,
Minadə, ey Əli Əkbər, yox idi Şimr ilə Sinan,
Gəlibdür qətlüvə Münqiz, əlində nizəvü xəncər.

Sənə gər indi ki, rüxsət verüb Sultani-məzluman,
Əli Əkbər, olubsan şövq ilə sən azimi-meydan,
Buyur, əgləş, sənə zinət edim, bari, məni-nalan,
Verim zinət, görüb rəhm eyləsünlər bəlkə bu ləşkər.

Səkinə gördi bu övzayi, könli gəldi əfğanə,
Dedi, qardaş, Əli, gəl, eyləyim ol zülfüvə şanə,
Yəqin billəm bu səhradə batar ol zülflər qanə,
Edəllər xakü xunalud o zülfün qövmi-bədəxtər.

Xülasə, çün təsəlli verdi Əkbər Ali-Tahayə,
Dübarə gəldi gözyaşlı hüzuri-Şahi-valayə,
Edüb icz ilə payün busə, düşdi payinə sayə,
Sual etdi nədür məqsudin ağlarsan, Əli Əkbər.

Dübarə icz ilə ərz eylədi Əkbər ol Sultanə,
Üqab üstə məni göndər, gedim bu qanlı meydanə,
Əgər lütf eyləsən, ey Sərvəri-aləm, bu ətşanə,
Alım su, ya batım qanə, misal Əbbasi-qəmpərvər.

O vəqtə ağladı Şahi-şəhidan, tökdi göz yaşın,
Xəyalə saldı çün qolsuz düşən sədparə qardaşın,
O vəqtə gördilər Külsum deyər Əbbas, yolar başın,
Gətirdi çün Üqabı yalı olmuş qan ilə əhmər.

Əli Əkbər səvar oldı Üqabi-bavəfa üstə,
Misali-şəmsi-nurani durub ərşi-Xuda üstə,
Düşüb rəftarinün nuri zəmini-Kərbəla üstə,
İşıxlandı, həmən nur ilə oldı Kərbəla ənvər.

Mədinə Yusifi, əl-qissə, oldı azimi-meydan,
Əlitək sədri-zin üstə, belində xəncəri-bürran,
Görüb ol növcəvani heyrətə düşdi təmam üdvan,
Deyərdi əşqiya, gəlmiş Hüseyn dadinə Peyğəmbər.

Mübariz istədi nə`rə çəküb ol Əkbəri-nakam,
Aşağə başlarını saldılar o firqeyi-bədnam,
Özün vırdı həmən dəm ləşkərə ol növgüli-əyyam,
Çəkərdi nə`reyi-Əllahu Əkbər, hər dəm ol yavər.

Süfufi-kufəyani ol bir anda tarümar eylüb,
Nə qədr kafəri qəhr ilə qanə laləzar eylüb,
Qarışdı fövci-səflər bir-birə, yeksər fərar eylüb,
Dağıldı ləşkəri-ə`da, qarışdı bir-birə səflər.

Cəhənnəmtək zəbanə çəkdi ol vəqt Münqizi-kafər,
Gəlüb əzmi-qitalə çün bəsani-bir səgi-əbtər,
Çalındı təblü nəqqarə, gələndə talibi-kəmtər,
Bu övzayi görüb ağlardı ərş üzrə məlaiklər.

Sədayi-təbl yetdi xeymələrdə guşi-Leylayə,
Yetüb şivən sədası xeymələrdən ərşi-Ə`layə,
Təmam ağlardılar ol növcəvani-çeşmi-şəhlayə,
Durublar Əkbər ilə rubəru o zalimi-digər.

Qənimət bildi, fürsətdi çəkübb tiğün o kani-şər,
Ki, bəlkə eyləsün ol növcəvani qan ilə əhmər,
Əli Əkbər dəliranə çəkibdür başinə miğfər,
Qılıncı rədd edüb yıxdı sipər atdan güli-ənvər.

Qilafindən nicat verdi çü şəmşirə dəliranə,
Üqabə göstərüb məhmiz dolandı dövri-üdvanə,
Dedi, ey Münqizi-kafər, necə gör, mərdi-mərdanə,
Səni imdi cəhimə göndərər bu zadeyi-Heydər.

Sipər çək başuva, çalak ki, olma qafil, ey kafər,
Demə qafil məni öldürdi şəhzadə Əli Əkbər,
Təmaşayə durub əl`an çün ərş üzrə məlaiklər,
Cəhimi eyləyər məskən sənə bu əldəki xəncər.

Qərəz, ol zalimi-napak, sipər atda olub pünhan,
Əli Əkbər qılıncı əldə, Üqab üstə edüb cövlan,
Təmaşayə durub təll üstə bikəs Şahi-məzluman,
Deyər, Allah, cəvandur Əkbərim, ol Əkbərə yavər.

Cəmali şə`şə`at eylərdi çün ruyi-Peyəmbərtək,
Əlində qəbzeyi-şəmşir, çəkərdi nə`rə Heydərtək,
Gəzərdi rəzmgəh içrə at üstə fəthi-Xeybərtək,
Vırub qəhr ilə şəmşirün misali-qatili-Əntər.

Qılınc endi, bölüb qalxanı çün əgləndi sər üstə,
Nə mən, nə xəlq, nə sinə, bölüb keçdi cigər üstə,
Xülasə, bərqi-şəmşirün bölüb keçdi əyər üstə,
O zərbi-şəstə cümlə mərhəba söylərdi düşmənlər.

Atub atdan, kəsüb başun o məl`unun dəliranə,
Səvari-sədri-zin oldı, Üqabi gətdi cövlanə,
Gətürdi ol səri, atdı hüzuri-Şahi-dövranə,
Dedi, baba, əmandı, əl-ətəş, ey aləmə yavər.

Bəs et bu qissəni, Nadim, təmami ağladı sözlər,
Yəqinən ağlamaz həşr güni bu ağlayan gözlər,
Dəva etsün o gizlün dərdüvə nakam Əli Əkbər,
Qələm əldə yazub ağlar bu şərhi Nadimi-nokər.

**Əfrad**

Atdan salublar Əkbərüvi, sərvərim, həray,
Qanə batubdı zülm ilə gül peykərim, həray.

Yarə yetübdi cismimə, qalmubdı taqətim,
Ətrafımı alubdılar düşmənlərim, həray.

Fəvvarətək bu yarələrim qan vırar, baba,
Gül soldı, lal olubdıla bülbüllərim həray.

Gəlsə suya gümanun, əman, tez yetür mənə,
Yandı ətəşdən, ey baba, bu ləblərim, həray.

Gəl, mümkin olsa kölgəyə çək təşnə oğluvı,
Gözlər xiyamdə yolumı madərim, həray.

Nadim həmişə növhə edər, ağlayar mənə,
Yar ol məzardə ona qəmpərvərim, həray.

**Həzrət Əli Əkbərlə həzrət Leylanun vidalaşması**

Gəl, həlal eylə məni, çün yetüb hicran, anacan,
Oluram şövq ilə mən azimi-meydan, anacan.

Gedirəm rəzmgəhə, gəl, ana, qol boynuma sal,
Çəkmisən zəhmətimi, barı, mənə eylə həlal,
Gedür oğlun, əlün əldən üzülür, gəl, yola sal,
Ağlayub olmagilən zarü pərişan, anacan.

Gəl otur, şanə edim zülfi-pərişanə, oğul,
Qürbət eldə, Əli, rəhm eylə bu nalanə, oğul,
Düşər hicründə anan kuhü biyabanə, oğul,
Məni etdün əcəb avareyi-dövran, Əlican.

Ağlama, səbr elə, ey bikəsü biçarə, ana,
Ver təhəmmül özüvə, səbr elə, dilparə ana,
Töksələr qanımı bu səfheyi-rüxsarə, ana,
Səbr et Hacər kimi sən, eyləmə əfğan, anacan.

Hacər İsmaili göndərdi Minayə o zəman,
Çün Minadə yox idi Şimr ilə həm zəcri-Sinan,
Getməgün olsa əgər Münqizi-bidinə əyan,
Çün yəqinimdür edər qanuva qəltan, Əlican.

Səbr elə firqətimə, madəri-avarəvətən,
Zülfümə şanə edüb sal yola, çox çəkmə mühən,
Qoy gedim bir yetişim şövq ilə Cananimə mən,
Şühədalər yolumı gözləyür əl`an, anacan.

Gəl, edim şanə mən ol zülfi-pərişanə, Əli,
Tökəcəklər bilürəm qanuvı meydanə, Əli,
Get, himayət elə ol Şahi-şəhidanə, Əli,
Razıyam zülfini yeksan eləyə qan, Əlican.

Bilürəm çünki budur, ey ana, axır səfərim,
Axacaq qan, dolacaq qanım ilə didələrim,
Qəmküsarım olu məndən sora, bil, əmmələrim,
Qoy, gedim rəzmə, yetibdür mənə meydan, anacan.

İmdi ki, izn verüb Sərvəri-əbrar sənə,
Gəl otur xeymədə, mən şanə edim gül bədənə,
O zəman ki, gedərik əmmələrinlə vətənə,
Toy otağında olar göz yaşım ümman, Əlican.

Bu fələk qoydı gözimdə, ey ana, həsrətimi,
Get, vətəndə, ana, sal yaduva hər möhnətimi,
Babamun payinün altında gərək mərqədimi,
Ta ziyarət edə zəvvar məni hər an, anacan.

Nadimün göz yaşını cari edər ruzü şəban,
Hər əzadə qələm əldə eləyər ahü fəğan,
Et əta nokərüvə ruzi-qiyamətdə cinan,
Sənün eşqündə olub çünki nəvaxan, Əlican.

## Nuri-eynim, ya Əli

Xab etmə qum üstə, oyan,
Dur, nuri-eynim, ya Əli.
Leylanı sərgərdan qoyan,
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

Getdün, qoyub tənha məni,
Yalquzladı ə`da məni,
Doğralla sərtapa məni,
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

Gülzardə xar olmuşam,
Qan ilə xunbar olmuşam,
Axır oğulsuz qalmışam,
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

Ə`da səni dildən salub,
Gültək rüxi-alun solub,
Şirin dilün axır nolub?
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

Tənha qoyub getdün məni,
Soldı İmamət gülşəni,
Tapdım, itirdim tez səni,
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

Gül peykərün xunbardür,
Qandan yüzün gülnardür,
Bilməm, bu nə didardür,
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

*Əfrad*

Başuvı qoy dizim üstə, silim gözün qanın,
Xərabə oldı əcəb xanimanı Leylanun.

Necə xəbər aparım xeyməgahə, vaveyla,
Olubdı müntəzirün xeymədə anan Leyla.

Gözün tiküb yola, gözlər ki, Əkbərim gələcək,
Bəlalı qəlbimün aramı, yavərim gələcək.

*Baqiyi-növhə*

Düşdüm min ənduhü qəmə,
Batdı əyalım matəmə,
Qoy nazlı başun sinəmə,
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

Nadim fəğan eylər müdam,
Əldə qələm hər sübhü şam,
Dünya mənə oldı həram,
Dur, nuri-eynim, ya Əli.
Nuri-düeynim, ya Əli.

## Cənab Əli Əkbərün növhəsi

Get, oğul, Əkbər, səni ərş xudahafiz eyləsün,
Şibhi-Peyğəmbər, səni ərş xudahafiz eyləsün.

Qaldı cümlə həsrətün könlündə, kamə yetmədün,
Dəhrdə biçarə Leylani, oğul, şad etmədün,
Növcəvanlartək, oğul, damad olub toy etmədün,
Leyliyə bavər, səni ərş xudahafiz eyləsün.

Zəhmətün çəkdim, oğul, bir şad günüvi görmədim,
Ey oğul, dəstün dutub dəsti-ərusə vermədim,
Bəslədim gültək səni, axır gülüvi dərmədim,
Ey güli-növbər, səni ərş xudahafiz eyləsün.

Səndən özgə, Əkbərim, yoxdur mənə bir dadrəs,
Yoxdı səndən özgə bir kəs ta verə səsimə səs,
Öldürür getsən səni, Əkbər, bu qövmi-naşinas,
Çoxdı bu ləşkər, səni ərş xudahafiz eyləsün.

Qətlüvə amadədür, getmə, bu ceyşi-kufəyan,
Əllərə cümlə alubla nizə, xəncər cansitan,
Rəhm elə Leylayə, gəl, getmə bu meydanə, əman,
Ağlayar madər, səni ərş xudahafiz eyləsün.

Leyliyi-biçarə bu qəmdə olub giryan, oğul,
Göz yaşın rüxsarinə cari edər hər an, oğul,
Əkbərim, getsən şəhid eylər səni üdvan, oğul,
Varisi-Heydər, səni ərş xudahafiz eyləsün.

Əkbərim, əflakə ahım övc edər bu qüssədən,
Əşki-xun cari olar rüxsarimə çün didədən,
Toy libasın, Əkbərim, zülm ilə çün oldı kəfən,
Ey məhi-ənvər, səni ərş xudahafiz eyləsün.

Yox dəvamım, Əkbərim, hicranuva tab eyləyim,
Əşki-xun ilə gərək üzari sirab eyləyim,
Arizum bu idi toy hicləvi abad eyləyim,
Əkbəri-sərvər, səni ərş xudahafiz eyləsün.

Kərbəla dəştin təmamən ləşkəri-kafər dutub,
Əllərində xəncəri-bürran hamı ləşkər dutub,
Bir səni öldürməgə əldə hamı yeksər dutub,
Nizəvü xəncər, səni ərş xudahafiz eyləsün.

Nadima, bu qəmdə tök sən də üzarə əşki-tər,
Bu müsibət eyləyüb Leylani zarü xuncigər,
Başuva vır, cari qıl rüxsaruva əşki-bəsər,
Əkbərə nokər, səni ərş xudahafiz eyləsün.

**Əfrad**

Atdan ədu salubla məni, yavərim, həray,
Al qan ilə dolubdı qəra gözlərim, həray.

Oğlun yaralanubdı, baba, gəl, apargilən,
Görsün ölən zəmanda məni madərim, həray.

Gün yandırar, yaralarımun var əziyyəti,
Cari olub üzarimə əşki-tərim, həray.

Cismim yaralıdur, babacan, yoxdı qüvvətim,
Gər istəyəm duram, bükülər dizlərim, həray.

Atdan yıxılmışam, baba, durma, hərayə gəl,
Əl`an büruzə gəldi hamı qəmlərim, həray.

Bikəs anam yol üstə çəkər intizarımı,
Va Əkbəra deyər, o vəfapərvərim, həray.

Xuni-cəfa bu dideyi-şəhlanı doldurub,
Qan kasəsi kimin boyanub gözlərim, həray.

Gəldim Səkinəyə su alam, olmadı nəsib,
Qaldı susuz bu dəştdə ol xahərim, həray.

Çox təşnəyə su olsa gər, ehsan qıl mənə,
Gül qönçəsi kimin saralubləblərim, həray.

Ağlar həmişə mahi-mühərrəm, dutar əza
Əhvalıma o Nadimi-qəmpərvərim, həray.

**Yaralanmışam, ölürəm, Üqab**

Dəxi qalmayubdur bədənimdə tab,
Yaralanmışam, ölürəm, Üqab.
Gün hərarəti eyləyüb kəbab,
Yaralanmışam, ölürəm, Üqab.

Bu çəməndə bir güləm aşikar,
Yetişübdi bülbülə cövri-xar,

Məni xeyməgahə tərəf apar,
Yaralanmışam, ölürəm, Üqab.

Nedim ki, yox köməgim, elim,
Yetişüb xəzan, saralub gülim,
Susuzam, yanar dodağım, dilim,
Yaralanmışam, ölürəm, Üqab.

Apar, halıma anam ağlasun,
Cigərün fəğan ilə dağlasun,
Başımun yarasını bağlasun,
Yaralanmışam, ölürəm, Üqab.

Boyanubdı qanıma cismi-zar,
Eylüb əcəl məni biqərar,
Məni ölməmiş anama apar,
Yaralanmışam, ölürəm, Üqab.

Anama apar özi ağlasun,
Əli vay deyüb sinə dağlasun,
Gözimi anam özi bağlasun,
Yaralanmışam, ölürəm, Üqab.

Qalub intizar anamun gözi,
Ölür Əkbəri, qutarır sözi,
Görüm ölməmiş o oğulsuzı,
Yaralanmışam, ölürəm, Üqab.

Dəxi durma, sə`y eylə, et şitab,
Məni xeyməyə apar, et səvab,
Bədənimdə qalmadı heç tab,
Yaralanmışam, ölürəm, Üqab.

Anam imdi xeymədə hər zəman,
Gözi rahidə, eyləyür fəğan,
Gözi yaşlı Nadimi-natəvan,
Yaralanmışam, ölürəm, Üqab.

**Həzrət Əli Əkbərün növhəsi**

Ləşkəri-üdvan məni atdan salub,
Sərvəri-dövran, yetiş imdadimə.
Qətlim üçün dövrəmi üdvan alub,
Şahi-şəhidan, yetiş imdadimə.

Can o güli-surətə aləm fəda,
Bu fələk etdi səni məndən cüda,
Neyləyim, əlbət budı əmri-qəza,
Virdi-zəbanım, Əli ləbbeyk, oğul,
Ruhi-rəvanım, Əli ləbbeyk, oğul.

Əkbərün əldən gedür əl`an, baba,
Olmuşam öz qanıma əlvan, baba,
Kəsdi yolum axırı meydan, baba,
Sərvəri-dövran, yetiş imdadimə,
Şahi-şəhidan, yetiş imdadimə.

Bu fələk axır qapımi bağladı,
Sinəmi hicranun, oğul, dağladı,
Halıma düşmənlərimiz ağladı,
Viridi-zəbanım, Əli ləbbeyk, oğul,
Ruhi-rəvanım, Əli ləbbeyk, oğul.

Əhdüvə yetdün, baba, olma məlul,
Şükrü səna eyləllə əzizi-Bətul,
Eylədi qurbanuvı Xaliq qəbul,
Sərvəri-dövran, yetiş imdadimə,
Şahi-şəhidan, yetiş imdadimə.

Saldı əcəb narə fəraqun məni,
Şad elədün aləmara düşməni,
Yox yaralı görməgə tabım səni,
Viridi-zəbanım, Əli ləbbeyk, oğul,
Ruhi-rəvanım, Əli ləbbeyk, oğul.

Eyləmə tə`xir, əmandur, baba,
Çün sənə bir sirrim əyandur, baba,
Bəstərü fərşim qurı qandur, baba,
Sərvəri-dövran, yetiş imdadimə,
Şahi-şəhidan, yetiş imdadimə.

Suzi-ətəş gər səni dildən salub,
Dövrəvü ətrafuvi üdvan alub,
Xeymədə Leyla gözi yaşlı qalub,
Viridi-zəbanım, Əli ləbbeyk, oğul,
Ruhi-rəvanım, Əli ləbbeyk, oğul.

Oldı xəzan gülşəni Peyğəmbərün,
Zülm ilə doğrandı Əli Əkbərün,
Söylə yolum gözləməsün madərim,
Sərvəri-dövran, yetiş imdadimə,
Şahi-şəhidan, yetiş imdadimə.

Baba, hərayə yetiş, ayrılıq zəmanı olub,
Axub bu xuni-cəfa, qarə gözlərim də solub.

Xəlili-Həq, baba, durma, özün Minayə yetür,
Suya güman əgər olsa, bircə cür`ə gətür.

Su rəsmdür ki, verəllə kəsəndə qurbanə,
Gümanun olsa suya, su verüb gəl ehsanə.

Axubdı qan, boyanubdur təmam rüxsarım,
Qalubdı naləkünan madəri-diləfkarım.

Eşitdi xeymədə çün Şahi-din Əli səsini,
Üzarə etdi rəvan əşki-xuni-didəsini.

Dedi, şibhi-Peyğəmbər, Əli cəvan, ləbbeyk,
Fəda o surətə olsun qərib atan, ləbbeyk.

Hərayuva gələrəm, ey güli-bəharım, oğul,
Nə tez qürub elədün, mahi-ruzigarım, oğul.

Əgərçi qırdılar üdvan qəbiləmi, elimi,
Sənün bu səsləməgün bükdi tazədən belimi.

Əl ata əgər əngüştərə Əli Əkbər,
Səni görəndə deyərdim ki, sağdı Peyğəmbər.

*Baqiyi-növhə*

Çün səsün aramımı əldən alub,
Dildə hamı niskilim əl`an qalub,
Səbr elə, fəryaduva şahun gəlüb,
Viridi-zəbanım, Əli ləbbeyk, oğul,
Ruhi-rəvanım, Əli ləbbeyk, oğul.

Kərbübəla dəşti edər zəlzələ,
Bilsə anam ərşə salar vəlvələ,
Bircə içim su mənə ehsan elə,
Sərvəri-dövran, yetiş imdadimə,
Şahi-şəhidan, yetiş imdadimə.

Çün sən idün ruhi-rəvanım, oğul,
İsmün idi virdi-zəbanım, oğul,
Hicrün alub tabü təvanım, oğul,
Virdi-zəbanım, Əli ləbbeyk, oğul,
Ruhi-rəvanım, Əli ləbbeyk, oğul.

Həşrə kimi növhə edər Nadimün,
Cari edər əşki-bəsər Nadimün,
Növhə edər şamü səhər Nadimün,
Sərvəri-dövran, yetiş imdadimə,
Şahi-şəhidan, yetiş imdadimə.

**Oyan, sərdar Əli Əkbər**

Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Əli, rəhm eylə Leylayə,
Dönüb göz yaşı dəryayə,
Gələ lə`nət bu dünyayə,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Könül hicran ilə yandı,
Fəraqi-narə odlandı,
Səni görcək belim sındı,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Sitarəm, məhcəbinimsən,
Mənim yarü müinimsən,
Gözün aç, nuri-eynimsən,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Mənə bəs kim gələr dadə,
Əli, sənsiz bu dünyadə,
Kimim var, kim salar yadə,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Oğul, sən dadxahimsən,
Mənim nurani mahimsən,

Əli, püştü pənahimsən,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Əlimdən kim səni aldı,
Belə topraqlarə saldı,
Əcəb Leyla mələr qaldı,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Nolub şirin dilün, söylə,
Məni gözdən salub böylə,
Oğulsuz qoyma, rəhm eylə,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Gözüm al qan ilən doldı,
Yanub qəlbim kəbab oldı,
Sənə qan rəxtxab oldı,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Mənə rəhm et, səni Tari,
Qoyub getmə bu biyari,
Du mənlən ağlaşaq, bari,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Bu gün sənsiz, Əli Əkbər,
Hücumavər olar ləşkər,
Yoxumdur nasirü yavər,

Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

Salub atdan səni ləşkər,
Hərəmlər ağlayar yeksər,
Anan Leyla yolun gözlər,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

*Əfrad*

Əcəb nişan elədün navəki-bəlayə məni,
Bu halət ilə gətürdün, oğul, nəvayə məni.

Səni əlimdən alub, qoydular məni yalquz,
Həmişə eyləyər əfğan bu zarü diləfruz.

Yaralı qəlbimi hicran oduna dağladılar,
Gözüm önündə səni parə-parə doğradılar.

Fəraq atəşinə odlanub bu xun cigərün,
Anava mən aparum bəs necə ölüm xəbərün?

Necə deyim ki, Əli Əkbərim batub qanə,
Hərəmlərim başaçux yüz qoyalla meydanə.

Necə deyim ki, xizab oldı qan ilə Əkbər,
Eşitsə bu sözi Zeynəb, tökər sirişki-bəsər.

Bu möhnətü qəmə tağī-fələk alovlandı,
Məni-oğulsuza rəhm et, Əli, belim sındı.

Bu möhnətü qəm öldüri, oğul, məni billəm,
Rəvanə olsan əgər, mən də durmaram, gəlləm.

*Təmamiyi-növhə*

Olubdur Nadimün giryan,
Edər şamü səhər əfğan,
Yaralı cismüvə qurban,
Oyan, sərdar Əli Əkbər,
Mələkrüxsar Əli Əkbər.

**Bir oyan, Əli Əkbər**

Yatma xaki-xun üstə, növcəvan Əli Əkbər,
Qoy başın dizim üstə bir oyan, Əli Əkbər.

Ağlaram bu mə`nayə, arizuma yetmədim,
Şəm` alub ələ, Əkbər, hicləvi bəzətmədim,
Ey oğul, analartək mən sənə toy etmədim,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

Ağlayam gərək sənsiz növhə eyləyim hər an,
Çünki Münqizi-bidin qodı* xanəmi viran,
Dildə həsrətün qaldı, öldün həsrətü nalan,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

* Qoydu

Ey oğul, batub qanə gül yüzün bu Minadə,
Toy libasuvı Leyla görmədi bu dünyadə,
Cümlə niskilün gizlin qaldı qəlbi-Leyladə,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

Gülşənün fəraqində növhə eyləyür bülbül,
Nalə eyləyər, görsə gər xəzan olubdur gül,
Mən gərək bu möhnətdə ağlayam, deyəm hər il,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

Yoxdı hicrüvə tabım, cuş edüb bu gün qəmlər,
Əşqiya əsir eylüb Ali-Heydəri yeksər,
Dur, özün əlac eylə, madərün qalub bisər,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

Aç gözüvi, Leylanı dəstgir edüb üdvan,
Narə yandırub üdvan, xeymələr olub suzan,
Dur əyağə, Leylanun dərdinə elə dərman,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

Aç gözün bu aləmə, gəl rəhm elə, səni Tarı,
Bircə lütflə dindür bu qəribü naçarı,
Qan ilən dolan çeşmün qoy, oğul, öpüm, barı,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

Parə-parə gül bədəni doğranan cəvanım, vay,
Qüsli cövri-ə`dadən qan olan cəvanım, vay,
Təşnə-təşnə həsrətlə can verən cəvanım, vay,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

Doymuşam oğul, canə, hər bəlavü möhnətdən,
Rəhm eylə, oğul, qəddim xəm olub müsibətdən,
Nadimi qutar ruzi-həşrdə zəlalətdən,
Növcəvan Əli Əkbər, bir oyan, Əli Əkbər.

**Yetiş imdadimə, ətşan babacan**

Yaralandım, yetiş imdadimə, ətşan babacan,
Yolumı kəsdilər axır mənim üdvan, babacan.

Badi-zülm əsdi, solub cövrü cəfa ilə çəmən,
Bülbüli-qəmzədənün dövrün alub zağü zəğən,
Səslərəm dadimə bais budı əl`an səni mən,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

Sə`y edərdim ki, baxam bir də səlamət yüzüvə,
Baxmağım olmadı mümkin məhi-təl`ət yüzüvə,
Olma razi ki, öləndə qalım həsrət yüzüvə,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

Demirəm ki, bədənim doğrana möhnətdi mənə,
Xaki-payində verəm canımı, minnətdi mənə,
Yüzüvi görsəm ölən vəqtə, səadətdi mənə,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

Yığışub sinəmə canım, məni, gəl, can aparur,
Qan axur, yarələrim suzişi var, qan aparur,
Bəzmi-Cananə əcəl ruhimi mehman aparur,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

Gəl, baba, qətlimə qatillərim eyləllə şitab,
Ruyi-gülnarımi al qan ilə eylüblə xizab,
Məni, gəl kölgəyə çək, suzi-ətəş etdi kəbab,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

Saralub rəngü rüxüm, yarələr aramım alub,
Baş sınub parələnüb, gözlərimə qan dolub,
Xeymələrdə anamın gözləri yollarda qalub,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

Nə`şim üstə mənə xoşdur anam açsun başını,
Can verən vəqt üzümə cari edə göz yaşını,
Ağlasun nazlı Səkinə yaralı qardaşını,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

Nadimim əldə qələm yox səməri ağlamasa,
Ali-Taha baş açub cümlə sinə dağlamasa,
Verməræm can anam hərgiz gözümi bağlamasa,
Yaralandım, yetiş imdadimə, ətşan babacan.

**Ey əmmə, babam Əkbəri-ətşani gətürdi**

Ey əmmə, babam Əkbəri-ətşani gətürdi,
Minadə batan qanına qurbanı gətürdi.

Mə`lumdi, əmmə, babamun çoxdı məlalı,
Çün parələnüb zülm ilə əbruyi-hilalı,
Qanə bələşüb Əkbərimün Haşımi xalı,
Bir hüsn ilə min Yusifə həmtanı gətürdi.

Zahirdi babamda bu nə halətdür, ey əmmə,
Bu xeymələr içrə nə qiyamətdür, ey əmmə,
Gər Əkbərimün cismi səlamətdür, ey əmmə,
Kimdür bu cəvan cari olan qanı gətürdi.

Olmuşdı Əli azimi-meydanə səlamət,
Də`va edə üdvan ilə ol kani-rəşadət,
Mə`lum olunur nuş eləyüb cami-şəhadət,
Bikəs babam ol qanına qəltanı gətürdi.

Leyla anama eyləmə izhar bu halı,
Təğyir tapar halı, olar tirə xəyalı,
Zülm ilə mübəddəl olub hicranə vüsalı,
Arami-qərarı dili-Leylanı gətürdi.

Sən mane` bu gün olma bu göz yaşimə, əmmə,
Mən ağlamıram, bilgilən, öz başimə, əmmə,
Həsrət qalubam zülm ilə qardaşimə, əmmə,
Bikəs babam ol sərvi-dilaranı gətürdi.

Əkbər yarası dildə dəmadəm olu büruz,
Ta həşrə kimin eyləyərəm ol qədər əfsus,
Bu çərxi-fələk eylədi mən bikəsi mə`yus,
Sərdarım ölüb, nə`şini Sultanı gətürdi.

Zikr eyləgilən bu qəmi-pürsuzi dəmadəm,
Əzbər elə, Nadim, bu sözi mahi-mühərrəm,
Od dutdı qələm, yandı vərəq, ağla, ey aləm,
Ey əmmə, babam Əkbəri-ətşanı gətürdi.

**Cənab Əli Əkbərün növhəsi**

Dadə yetiş, Şahi-şəhidan baba,
Saldılar atdan məni üdvan, baba.

Saldılar atdan məni, çoxdur yaram,
Tez gəl hərayə, olur ömrüm təmam,
Vermə xəbər, bilməyə, bari, anam,
Bilsə, edər naləvü əfğan, baba.

Təşnə Fərat üstə kəsilmiş başım,
Cari olub ruyimə, gəl, göz yaşım,
Xeymədə ləbtəşnə qalub qardaşım,
İçmədi su Əsğəri-ətşan, baba.

Aldılar ətrafımı qövmi-dəni,
Eylədilər qan ilə əlvan məni,
Tərk elədi Şahi-şəhidan məni,
Göz yaşımı eylədilər qan, baba.

Yoxdı yetən bircə nəfər dadimə,
Yarım ola ta yetə fəryadimə,
Ey Şəhi-dövran, yetiş imdadimə,
Can verirəm ləbləri ətşan, baba.

Ləşkəri-məl`un məni əldən salub,
Taqətü aramımı əldən alub,
Xeymədə Leyla gözi yaşlı qalub,
İndi edir naləvü əfğan, baba.

Göz yaşımı eyləyərəm cari mən,
Səsləyərəm sən kimi sərdarı mən,
Tez gəl hərayimə, səni Tarı, mən,
Ta ölürəm azimi-rizvan, baba.

Yarə yetüb cismimə ləşkər qədər,
Qoydı oğulsuz səni ox, nizələr,
İcz elərəm, ey Şəhi-xunincigər,
Vəslin ilə et məni mehman, baba.

Nadimün aludə vüsalun olub,
Aşiqi-müştaqi-cəmalun olub,
Qəbrdə möhtaci-vüqarun olub,
Et şəbi-vəhşət onı mehman, baba.

**Mən, Hüseyn ibn Əlinün eli, arxasıydım**

Mən, Hüseyn ibn Əlinün eli, arxasıydım,
Bu susuz çöldə Ələmdar ilə səqqasıydım.

Canü cismə yetürən vəqtdə ə`da əcəli,
Gözin hifz eyləməgə dəf`inə yollalla eli,
Qalmayub məndən əlavə bunun ənsarü eli,
Hər yəman gündə bunun yavəri, arxasıydım.

Raziyəm payinə qurban kəsilim can ilə mən,
Belə əhd eyləmişəm Şahi-şəhidan ilə mən,
Ya gərək su aparam, ya boyanam qan ilə mən,
Haşimilərdə sədaqət nədi, mə`nasıydım.

Bu Şəhün Əsğərinə canımı qurban demişəm,
Su alam Əsğərə, ya qanə bata can demişəm,
Bu biyabanda olam qan ilə əlvan demişəm,
Bu Şəhün dadrəsü sərvi-dilarasıydım.

Bu biyabanə rəvadırmı Fərat cari ola,
Bu Hüseynün balası xeymədə ləbtəşnə qala,
Necə bülbül ola razi, tapa əl xar gülə,
Bu Hüseyn gülşəninün bülbüli-şeydasıydım.

Gəlmişəm cəngə Hüseyn eşqinə meydanə bu gün,
Ceyşi-ə`dani xizab eyləyərəm qanə bu gün,
Canımı bəzl elərəm şövq ilə Cananə bu gün,
Cismi-məcruhinə bir ruhi-dilarasıydım.

Tanıyun, rəzmdə şəhbazsifət pər açaram,
Töküb ə`da qanını, səhmlə xəncər açaram,
Xakə ə`da başını bərgi-xəzantək saçaram,
Qəhr ilə mövcə gələn lücceyi-dəryasıydım.

Nə qədər var nəfəsim, qoymaram övladi-Əli,
Qalalar xeymədə əfğan ilə ləbtəşnə vəli,
Ah, o vəqtdən içirərsüz mənə cami-əcəli,
Bilər aləm ki, onun möhnəti-üzmasıydım.

Ağlaram, vardur həyatım hələ dünyadə, sənə,
Mümkin olsa olaram zair o Minadə sənə,
Mültəcidür genə bu Nadimün üqbadə sənə,
Hər əzanun bilüsən natiqi-şeydasıydım.

## Çoxdı yarəm, vırmayun

Çoxdı yarəm, ey güruhi-bihəyalər, vırmayun,
Rahimi gözləllə övladi-Peyəmbər, vırmayun.

Vırmayun yarə mənə, bəsdür dəxi bu yarələr,
Müntəzir təll üstə gözlər Padşahi-xuncigər,
Bu yaralı haldən Leyla gər olsa baxəbər,
Söyləyər, va möhnəta, Leylayi-müztər, vırmayun.

Göz tiküb bikəs anam imdi yola, gözlər məni,
Bir yaralı ahutək seyd etdüz, ey ləşkər, məni,
Naümid etdi həyatımdan bu bir xəncər məni,
Bəsdi bu xəncər dübarə, bari, xəncər vırmayun.

Çün yəqinim oldı Leylanun oğulsuz qalmağı,
Etmisüz adət qəvi cəlladtək can almağı,
İstərəm Leylanı görmək ömrümün axır çağı,
Qalmayub tabü təvanım, qövmi-kafər, vırmayun.

Münqizi-bidin alub axır nəfəs aramımı,
Zülm ilə cari edüb ərzü səmayə qanımı,
İstərəm bir də görəm axır nəfəs cananımı,
Çoxdı yarəm, rəhm edün, qövmi-sitəmkər, vırmayun.

Axırı xar əl tapubdur səhni-gülşəndə gülə,
Nə rəvadur xar edə zülmü sitəmlər bülbülə,
Yol verün, can üstəyəm, bari, əlim yetsün ələ,
İntizarımdur mənim şəhzadə xahər vırmayun.

Bir ləin oldı düçar ol vəqtə nalan Əkbərə,
Əl tapub Yə`qubi-Əsqəlani dəsti-xəncərə,
Vırdı bir xəncər yarası surəti-Peyğəmbərə,
Söyləyərdi Əkbəri-şəhzadə, kafər, vırmayun.

Çün Üqab üstən yıxıldı Əkbəri-alinəsəb,
Yüz xiyamə döndərüb səsləndi ol kani-ədəb,
Keçdi iş-işdən, yetiş imdadimə, Şahi-ərəb,
Halinə rəhm eyləməzlər, sölər Əkbər, vırmayun.

*Əfrad*

Bu yarə bəsdi mənə, vırmayun dübarə məni,
Evimi yıxdı, yəqin öldürər bu yarə məni.

Atam gəlincə, məni vırmayun, sizi Tari,
Gələ oğulsuz atam, gül yüzün görüm, bari.

*Təmamiyi-növhə*

Ey baba, yox səndən özgə yarü imdadım, həray,
Səslərəm yetməz sənə əfğanü fəryadım, həray,
Qətlimə eylər şitab birəhm cəlladım, həray,
Saxlamaz əl, Əkbərün hərçənd sölər, vırmayun.

Nadiməm, göz yaşımı əldə qələm qıllam rəvan,
Bu əzayi-qəmfəzadə ağlaram ruzü şəban,
Bu Peyəmbərzadə məndə qoymayub tabü təvan,
Sölədi, çoxdı yaram, ey əşqiyalər, vırmayun.

**Fəryadə yetiş, varisi-Heydər, yaralandım**

Fəryadə yetiş, varisi-Heydər, yaralandım,
Aramım alub nizəvü xəncər, yaralandım.

Qan cari olur ruyimə, gəl, sər yarasından,
Yox tabü təvanım sərü peykər yarasından,
Busə yeri yox nizəvü xəncər yarasından,
Başım, bədənim yarədi yeksər, yaralandım.

Qanə boyanub nuri-düeynün, Şəhi-vala,
Çox yarə vırub saldıla dildən məni ə`da,
Gəl, ölməmiş apar yüzimi bir görə Leyla,
Görsün yüzümi Ali-Peyəmbər, yaralandım.

Leylayə denən, dildə hər həsrətləri qaldı,
Gülzarinə xar əl tapub, axır güli soldı,
Faş eyləmə, doğrandı Əli Əkbərün, öldi,
Qanə boyanub zülfi-müənbər, yaralandım.

Baba, bu yəman gündə yetiş dadimə, barı,
Sil gözlərimün qanını, dindür, səni Tarı,
Bu gün qabağından məni çək kölgəyə sarı,
Qan oldı mənə balıcü bəstər, yaralandım.

Zülmün şərərü şö`ləsi əflakə dayandı,
Qəlbimün vərəqi atəşi-hicran ilə yandı,
Gəl, sındı belün, Əkbərün al qanə boyandı,
Hədsizdi yaram, sanma mühəqqər, yaralandım.

Görsən məni, təğyir tapar halətü halun,
Başum yarası artırar ənduhü məlalun,
Məqsudim odur bir də görəm mah cəmalun,
Çeşmim nigəran rahuvı gözlər, yaralandım.

Ətrafımı ə`dalər alub dəstəbədəstə,
Çox yarə vırub saldıla sədparə qum üstə,
Seyd olmuşam ə`dalərə bir qanlı qəfəsdə,
Tir etməgə yox balü nə şəhpər, yaralandım.

Səyyadlərim seydsifət damə salublar,
Çox yarə vırub taqətimi əldən alublar,
Müştaqi-vüsaləm, baba, heyrətdə qalublar,
Yox dadrəsim, yarü nə yavər, yaralandım.

Yox səndən əlavə dəxi bir yarü pənahım,
Övc eyləyər əflakə, baba, naləvü ahım,
Rəhm eylə məni-bikəsə, yet dadıma, Şahım,
Qoyma kəsələr başımı ləşkər, yaralandım.

Yaz əldə qələm Əkbəri-şəhzadənün halın,
Əlvan eləyən vəqtdə qan Haşimi xalın,
Qanı boyayan vəqtdə, Nadim, rüxi-alın,
Söylərdi, yetiş, Şafiyi-məhşər, yaralandım.

## Cənab Əli Əkbərün sinəzəni Seyyidüş-şühədanun dilindən*

Əli, yandırma məni, nitqə gəl, ətşan bala vay,
Bir danış, mən də cəvabında deyim, can, bala vay.
Qanına qəltan, bala vay.

Gözün aç, yıxma evim, gör, Əli, qəddim bükülüb,
Sən kimi oğlum ölür, üstümə qəmlər tökülüb,
Gül yüzün gül kimi solmuş, ala gözlər sökülüb,
Düzülüb gül yüzüvə şəddeyi-mərcan, bala vay.
Qanına qəltan, bala vay.

Babavun göz yaşına rəhm et, Əli, gözlərün aç,
Haşımi xaluvi əlvan eləyüb xun ilə xak,
Bu oğulsuz baban az qaldı, Əli, olsun həlak,
Xabi-naz etmə, oyan, mən sənə qurban, bala vay.
Qanına qəltan, bala vay.

Qətrə-qətrə bürüyüb qan, bəzəyüb gül yüzüvi,
Pak edim qoy əlim ilə, Əli, qandan gözüvi,
Aç gözün, eylə təkəllüm, sölə bir sir-sözüvi,
Et vəsiyyətlərüvi, saxlama pünhan, bala vay.
Qanına qəltan, bala vay.

Görürəm qıçlaruvı çox uzadubsan, çəküsən,
Çün yəqin oldı mənə dari-fənadən köçüsən,
Özin asudə olub, üstümə qəmlər töküsən,
Gözi həsrət  toya, toy hicləsi viran, bala vay.
Qanına qəltan, bala vay.

---

«Sinəzəni-cənab Əli Əkbər əz zəbani-Seyyidüş-şühəda»

Mənə rəhm eylə, oğul, əldən alublar elimi,
Altı qardaş ölümi xəm eləyübdür belimi,
Səni də əldən alub kəsdilər çarə yolımi,
Mən oğulsuz eləyim, qoy, özüm əfğan, bala vay.
Qanına qəltan, bala vay.

Aparım xeymələrə nə`şüvi sinəmdə sənün,
Qaldı həsrətlərün axır, Əli, çeşmündə sənün,
Necə ağuşə alım, parələnibdür bədənün,
Bənd-bəndindən olub, yarədür hər yan, bala vay.
Qanına qəltan, bala vay.

Saldılar bu gunə o qaili-Qur`an balasın,
Belə kim öldürər aləmdə müsəlman balasın?
Əşqiya doğradılar Şahi-şəhidan balasın,
Cismüvi parələyüb navəkü peykan, bala vay.
Qanına qəltan, bala vay.

Göz önündən səni Leyla qoya bilməzdi kənar,
Oldı Leylanun işıqlı güni, gör, bir necə tar,
Qalmayub əhli-əyalımda dəxi səbrü qərar,
Gözlər imdi yoluvı Zeynəbi-nalan, bala vay.
Qanına qəltan, bala vay.

Nadim, ağla bu əzadə, yüzə tök göz yaşını,
Könlüvin şişəsinə vır bu müsibət daşını,
Şahi-din aldı dizi üstünə Əkbər başını,
Söylədi, bir də danış, nitqə gəl, ətşan bala vay.
Qanına qəltan, bala vay.

## Həzrət Əli Əkbərün dilindən

Məndən çəkün əl, ləşkəri-üdvani-şərarət,
Fəryadə babam Heydəri-Kərrarı çağırram.
Bu xeymədə vardur bir əmüm, kani-rəşadət,
İmdad üçün imdadə Ələmdarı çağırram.

Bilmün məni bikəs ki, mənim çoxdı pənahım,
Bais budur əflakə çıxar naləvü ahım,
Kəsdüz su yolun, xeymədə ləbtəşnədi Şahım,
Fəryadimə ol Şahi-mədədkarı çağırram.

Bu dəşti ləbaləb eləyüb ləşkəri-kinə,
Mehman gəlüb axır sizə Sultani-Mədinə,
Axır ətəşindən gəlüb əfğanə Səkinə,
Dövr eyləməyün dövrəmi, sərdarı çağırram.

Təşnə görübən Əsğəri, tab eyləmədim mən,
Gəldim su alam, xeymədə xab eyləmədim mən,
Aya məni tənha görüsüz firqeyi-düşmən,
İmdadə bu gün Cə`fəri-Təyyarı çağırram.

Biyarü həvadar məni bilməyün əl`an,
Yarə yetişüb cismimə, sinəmdən axar qan,
Gözlər yolumı xeymədə Sultani-şəhidan,
Bilmün məni bikəs, Şəhi-biyarı çağırram.

Var altı əmüm xeymədə, ey qövmi-şərarət,
Cümlə hamısı mərdi-dəlirü sahibi-surət,
Miras idi Heydərdən ona səhmü səlabət,
Əbbasi-hünərpərvərü qəmxarı çağırram.

Nadim, elə bu bəzmdə sən göz yaşı cari,
Əbbasün əlindən o zəman getdi qərari,
Ağuşə çəküb Əkbəri sölüb, səni Tari,
Yalvarma, oğul, tiri-şərərbarı çağırram.

### Ölürəm, baba, tez gəl

Ey Sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

Əldən gedüb təvanım, dura bilməm əyağə,
Bir də görəm yüzüvi, düşdüm bu iştiyaqə,
Apar məni, öləndə Leyla alsun qucağə,
Ey Sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

Atdan yıxılmışam mən, baba, tez gəl imdadə,
İmdad eylə, əmandur, baba, bu namuradə,
Başım cəllad əlində, yalvarıram cəlladə,
Ey Sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

Həsrətlərim təmamən qaldı dili-Leyladə,
Olma riza, baba, icz edim əhli-inadə,
Seyd olmuşam yaralı, min qan tökən səyyadə,
Ey Sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

*Əfrad*

Bu Münqizi-ləin əldən qərarımı aldı,
Belə güman edirəm, did məhşərə qaldı.

*Baqiyi-növhə*

Gözləllə xeymələrdə əhli-hərəm yolumi,
Zülm ilə əhli-kinə soldurdılar gülimi,
Apar bikəs anama, deyim dərdi-dilimi,
Ey sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

*Fərd*

Əmandı, qibləyə gəl, ey baba, görüm yüzüvi,
Apar öləndə, deyim, bari, madərə sözimi.

*Baqiyi-növhə*

Yox səndən özgə bir kəs yarü müinim olsun,
Bir kimsə yox yaralı başım qucağə alsun,
Bu can verən zəmanda mənə imdadə gəlsün,
Ey sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

*Fərd*

Qərib anama de, gülşəndə gülləri soldı,
Cəvan Əli balavun toy təbağı qan oldı.

*Baqiyi-növhə*

Yox səndən özgə bir kəs, ey Şahi-din, pənahım,
Gəlməz yaram şümarə, övc eylər ərşə ahım,
Bu can verən zəmanda, yet dadə, padşahım,
Ey Sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

*Fərd*

Əmandı, qoyma məni atlarun əyağında,
Oğula, xoşdı verə can ana qucağında.

*Təmamiyi-növhə*

Apar ölən zəmanda Leyla müinim olsun,
Yaralı nə`şimi ol bikəs qucağə alsun,
Baş nə`şim üstə açsun, zülfün Səkinə yolsun,
Ey Sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

Hər qədr həyatun olsa dari-fənadə, Nadim,
Göz yaşı tök üzarə bəzmi-əzadə, Nadim,
Qəmxarun olsun Əkbər ruzi-cəzadə, Nadim,
Ey Sərvəri-Mədinə, ölürəm, baba, tez gəl,
Yolum gözlər Səkinə, ölürəm, baba, tez gəl.

**Oyan, sərdar Əli Əkbər**

Salub getmə bu biyarı,
Mənə qəmxar, Əli Əkbər.
Gözün aç, bir səni Tarı,
Əli Əkbər, Əli Əkbər.

Gül olmaz səhni-gülşənsiz,
Daha gülməz yüzüm sənsiz,
Baban ölməz neçün sənsiz?
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Mənə rəhm et, oğul, imdi,
Müinü yavərim kimdi,
Səni görcək belim sındı,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Olubdur göz yaşım əlmas,
Dutublar Əhli-Beytim yas,
Mənə rəhm et, ölüb Əbbas,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Kimim var dadimə gəlsün,
Ənisü munisim olsun,
Riza olma belim sınsun,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Qəribəm, yoxdı salarım,
Ölüblər yarü ənsarım,
Batub qanə Ələmdarım,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Sitarəm, tez qürub etdün,
Özün məqsudüvə yetdün,
Məni yalquz qoyub getdün,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Dolub qan ilə hər yanun,
Axub çeşmün, çıxub canun,
Silim, qoy, gözlərün qanun,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Axubdur başuvun qani,
Gözün aç, Yusifi-sani,
Gətürmə rəzmə Leylani,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Səni dildən salub xəncər,
Du gəl ağuşimə, Əkbər,
Bacım Zeynəb yolum gözlər,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

Qələm əldə, Əli Əkbər,
Həmişə Nadimi-müztər,
Edibdür vəsfüvi əzbər,
Oyan, sərdar Əli Əkbər,
Əli Əkbər, Əli Əkbər.

**Həzrət İmam Hüseyn (ə)-ın dilindən Əli Əkbərə**

Aç gözün, əmandı, rəhm et Şahi-Kərbəlayə, Əkbər,
Şö`ləlndi ahım əl`an, övc edər səmayə, Əkbər.

Tez qürub edübsən axır sən işıqlı yıldızımsən,
Qəlbimün sərvəri, oğlum, tabü taqəti-dizimsən,
Çeşmimün ziyası, Əkbər, həm bəsirətən gözimsən,
Sənsiz etmərəm nəzarə aləmi-fənayə, Əkbər.

Arizuyi-qəlbim, Əkbər, cümlə qaldı dildə pünhan,
Yetmədün muradü kamə, bəzmi-eyşim oldı viran,
Olmadun cəhandə damad, toy otağun oldı meydan,
Həsrət oldı çeşmün axır şərbəti-Minayə, Əkbər.

*Fərd*

Bu idi arizum, Əkbər, edim səni damad,
Mədinə əhli verəydi mənə mübarəkbad.

*Baqiyi-növhə*

Səni yetmədün muradə, işrətün fəğanə döndi,
Kərbəladə toy libasun zülm əlilə qanə döndi,
Mən səni bu növ` gördüm, qamətim kəmanə döndi,
Razi olma icz edim mən ceyşi-əşqiyayə, Əkbər.

Rəhm eylə, Əli, əmandı, bu qəribü bipənahə,
Bu cəhandə zülm olubdı, söylə, səntək hansı şahə?
Tə`sir eləyür fəğanü naləm imdi mehrü mahə,
Çünki həsrət oldı çeşmim xişü əqrəbayə, Əkbər.

*Fərd*

Əyağə dur, aparım xeyməyə bu gül bədənün,
Ölən zəmandə anan ağlasun doyunca sənün.

*Baqiyi-növhə*

Yıxdılar evimi düşmən, aldılar səni əlimdən,
"Va Əli" sədası düşməz can verüncə ta dilimdən,
Xarlər tapub əl, axır ayrı saldılar gülimdən,
Qoy, yüzin-yüzimə mənlə ver səda-sədayə, Əkbər.

Rəsmdür, açar çəməndə gülü lalə şəbnəm üstə,
Qətrə-qətrə qan durubdur gül misal didən üstə,
Dur, o qanlı başuvı qoy, bu yaralı sinəm üstə,
Keçməmiş səri-vəcihün zülm ilə cidayə, Əkbər.

*Fərd*

Yaralı sinəmə qoy başuvı, cəvanım oğul,
Gəlürdi bircə sənə dəhrdə gümanım, oğul.

Təmamiyi-növhə

Açmasan[*] gözün nədən bəs, yoxsa qan ilə dolubdur,
Rəhm elə, oğulsuzam mən, qamətim kəman olubdur,
Dur, gedək xiyamə, Leyla imdi bağrıqan olubdur,
Xeymədə özün təsəlli ver o binəvayə, Əkbər.

Çün məni cünun edibdür aləm içrə Əkbər eşqi,
Hər əzadə zakir eylüb varisi-Peyəmbər eşqi,
Məhv edübdi tabımı ol rövzeyi-mütəhhər eşqi,
Nadimi seyyümbar zair eylə Kərbəlayə, Əkbər.

**Həzrət Zeynəbün dilindən Əli Əkbər növhəsi**

Nizə başında, Xuda, nuri-təcəlla görünür,
Şəms ilə qövsü qəmər olmuş hüveyda görünür.

Görünür çeşmeyi-dil nurmisal qövsü qəmər,
Ya mələkdür bu kəsik baş, Xuda, ya ki, bəşər,
Onı görcək yüzümə oldı rəvan əşki-bəsər,
Dövri-ruyində siyah zülfi-səmənsa görünür.

Bu mənim qəlbimün aramıdur, aramım olub,
Məni Məcnun kimi qolbağlı xiyabanə salub,
Necə Əkbər deyüb, Allah, bu nə gül rəng solub,
Əl vırur zülfün açır, kəlbeyi-Leyla görünür.

Muyi-zülfində, oğul, qətrələnüb qan düzülüb,
Əbrişəm üstə misal şəddeyi-mərcan düzülüb,
Sən kimi oğlum ölübdür, əlim əldən üzülüb,
Zibh olan tək-təki guya səri-Yəhya görünür.

---

[*] Açmazsan

Şamə getsə bu kəsik başun, oğul, sənlə varam,
Tökərəm ruyimə göz yaşım, oğul, sənlə varam,
Şamyan atsa cəfa daşın, oğul, sənlə varam,
Gərçi bəxtimdə mənim möhnəti-üzma görünür.

Ah, o vəqtdən başuvı eylədilər varidi-Şam,
Qürfəvü bamə çıxub xəlq təmaşayə təmam,
Dedilər, kim bu cəvanə eləyüb ömri təmam?
Odı nimşəqq edən ayə, budı Musa görünür.

Zülfi-mişkinün alub dövrüni çün əbri-bəhar,
Yusifi-sanidi aya, nə ala gözləri var,
Qoymadı bizdə bu şəhlayi gözün səbrü qərar,
Ya ki, darə çəkilən Həzrəti-İsa görünür.

Etdilər Şamə Züleyxaləri göz yaşı rəvan,
Gördülər zülfünü əlvan eləyüb qırmızı qan,
Dedilər, ah, anan ölsün sənün, ey tazə cəvan,
Qanlı ruyində sənün nuri-Məsiha görünür.

Çox çətindür ki, çəməndə belə əhmər gül ola,
Nə rəvadur belə gül zərbəti-tir ilə sola,
Səngdil qatilivün əlləri, ya Rəb, şil ola,
Bad əsüb zülfün atanda rüxi-ziba görünür.

Degi Musa bu cəvan, Həzrəti-Zəhra gülidür,
Bu Hüseyn ibn Əli gülşəninün bülbülidür,
Ümmi-Leylanun Əli Əkbəri-şirindilidür,
Eyləyüb qanı hədəf zülminə ə`da, görünür.

Budı Leylanı edən dəhrdə avarəvətən,
Budı məhşər günü asilər üçün dadə yetən,
İltifat eylə, Əli, Nadimi-məhzunüvə sən,
Çünki şə`nində sənün rəhməti-üzma görünür.

**Yetiş imdadə, baba, halı pərişan ölürəm**

Yetiş imdadə, baba, halı pərişan ölürəm,
Eyləyüb əhli-cəfa qanıma qəltan, ölürəm.

Özüvi tez yetür, ey təşnələrün dadrəsi,
Əkbərün qanə batubdur, budur axır nəfəsi,
Eşidüb xeymədə çün madəri Leyla o səsi,
Dedi, o sövtüvə qurban ola Leylan, ölürəm.

Gəl, apar əmmələri, cümlə mənə ağlayalar,
Baş açub nə`şimün üstündə, sinə dağlayalar,
Can verən vəqtə mənim gözlərimi bağlayalar,
Yanaram təşnəcigər mən ləbi-suzan, ölürəm.

Baba, tez gəl, məni-biçarəni bir yanə apar,
Yolumı gözləyür ol madəri-nalanə apar,
Gözümi bağlasun ol xanəsi viranə, apar,
Bağlasun gözlərimi madəri-nalan, ölürəm.

Gəl, apar, barı, öləndə o vəfadarı görüm,
Can verən vəqtə, baba, xahəri-naçarı görüm,
Bir doyunca baxım, ol Abidi-bimarı görüm,
Bu zəman rahi-bəqa eyləyüb əl`an ölürəm.

Gedüb əldən, babacan, tabü təvanım bu zəman,
Əcəl eylər məni əl`an, baba, rizvanə rəvan,
Çox yaram var, məni əlvan eləyüb qırmızı qan,
Çıxırı* canım ətəşdən, elə ehsan, ölürəm.

Qüvvətü tabü təvanım dəxi yox məndə, baba,
Zülm ilə tazə gülün soldı bu gülşəndə, baba,
Lütf elə, görməgə qurbanuvı, gəl, sən də, baba,
Boyanub qanıma bu ərseyi-meydan, ölürəm.

Zülm ilə aldı əlindən məni bir növ`i fələk,
Yetişüb vəqti-əcəl, azimi-rizvan edəcək,
Susuzam, gün qabağından məni, gəl, kölgəyə çək,
Olmuşam, ey baba, öz qanıma yeksan, ölürəm.

Zülfümə ləxtəbələxtə bələşüb xun ilə xak,
Anama halımı bildirmə, özün eylər həlak,
Olu məndən sonra  o ağlayuban sinəsi çak,
Məni Leylanun əlindən alub üdvan, ölürəm.

Yüz qoyub Sərvəri-din ərseyi-meydanə tərəf,
Yetişüb rəzmə çün ol varisi-Sultani-Nəcəf,
Gördi sədparə düşüb Əkbəri al qanə hədəf,
Söylədi, sındı belim, Yusifi-Kən`an, ölürəm.

Oğlınun başınun üstə yetişüb Şahi-cəhan,
Başını qoydı diz üstə dedi, ey mahi-cəhan,

* Çıxır

Xeymələrdə yoluvı gözliri* gözyaşlı anan,
Həşrətək eyləyəcək Nadimin əfğan, ölürəm.

**Ya Rəbb, bu gün kimdi ki, Peyğəmbərə bənzər**

Ya Rəbb, bu gün kimdi ki, Peyğəmbərə bənzər,
Surətdə, vəcahətdə məhi-ənvərə bənzər.

Məhv etdi hamı ləşkəri çün mahi-cəmali,
Əbruləridür qövsü quzeh, taği-hilali,
Gül qönçəsi rüxsarə bəzək Haşimi xali,
Zülfi şəbi-zülmati-fələkəxkərə bənzər.

Təştə tökülən qanı bu Yəhyadı bu, ya Rəb,
Tur üstə gəzən həzrəti-Musadı bu, ya Rəb,
Darə çəkülən həzərti-İsadı bu, ya Rəb,
Çox həzrəti-İsmaili-gülhəncərə bənzər.

Yox-yox ki, qələtdür buna Yəhya demək olmaz,
Bihiss düşən həzrəti-Musa demək olmaz,
Darə çəkülən həzrəti-İsa demək olmaz,
Bir zərbət ilən Əmri bölən Heydərə bənzər.

Bu sahibi-İncildi və ya sahibi-Tövrat,
Nurani olur ruyi ki, xurşidü səmavat,
Zülfi şəbi-yeldadı, dutub dövrini zülmat,
Şəhla gözi Yasin oxunan yavərə bənzər.

---

* Gözləyir

Yoxsa bu Peyəmbərdi gəlüb bu çölə, yaran,
Razi ola bilmüb[**] ola ətfalı hərasan,
Tənha, yaralı görmüş Hüseyn oğlunı ətşan,
İmdadə gəlüb oğluna ol yavərə bənzər.

Ol vəqtə səda etdi Ömər Sə`di-cəfakar,
Heç xövfü həras eyləməyün, ləşkəri-əşrar,
Kim olmağını mən bu cəvanun edim izhar,
Kimdür ki, görün, hüsndə bu kimlərə bənzər.

Ey qövmi-dəğalər, bu Peyəmbərdi ki, billah,
Xövf eyləməyün Şafiyi-məhşərdi ki, billah,
Xeybər dağıdan qatili-Əbtərdi ki, billah,
Əkbərdi, səlabətdə Qəzənfərfərə bənzər.

Biçarə Hüseynün gedüb hər cahü cəlalı,
Ləbtəşnə qalub xeymədə ətfalü əyalı,
Solmaqdan ötər göndərüb ol mahi-cəmalı,
Gülşəndə susuzdan saralan güllərə bənzər.

Gəhvarədə ağlar susuzundan Əli Əsğər,
Su almağa meydanə gəlibdür Əli Əkbər,
Tikmüş buna göz cümlə hamı Ali-Peyəmbər,
Bu şibhi-Nəbidür, bəli, Peyğəmbərə bənzər.

Bildim bu Hüseynün gedüb hər çarəsi əldən,
Zülm ilə kənar etdim əcəb bülbüli güldən,
Vermün buna fürsət dəxi siz möhlət əcəldən,
Səflər dağıdan, Xeybər alan Səftərə bənzər.
Nadim o susuz haluva qurban, Əli Əkbər,

---

[**] Bilməyib

Leylanı qoyan xanəsi viran, Əli Əkbər,
Hər ruzü şəban eylərəm əfğan, Əli Əkbər,
Başun yarası zəxmi-şəfi`i-məhşərə bənzər.

**Verdi rüxsəti Şahi-Kərbəla**

Verdi rüxsəti Şahi-Kərbəla cəngdən ötri xoşmənzər Əkbərə,
Ta gedüb ala əhli-Kufədən bircə cür`ə su Ali-Heydərə.

Ol zəman Səkinə edüb fəğan,
Bu zəban ilə eyləyüb bəyan:
Getmə meydanə, qardaş, əl-əman,
Rəhm elə məni-zarü müztərə.

Ali-Heydəri eyləyüb vida,
Çün olan zəman azimi-Mina,
Söylədi Hüseyn şah ol Xuda,
Bir gəlür gümanım bu yavərə.

Vermişəm rəhi-eşqdə, Xuda,
Ta gedüb edə canını fəda,
Əhdimə gərək eyləyim vəfa,
Ta olam şəfi` əhli-məhşərə.

Eyləyüb xudahafiz ol cəvan,
Səmti-rəzmgahə olub rəvan,
Şə`ni-rütbədə Yusifi-zəman,
Vırdı çün özün fövci-ləşkərə.

Bir neçə rəcəz eyləyüb əda,
Lərzəyə düşüb dəşti-Kərbəla,
Eyləyüb həray ceyşi-əşqiya,
Qüssə yüz verüb Şimri-kafərə.

Ol ləin olub qüssədən kəbab,
Əhli-ləşkərə eylədi xitab,
Yoxdı bir nəfər, qövmi-bihicab,
Olsun həmcədəl bu dilavərə.

Rudtək duran ceyşi-əşqiya,
Ar ola sizə, qövmi-bihəya,
Sə`di-bihəya eyləyüb səda,
Almısuz əbəs xəncər əllərə.

Bir ləin olub mərkəbə səvar,
Çəkdi bir neçə nə`rə aşikar,
Kuhtək dutub rəzmdə qərar,
Tir həm sipər aldı əllərə.

Söylüb, ey cəvan, mən hünərvərəm,
Min səvariyə həm bərabərəm,
Çoxdı şöhrətim, çün dilavərəm,
Əl atam əgər tirü xəncərə.

Qeyzə çün gəlüb Əkbəri-cəvan,
Qəhr ilə edüb misriyi bəyan,
Zərbi-dəstüvi etgilən əyan,
Şəstüvi əyan eylə ləşkərə.

Çəkdi nə`rə ol kəlbi-kəmtərin,
Durdı çün rikab üstə ol ləin,
Endirən zəman gögdən əllərin,
Qüssə yüz verübdi hərəmlərə.

Gəzdirüb atın şibhi-Müstəfa,
Çəkdi şəmşiri bərqi-pürbəla,
Lərzəyə düşüb dəşti-Kərbəla,
Mərhəba səsi yetdi göglərə.

Endi çün qılınc, böldi miğfəri,
Eyləyübdi qəm Misr kafəri,
Biçdi cismini, böldi mərkəbi,
Eyəlyübdi nim, saldı çün yerə.

Şiələr müdam ağlasın gərək,
Nalə eyləsün ruzi-həşrətək,
Həsrət ölməgi verdi bu fələk,
Kərbəladə şibhi-Peyəmbərə.

Kəsdi başını, cismini salub,
Şövqü zövq ilə xeyməyə gəlüb,
Çün Hüseyndən cayizə alub,
Nadim ərz edüb ağlar Əkbərə.

**İmam Hüseyn (ə)-ın dilindən**

Aç gözlərün, mələkrüxsarım Əkbər,
Şəbihi-Əhmədi-Muxtarım Əkbər.

Riza olma əlim əldən üzüm mən,
Görürsən bu Minada yalquzam mən,
Mənə rəhm et, Əli, oğulsuzam mən,
Gedüb əldən hamı qəmxarım, Əkbər.

Müinim, yavərim əldən alublar,
Əyalü itrətim ətşan qalublar,
Səni ləbtəşnə xak üstə salublar,
Batubdur yasə bacılarım, Əkbər.

Mən ölməmiş dutub Zeynəb bacım yas,
Rəvandur əşki-didəm misli-əlmas,
Ələm yatdı, əlimdən getdi Əbbas,
Görürsən yox dəxi sərdarım, Əkbər.

Batub rüxsarun alü qanə əlvan,
Ədulər etdilər qanuva qəltan,
Yolun gözlər təmamən Ali-İmran,
Qalubdur müntəzir bimarım, Əkbər.

Bu zülfi-mişkinin batıbdı qanə,
Özüm əfğan edüb gəlləm fəğanə,
Gələ lə`nət, oğul, sənsiz cəhanə,
Bu gün yox etdilər əğyarım, Əkbər.

Gözün aç, gəldilər, vardur hərasım,
Qəbul et, bari, sən bu iltimasım,
Batubdur Övnü Cə`fər qanə Qasim,
Dəxi yox bir nəfər simsarım, Əkbər.

Sənün bu ölməgün qəlbimi dağlar,
Mənim bu halimə düşmənlər ağlar,
Gərək geysün qəra tazə cəvanlar,
Əli vay, söyləsün zəvvarım, Əkbər.

Mərcan kimi zülfündə qan düzüldi,
Anan ümmidi hər yandan üzüldi,
Əsasü rövnəqim yeksər pozuldı,
Hücumavər olub əğyarım, Əkbər.

Həyatım var hələ dünyadə, Nadim,
Əgər vardur gözün üqbadə, Nadim,
Əli Əkbər qəmin sal yadə, Nadim,
Ümidim var, ola qəmxarım Əkbər.

**Xeyməl追rdə Əsğəri gördi Əli Əkbər susuz**

Xeymələrdə Əsğəri gördi Əli Əkbər susuz,
Ağlayar gəhvarədə ol tifli-məhpeykər susuz.

Gördi çün suzi-ətəşdən ləbləri gültək solub,
Bu müsibət ol cəvanun taqətin əldən alub,
Xeymələrdə gördi çün Ali-Əli ətşan qalub,
Əldə cam ağlar ətəşdən Ali-Peyğəmbər susuz.

Çün hüzuri-Şahi-valayə gəlüb ol növcəvan,
Payi-Mövlayə döşəndi, bu sözi etdi bəyan:
Təşnəlıqdan qalmayub tifl Əli Əsğərdə can,
Nə rəvadur xeymədə qalsun Əli Əsğər susuz.

Verdi çün Şahi-şəhidan izni-meydan Əkbərə,
Rüxsəti-meydan alub yüz qoydı səmti-ləşkərə,
Bəlkə alsun bircə cür`ə su Əliyyü Əsğərə,
Xeymədə gördi qalıbdur itrəti-Heydər susuz.

Sədri-meydanə yetüb Əkbər, mübariz istədi,
Cür`ət eylüb ol zəman meydanə bir kəs gəlmədi,
Ol zəman çəkdi cigərdən nə`reyi-bir ya Əli,
Çün özin vurdı səfi-ə`dayə ol yavər susuz.

Çəkdi bir nə`rə, dedi, ey qövmi-dun, mən Əkbərəm,
Mən zəmanimdə  şəbihi-surəti-Peyğəmbərəm,
Həm səlabətdə, şücaətdə Əmiri-Xeybərəm,
Kəsməgə baş, tökməgə qan, əldəki xəncər susuz.

Bir qədr də`va edibdür ol cəvani-növrəsid,
Çün rəvan etdi cəhimə bir neçə qövmi-pəlid,
Qoydı yüz qaçmağlığa ol qövmi-biarü ənid,
Fövci-ə`danı dağıtdı ol məhi-ənvər susuz.

Əhli-Kufə qaçmağa yüz qoydı yeksər ol zəman,
Fövci-ə`dadən ucaldı, əl-əmanü əl-əman,
Bir neçə namavəri eylüb dünim ol növcəvan,
Ləşkər içrə vəlvələ saldı çün ol sərvər susuz.

Çün zəban açdı bu növ`, ləşkərə qıldı bəyan,
Bircə cür`ə su verün, ehsan edün, ey kufəyan,
Qalmayub, vallah, susuzdan məndə heç tabü təvan,
Üç gecə-gündüzdi bu ləblər susuz, Əkbər susuz.

Əsğərə su və`də etmişdim gələndə, əhli-Şam,
Yollar üstündə durub nazlı Səkinə əldə cam,
Rahımi gözlər gözi yaşlı, fəğan eylür anam,
Göz yaşın eylür rəvan Leylayi-qəmpərvər susuz.

Bir qədr vırsaz, rizayəm, cismimə yarə, vurun,
Təşnədür Əsğər, ona bir cür`ə, bari, su verün,
Ali-Peyəmbər susuzdan yandı, bir insaf edün,
Xeymələrdə Ali-Peyəmbər qalub yeksər susuz.

Nadima, ağla bu qəmdə, şur ilə eylə nəva,
Bu müsibətdən fəğan eylər hamı şahü gəda,
Ədl divanun quranda ruzi-məhşərdə Xuda,
Qoymasun ol gün məni ol Şafiyi-məhşər susuz.

**Ey cəddəcan, babamı imşəb rö`yadə gördüm**

Ey cəddəcan, babamı imşəb rö`yadə gördüm,
Kəşti düşübdi ləngə, bir qan dəryadə gördüm.

Gördüm alub babamun ətrafını ə`dalər,
Yoxdur yanında Qasim, Əbbasü Övnü Cə`fər,
Gördüm yanında yoxdur burdan gedən köməklər,
Ali-Əbanı yeksər qalmış aradə gördüm.

Əbbas əmumi gördüm ə`da kəsüb yoluni,
Səflər əhatə eylüb gördüm sağü soluni,
Çün nəhri-Əlqəm üstə salmışdılar qoluni,
Qan ilə məşk dolmuş, nə`şin aradə gördüm.

Sərdar atamı gördüm, gültək solub cəmali,
Talan olub əsası, tarac olub mənali,
Səyyadə seyd olubdur ahusifət əyali,
Qalmış Səkinə bacım ahü nəvadə, gördüm.

Qarə geyüblə gördüm, Ali-Peyəmbər ağlar,
Gəhvarədə susuzdan şəhzadə Əsğər ağlar,
Göz yaşlı, sinə dağlı, nazlı hərəmlər ağlar,
Leyla anamı məhzun, bəzmi-əzadə gördüm.

Gördüm babam Hüseyni, tənha qoyubla ləşkər,
Əlvan olubdı qanə sədparə cismi-Əkbər,
Sirab olubdı gördüm öz qanı ilə Əsğər,
Qundağı qərq olubdur qanə Minadə gördüm.

Gördüm babam edibdür bir toy o çöldə icad,
Bir ləhzə Qasim olmuş, gördüm o çöldə damad,
Qandan həna əlinə yaxmış ərusi-naşad,
Filfövr əsir olubdur əhli-inadə gördüm.

Gördüm babamı səflər almışdılar arayə,
Cari olubdı qanı meydani-Kərbəlayə,
Ali-Əbanı gördüm vermiş səda-sədayə,
Ənqa kimi pər açmış, zəxmin ziyadə gördüm.

Mən Nadiməm, həmişə nari-fənayə yannam,
Qanə dönübdi əşkim, al qan ilə boyannam,
Görsəm o qəbri bir də, şövt eyləyüb dolannam,
Göz yaşımi rəvan hər bəzmi-əzadə gördüm.

**Səni əldən alub məni qoydular yalquz**

Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Yalquzladı səni ləşkər, toprağə saldı,
Qanun axub şəhla gözün qan ilə doldı,
Əl`an evim yıxıldı, qapım bağlı qaldı,
Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Canə doydum bu ceyşi-bədbünyad əlindən,
Bu əhli-Kufəvü Şamun fəryad əlindən,
Gəldim səni xilas edim cəllad əlindən,
Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Ə`vanım doğranub təmamən, bir kəsim yox,
Sərdarü salarım, yarım, həmnəfəsim yox,
Qardaşlarım ölüb, Əkbər, dadrəsim yox,
Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Atavın halına, rəhm et, mahi-Mədinə,
Qardaş deyüb ağlar, gözlər yolun Səkinə,
Yaxşı çirağımı keçirtdi əhli-kinə,

Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Cəddim Peyğəmbərə bənzər gözlər söküldi,
Alışdı canım, üstümə qəmlər töküldi,
Yaralı qəlbimə oğul dağı çəkildi,
Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Çeşmim ziyası, lə`nət bu dünyayə sənsiz,
Ağlar, gözüm yaşı dönər dəryayə sənsiz,
Şəmatət eyləyür ə`da Leylayə sənsiz,
Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Qıllam nəzarə cismüvə yarədi yeksər,
Gəl, sinəm üstə qoy başun, şibhi-Peyəmbər,
Dur, xeyməyə gedək, yolun gözlür hərəmlər,
Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

Tökər göz yaşını Nadimi-biçarə, ağlar,
Sinəzən növhə edüb, ağlar cəvanlar,
Əkbər başı üstə söylərdi əbrar,
Səni əldən alub məni qoydular yalquz,
Yaxşı belim sındı, Əli, qaldım oğulsuz.

## Leylanun xitabı Kərbəla yerinə
## Əli Əkbər xüsusunda

Kərbəla, bu Əkbəri-ətşanı tapşurdum sənə,
Əlləri al qan ilən əlvanı tapşurdum sənə.

Yaxşı saxla, can sənün, ey Kərbəla, can Əkbərün,
Arizusi qaldı çün könlündə pünhan Əkbərün,
Xun ilə gül cismini eylüblə əlvan Əkbərün,
Zülfləri al qan ilə yeksanı tapşurdum sənə.

Yaxşı saxla, Kərbəla, ə`zası parə-parədür,
Cismi-paki Əkbərün başdan-əyağə yarədür,
Çox vırublar əhli-kinə, peykəri sədparədür,
Həq yolunda zibh olan qurbanı tapşurdum sənə.

Səndə qoydum, Kərbəla, bu bülbüli-nalanı mən,
İmdi tapşurdum sənə bu ləbləri ətşanı mən,
Qoymadı Şimr ağlayam bu Əkbəri-nakamı mən,
Zülm ilən gül peykəri al qanı tapşurdum sənə.

Kərbəla, incitmə, barı, bu ləbi ətşanı sən,
Xun ilə əlvan olubdur Əkbəri-gülpirəhən,
Çün sənə verdim əmanət Yusifi-Kən`anı mən,
Kərbəla, bu Yiusifi-Kən`anı tapşurdum sənə.

Kərbəla, qüsl etmədim bu növcəvani-Haşimə,
Münqizi-bidin dizimdə çəkdi xəncər başimə,
İstədim əza dutam, mane` olu göz yaşimə,
Qumlar üstə peykəri üryanı tapşurdum sənə.

Kərbəla, toy etmədim bu Əkbəri-nalanıma,
Çün olub bais bu niyyət naləvü əfğanıma,
Əkbərün bu niskili saldı şərarə canıma,
Bu şəhidi-ləşkəri-üdvanı tapşurdum sənə.

Ağlaram mən bu əzayi-qəmfəzadə, Kərbəla,
Zibh olub İsmailim kuhi-Minadə, Kərbəla,
Ağlayar cümlə mələklər bu əzadə, Kərbəla,
Xəncər ilə doğranan mehmanı tapşurdum sənə.

Münqizi-bidin bu gün ağlar qoyub mən müztəri,
Zülm ilə eylüb şəhid nakam Əliyyül-Əkbəri,
Qan ilə əlvan edibdür surəti-Peyğəmbəri,
Bu zəbihi-xəncəri-bürranı tapşurdum sənə.

Daima bu qəmdə mən lazımdı sinə dağlayam,
Qoymadılar oğlumun çün nə`şi üstə ağlayam,
Olmadı fürsət öləndə gözlərini bağlayam,
Kərbəla, bu həsrəti-giryanı tapşurdum sənə.

Nadimi-biçarə bu qəmdə olubdur növhəxan,
Daima bu mətləbi nəzmə çəküb eylər bəyan,
Qaldı səndə, Kərbəla, bu Əkbəri-şirinzəban,
Qəlbi-aramü dili-Leylanı tapşurdum sənə.

## **Həzrət Leylanun dilindən**

Parə-parə doğranan ə`zası, ətşan Əkbərim,
Şövq ilə canın verən Cananə qurban, Əkbərim.

Ey oğul, ağlar gözüm eşqündə, ağlar sübhü şam,
Ömri-dünya oldı bundan sonra Leylayə həram,
Çünki yeksər qaldılar həsrətlərim gözdə təmam,
Qaldı cümlə arizum könlümdə pünhan, Əkbərim.

Zəhmətin on səkkiz il çəkdim, fənayə getmədi,
Arizusinə, oğul, dünyadə Leyla yetmədi,
Növcəvanlar tək sənə damad edüb toy etmədi,
Toy otağın oldı bu səhradə meydan, Əkbərim.

Arizu etdim sənə toy hicləsi abad edəm,
Bu dili-məhzunimi dünyadə bəlkə şad edəm,
Olmadı qismət, sənə toy eyləyüb damad edəm,
Oldı toy rəxtün kəfən qan ilə yeksər, Əkbərim.

Toy hənası yaxmadun, ey Əkbəri-gülpirəhən,
Yetmədün kami-muradə namuradü bivətən,
Toy libasun oldı bu səhradə bir qanlı kəfən,
Toy təbağı qan, hənası xaki-meydan, Əkbərim.

Arizular qaldı, Əkbər, qəlbi-Leyladə hər il,
Hər qədər olsa həyat, ağla bu qəmdə müttəsil,
Kur olaydım, görməyeydim cismüvi beylə zəlil,
Ey düşən gül cismi qumlar üstə üryan, Əkbərim.

Nə`şüvi bu növ` ilə görməkligə yox məndə tab,
Cismüvi başdan-əyağə eyləyüb al qan xizab,
Mən səni bu növ` ilə görcək olub qəlbim kəbab,
Çəkməgə bu möhnəti Leyladə yox can, Əkbərim.

*Əfrad*

Əyağə dur, mən ilə bircə gəl verək əl-ələ,
Çətindür bir də, Əli, madərin bu dəştə gələ.

Gözüvi aç, nəzər et halimə, səni Tarı,
O gül yüzün öpüm axır, vida edim barı.

Oğul, bu halətin aramımı əlimdən alub,
Gül üzli oğlum ölüb, əllərim yüzimdə qalub.

Qolumı bağlayub ə`da əsir edüblə məni,
Yox ixtiyarım, oğul, dəfn edim bu gül bədəni.

Xəyal eyləmə sənsiz ki, Şamə mən gedərəm,
Başun qabağə salub, ağlayub fəğan edərəm.

Dedim, Mədinədə mən eylərəm səni damad,
Mədinə əhli verərlər mənə mübarəkbad.

*Təmamiyi-növhə*

Toy otağı ki, cəvanlar edər icad, eyləsün,
Ağlayub bu Əkbəri-nakamımı yad eyləsün.
Şiələr Leylayə göz yaşilə imdad eyləsün,
Çünki ümmətlər yolında oldı qurban Əkbərim.

Siğə qardaşlarıvun cümlə gözi yolda qalub,
Çox güman eylərlə Əkbər şövq ilə damad olub,
Neyləyim bilməzlə zülm ilə evim bərbad olub,
Toy otağun oldı imdi qanlı meydan, Əkbərim.

Növcəvan ölsə yəqin tə`siri vardur düşmənə,
Madəri-yarım hicründə müsibətdür mənə,
Ağlayım, qoymur ədu bircə doyunca mən sənə,
Ta quram bəzmi-əza bu gündə əl`an, Əkbərim.

Nadimi-naçar əzadarun olub ağlar müdam,
Tə`ziyə saxlar sənə, ağlar həmişə sübhü şam,
Çünki parə-parə eylüb cismüvi əhli-zülam,
Bu avazda həşr olunca eylər əfğan, Əkbərim.

**Əli Əkbərim, oyan**

Aç gözün, Əli Əkbərim, oyan,
Cuş edüb bu gün qəmlərim, oyan.

Əl tapubdı gül xarə, Əkbərim,
Cismin etdi sədparə, Əkbərim,
Olmuşam güni qarə, Əkbərim,
Yoxdı bir nəfər yavərim, oyan.

Düşdi möhnətü dərdə canımız,
Ərşə çıxdı ahü fəğanımız,
Yoxdı bir nəfər pasibanımız,
Doğranub təmam əllərim, oyan.

Sən mənə, oğul, qəmküsar idün,
Hüsndə məhi-ruzigar idün,
Növrəsidə güli-abdar idün,
Soldı zülm ilə güllərim, oyan.

Bəslədim çün on səkkiz il səni,
Şad olam sənə toy edən güni,
Yaxşı naümid eylədün məni,
Ağlayar müdam gözlərim, oyan.

Kim səni əlimdən alub, oğul,
Canuvı bəlayə salub, oğul,
Həsrətün gözündə qalub, oğul,
Sındı qüssədən şəhpərim, oyan.

Başıma ədu tökdi kül mənim,
Qüssədən dönən qanə dil mənim,
Əlündən dutan, Əkbər, əl mənim,
Üzmə vəsldən əllərim, oyan.

Çün səni görüb qan ilən xizab,
Dizlərimdə heç qalmayubdı tab,
Münqizi-ləin etmədi hicab,
Kəsdi başuvı, sərvərim, oyan.

Yıxdılar evim ləşkəri-ədu,
Şahi-din alub qan ilə vüzu,
Zibh edüb səni vermədilə su,
Təşnə can verən yavərim, oyan.

Qafilə rəvan oldı Kufəyə,
Olmuşam əsir əhli-kinəyə,
Dur, təsəlli ver sən Səkinəyə,
Növhə eylər ol dilbərim, oyan.

*Əfrad*

Dedim, oğul, sənə toy eylərəm Mədinədə mən,
Ki, bilmədim olaram zülm ilə qəribi-vətən.

Dedim, oğul, toy edüb eylərəm səni damad,
Mədinə əhli verəllə mənə mübarəkbad.

Dedim ki, əmmələrün toy hənavı bağlallar,
Yaralı başıvın üstə nəinki ağlallar.

O zülfə olmaz idım razi əgləşeydi qübar,
Oğul, nə növ`i görüm cismüvi bu növ`ilə xar.

Bu çöldə əşki-xunalud üzarimə tökərəm,
Bu gündə öz əlim ilə sənə kəfən biçərəm.

Əyağə dur ki, oğul, Şami-şumə əzm edirəm,
Səni hənutü kəfən etməmiş qoyub gedirəm.

Başun qabağıma sallam, baxub fəğan edərəm,
Xəyal eyləmə sənsiz qoyam kənarə qədəm.

*Baqiyi-növhə*

Dəstgir edüb əşqiya bizi,
Eyləyüb əhatə bəla bizi,
Dur, oğul, özün sal yola bizi,
Getdi ol əziz günlərim, oyan.

Dur, oğul, özün ver səsimə səs,
Yox mənə olan bircə dadrəs,
Öldürüb məni qövmi-naşinas,
Ol bu gündə qəmpərvərim, oyan.

*Əfrad*

Əyağə dur, anavın göz yaşına rəhm eylə,
Dübarə yoxdı güman madərin bu dəştə gələ.

Əyağə dur, gözüvi açgilən səni Tari,
Fəraq mövsümidür qoy öpüm yüzün, bari.

Mükatibani-qəza karımi yazub əfqan,
Görən sora səni əlvan edübdi qırmızı qan.

Xəyal eyləmə səndən sora rəha ollam,
Əli, Əli deyübən qəlbi pürbəla ollam.

*Təmamiyi-növhə*

Ağlayub fəğan eylərəm özüm,
Naqədə xəraş eylərəm yüzüm,
Şami-şumətək ağlayar gözüm,
Aç gözün, məhi-ənvərim, oyan.

Nadim, ağla bu Əkbərə müdam,
Göz yaşını seyl eylə ruzü şam,
Söylə, ey susuz can verən ağam,
Ruzi-həşridə davərim, oyan.

**Əkbərim, Əkbərim**

Ey bülbüli-baği-cinan, Əkbərim, Əkbərim,
Şibhi-Rəsul, mahi-cəhan, Əkbərim, Əkbərim.

Əlvan edüb gül çeşmüvi öz qanun, öz qanun,
Aç çeşmüvi, dindür bu natəvanun, natəvanun,
Səndən sora kari olub Leylanun, Leylanun,
Həşrə kimin ahü fəğan, Əkbərim, Əkbərim.

Xar əl tapub sındırdı gül budağun, budağun,
Çəkə bilməz ana oğul fərağun, fərağun,
Əli, bağlı qalubdı toy otağun, otağun,
Toy hicləsi viran olan Əkbərim, Əkbərim.

Aç bir gözün, oyan, mahi-Mədinə, Mədinə,
Qardaş deyüb zülfün yolar Səkinə, Səkinə,
Dur, bir nəzər qıl bu zarü həzinə, həzinə,
Qan içrə yatma, bir oyan, Əkbərim, Əkbərim.

Bu çöldə güllərim yeksər solubdur, solubdur,
Günim qarə, işim əfğan olubdur, olubdur,
Şəhla gözün al qan ilən dolubdur, dolubdur,
Öz qanına əlvan olan Əkbərim, Əkbərim.

Dedim, sənə toy eylərəm dünyadə, dünyadə,
Səd heyf, yetmədün kamü muradə, muradə,
Niskillərim qaldı dili-Leyladə, Leyladə,
Rəxtü libası qan olan Əkbərim, Əkbərim.

Dedim, Əli, toy şərbətün içərəm, içərəm,
Ki, bilmədim vətənimdən köçərəm, köçərəm,
Qürbət eldə sənə kəfən biçərəm, biçərəm,
Rəxti kəfən, təbağı qan Əkbərim, Əkbərim.

Dedim, toy hənavı ələ bağlaram, bağlaram,
Ki, bilmədim sənə əza saxlaram, saxlaram,
Nə`şün üstə gəlüb sinə dağlaram, dağlaram,
Həqq yolunda qurban olan Əkbərim, Əkbərim.

Xar əl tapub soldurublar gülümi, gülümi,
Fələk üzdi damənindən əlimi, əlimi,
Qırdı ədu qəbiləmi, elimi, elimi,
Bisər qalub bikəs anan, Əkbərim, Əkbərim.

Gəlməz dəxi bir kimsəyə gümanım, gümanım,
Talandı xeymələr, öldi sultanım, sultanım,
Səmayə övc edər ahü fəğanım, fəğanım,
Ey zinəti-meydan olan Əkbərim, Əkbərim.

Əsir oldum, Əli, əhli-inadə, inadə,
Çəkəllər qolbağlı Şamə piyadə, piyadə,
Başun qabağımca növki-cidadə, cidadə,
Şamə kimin edər cövlan Əkbərim, Əkbərim.

Zülm ilə soldı gülzari-İmamət, İmamət,
Əsir eylər bizi əhli-şərarət, şərarət,
Eyləllə bizlərə tə`nü şəmatət, şəmatət,
Viranə içrə şamiyan, Əkbərim, Əkbərim.

Nadim bu qissədən gələr fəğanə, fəğanə,
Üzarə göz yaşı eylər rəvanə, rəvanə,
Oğul, lütf etgilən ol natəvanə, təvanə,
Ey qan ilə yeksan olan, Əkbərim, Əkbərim.

**Xanım Leylanun dilindən**

Firqətündə, ey Yusifi-zəman,
Bu qərib anan ağlar, ağlamaz?
Töksə qanuvı ceyşi-kufəyan,
Bu qərib anan ağlar, ağlamaz?

Rəhm elə, məni qoyma bağrıqan,
Olma razi mən eyləyim fəğan,
Kəssə başuvi tiği-cansitan,
Bu qərib anan ağlar, ağlamaz?

Qoymayub, Əli, qüssə məndə tab,
Ağlayub o qədr olmuşam kəbab,
Zülfüvi əgər qan edə xizab,
Bu qərib anan ağlar, ağlamaz?

Rəhm elə məni-zarə, məhcəbin,
Neyləyim məni-zarü dilhəzin,
Töksə qanuvı Münqizi-ləin,
Bu qərib anan ağlar, ağlamaz?

Ülfət eyləsün yerdə qan ilən,
Səbr edim necə xəstə can ilən,
Bağlana qolum risman ilən,
Bu qərib anan ağlar, ağlamaz?

Qanuvı sənün etsələr rəvan,
Təşnə can verər Şahi-insü can,
Şö`ləvər olub yansa aşiyan,
Bu qərib anan ağlar, ağlamaz?

Yalvarammaram* əhli-ləşkərə,
Hülqüvi nişan etsə xəncərə,
Ali-Müstəfa qaçsa çöllərə,
Bu qərib anan ağlar, ağlamaz?

Cismüvi əgər etsələr cüda,
Münqizi-ləin eyləməz həya,
Batsa qanuva xaki-Kərbəla,
Bu qərib anan ağlar, ağlamaz?

Etmədün qərib madərüvi şad,
Peykəri batan qanə, namurad,
Çəksə məclisə zadeyi-Ziyad,
Bu qərib anan ağlar, ağlamaz?

Gül cəmaluva mən fəda olum,
Başuvı kəsər ləşkəri-zəlum,
Risman ilə bağlana qolum,
Bu qərib anan ağlar, ağlamaz?

---

* Yalvara bimərəm

Nadimin nihan ağlayar sənə,
Ruzü şəb əza saxlayar sənə,
Keçsə gül sərin növki-düşmənə,
Bu qərib anan ağlar, ağlamaz?

**Getmə bu meydanə sən**

Rəhm elə göz yaşıma, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Görmə rəva ruyimə cari ola göz yaşım,
Yoxdı bu səhradə bir dadrəsim, qardaşım,
Getsən əlimdən, olar mə`cərə möhtac başım,
Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Qönçəsifət bəslədim mən səni naşad, oğul,
Heyf, Əli, etdim səni şövq ilə damad, oğul,
Xanəmi hicran ilən eyləmə bərbad, oğul,
Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Cövri-fələk eylədi yaxşı peşiman məni,
Salma fəraqində gəl, yollara giryan məni,
Getsən, əsir eyləyər ləşkəri-üdvan məni,
Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Həşrə kimin ağlaram möhnətü hicran ilə,
Surəti-alun əgər batsa qızıl qan ilə,
Bəstəyəm ol zülfüvə bu dili-viran ilə,

Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Sənsiz, Əli, şur ilən sübhü məsa ağlaram,
Cismdən ə`da başun etsə cüda, ağlaram,
Yetsə bu gül cismüvə cövrü cəfa, ağlaram,
Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Sənsiz edər dəstgir madərüvi kufəyan,
Xeymələri odlayar cövr ilə Şimrü Sinan,
Qolları bağlı edər Kufəvü Şamə rəvan,
Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Salma nəzərdən məni-bikəsi, nuri-bəsər,
Eyləmə məcnunsifət naqəsəvar, dərbədər,
Sənsiz olar Şamdə cay mənə viranələr,
Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

Dərdü mühən yüz qoyub Nadimi-zar üstünə,
Əbrtək ağlar tökər əşkin üzar üstünə,
Yetsə əlim, söylərəm, tozlı məzar üstünə,
Rəhm elə göz yaşimə, getmə bu meydanə sən,
Olma riza icz edim, ya Əli, üdvanə, sən.

## Ey Əkbəri-şirinzəban, yəbni, yəbni

Ey Əkbəri-şirinzəban,
Yəbni, yəbni, yəbni, yəbni.
Yatma bu qan üstə, oyan,
Yəbni, yəbni, yəbni, yəbni.

Əgər desəm, dutmaz dilim,
Ey munisim, arxam, elim,
Aç gözlərün, sındı belim,
Yəbni, yəbni, yəbni, yəbni.

Ey məhrəmi-əsrari-mən,
Ey növgüli-gülzari-mən,
Aç gözlərün, gülpirəhən,
Yəbni, yəbni, yəbni, yəbni.

Əhvaluva yannam özüm,
Sənsiz müdam ağlar gözüm,
Sındı belim, gülməz yüzüm,
Yəbni, yəbni, yəbni, yəbni.

Düşmən əcəb yıxdı evim,
Yoxdur dəxi arxam, elim,
Sındı belim, yandı dilim,
Yəbni, yəbni, yəbni, yəbni.

Ey dilbəri-şirinzəban,
Oldum oğulsuz, bağrıqan,
Qanlı gözün aç, bir oyan,
Yəbni, yəbni, yəbni, yəbni.

Zülfün olub qandan xizab,
Qoymaz  bu firqət məndə tab,
Topraqlar üstə etmə xab,
Yəbni, yəbni, yəbni, yəbni.

Qəddim büküldi ah, ah,
Sənsiz mənə yox dadxah,
Ol Nadimə püştü pənah,
Yəbni, yəbni, yəbni, yəbni.

**Əfrad**

Leyla fəğanə gəldi ki, guya bu hal ilən,
Qoydun, Əli, bu çöldə məni yüz məlal ilən.

Getdün fəna cəhandan, əcəb salmısan, oğul,
Leylanı odlara o gülüzli cəmal ilən.

Yıxdı evimi bu fələki-kəcmədar, Əli,
Zinət verəndə mən sənə şövqi-vüsal ilən.

Könlüm quşı ki, mail olub xaluva, oğul,
Ağlar fəraquva gecə-gündüz xəyal ilən.

Sən görmədün şəmatəti-ə`danı, ey Əli,
Köç eylədün bəqayə çü zəxmi-sinan ilən.

Eylər şəmatət madərüvə əhli-kinələr,
Tə`nü şəmatətə dözərəm xəstə can ilən.

Bəzmi-əzadə Nadimi-şeyda fəğan edər,
Eylər müamilə o Şəhi-insü can ilən.

**Cənab Leylanun dilindən**

Həşrə kimi eylərəm
Naləvü əfğan, oğul.
Cismüvi bisər salub,
Ləşkəri-üdvan, oğul.

Qanə batub ləblərün,
Parələnüb peykərün,
Oldı əcəb madərün,
Halı pərişan, oğul.

Oldı xizab al yüzün,
Kaseyi-qandur gözün,
Vardı əgər sirr sözün,
Dur, elə e`lan, oğul.

Əkbəri-qəmpərvərim,
Yavərü həm sərvərim,
Aç gözüvi, Əkbərim,
Mən sənə qurban, oğul.

Fərşün olub xuni-xak,
Oldı anan zəhrnak,
Qəm məni eylər həlak,
Dur, elə dərman, oğul.

Kim səni bisər salub,
Naqəvi əldən alub,
Madərün ağlar qalub,
Ağlayar hər an, oğul.

Növhə edim, qoy, özüm,
Qüssədən ağlar gözüm,
Dur, sənə var bir sözüm,
Söyləyim əl`an, oğul.

Bəslədim illər səni,
Qoydun oğulsuz məni,
Zeynəbə ta ver məni,
Ey məhi-taban, oğul.

Nadim olub növhəxan,
Ruzü şəb eylər fəğan,
Didələrindən rəvan,
Eyləyür al qan, oğul.

**Sinəzəni-cənab Leyla**

Əkbərün yaralı nə`şin gördi çün cənab Leyla,
Əşki-çeşmini üzarə tökdi bihesab Leyla.

Parə-parə nə`şün üstə sərdi zülfün etdi satir,
Söylədi, oğul, əmandur, dur, yəman günümdür axir,
Qoysalar, məzarun üstə ollam hər zəman mücavir,
Gözlərilə Əkbər üstə səpdi çün gülab Leyla.

Söylədi, Əli, anan kaş bu diyarə gəlməyeydi,
Gül cəmaluvi bu növ`i parə-parə görməyeydi,
Sən bu növ`i can verəndə, Kərbəladə olmayeydi,
Əşki-xunə muyi-cismi oldı çün səvab Leyla.

Həsrətim gözümdə qaldı, arizumə yetmədim mən,
Dəstüvi xizab edüb bir toy təbağın dutmadım mən,
Şəm` alub əlimə bir toy hicləvi bəzətmədim mən,
Bu xəyal ilən edərdi ruzü şəb şitab Leyla.

Bu bəla çölündə, ya Rəbb, mən düçari-möhnət oldum,
Çeşmi-əşkbarim ilə layiqi-müsibət oldum,
Getdi Əkbərim əlimdən, gül yüzinə həsrət oldum,
Şö`leyi-fəraqə yandı, oldı çün kəbab Leyla.

Odladı məni fəraqun, canımı alubdı qəmlər,
Xanimanım oldı bərbad, ey süruri-qəlbi-madər,
Qanuvı alan ədudən yox olubdı Övnü Cə`fər,
Qaldı gül cəmalə həsrət xanəsi xərab Leyla.

Aç gözüvi, nuri-eynim, qüssədən tükəndi canım,
Hicr narına alışdı yandı məğzi-üstüxanım,
Dur, bu gündə dut əlimdən, gəlməz heç kimə gümanım,
Su yüzündə qaldı əl`an məsəli-hübab Leyla.

Əkbərim gedüb əlimdən, yoxdı bir nəfər həvadar,
Yaxşı möhnətü bəlayə elədi məni giriftar,
Yoxdı dadıma yetən bi* kimsə, qalmayub mədədkar,
Elədi oğul qanından zülfüni xizab Leyla.

---

* Bir

Ağlaram, Xuda, həmişə, Əkbərim gedüb əlimdən,
Vay oğul, sədası düşməz can verincə ta dilimdən,
Əhli-Kufə ayrı saldı zülm ilə məni elimdən,
Nadim, ağla, çünki ağlar ruzü şəb cənab Leyla.

**Gəlməyim fəğanə, neyləyim**

Əldən Əkbərim gedüb, Xuda, gəlməyim fəğanə, neyləyim,
Həsrət oldı gözlərim dəxi Əkbəri-cəvanə, neyləyim.

Yatmadım gecə səbahədək, bəslədim o sərv qamətin,
Ta bəzətmədim zəmanədə toy günündə bəzmi-işrətin,
Tuş qıldı canimə fələk Kərbəladə dərdü möhnətin,
Eşq dəstgir edüb məni ceyşi-kufəyanə, neyləyim.

Madəri-qəribüvün qolun bağlayubla risman ilə,
Yetmədi muradinə, xizab əlləri boyandı qan ilə,
Madəri-qəribüvün qolun bağlayubla risman ilə,*
Toy təbağı zülm ilə dönüb ləxtə-ləxtə qanə, neyləyim.

Mürği-bipərəm, fəraq ilə imdi cismü canım odlanub,
Çün batubdı qanə Əkbərim, qəlbi-tarümarım odlanub,
Rəxtimi soyubdı əşqiya, narə xanimanım odlanub,
Öldi imdi madərün, qoydı yanə-yanə, neyləyim.

Əkbərin qəmi alub, Xuda, tabü taqətü qərarımı,
Möhnəti-zəmanə qalxızur taği-asimanə zarımı,
Bir qəribü bikəsəm, Xuda, öldürüblə qəmküsarımı,
Möhnəti-fəraqı döndərüb qədimi kəmanə, neyləyim.

---

* Misra təkrardır

Əkbər oldı xəncərə sipəh, yaxşı qoydı yarsız məni,
Bu bəla çölündə eylədi, yaxşı qəmküsarsız məni,
Münqizi-ləin cəfa ilən qoydı yadigarsız məni,
Qollarımı bağlayub ədu imdi rismanə, neyləyim.

Güllərimi soldurub ədu, əndəlibi-qəməm, çəmənsizəm,
Göz önündə qanə Əkbərim batdı, bikəsəm, vətənsizəm,
Naqə üstə ağlaram müdam, çünki qürbət eldə sənsizəm,
Nə`şüvün üstə qoymaz əşqiyalər gələm fəğanə, neyləyim.

*Əfrad*

Əyağə dur, nəzər et, Əkbər, Ümmi-Leylayə,
Cünuni-eşqün olub, yüz qoyubdı səhrayə.

Əlimdən aldılar ə`da qəbiləmi, elimi,
Səni şəhid eləyüb, yaxşı yıxdılar evimi.

Nə çarə etsün, oğul, bu qəribü dilxəstə,
Necə o gül bədəni mən görüm türab üstə.

Yaralı qəlbimi hicran oduna dağladılar,
Evim yıxıldı, sən öldün, qapımı bağladılar.

Yaralar üstə açub zülfimi çox etdim qəşş,
Anan əsir olub, Əkbərim, misali-Həbəş.

Əlacım olmadı qandan ki, pak edəm yüzüvi,
Başun diz üstə alub bağlayammadım gözüvi.

Oğul doyarmış anadan, Əli, bəyan eylə ,
Dəməşqə getməliyəm, dur, məni rəvan eylə.

Həyatım olsa, Əli, bir də zairin ollam,
Məzarın üstə fəğan ilə zülfümi yollam.

*Təmamiyi-növhə*

Kufəyə rəvanəm, ey bala, bir sınıq kəcavə üstə mən,
Söylərəm, Əli, Əli müdam naqə üstə dəsti bəstə mən,
Əndəlibi-bipərəm misal, həbs olunmuşam qəfəsdə mən,
Seyd olunmuşam mən imdi səyyadi-kufəyanə neyləyim.

Ağlasun gərək zəmandə hər əzadə Əkbər aşiqi,
Nail olsun hər müsibətə ol Hüseyni-bisər aşiqi,
Ya Hüseyn, olubdı Nadimün rövzeyi-Peyğəmbər aşiqi,
Yoxdı sərvətim, ümid dutam, gəlməyim bəyanə, neyləyim.

**Oyan, sərdar Əli Əkbər**

Şərari-hicr ilə yandım,
Oyan, sərdar Əli Əkbər.
Əli, bir dillən, odlandım,
Mənə qəmxar, Əli Əkbər.

Deyəm Əkbər, dilim gəlməz,
Ölüm, qövmüm, elim gəlməz,
Sınub sənsiz belim, gəlməz,
Oyan, sərdar Əli Əkbər.

Ədu əldən səni aldı,
Məni möhnətlərə saldı,
Anan Leyla mələr qaldı,
Oyan, sərdar Əli Əkbər.

Görüm, çərxin güli solsun,
Pozulsun, payimal olsun,
Bu oğulsuz qalan ölsün,
Oyan, sərdar Əli Əkbər.

Könül nari-qəmə yandı,
Məhəbbətdən alovlandı,
Əli, sənsiz belim sındı,
Oyan, sərdar Əli Əkbər.

Səni əldən alub ləşkər,
Vırublar nizəvü xəncər,
Anan Leyla yolun gözlər,
Oyan, sərdar Əli Əkbər.

Gələ lə`nət bu əyyamə,
Oğul, sən yetmədün kamə,
Anan Leyla gedər Şamə,
Oyan, sərdar Əli Əkbər.

Olubdur Nadimin giryan,
Qələm əldə edər əfğan,
Olan öz qanına əlvan,
Oyan, sərdar Əli Əkbər.

## Cənab Leylanun dilindən Əli Əkbərə

Əli, dindir məni, bimunisü yavər gedirəm,
Səni qan üstə qoyub Şamə mükərrər gedirəm.

Gözümün yaşına rəhm eylə, dönüb seylə, oğul,
Et nəvaziş, məni dindir, mənə rəhm eylə, oğul,
Ananı oğlı atarmış ki, məgər beylə, oğul,
İmdi bu çöldə, oğul, var nə bəradər, gedirəm.

Səni gər qumlarun üstə salub ə`da yaralı,
Nizə başında başun etsə təcəlla yaralı,
Misli-nar üstə sızıldar dili-Leyla yaralı,
Məni Məcnun eləyər firqətün, Əkbər, gedirəm.

Rahət on səkkiz ili yatmadım, ey xuni-cigər,
Gül kimin sərvi-qədün bəslədim, ey nuri-bəsər,
Parə-parə səni görmək mənə asandı məgər?
Yandırar qəlbimi qanlı ala gözlər, gedirəm.

Bu idi arizum axır səni damad edərəm,
Yəsrib içrə sənə toy hicləsi abad edərəm,
Qəlbimi gül yüzüvi görmək ilən şad edərəm,
Növərus oldı sənə navəkü xəncər, gedirəm.

Sənə toy eyləyüb, heç toyda həna bağlamadım,
Namurad oldun, oğul, çünki əza saxlamadım,
Zəcri-dun mane` olub, gözlərüvi bağlamadım,
Cövr ilə aldı əlimdən səni ləşkər, gedirəm.

Sənün eşqündə çəkəm min belə zəhmət, dözərəm,
Qəmçi vırsa başıma Şimri-şərarət, dözərəm,
Şamın əhli nə qədr etsə şəmatət, dözərəm,
Bağlayub qollarımı zümreyi-kafər, gedirəm.

Anan ölsün, gözün aç, gör nə yaman gündi mənə,
Pasiban olmuş oğul Şimrü Sinan imdi sənə,
Qəm yemə, təşnə bala, düşsə güzarım vətənə,
Tə`ziyədarun olub ağlaram illər, gedirəm.

Bəslədim gül kimin illərlə otağımda başun,
Qolum üstə, əlim üstündə, quçağımda başun,
Nizə başında gedər Şamə qabağımda başun,
Yaralı başun ilən Şamə bərabər gedirəm.

Dəstgir oldum əcəb ləşkəri-üdvanə, oğul,
Ağlamaqdan gözümün yaşı dönüb qanə, oğul,
Nadimin göz yaşını döndərüb ümmanə, oğul,
Əli, dindir məni bimunisü yavər gedirəm.

**Etsün nə çarə Leyla**

Söylə, oğul, etsün nə çarə Leyla,
Səndən sora, bu bəxti qarə Leyla.

Gəlür sənə aləmdə bir gümanım,
Hicrün alar əldən tabü təvanım,
Pərvanəvəş, qoy başuva dolanım,
Çün həsrət olmamış didarə Leyla.

Övc eyləyər sənsiz səmayə ahım,
Bilürsən qeyri səndən yox pənahım,
Əgər rüxsət veribdür padşahım,
Bu əmrə razidür biçarə Leyla.

Rizasən, adətim əfğanə dönsün,
Ağarsun zülf, qəlbim qanə dönsün,
Xəm olsun qamətim, kəmanə dönsün,
Zülm ilə gəlsün ahü zarə Leyla.

Gedirsən imdi ki, əl`an əlimdən,
Yəqin alar səni üdvan əlimdən,
Oğul vay-naləsi düşməz dilimdən,
Tökər göz yaşını rüxsarə Leyla.

Gəl, əgləş, bari, eylüm şanə zülfün,
Edim şanə, sərim əfşanə zülfün,
Xizab eylər ədulər qanə zülfün,
Qurban, ol zülfi-müşkibarə, Leyla.

Zəlil etmə məni küffar əlində,
Töküm göz yaşımı əğyar əlində,
Qalınca ləşkəri-xunxar əlində,
Ey kaş, öleydi bu dilparə Leyla.

Gedirsən itrəti-ətharə tapşur,
Məni bu Əhli-Beyti-zarə tapşur,
Xüsusən, Zeynəbi-naçarə tapşur,
Olammaz dəstgir küffarə Leyla.

Əcəb etdin məni dünyadə Nadim,
Fəda ol qaməti-şümşadə Nadim,
Gətür Leylanın halın yadə, Nadim,
Çətindür icz edə əğyarə Leyla.

**Ey Minayi-eşqdə öz qanına əlvan olan**

Ey Minayi-eşqdə öz qanına əlvan olan,
Cismi-paki Kərbəladə zinəti-meydan olan.

Sən mənə axır müinü munisü qəmxar idün,
Gülşəni-Ali-Əbayə bir güli-növbar idün,
Ey oğul, qəmgin günümdə munisü qəmxar idün,
Aç gözün, gəldi baban, ey qan ilə yeksan olan.

Doğranubdur cismi-pakün xəncəri-xunxar ilən,
Ağlaram əhvaluva bu çeşmi-əşkbar ilən,
Ümmidiydün dəhrdə Leylanın ahü zar ilən,
Ağlayar hər vəqt sənə o xanəsi viran olan.

Əlləri qoynunda qaldı, rahuvı gözlər anan,
Ağlamaqdan oldı Leylanun sirişki-çeşmi qan,
İmdi Leyla xeymədə göz yaşını eylər rəvan,
Aç gözün, ey zülfləri öz qanına əlvan olan.

Durmuş imdi təll üstə o Səkinə biqərar,
Rahuvı gözlər sənün ol tifl üzari dilfikar,
Göz yaşın eylər rəvan eşqündə eylər ahü zar,
Xeyməgahə saldı şuriş ol ləbi ətşan olan.

Razısan, Əkbər, aparım xeyməyə aya səni,
Göndərüb Minayə axır Hacəri-Mina səni,

Gözləyür gözyaşlı əl`an xeymədə Leyla səni,
Bir də görsün ruyüvi ol didəsi giryan olan.

Çün alub ağuşinə ol Əkbəri-ətşanını,
Ol Xəlili-Həq gətirdi xeyməyə qurbanını,
Yetdi qəl`ə üstə, səslüb Zeynəbi-nalanını,
Gəl, sənə mehman, bacı, bu ümmətə qurban olan.

Çün töküldi xeymələrdən Əhli-Beyti-dilfikar,
Gördülər Əkbər olub zülm ilə qanı laləzar,
Növhə eylüb çün Səkinə, oldı qəlbi tarümar,
Soldı ol dəm tacdarü zarü sərgərdan olan.

Nalə eylər Nadim, ağlar bu əzadə hər zəman,
Ruzi-məhşər bu günahla neylərəm mən, əl-əman,
Qismət et məhşər güni mən bikəsə qəsri-cinan,
Canuva olsun fəda bu Nadimi-nalan olan.

**Ey İlahi, ah, o vəqtən tapub Əkbərini Leyla**

Ey İlahi, ah, o vəqtən tapub Əkbərini Leyla,
Yüzi qan ilə boyanmış məhi-ənvərini Leyla.

Nə görübdi, qan içində bədənini parə-parə,
O yaralı cismi-pakın yetişüb alub kənarə,
Dedi, bəs nə çarə etsün, ey oğul, bu bəxti qarə,
Gətirüb qoyub dizi üstə yaralı sərini Leyla.

Buyurub, Əli, anan kaş, bu diyarə gəlməyeydi,
Qurı yerlər üstə cismün belə xar görməyeydi,
Baş açub cənazən üstə, Əli, zülf sərməyeydi,
Nə göreydi qönçə solmuş güli-əhmərini Leyla.

Başını alub diz üstə dedi, növcəvan oğul vay,
Səni kim əlimdən aldı, mənə qıl bəyan, oğul vay,
Yüzüvi misali-lalə boyuyubdı qan, oğul vay,
Eyləyüb xizab o qandan yüzün-əllərini Leyla.

Gətirüb qurı yer üstən başını alub dizinə,
Dili gördi sakit olmaz, yüzini qoyub yüzinə,
Nə görüb ki, baş sınıbdur tökülübdi qan yüzinə,
Necə şivən ilə almaz ələ mə`cərini Leyla.

Əli, həşr olunca sənsiz məni ağladar fəraqun,
Yara gül kimin açılmış bədənündə qan təbağun,
Qan hənadur əlləründə, qurı yerdi toy otağun,
Dəxi şad edəmməz əsla dili-müztərini Leyla.

Yetişüb o vəqtdə nagah adı Münqizi-sitəmkər,
Dedi, bir durun, kənarə keçün, ey həzinü müztər,
Baxub o ləinə Leyla, nə görüb əlində xəncər,
Gözi yaşlı gözlərinə qoyub əllərini Leyla.

Kəsilüb əlacı nagah, çəkilüb kənarə naçar,
Qurı topraq üstə qoydı səri-Əkbəri o biyar,
Dedi, rəhm elə, əmandur, gözimün yaşinə, qəddar,
Nə rəvadı xəncər altda görə Əkbərini Leyla.

Gətirüb qədəm, kənarə gedə bülməyüb, dayandı,
Dili-pürşərarı qəmdən ətəşi-fəraqə yandı,
Çevirüb yüzin nə gördi, bala qan ilə boyandı,
Dolanub görüb cidadə səri-Əkbərini Leyla.

Gətirüb yaralı başın ələ, basdı sinəsinə,
Sitəm ilə gəldi dərdə dedi, ey güli-Mədinə,
Bu Minayi-Kərbəladə əcəb indi əhli-kinə,
Necə birbəbir bəyanə çəkə qəmlərini Leyla.

Dedi, nizələr sərində dolanur sərün bədənsiz,
Qurı yerlər üstə cismün boyuyubdı qan kəfənsiz,
Vətənə qərib anan bəs gedəcək nə növ`i sənsiz?
İtirüb bu Kərbəladə hamı ellərini Leyla.

Hələ var həyatun əldə, elə ahü nalə, Nadim,
Qəmi-Əkbər eyləyübdür məni biqərarə, Nadim,
Əli vay, deyərdi Leyla gəzüb əşkbarə, Nadim,
Dolanurdı qətlgahi tapa Əkbərini Leyla.

### Xoş gəldün, oğul

Getməlisən, getgilən Minayə, xoş gəldün, oğul,
Həq səni çox görməsün Leylayə, xoş gəldün, oğul.

Hüsndə dünyadə misli-Yusifi-Kən`ansən,
Nuri-eynimsən, oğul, sən qəlbimün aramisən,
Qoyma sənsiz yalvara üdvanə bu nalan Həsən,
İmdi ki, verdün təlaq dünyayə, xoş gəldün, oğul.

Ey mənim arami-qəlbim, sən özün şəhzadəsən,
Yetmədün kamü muradə bu fəna dünyadə sən,
Olmusan min şövq ilə can verməgə amadə sən,
Heyf ola bu surəti-zibayə, xoş gəldün, oğul.

İmdi ki, izni-cihad verdi Şəhi-bikəs sənə,
Mən də rüxsət verməsəm, eylər hamı töhmət mənə,
Bir dəqiqə səbr elə, barı, büküm xəl`ət sənə,
Geydirim bu qaməti-rə`nayə, xoş gəldün, oğul.

Gəl, otur, şanə edim ol zülfi-mişki-famuva,
Müşk ilə ətr səpim o kakili-əfşanuva,
Çün yəqinimdür batar zülfi-siyəh öz qanuva,
Lə`nət olsun, ey Əli, üdvanə, xoş gəldün, oğul.

Düşmənün səf-səf durubdur, sən özün birsən, Əli,
Bu bəlalı rəzmdə gözlər səni düşmən, Əli,
Gəl, yüzündən qoy öpüm, barı, doyunca mən, Əli,
Dolmamış qan dideyi-şəhlayə, xoş gəldün, oğul.

Getməmiş talanə rəxtün, ey məhi-nurənvərim,
Qalmaya həsrət o rə`na qəddüvə bu gözlərim,
Bir qəbağımda yeri, eylüm təmaşa, Əkbərim,
Barı, təskinlik ola Leylayə, xoş gəldün, oğul.

Gəl, olaq bir qol-boyun, şad et dili-rəncuri sən,
Gözlərim ağlar fəraqündə, gözimün nurisən,
Azimi-meydan olubsan, get, oğul, mə`zursən,
Get, dəmi-şəmşiri-bərqasayə, xoş gəldün, oğul.

Eşqi-canan ilə əzbəs ki, oğul, sərməstsən,
Vəsli-canana yetişməklikdən ötri məstsən,
Eşq zəncirinə eşq ilə, Əli, pabəstsən,
Azim oldun şövq ilə üqbayə, xoş gəldün, oğul.

Düşsə rahim qətlgahə, nə`şün üstə ağlaram,
Münqizi-məl`un, Əkbər, qoysa, gözivi bağlaram,
İntizar olma, ölüncə mən əzavı saxlaram,
Qaldım həsrət şəkkəri-səhbayə, xoş gəldün, oğul.

Səmti-Şamə çəksələr gər bizləri əhli-cəfa,
Sən xəyal etmə, Əli, olsun anan səndən cüda,
Başuvi Şamə kimin sallam qabağımca, bala,
Düşərəm gözyaşlı bu səhrayə, xoş gəldün, oğul.

Qanun ilə, Əkbərim, zülfün xizab eylər anan,
Başuva pərvanə ollam, sübhü şamı hər zəman,
Daş vıranda başıva Şam əhli mən qıllam fəğan,
Lə`nəti-Xaliq ola ə`dayə, xoş gəldün, oğul.

Ey Əli Əkbər, özün ver Nadimə əcrü səvab,
Şiəyani-Mürtəzadən bu həqiri qıl hesab,
Şur ilə bu mətləbi sübhü məsa eylə xitab,
Həqq səni çox görməsün Leylayə, xoş gəldün, oğul.

**Tərəhhüm et, məni-ətşanə, Əkbər**

Tərəhhüm et, məni-ətşanə, Əkbər,
Gözüm yaşı dönübdür qanə, Əkbər.

Qoy, eylüm nalə məni-zarü diləfruz,
Bu qanlı çöldə qaldım imdi yalquz,
Əli, rəhm et, məni qoyma oğulsuz,
Riza olma gəlim əfğanə, Əkbər.

Mənə rəhm et, oğul, Əbbas ölübdür,
Hərəmlər, bacılar ağlar qalubdur,
Bu şəhla gözlərün xunbar olubdur,
Salublar cismüvi meydanə, Əkbər.

Sənüntək növcəvan yavər yetirdim,
Bu gün bu qanlı səhradə itirdim,
Yəravə göz yaşun dərman gətirdim,
Nəzər qıl bu Şəhi-ətşanə, Əkbər.

Əli, sən kövkəbi-Əhməddün axir,
Qürub etdün olandan sonra zahir,
Məzarun üstə mən ollam mücavir,
Məni salmasalar meydanə, Əkbər.

Əlimdən kim səni zülm ilə aldı,
Yaralı cismüvi toprağə saldı,
Hərəmlər, bacılar gözyaşlı qaldı,
Salublar ahü vay dövranə, Əkbər.

Bu qəmdə Nadimi-biçarə ağlar,
Tökər göz yaşını rüxsarə, ağlar,
Olubdur qüssədən dilparə, ağlar,
Gələr şamü səhər əfğanə, Əkbər.

**Cənab Leylanun dilindən**

Eylədün məni zarü xuncigər həşrətək, Əli Əkbər, ağlaram,
Ruyimə nisar eylüb əşki-tər, ey şəbihi-Peyğəmbər, ağlaram.

Zəhmətün çün on səkkiz il çəküb istədim səni şadü kam
edəm,
Yəsrib içrə bir toy dutub sənə, cabəca büsatun təmam edəm,
Gözlərimə on səkkiz il yuxını, oğul, rəvadur həram edəm,
Eylədün məni yaxşı naümid, ey şəbihi-Peyğəmbər, ağlaram.

İmdi ki, səni Şahi-Kərbəla,
Eyləyüb, Əli, azimi-bəla,
Qoy, özüm olum payüvə fəda,
Ey şəbihi-Peyğəmbər, ağlaram.

Ey oğul, qabağımda, bir yeri, eyləyüb təmaşa cəmaluva,
Bari, gözlərim həsrət olmasun hüsnü surətü xəttü xaluva,
Bu qərib anan qətlgahdə bir də yetişsə vüsaluva,
Qanlı nə`şüvə eyləyüb nəzər, ey şəbihi-Peyğəmbər, ağlaram.

Bircə taqə şal atdı Əkbərün payi altına tökdi əşki-tər,
Qəlbimi mənim eylədi dünim ol qəribün əhvalı, şiələr,
Söylədi, əman, rəhm elə gözüm yaşinə, Əli, eyləmə səfər,
Bu fəraqə mən tab edəmmərəm, ey şəbihi-Peyğəmbər,
ağlaram.

İmdi ki, gedirsən, Əli, bala, tapşur əmməvə mən oğulsuzi,
Sən ölən sora, ey cəvan oğul, kufəyan əsir eyləyər bizi,
Rəsmdür, Əli, çün soyuq olar qövmsiz, oğulsız ana yüzi,
Qalmışam, oğul, qəmküsarsız, ey şəbihi-Peyğəmbər,
ağlaram.

Söylədi Əli Əkbəri-cəvan, qəlbimi kəbab eylədün, əman,
Qəm yemə olar əmmələr sənə mən ölən sora yarü mehriban,
Ey qərib ana, səbri ixtiyar et sənə cəfa etsə kufəyan,
Sən oğul deyüb ağlayan zəman, mən də söylərəm madər,
ağlaram.

Gər səni əsir etsə kufəyan,
Şamü Kufəyə eyləsə rəvan,
Naqə üstə sən eyləsən fəğan,
Mən zəbihi-çeşmi-tər ağlaram.

Nadimin ola cismüvə fəda,
Ruzü şəb edər şur ilə səda,
Yet hərayimə, şibhi-Müstəfa,
Olmuşam bu gün müztər, ağlaram.

**Həzrət Leyla dilindən**

Get, Əkbər, oğul, ərseyi-meydanə, Alullah,
Əlvan olasan gərçi qızıl qanə, Alullah.

Çün rahi-Xudadə səni qurban demişəm mən,
Canan yolunda verəsən can demişəm mən,
Qüslün ola bu ərsədə al qan demişəm mən,
Leyla düşə eşqündə biyabanə, Alullah.

Başın kəsələr ləşkəri-ə`da, dözərəm mən,
Qanə bata bu zülfi-mütərra, dözərəm mən,
Solsa sitəm ilə rüxi-ziba, dözərəm mən,
Olsam da əsir firqeyi-üdvanə, Alullah.

Bax, bir gözimün yaşına, rəhm et, səni Tarı,
Yox səndən əlavə anavın yavərü yarı,
Tapşırgilən, Əkbər, məni sən Zeynəbə, barı,
Qəmxar ola mən zarü pərişanə, Alullah.

Səf-səf düzülüb qətlin üçün ləşkəri-kinə,
Tökməkligə al qanuvı bu ruyi-zəminə,
Göz yaşı tökə səfheyi-rüxsarə Səkinə,
Eşqündə düşər dəştü biyabanə, Alullah.

Sənsiz bu anan nalə edər leylü nəharı,
Ə`da bizi qolbağlı çəkər Kufəyə sarı,
Şamə çəkilər Zeynəbü Külsum qətarı,
Gər məskənimiz eyləsə viranə, Alullah.

Viranələr içrə, ey Əli, naləyə gəlləm,
Asandı məgər hicr odı, mən halımı billəm,
Hicranə dəvam etməgə yox taqətim, ölləm,
Yansam da əgər atəşi-hicranə, Alullah.

Bir riqqəti-üzma var Əli Əkbər adında,
Göz yaşım olar yadə düşən vəqtdə, dərya,
Söylərdi Əli Əkbərə əfğan ilə Leyla,
Yaxşı elədün Nadimi divanə, Alullah.

## Cənab Qasim və Həzrət İmam Hüseyn (ə)-ın dilindən

Dur əyağə, ey Şahi-möhtəşəm,
Əmucan, apar anama məni.
Sinən üstə oldı qolum qələm,
Əmucan, apar anama məni.

Bala, səbr elə bu müsibətə,
Bu cəfayi-əhli-şərarətə,
Yetişərsən axırı ne`mətə,
Bala, səbr elə, oğul, ağlama.

Apar, halıma anam ağlasun,
Başını açub sinə dağlasun,
Qolumun yarasını bağlasun,
Əmucan, apar anama məni.

Mənə də olubdur həyat həram,
Bu dəqiqə ömrüm olur təmam,
Yaralanmışam, dura bilmirəm,
Bala, səbr elə, oğul, ağlama.

Əmu, məndə yoxdı bu dərdə tab,
Bədənim olub qan ilən xizab,
Məni qoyma gün eyləsün kəbab,
Əmucan, apar anama məni.

Nə qədər cəfa edə kufəyan,
Bala, səbr qıl, eyləmə fəğan,
Səni də xizab eyləyübdi qan,
Bala, səbr elə, oğul, ağlama.

Sənə canımı eylədim fəda,
Gələ kaş, bu vəqtə Müctəba,
Görə halımı, o da ağlaya,
Əmucan, apar anama məni.

Boyanubdı qanimə Kərbəla,
Sinəm üstə qoy başuvı, bala,
Səni tapşurub mənə Müctəba,
Bala, səbr elə, oğul, ağlama.

Anam xeymədə imdi dilfəşan,
Bu yetim üçün eyləyür fəğan,
Dur əyağə, ey Şəhi-insü can,
Əmucan, apar anama məni.

Nə edim ki, yoxdı əlim, oğul,
Səni bir qucağə alım, oğul,
Bu gözün fədası olum, oğul,
Bala, səbr elə, oğul, ağlama.

Yaralanmışam, tökülüb qanım,
Bu yara ilən çıxacaq canım,
Dur əyağə, başuva dolanım,
Əmucan, apar anama məni.

Səni də yaraladılar ədu,
Mən ilə salubla rubəru,
Qoy edim, oğul, qan ilə vüzu,
Bala, səbr elə, oğul, ağlama.

Bu çəməndə bircə güləm, susuz,
Qolumı edüblə qələm hənuz,

Yaralanmışam, ölürəm susuz,
Əmucan, apar anama məni.

Susuz öldi Əkbəri-təşnəkam,
Bizə su bu çöldə olub həram,
Səni gözləyür baban əldə cam,
Bala, səbr elə, oğul, ağlama.

Qolum incidür bu zəman məni,
Eyləyür bəqayə rəvan məni,
Dur, apar, görə bir anam məni,
Əmucan, apar anama məni.

Qoy alım bu hal ilə dəstəmaz,
Eyləyim Xuda ilə bir niyaz,
Oturum qan üstə, qılım nəmaz,
Bala, səbr elə, oğul, ağlama.

Qutarub həyat, çıxar imdi can,
Eyləyüb xizab bu yetimi qan,
Sənə dərdimi eyləyim əyan,
Ölürəm, apar anama məni.

Bu əzadə, ey Şəhi-Kərbəla,
Qələm əldə, Nadimi-binəva,
Bu zəban ilən eyləyər səda,
Bala, səbr elə, oğul, ağlama.

**Yetiş fəryadimə, sərdar əmucan**

Salublar Qasimi rəzmi-bəlayə,
Yetiş fəryadimə, sərdar əmucan.
Tərəhhüm et, yetimi-Müctəbayə,
Məni-naşadə ol qəmxar, əmucan.

Yetiməm bir nəfər, qəlbi şikəstə,
Bu zalim ləşkəri dəstəbədəstə,
Salublar cismimi topraqlar üstə,
Bu qövmi-ləşkəri-xunxar, əmucan.

De anama, etsün fəğanü nalə,
Bələşdi qanə oğlı misli-lalə,
Denən, növrəs balan gəldi zəvalə,
Gülinə əl tapubdur xar, əmucan.

Yetiməm, bir nəfər yadə salan yox,
Mənə imdad edüb qanım alan yox,
Yaralı nə`şim üstə ağlayan yox,
Kəsəllər başımi küffar, əmucan.

Neçün gəlməz babam bizim əzayə,
Batubdur əllərim qandan hənayə,
Kəsüllər başımi, tez gəl hərayə,
Alub ətrafımi əğyar, əmucan.

Dayanma, tez yetir özün Minayə,
Batubdur Qasimün qandan hənayə,
Qanım zinət verüb Kərbübəlayə,
Edüblər qanıma xunbar, əmucan.

Cəvanəm, həsrətim könlümdə qaldı,
Çəməndə güllərim soldı, saraldı,
Qılıclar yarəsi aramım aldı,
Olub dünya mənə zinhar, əmucan.

Axar qanım, dolub qan ilə didəm,
Köməksiz qalmışam mən, naümidəm,
Bu əhli-Kufə çoxdur, mən vəhidəm,
Gəl, oldum qan ilə gülnar, əmucan.

Atam yoxdur edə dərdimə çarə,
Yetiş, imdad qıl bu dilfikarə,
Məni, gəl, öz əlünlə qoy məzarə,
Ki, qoyma nə`şim olsun xar, əmucan.

Yetiməm, bir nəfər zarü qəribəm,
Ölürəm, bu cəhanda binəsibəm,
Sinəmdə at çapublar, xürd-xürdəm,
Bu əhli-ceyşi-bədkirdar, əmucan.

Bu qəmdə Nadimi-biçarə məhzun,
Olubdur ağlamaqdan zarü dilxun,
Hər il fəsli-mühərrəm misli-Məcnun,
Bu şərhi eyləyür izhar, əmucan.

**Yaralandım, əmu, tez gəl**

Salub atdan məni ləşkər,
Yaralandım, əmu, tez gəl.
Alub ətrafımi səflər,
Yaralandım, əmu, tez gəl.

Alub ətrafımı üdvan,
Kəsəllər başımı əl`an,
Gəl, ey Sultani-məzluman,
Yaralandım, əmu, tez gəl.

Yetişdi mövsimi-firqət,
Qalub könlümdə hər həsrət,
Vırublar cismimə zərbət,
Yaralandım, əmu, tez gəl.

Atam yox, eyləsün imdad,
Ölürəm həsrətü naşad,
Bu gündə qıl mənə imdad,
Yaralandım, əmu, tez gəl.

Yaralandım, çıxar canım,
Axar fəvvarətək qanım,
Yetiş fəryadə, Sultanım,
Yaralandım, əmu, tez gəl.

Yetiməm, şad edən yoxdur,
Mənə imdad edən yoxdur,
Bu cismimdə yaram çoxdur,
Yaralandım, əmu, tez gəl.

Yetiməm, heç yüzüm gülməz,
Anam əhvalımi bilməz,
Neçün bəs Müctəba gəlməz?
Yaralandım, əmu, tez gəl.

Cəvanəm, həsrətü naşad,
Qəribəm, xanəsi bərbad,
Düşüb atdan yerə damad,
Yaralandım, əmu, tez gəl.

Salub atdan məni üdvan,
Edüblər qanıma qəltan,
Məni dərk et, Şəhi-dövran,
Yaralandım, əmu, tez gəl.

Yetiş fəryadə, ey Sərvər,
Alıbdur canımi qəmlər,
Sinəmdə at çapar ləşkər,
Yaralandım, əmu, tez gəl.

Bəyan et növhə sən, Nadim,
Çıxub əflakə fəryadım,
Gəl, ey Sultanım, imdadım,
Yaralandım, əmu, tez gəl.

## Ey əmu, fəryadə gəl

Ey əmu, fəryadə gəl doğranmamış, canım həray,
Su kimi cari olur ətrafıma qanım, həray.

Göz yaşım cari olub rüxsarimə qəmdən, əmu,
Qan ilən məmzuc axar fəvvarə didəmdən, əmu,
Gedərəm, kəsdim əlaqəm mən bu aləmdən, əmu,
Müntəzir gözlər səni çü çeşmi-xunbarım, həray.

Gözlərim gözlər yolun, sən gəlməyincə ölmərəm,
İxtiyarım getdi əldən, gəl, yoluvı gözlərəm,
Gül cəmalun görməsəm axır nəfəs, can verмərəm,
Rahuvı gözlər gözüm, yet dadə, Sultanım, həray.

Mərhəmət eylə, əmu, gəl, verdigün qurbanə bax,
Gör, necə məstanə canın tapşurub Cananə, bax,
Gör, nə növ`i olmuşam əlvan bu gün al qanə, bax,
Şövq ilə yetdi təmamə əhdü peymanım, həray.

*Əfrad*

Yetiş hərayə, əmu, bircə al kənarə məni,
Müyəssər olsa, hənut et, yetir məzarə məni.

Bu çöldə yoxdı bilürsən atam, hərayə gələ,
Yetimi-bipədərəm, gəl, mənə himayət elə.

Gözüm yaşinə, əmu, rəhm elə, səni Tari,
Apar cənazəmi bikəs anam görə, bari.

Əcəl məni, görürəm, azimi-cinan edəcək,
Di, gəl, bu gün qabağından, əmandı, kölgəyə çək.

*Baqiyi-növhə*

Gör, necə al qanə əlvan eyləyüblər Qasimi,
Parə-parə, zarü giryan eyləyüblər Qasimi,
Qövmi-dun halı pərişan eyləyüblər Qasimi,
Qaldı gözyaşlı, qərib, xanəsi viranım, həray.

Eylədi məhrum ədu, feyzi-vüsalından məni,
Sərfəraz et gəlmək ilə, gül cəmalından məni,
Ol qədr yarə vırub ə`da, salıb dildən məni,
Dəmbədəm artar, əmandur, dərdü tüğyanım, həray.

Vüs`əti-meydan, əmu, oldı mənə künci-qəfəs,
Səslərəm qəşş halətində mən səni axır nəfəs,
Həqq rizasinə, əmucan, ver səsimə, bari, səs,
Gül yüzün bir də görüm, ey Şahi-ətşanım, həray.

Ey olan dünyavü üqbadə pənahı Nadimin,
Şö`ləvər oldı, ucaldı ərşə ahı Nadimin,
Əfv elə, ey Şahi-din, çoxdur günahı Nadimin,
Hər günahə bu qələmdür əldə dərmanım, həray.

**Cənab Qasimün dilindən**

Ə`da məni nəfəsdən saldı, həray, əmucan,
Mürği-dilim qəfəsdən aldı, həray, əmucan.
Sərdar əmu, əmandur, halım sənə əyandur,
Tabü təvanım ə`da aldı, həray, əmucan.

Atdan salublar ə`da, tez gəl, əmu, imdadə,
İmdad elə, əmandur, bu bikəsü naşadə,
Seyd olmuşam, əmandur, min qan tökən səyyadə,
Ə`da məni nəfəsdən saldı, həray, əmucan,
Mürği-dilim qəfəsdən aldı, həray, əmucan.
Sərdar əmu, əmandur, halım sənə əyandur,
Tabü təvanım ə`da aldı, həray, əmucan.

Sədparəyəm, yıxıldım qan üstə, cism xəstə,
Cismim düşüb yaralı bihiss topraq üstə,
Et mərhəmət, əmandur, al başımı diz üstə,
Ə`da məni nəfəsdən saldı, həray, əmucan,
Mürği-dilim qəfəsdən aldı, həray, əmucan.
Sərdar əmu, əmandur, halım sənə əyandur,
Tabü təvanım ə`da aldı, həray, əmucan.

Yox Müctəba bu çöldə cənazəm üstə gəlsün,
Xüşk eyləsün yaramı, başım diz üstə alsun,
Bu can verən zəmanda yarü müinim olsun,
Ə`da məni nəfəsdən saldı, həray, əmucan,
Mürği-dilim qəfəsdən aldı, həray, əmucan.
Sərdar əmu, əmandur, halım sənə əyandur,
Tabü təvanım ə`da aldı, həray, əmucan.

Rəhm et mənə, yetiməm, ey Şahi-din, əmandur,
Gəl, yola sal, vida et, öz başuva dolandur,
Başım qanı üzarə cari olub, rəvandur,
Ə`da məni nəfəsdən saldı, həray, əmucan,
Mürği-dilim qəfəsdən aldı, həray, əmucan.
Sərdar əmu, əmandur, halım sənə əyandur,
Tabü təvanım ə`da aldı, həray, əmucan.

Qanı olan hənası dari-fənadə Qasim,
Nakam ölən yaralı Kərbübəladə Qasim,
Bikəs qalan Hüseyni səslərdi dadə Qasim,
Ə`da məni nəfəsdən saldı, həray, əmucan.
Mürği-dilim qəfəsdən aldı, həray, əmucan.
Sərdar əmu, əmandur, halım sənə əyandur,
Tabü təvanım ə`da aldı, həray, əmucan.

Vardur həyat əlində, et ahü nalə, Nadim,
Yaz misreyi-müsibət, əldə məqalə, Nadim,
Sən Qasimün o halın sal bir xəyalə, Nadim,
Yaz həsrətim gözümdə qaldı, həray, əmucan,
Ə`da məni nəfəsdən saldı, həray, əmucan.
Mürği-dilim qəfəsdən aldı, həray əmucan.
Sərdar əmu, əmandur, halım sənə əyandur,
Tabü təvanım ə`da aldı, həray, əmucan.

## Qasimi-cəvan gəldi

Dur, gəl, ey bacı Zeynəb, Qasimi-cəvan gəldi,
Cövr ilə bu Minadə qan həna yaxan gəldi.
Yetdi ömrün itmamə, lə`nət olsun əyyamə,
Heyf, yetmədün kamə, mövsümi-fəğan gəldi.

Sədparədür cismi, doğranubdur ə`zası,
Toy hənası qan oldı, başlanub, bacı, yası,
Qan ilə olub əlvan çeşmi-paki-rə`nası,
Bir qəribü nakamü zarü biməkan gəldi.

Qaninə olub qəltan, doğranub cəvan oğlun,
Qan ilə olub əlvan həsrəti-məkan oğlun,
Neçün bəs həna yaxmış qan ilə cəvan oğlun?
Gülşənə qalub həsrət bülbüli-cəhan gəldi.

Söylə ki, Şəhi-ətşan, getdi cismi-sədparə,
Qan ilə olub əlvan, cisminə yetüb yarə,
Yetüb gülşənə möhnət, işrət üz verüb xarə,
Qətligahi-Minadə cismi doğranan gəldi.

Sənə, ey bacı, Zeynəb, hərçi yüz verüb möhnət,
Kərbəladə zibh olmaq çün bizə olub qismət,
Toy libası damadın oldı qanlı bir xəl`ət,
Toy təbağı zülm ilə ləxtə-ləxtə qan gəldi.

Çıxdı Əhli-Beyt dışra, cümləsi təmam al qan,
Gördülər gəlür damad qan ilə olub əlvan,
Başladı hərə bir-bir cürbəcür edüb əfğan,
Qasim ilə xunalud Şahi-insü can gəldi.

*Əfrad*

Səriyyə şur ilə çəkdi fəğani-“va vələda”,
Dedi, yəman günə qaldım bu çöldə Bari-Xuda.

Bunilə eylər idim naümidimi dilşad,
Ki, axırı edərəm bu yetimimi damad.

Bu qövmi-dun elədi yaxşı naümid məni,
Cəfa ilə susuz öldürdülər bu çöldə məni.

*Təmamiyi-növhə*

Nadimün olub zarü xuncigər, fəğan eylər,
Cari eyləyür gözdən ruyinə çün əşki-tər,
Gördi Qasimün nə`şün, ol əzizi-Peyğəmbər,
Söylədi, bacı, Zeynəb, qan həna yaxan gəldi.

**Cənab Qasim dilindən**

Saldılar məni atdan əşqiya, eyləyüb xizab qan həna məni,
Başımı kəsər qövmi-bihəya, dərk et, ey Şəhi-Kərbəla, məni.

Dövrəmi ədu yeksər aldılar, tapdılar ədu fürsət, ey əmu.
Qətlimə hücumavər oldular, bu güruhi-biqeyrət, ey əmu.
Bir də istərəm gül yüzün görəm, verməz əşqiya möhlət, ey
əmu.
Peykərim ədu xakə salmamış, tap, Şəhənşəhi-Neynəva məni.

Tapşurub, əmu, can verən zaman, bu yetimini Müctəba sənə,
Qalmayub bu gül cismdə rəməq, tab edəm dəxi cövri-düşmənə,
Başımı kəsər qatilim susuz, eyləsən əgər mərhəmət mənə,
Gəl, xilas elə cövri-kindən, həm də qəmdən et, gəl, rəha məni.

Bülbüli-qəməm, gülməz heç yüzüm, düşmərəm dəxi gül sorağına,
Artırar yaram suzişini gün, gəl, apar məni qəm otağına,
Halımı əgər bilmək istəsən, Qasimün yetüb can dodağına,
Xeymədə, apar, can verən zaman, ağlasun anam bir zaman məni.

Gəl, gör, ey əmu, gül rüxüm solub, parə-parədür cismi-növrəsim,
Şəhla gözlərim qan ilə dolub, səslərəm, sənə yetməz heç səsim,
Xeymədə anam müntəzir qalub, ondan özgə yox kimsə bir kəsim,
Can verən zaman, gəl, vüsalə yet bir də, barı, sən et vida məni.

Can ilən, Əkbər, razıyam özüm, təşnə can verəm Kərbəladə mən,
Razı olma sən icz edim, əmu, can verəndə, əhli-inadə mən,
Parə-parəyəm, qan içindəyəm, qoyma tək qalım bu aradə mən,
Həqq rizasinə, xeyməyə apar, Padşahi-gülgunqəba, məni.

Nadimün gərək eyləsün nəva, tə`ziyə dutub ağlasun sənə,
Mahi-mühərrəmi saxlayub əza, şur ilə cigər dağlasun sənə,
Növhə zikr edüb, zakirün olub, ruzü şəb əza saxlasun sənə,
Söləsün mükərrər bu mətləbi, dərk et, ey Şəhi-Kərbəla məni.

**Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum**

Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum,
Kəsilim payüvə qurban, əmu, qurbanun olum,
Can, əmu, qurbanun olum.

Gəl, çevir başuva, rahət elə qəmdən məni sən,
Ver icazə, yola sal, salma rəqəmdən məni sən,
Gəl, xəcalət eləmə əhli-hərəmdən məni sən,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Gözümün yaşinə rəhm eylə, məni etmə məlul,
Mən yetimi, əmu, qurbanlığa, gəl, eylə qəbul,
Məni mə`yus eləmə, hörməti-Zəhrayi-bətul,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Belimə bağla qılıc, mərhəmət eylə, yola sal,
Halimə mərhəmət et, bipədərəm, könlümi al,
Çəkmisən zəhmətimi, ey Şəhi-din, eylə həlal,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Səni gözyaşlı qəsəm verrəm İmami-Həsənə,
Müctəba xatirinə, ey əmu, rəhm eylə mənə,
Məni qurban verüb axir quzı qurbanı sənə,

Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Çox düşüb başimə sövdayi-Peyəmbər görüşi,
Övn ilə Fəzl ilə Əbbas ilə Cə`fər görüşi,
Gözi həsrət toya, toy görməyən Əkbər görüşi,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Əmu, Əbbas öləli səbrü qərarım kəsilüb,
Zindəganlıq nedirəm, buteyi-barım kəsilüb,
Qalmayub yarü müin, söhbəti-yarim kəsilüb,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Leyliyi-qəmzədənün başinə küllər ələnüb,
Haşimi xallı Əli Əkbəri qanə bələnüb,
Qasimin Əkbər öləndən sora səbri tükənüb,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Olmusan razi məgər, mən sənə qurban yazılım,
Dəftəri-qəmdə müdam həsrətü giryan yazılım,
Məcməi-Kərbübəladə ləbi ətşan yazılım,
Ver mənə rüxsəti-meydan, əmu qurbanun olum.
Can, əmu, qurbanun olum.

Nə`şim üstə mənə xoşdur anamın ağlamağı,
Baş açub başımun üstündə cigər dağlamağı,
Razıyam, olmasa mümkün gözümi bağlamağı,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

Göz yaşın Nadimi-biçarə gərək qan eləsün,
Namurad ölməgimi xəlqə nümayan eləsün,
Baş açub, sinə vırub göz yaşını qan eləsün,
Ver mənə rüxsəti-meydan, əmu, qurbanun olum.
Can, əmu, qurbanun olum.

**Ölürəm, əmu, tez gəl**

Ey insü cin İmamı, ölürəm, ölürəm, əmu, tez gəl,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.

Atam yoxdı, yetiməm, başım üstə gəleydi,
Bu can verən zəmanda dərdi-dilim bileydi,
Bu yaralı başımı dizi üstə aleydi,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

Çoxdur yaram, əmucan, dura bilməm əyağə,
Yaralıyam, düşübdür könlüm bu iştiyaqə,
Apar, canim verəndə anam alsun qucağə,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

Bu Kərbəla çölində cismim qalub aradə,
Gözüm qalub yolunda, tez gəl, əmu, imdadə,
Başım cəllad əlində, yalvarıram cəlladə,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

Çoxdur cismim yarası, yoxdı səbrü qərarım,
Dura bilməm əyağə, yox əldə ixtiyarım,

Tez gəl, olub mübəddəl xəzanə növbəharım,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

Yox səndən özgə yarım, imdad et mən biyarə,
Gəl, gör, məni nə növ`i eylüblə parə-parə,
Sölə, anam Səriyyə dutsun təbağı qarə,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

Yoxdur atam yetiməm, gülməz yüzüm dünyadə,
Şad olmaram ölüncə, yox yetən bir imdadə,
Seyd olmuşam yaralı min qan tökən səyyadə,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

Çoxdur yaram, əmucan, gəlməz həddi-şümarə,
Qaldı anam oğulsuz, netsün* o bəxti qarə,
Apar can halətində anam alsun kənarə,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

Can üstəyəm, qəribəm, özün yetiş hərayə,
Bikəs görüb alublar qatillərim arayə,
İstər başımi kəssün düşmən vırsun cidayə,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

---

* Nə etsin

Düşdükcə yadə, Nadim, bu Qasimün əzası,
Səslərdi, yet hərayə, ey məzlumlar mövlası,
Qan oldı Kərbəladə zülm ilə toy hənası,
Könlüm istər anamı, ölürəm, ölürəm, əmu, tez gəl.
Susuzam, yanıram, əmu, tez gəl.

**Yaralandım, yetiş dadə**

Yaralandım, yetiş dadə,
Əmucan, əl-əman, öldüm.
Atam yox gəlsün imdadə,
Hərayə gəl, əman, öldüm.

Çəməndə gül kimin soldum,
Dutuldum, dəstgir oldum,
Sitəmkarə əsir oldum,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Ədulər dövrəmi aldı,
Vırub atdan yerə saldı,
Dəhanım qan ilə doldı,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Mənim dadü pənahimsən,
Ümidim, dadxahimsən,
Əman verməz mənə düşmən,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Gözümdən yaş olub cari,
Hərayə gəl, səni Tari,
Məni çək kölgəyə, bari,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Yaram hədsizdi, san verməz,
Gözüm həsrətdi, can verməz,
Mənə düşmən əman verməz,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Nişanəm tirü peykanə,
Boyandım lalətək qanə,
Yıxublar qanlı meydanə,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Əsirəm əldə səyyadə,
Başım tuş oldı cəlladə,
Əmandı, tez gəl imdadə,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Yaralandım, yaram çoxdur,
Firaşım nizəvü oxdur,
Səsimə səs verən yoxdur,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Solub gül qönçə çağında,
Gözüm ağlar fəraqında,
Qalub atlar əyağında,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

Bu şərhi Nadimi-naçar,
Qələm əldə yazub ağlar,
Salub atdan məni küffar,
Əmucan, əl-əman, öldüm,
Hərayə gəl, əman, öldüm.

**İmam Hüseyn (ə)-ın dilindən**

Aldılar səni əlimdən, doydum imdi canə, Qasim,
Bilmirəm nə etmişəm mən əhli-kufəyanə, Qasim.

Aldılar səni əlimdən, qardaşım nişanəsiydün,
Müctəbanun axır aləm içrə nuri-didəsiydün,
Qəlbimün təsəllisiydün, mayeyi-bəhanəsiydün,
Cismüvi xizab edüblər əhli-kinə qanə, Qasim.

*Fərd*

Səni görəndə mən, ey növgüli-bəlayi-mühən,
Belə güman edirəm ölməyüb İmami-Həsən.

*Baqiyi-növhə*

Cismi-paküvə ədulər zülmi-bihesab edüblər,
Zülfi-mişkbarun, oğlum, qan ilə xizab edüblər,

Firqətündə, gör, nə növ`i qəlbimi kəbab edüblər,
Navəki-bəlayə cismün etdilər nişanə, Qasim.

*Fərd*

Əyağə dur, aparım xeyməyə səni-zari,
Anan doyunca görə bir də gül yüzün, bari.

*Baqiyi-növhə*

Aldılar səni əlimdən, qalmadı müinü yavər,
Öldi əqrəba təmamən, qalmayub bircə bəradər,
Can gözüm önündə verdi təşnələb Əliyyü Əkbər,
Madərün salubdı şivən, gör, necə cəhanə, Qasim.

*Fərd*

Boyandı qanə hamı yarü yavərim, getdi,
Nə var oğul, nə bəradər, köməklərim getdi.

*Baqiyi-növhə*

Mən necə verim təsəlli Əhli-Beyti-zarə sənsiz,
Eyləmə güman cəhanda ömr edəm dübarə sənsiz,
Mən oğulsızı edərlər imdi parə-parə sənsiz,
İtrətim əsir olallar Şimr ilə Sinanə, Qasim.

*Fərd*

Səni görüb qurı yerdə qəddim düta oldı,
Əsüb səmumi-sitəm, qönçə güllərim soldı.

*Baqiyi-növhə*

Badi-zülm əsüb bu çöldə, qönçə güllərim solubdur,
Cismüvə yetübdi yarə, qan ilə xizab olubdur,
Açmasan* gözün neçün bəs, yoxsa qan ilə dolubdur?
Dur, danış mən ilə axır, bir də gəl bəyanə, Qasim.

*Fərd*

Salubdı nitqdən ə`da, oğul, bu gül bədəni,
Bu hal ilə aparım mən necə xiyamə səni.

*Baqiyi-növhə*

Eylərəm fəğanü nalə Şimr ilə Sinan əlindən,
Cayi-busə yox yüzində tiği-cansitan əlindən,
Ömrdən usandım axır cövri-kufəyan əlindən,
Döndərüb müsibət axır qədimi kəmanə, Qasim.

*Fərd*

Hərayimə hanı bəs yarü yavərim gəlsün,
Xəbər verün boyanan qanə Əkbərim gəlsün.

*Baqiyi-növhə*

Zəxmi-bişümar əlindən qalmayub əlündə tabun,
Vermisən** səsimə səs, mən gözlərəm, oğul, cəvabun,

---

* Açmazsan
** Vermirsən

Səbrimi əlimdən axır aldı zəxmi-bihesabun,
Cismüvi edüblər əlvan əhli-kinə qanə, Qasim.

*Fərd*

Doyubdı canə əmün əşqiya cəfasından,
Kənarə saldı ədu xişü əqrəbasından.

*Təmamiyi-növhə*

Hər qədr həyatun olsa, ağla bu əzadə, Nadim,
Bu yetimə növhə eylüb, sal qəmini yadə, Nadim,
Qismət olsun ağla bir də səhni-Kərbəladə, Nadim,
Aldılar səni əlimdən doydum imdi canə, Qasim.

**Novərusun dilindən**

Əzm etmə rəzmi-meydanə, Qasim,
Rəhm et ərusi-nalanə, Qasim.

Həşrətək ağlar eşqündə didəm,
Yox dadxahım, çün naümidəm,
Axır əzizi-Şahi-vəhidəm,
Yoxdur dəvamım hicranə, Qasim.

Mən bir əliləm, sərdar əmoğlı,
Didəm olubdur xunbar, əmoğlı,
Ağlar ərusi-naçar, əmoğlı,
Eşqündə gəlləm əfğanə, Qasim.

Sərdar atamun yoxdı pənahi,
Qanə batubdur hər dadxahi,
Gəl, qoyma tənha ol Padşahi,
Et bir nəzər ol Sultanə, Qasim.

Çoxdur bu çöldə qövmi-sitəmkər,
Əllərdə dutmuş şəmşirü xəncər,
Alsa səni də əldən bu ləşkər,
Bax, çoxdı, qövmi-üdvanə, Qasim.

Mən bəxti qarə qandur duvağım,
Talan edəllə bu toy otağım,
Bu çöldə keçdi cəbrən çırağım,
Döndi hənamız al qanə, Qasim.

Bisər düşübdür meydanə Əkbər,
Oldı nişanə peykanə Əsğər,
Yasə batubdur Ali-Peyğəmbər,
Yeksər gəlüblər əfğanə, Qasim.

Olsun şədid, ol Şimrün əzabı,
Həqqə nolur məhşərdə cəvabı?
Dəstimə ə`da vırar tənabı,
Cismün düşən dəm meydanə, Qasim.

Yox bircə kimsə imdadə gəlsün,
Sərdar əmümün qanını alsun,
Get, qoy, ərusun gözyaşlı qalsun,
Canun fəda et Cananə, Qasim.

Sən, get, fəda et, Cananə canun,
Qoy, zinət olsun meydanə qanun,
Viranələrdə mən növhəxanun,
Gəlləm həmişə əfğanə, Qasim.

Əldə qələm, ey dilparə Nadim,
Göz yaşını tök rüxsarə, Nadim,
Söylər ərusi-biçarə, Nadim,
Getmə, əmandur, meydanə, Qasim.

**Bu toy libasun, olsun mübarək**

İşrət əsasun, olsun mübarək,
Bu toy libasun, olsun mübarək.

Ərşə çıxubdur ahi-yetiman,
Damad batubdur al qanə əl`an,
Eylər ərus fəryadü əfğan,
Bu çöldə heç toy olmaz mübarək.

Eylə sifarişi gəlsünlə yeksər,
Əbbasü Övnü Fəzl ilə Cə`fər,
Gəlsün mübarəkbadlux verənlər,
Bu toy libasun olsun mübarək.

Ey binəvavü zarü mükəddər,
Qanə batubdur cismim sərasər,
Aramım aldı əldən bu ləşkər,
Bu çöldə heç toy olmaz mübarək.

Tazə ərusun giryan olubdur,
Gözyaşlı nə`şün üstə gəlibdür,
Dur, toy otağun viran olubdur,
Bu toy libasun olsun mübarək.

Məcruh olubdur zülm ilə canım,
Toprağı əhmər eylübdi qanım,
Durmaxla yox tabü təvanım,
Bu çöldə heç toy olmaz mübarək.

Gördüm ki, meydandur toy otağun,
Əlvan edibdür qan əl-əyağun,
Çün ləxtə-ləxtə qandur təbağun,
Bu toy libasun olsun mübarək.

Xəncər yarası ki, saldışındur,
Sölə, əmoğlu, kim solduşundur?
Bircə dur, əgləş, son görüşündür,
Bu çöldə heç toy olmaz mübarək.

Salduş yatubdur sağımda Əkbər,
Soldış boyanmuş qan ilə Əkbər,
Eyləllə əfğan Ali-Peyəmbər,
Bu çöldə heç toy olmaz mübarək.

Nari-cəfayə yandı otağun,
Talan olubdur əlvan təbağun,
Yaxmuş həna al qan əl-əyağun,
Bu toy libasun olsun mübarək.

Ali-Peyğəmbər giryan olublar,
Gözyaşlı bəzmi-işrətə gəlüblər,
Cümlə mübarəkbadlux verəllər,
Bu toy libasun olsun mübarək.

Xoş gəlmisüz bu bəzmi-əzayə,
Növhə edün bu növkədxudayə,
Dəstim batubdur qandan hənayə,
Bu çöldə heç toy olmaz mübarək.

Gülzarə yetdi ölüm həvası,
Gülşəndə gəlməz bülbül sədası,
Bu dillər ilə söylər anası,
Bu toy libasun olsun mübarək.

Sən də bu növ`i dünyadə, Nadim,
Növhə edüb, gəl fəryadə, Nadim,
Ol növcəvanı sal yadə, Nadim,
Bu çöldə heç toy olmaz mübarək.

**Ərusun dilindən**

Olan işrət hənası qan, əmoğlı,
Qalan toy hicləsi viran, əmoğlı.

Olubdur didəsi giryan ərusun,
Edibdür göz yaşın ümman ərusun,
Qalubdur bikəsü nalan ərusun,
Yaralı nə`şüvə qurban, əmoğlı.

Qəribəm, bir nəfər yoxdur həvadar,
Müsibətdən həyatım oldı zinhar,
Qolımı bağlayublar ceyşi-xunxar,
Əsir eylüb məni üdvan, əmoğlı.

Səni əlvan edüblər qan hənayə,
Cəfa qıldı ədu növkədxudayə,
Vırublar başuvı növki-cidayə,
Edüblər qanuva əlvan, əmoğlı.

Şəhid eylüb ədu Şahi-cəhani,
Dutub şivən sədası asimani,
Edüblər dəstgir Ali-Əbani,
Qalubdur əmmələr giryan, əmoğlı.

Bizə toy eylədi Şahi-Mədinə,
Ver ərus əlin damad əlinə,
Vırub zənciri-kin tazə gəlinə,
Edüblər zivərün talan, əmoğlı.

Bu növ`i hansı toy yasə dönübdür?
Cəfadən toy hənası qan olubdur,
Sənüntək hansı damad doğranubdur?
Olub toy xəl`əti al qan, əmoğlı.

Qolum bağlı çəkəllər hər diyarə,
Mənimtək yox cəhanda bəxti qarə,
Dutar bu qissədən qəlbim şərarə,
Nedim axır məni-nalan, əmoğlı.

Bu çöldə doğranub şəhzadə Əkbər,
Nişan oldı dəmi-peykanə Əsğər,
Qalub Ali-Əli bu çöldə bisər,
Eyləllə şur ilə əfğan, əmoğlı.

Mənə rəhm et, dəxi yoxdur pənahım,
Bu çöldə doğranubdur dadxahım,
Yoxumdur səndən özgə bir pənahım,
Oyan, qıl dərdimə dərman, əmoğlı.

Tökər göz yaşını Nadim yüzinə,
Vırar hər bəzmdə şur ilə sinə,
Budur bais, əza saxlar Hüseynə,
Qələm əldə edər əfğan, əmoğlı.

**Xoş gəldün, əmoğlı**

Qurban kəsilim aduva, xoş gəldün, əmoğlı,
Allah yetişə daduva, xoş gəldün, əmoğlı.

Yaxşı mənə toy eylədin, olsun evün abad,
Saldım başıma qarə, toyumda məni-naşad,
Ya Rəb, bu necə toydı, batub qanına damad,
Xaliq yetişə daduva, xoş gəldün, əmoğlı.

Toyda geyinər rəsmdür hər tazə gəlin, al,
Zivər eləyüb tazə gəlin başə salar şal,
Bu möhnəti-qəm bülbüli-şeydanı edüb lal,
Qurban evi bərbaduva, xoş gəldün, əmoğlı.

Sən yax əlüvə qandan həna, ey güli-ənvər,
Sədparə salan vəqt səni meydanə bu ləşkər,
Zülfüm elərəm mən də həmən qan ilə əhmər,
Rəhm eylə bu naşaduva, xoş gəldün, əmoğlı.

Qanə bələşən vəqtdə ol cismi-əzizün,
Gözyaşlı gələr başıvun üstə bu əzizün,
Bu növ`ilə yas oldı toyı hansı əzizün?
Lə`nət gələ cəlladuva, xoş gəldün, əmoğlı.

Mən xarü zəlil oldum əcəb Kərbübəladə,
Bu vəqtdə çün oldum əsir əhli-inadə,
Şamə gələrəm başıvun ardınca piyadə,
Rəhm et dili-naşaduva, xoş gəldün, əmoğlı.

Düşmən məni soysa, çağırım bəs kimi dadə?
Yaxşı evimi yıxdı fələk Kərbübəladə,
Gəl, olma riza yalvarım ol əhli-inadə,
Qurban qədi-şümşaduva, xoş gəldün, əmoğlı.

Nə`şün yıxılan vəqtə, başun üstünə gəlləm,
Başun dizimin üstə alub zülfümi yollam,
Qasim deyübən şamü səhər ağlaram, ölləm,
Sən də məni sal yaduva, xoş gəldün, əmoğlı.

Nadim, elə sən şur ilə hər bəzmdə əfğan,
Cari elə rüxsaruva əşkün ilə al qan,
Damadi-Hüseyn verdi o səhradə susuz can,
Sal sən bu sözi yaduva, xoş gəldün, əmoğlı.

**Ərusun dilindən Qasimə***

Bu qəmgin haluva qurban, əmoğlı,
Gəl, olma azimi-meydan, əmoğlı,

Mənə rəhm et, çıxar əflakə ahım,
Bu gün yox səndən özgə bir pənahım,
Ölübdür qardaşım, yox dadxahım,
Tərəhhüm et mənə, ətşan əmoğlı.

Gözümdə əşki-qəm, sinə giriban,
Olubdur qüssədən qəlbim hərasan,
Bu əhli-Kufə əldə tiği-bürran,
Edəllər qanuva əlvan, əmoğlı.

Nəzər qıl bir, əmoğlı, göz yaşıma,
Ölub Əkbər, qarə sallam başıma,
Bu çöldə qaldım həsrət qardaşıma,
Olubdur adətim əfğan, əmoğlı.

Səni, getsən, şəhid eyləllə üdvan,
Toy otağun qalar zülm ilə viran,
Edər toyxanəvi əhli-kinə qan,
Edəllər hicləmi talan, əmoğlı.

Gözi yaşlı qalar nalan ərusun,
Edər həşrə kimi əfğan ərusun,
Riza olma ola giryan ərusun,
Sənə qurban məni-nalan, əmoğlı.

---

* «Sinəzən əz zəbani-ərus bə Qasim»

Mənə rəhm etgilən, zarü həzinəm,
Qəribü bikəsəm, bir bimüinəm,
Mən axır düxtəri-Şahi-zəminəm,
Bu çöldə qalmışam heyran, əmoğlı.

Yetüb fəsli-xəzan, solubdı güllər,
Bu çöldə doğranub qardaşım Əkbər,
Batıbdur qanına qundaği-Əsğər,
Olubdur qan ilə yeksan, əmoğlı.

Əmumi öldürüblə əhli-kinə,
Su camı əldə ağlayar Səkinə,
Salublar qollarun ruyi-zəminə,
Qalubdur Əhli-Beyt ətşan, əmoğlı.

Bu çöldə adətim əfğan olubdı,
Müsibətdən bu könlüm qan olubdı,
Nəzər qıl, gör, necə tənha qalubdı,
Əzizü sərvəri-dövran, əmoğlı.

Yanar həşrə kimi bu qəmdə canım,
Gedüb əldən Əli Əkbər cəvanım,
Dəxi yox səndən özgəyə gümanım,
Edər, getsən, qəmim tüğyan, əmoğlı.

Bu qəmdə ağlayar biçarə Nadim,
Tökər əşki-bəsər rüxsarə Nadim,
Gələr hər bəzmdə göftarə Nadim,
Edər bu möhnəti e`lan, əmoğlı.

**Ey dəşti-Kərbəladə qurban olan əmoğlı**

Ey dəşti-Kərbəladə qurban olan əmoğlı,
Zülm ilə toy hənası al qan olan əmoğlı.

Bu Kərbəla çölündə yaxşı muradə yetdün,
Olsun evün çox abad, niskilli bir toy etdün,
Biçarə növərusun şurü nəvayə gətdün,
Toy bəzmi-Kərbəladə viran olan əmoğlı.

Etdün məni fəramuş yaddan nə tez bu çöldə,
Olsun başıma topraq, yox ixtiyarım əldə,
Toy həsrətün ölüncə niskil olar bu dildə,
Zülm ilə hicləgahi talan olan əmoğlı.

Gülşəndə bülbül eylər nəşvü nüma gül ilə,
Aç gözlərün danış bir, mən zarü xundil ilə,
Gəldim bu Kərbəlayə, mən bir bölük el ilə,
İmdi olubdı karım ahü fəğan, əmoğlı.

Nə növ`i səbr edim mən hicranə qürbət eldə,
Qəmdən ərusi zarü giryan olan, əmoğlı.

Tab eyləsün ərusun nə növ`i sərzənişə,
Zülm ilə toy hənası al qan olan, əmoğlı.

Bu rəsmdür, gələnlər toyda geyəllər əlvan,
Bu qarəli ərusun heyran olan, əmoğlı.

Gözdən töküb sirişkim, qıllam həmişə nalə,
Ey gün önündə cismi suzan olan, əmoğlı.

Yaz bu kəlami, Nadim, eylə fəğanü nalə,
Cismi-şərifi başsız üryan olan, əmoğlı.

**Yetiş imdadimə, sərdarım əmu**

Yaralandım, yetiş imdadimə, sərdarım əmu,
Boyanub qanım ilə səfheyi-rüxsarım, əmu.

Çox ağırdur yaram, əl`an məni, gəl, qan aparur,
Ruhimi məclisi-Cananıma mehman aparur,
Qasimün qəşş eləyür, huşə gəlür qan aparur,
Yetiş imdadimə, ey qəm güni qəmxarım, əmu.

Qan axur yarələrimdən, əmu, fəvvarəsifət,
Qan içində əl-əyaq çalmağıma vardı cəhət,
Bənd-bəndindən olub, parələnüb cismü cəsəd,
Çox çəkər həsrətüvi dideyi-xunbarım, əmu.

Yarələr suzişi qoymub, əmu, məndə dəxi tab,
Gün önündən məni, gəl, kölgəyə çək, eylə səvab,
Başımı kəsməgə qatillərim eyləllə şitab,
Qoyma kəssün başımı qatili-xunxarım, əmu.

Mürği-bibalsifət saldı ədu damə məni,
Əmu, qan ləxtələnüb, incidür əmmamə məni,
Quruyub, incidi bu qanə batan camə məni,
Saralub qönçəsifət gülrüxü gülnarım, əmu.

Müctəba xatirinə, gəl, məni ağuşuva al,
Ayrılıq mövsimidür, qollaruvı boynuma sal,
Gəl, görüm gül yüzüvi, can verürəm, eylə həlal,
Ələ düşməz dəxi bir də belə didarım, əmu.

Yaralı seyd eləyibdür məni səyyadım, həray,
Eylərəm nalə, yetişməz sənə fəryadım, həray,
Səngdildür, mənə rəhm etmiri cəlladım, həray,
Kəsmək istər başımı qatili-cəbbarım, əmu.

Gözümün yaşı dönüb qanə, yaram suzişi var,
Yox dəxi tabü təvanım, kəsilüb səbrü qərar,
Nə`şimi qoyma bu düşmənlər içində ola xar,
Dövrəmi zağü zəğəntək alub əğyarım, əmu.

Kufənün əhli, həyatı mənə zinhar elədi,
Gözümə ruzi cəfa ilə şəbi-tar elədi,
Cismimi tiri-cəfa qan ilə gülnar elədi,
Qaldı gözyaşlı müdam madəri-naçarım, əmu.

Nadimim əldə qələm həşrə kimin ağlayacaq,
Madəri-bivətənim başə qəra bağlaycaq,
Şiələr mahi-mühərrəmdə əza saxlayacaq,
Vardı Nadim kimi gözyaşlı nəvakarım, əmu.

**Sinəzəni-cənab Qasim**

Rəhm eylə bu qəribü biəqrəbayə, Qasim,
Salma məni nəzərdən, getmə Minayə, Qasim.

Bu Kərbəla çölində gəlməz geri gedənlər,
Gültək batubdı qanə meydanda gül bədənlər,
Nəzm ilə yüzdə zülfün əbri-siyahmənzər,
Qorxum budur ki, batsun qandan hənayə, Qasim.

Sənsiz gələr fəğanə bu zarü biqərinə,
Getmə bu qanlı rəzmə, rəhm eylə, mən həzinə,
Aldı səni əlimdən, cövr ilə əhli-kinə,
Kim dadrəs olar bəs, mən binəvayə, Qasim.

Qurban ərusun olsun ol zülfi-mişkbarə,
Billəm ki, cismün ə`da eyləllə parə-parə,
Görsə səni o vəqtə başsız bu bəxti qarə,
Ali-Əba verəllə səda-sədayə, Qasim.

Olma riza ərusin dərdi-nihan, əmoğlı,
Gəlsün cənazən üstə etsün fəğan, əmoğlı,
Başun açub desün, ey hənası qan, əmoğlı,
İcz eyləyim nə növ`i mən əşqiyayə, Qasim?

*Əfrad*

Batubdur Əkbərimün qanə Haşimi xalı,
Qoyubdı naləkünan əndəlibi-bibalı.

Bu gün bu bəzmə gedənlər biri geri gəlməz,
Ölüblə qövmü qəbiləm, dəxi yüzüm gülməz.

Nə toydı bu ki, qəra eyləsün bunı Tarı,
Fəratun üstə susuz saldılar Ələmdarı.

Çəküb şərarə könül nari-firqətə yandı,
Babam Hüseynün əli üstə Əsğər oxlandı.

Sən olmasan, yəqin ə`da salar nizamə məni,
Qolumda ip, çəkəcək əhli-kinə Şamə məni.

*Baqiyi-növhə*

Gərçi özin rizasən biəqrəba ərusin,
Əhmər duvaq yerinə geysün qəra ərusin,
Gəlsün cənazən üstə, etsün nəva ərusin,
Naçar mən də razi ollam qəzayə, Qasim.

Bir səndəl üstə əgləş, mən bəxti qarə zülfün,
Şanə edüb dü hissə, sallam kənarə zülfün,
Qəltidə eyləyəllər qan ilə qanə zülfün,
Eylər üruc o vəqtə ahım səmayə, Qasim.

Etməz mənə məgər bəs, Əkbər qəmi kifayət,
Qəlbim açılmaz əsla, həddən ötüb müsibət,
Getsən, ədulər eylər, sənsiz mənə şəmatət,
Ə`da vıran zəmanda başun cidayə, Qasim.

Bu rəsmdür əruslər toyda geyəllə əlvan,
Damadə hiclə abad eyləllə misli-rizvan,
Payi-ərusin atda* zibh eyləyəllə qurban,
Döndi qərayə rəxtim, gəlləm hərayə, Qasim.

Bəsdür mənə bu möhnət, sərdar əmum ölübdür,
Badi-sitəm əsibdür, gülzari-din solubdur,
Ali-Əbanun əl`an kari fəğan olubdur,
Qarə geyüb batublar yeksər əzayə, Qasim.

Tirə nişan olubdur təşnə Əliyyü Əsğər,
Bir yanda parə-parə düşmüş Əliyyü Əkbər,

---

* Altında

“Va möhnəta” deyəllər biəqrəba hərəmlər,
Ali-Əba batubdur yeksər qərayə, Qasim.

Vardur hənuz həyatun, gəl şurü şeynə, Nadim,
Ağla bu növcəvanə, ağla Hüseynə, Nadim,
Qan etdi toy təbağın, yaz əhli-kinə, Nadim,
Sölə ərusə, rəhm et mən binəvayə, Qasim.

**Ərusun dilindən**

Gəl, getmə meydanə, növcəvan Qasim,
Yox hicrüvə tabım, getmə, əman, Qasim.

Rəhm eylə bu zarü nalan ərusə,
Dünya olar axır zindan ərusə,
Tə`nə edər axır üdvan ərusə,
Eşqün edir məni Şamə rəvan, Qasim.

Qurban olum sənə, gəl getmə meydanə,
Rəhm et bu ərusi-halı pərişanə,
Gər zülfü muyin batsa sənün qanə,
Qəmdən olar karım ahü fəğan, Qasim.

Dərdü qəm həddin ötdi müsibətdən,
Bu bir nişanədür ruzi-qiyamətdən,
Düşdüm kənarə mən bikəs, vilayətdən,
Ölübdür Əkbəri-şirinzəban, Qasim.

Axır nə edim, yoxdı bir dadgahım,
Tənha qalub bu çöldə padşahım,
Getmə, əmandur, bir sənisən pənahım,
Dərdü qəm olmuş qəmim əyan, Qasim.

İmdi ki, sən azim oldun bu meydanə,
Eylə vəsl, get məzari-nalanə,
Nə növ` səbr eyləyim bəs dərdi-hicranə,
Məni əsir etdi Şimrü Sinan, Qasim.

Dur, aç gözün, ey zari-dilparə,
Əsir olan vəqtə əşqiyavü əğyarə,
Rəhbər ol hər vəqt itrətü ənsarə,
O nə`şə həm əvəz ol sə`ylə cəvan Qasim.

Bu Nadimi-şeyda olmuş əzadarun,
Həsrət keçür görsün rö`yadə rüxsarun,
Çünki yəqin həşrə qaldı bu didarun,
Gəl, getmə meydanə, ey növcəvan, Qasim.

**Qum üstə yatma ətşan, əmoğlı**

Qum üstə yatma ətşan, əmoğlı,
Gəldi ərusun mehman, əmoğlı.

Gülzari-Heydər yeksər solubdur,
Əşk ilə çeşmi xunbar olubdur,
Ali-Peyəmbər bisər qalıbdur,
Kərbübəladə ətşan, əmoğlı.

Nazlı ərusun gəldi nəvayə,
İşrət libasun döndi qərayə,
Şivən salım, qoy, Kərbübəlayə,
Eşqündə ollam giryan, əmoğlı.

Ağlar qəmündə bimar ərusun,
Saxlar əzavı naçar ərusun,

Çün növhə eylər təkrar ərusun,
Məcnuni-eşqəm nalan, əmoğlı.

Lazımdı yatsun bülbül bağında,
Gülşəndə güllər lalə çağında,
Yoxdur neçün bəs solü sağında,
Çox vardı zəxmi-bürran, əmoğlı.

Qoy, bir öpüm bu qanlı dodağun,
Gültək solubdı ətşan dodağun,
Talan olub axır toy otağun,
Pozdı təbağın üdvan, əmoğlı.

Agah edim, qoy, bikəs anavı,
Gəlsün əlinə yaxsun hənavı,
Ta mən ölüncə sallam qəravı,
Qıllam həmişə əfğan, əmoğlı.

Virdim olubdur əfğanü nalə,
Saldun ərusün hicrü məlalə,
İcz ilə Nadim yazsun məqalə,
Şur ilə etsün əfğan, əmoğlı.

## Dadə gəl, sərdar əmu, sərdar əmu

Atdan yıxıldım, dadə gəl, sərdar əmu, sərdar əmu,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

Qanim tökübxunxar, əmu, qərq olmuşam dəryadə mən,
Tək qalmışam çün səslərəm axir səni imdadə mən,
Olma riza icz eyləyim bu qan tökən cəlladə mən,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

Lütf eylə, gəl fəryadimə, ey Padşahi-xuncigər,
Əlvan edüb öz qanimə bu ləşkəri-əhli-şərər,
Damə salublar seydtək bu qan tökən səyyadlər,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

Bu eşq Minasında mən, al qanə əlvan olmuşam,
Başımda var sövdayi-eşq, çün məsti-Canan olmuşam,
Məhbub Həqqə bəzl edim can, təşnə qurban olmuşam,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

Ey Kərbəla sultanı, gəl, əlvan edüb al qan məni,
İcma edüb ləşkər təmam, atdan salub üdvan məni,
Aldı arayə ahutək ətrafımı hər yan məni,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

Bir kəs gələn yox dadimə, ey Şahi-ətşanım, həray,
Rahində qaldı intizar bu çeşmi-giryanım, həray,
Təng oldı bu dünya mənə, pərvaz edər canım, həray,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

Mən bir yetimi-bikəsəm, dünyadə heç gülməz yüzüm,
Eyni-səadətdür mənə, olsam sənə qurban özüm,
Lütf eylə, imdadə yetiş, pak etgilən qandan gözüm,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

Bu Nadimi-məhzunü zar olsun növhəxan hər zəman,
Ruzi müsibət, sübhü şam göz yaşını eylər rəvan,
Can üstəyəm, əhvalıma rəhm eyləməz bu kufəyan,
Bari, əcəl dərk etməmiş dərk et məni, biyar əmu,
Sərdar əmu, sərdar əmu.

**Şəhi-dövran əmu, tez gəl**

Getdim dəxi əldən, Şəhi-dövran əmu, tez gəl,
Saldı məni atdan yerə üdvan, əmu, tez gəl.

Tez gəl, bu yetimin başı üstə oxu Qur`an,
Saldı məni sədparə, əmu, ləşkəri-üdvan,
Qurbandı bu canım sənə, ey Şahi-şəhidan,
Hər vəqtə olan dərdimə dərman, əmu, tez gəl.

Əl`an ölürəm, kimsə mənə ağlayan olmaz,
Meydanda mənim gözlərimi bağlayan olmaz,

Qaldım qurı yerlərdə, məzarə qoyan olmaz,
Qüslüm olu bu xaki-biyaban, əmu, tez gəl.

Sən olma riza Qasimi tənha görə üdvan,
Düşmənlər edüb laləsifət qanimə qəltan,
Çox yarə yetüb cismimə, ruhim çıxar əl`an,
Ey Şahi-cəhan, gərdişi-dövran, əmu, tez gəl.

Saldı məni atdan, əmu, bu əhli-şərarət,
Qurbanuvı zibh eyləyüri asiyi-millət,
Can nəğdi əlimdə yetişüb fəsli-şəhadət,
Təslim edərəm canımi əl`an, əmu, tez gəl.

Yox bircə nəfər dadrəs, ey Şahi-Mədinə,
Çün qanə batub şibhi-Nəbi, mahi-Mədinə,
Söylər o qərib madəri-məhzunü həzinə,
Nakam ölürəm, qəlbi pərişan, əmu, tez gəl.

Biçarə anam görmədi əhvalımı bilsün,
Mən ki, ölürəm, ağlayıban naləyə gəlsün,
Bu nə`şimün üstündə gəlüb zülfüni yolsun,
Qurbandı sənə Qasimi-ətşan, əmu, tez gəl.

Meydanda bu canım, əmu, qanə boyanubdur,
Bikəs anamın başına küllər ələnibdür,
Atlar əyağında bədənim parələnibdür,
Fəryadə yetiş, Şahi-şəhidan, əmu, tez gəl.

Naşad ölürəm dəhrdə mən həsrətü nakam,
Canda ətəşimdən dəxi heç qalmayub aram,

Əl`an başımun üstə babam əldə durub cam,
Mən getməliyəm cəddəmə mehman, əmu, tez gəl.

Zülm ilə səni qoydula çü bikəsü biyar,
Gəl, gör, necə gül cismim olub qan ilə gülnar,
Bu mətləbi Nadim edər hər bəzmdə izhar,
Getdim dəxi əldən Şəhi-dövran, əmu, tez gəl.

**Ərusun dilindən**

Rəhm et məni-zarə, ey mehriban Qasim,
Yox hicrüvə tabım, getmə, əman, Qasim.

Rəhm eylə bu zarü nalan ərusüvə,
Dünya olub axır zindan ərusüvə,
Qismət olar bəzmi-üdvan ərusüvə,
Eşqün edər məni Şamə rəvan, Qasim.

Qurban olum sənə, gəl getmə meydanə,
Rəhm et bu ərusi-hali pərişanə,
Bu muyi-zülfündən batsa əgər qanə,
Qəmdən olar karım ahü fəğan, Qasim.

Əlvan olub qanə nakam Əli Əkbər,
Peykani-üdvanə oldı nişan Əsğər,
Amadədür qətlüvə əhli-kin yeksər,
Getsən, dönər qanə işrəti-hənnan, Qasim.

Badi-xəzan əsüb soldurdı gülzarım,
Qəmdən həlak olar bu cismi-naçarım,
Yox səndən özgə bir müinü qəmxarım,
Hicrün bu qəddimi eylər kəman, Qasim.

Rəsmi budur məgər vüsalı damadun,
Viran olur getsən bu hicləabadun,
Ağlar fəraqündə ərusi-naşadun,
Əsir olar cəbrən bu natəvan, Qasim.

Düşmən çəkər Şamə bu zarü biyari,
Dolandırar ə`da kuçəvü bazari,
Qolı bağlı, bimə`cər ərusi-naçari,
Rüxsarə göz yaşım etmə rəvan, Qasim.

Ta həşrətək ağlar bu Nadimün nalan,
Rəhm et, məni qoyma dünyadə sərgərdan,
Qorxum budur, axır dutsun yolum meydan,
Bu möhnətə ağlar əhli-cəhan, Qasim.

**Lay-lay, Əli Əsğərim**

Suzi-ətəşdən solan,
Lay-lay, Əli Əsğərim.
Gül kimi xəndan olan,
Lay-lay, Əli Əsğərim.
Ey-vay, Əli Əsğərim.

Sinəmi etdün xəraş,
Möhnətimi etmə faş,
Tökmə yüzə qanlı yaş,
Lay-lay, Əli Əsğərim.
Ey-vay, Əli Əsğərim.

Az məni bitab elə,
Qəlbimi xunab elə,
Yuxla bir az, xab elə,
Lay-lay, Əli Əsğərim.
Ey-vay, Əli Əsğərim.

Qönçə kimi solmusan,
Dərdə düçar olmusan,
Gül, niyə bəs gülmüsən?*
Lay-lay, Əli Əsğərim.
Ey-vay, Əli Əsğərim.

Az məni yandur, oğul,
Candan usandur, oğul,
Aç gözüvi dur, oğul,
Lay-lay, Əli Əsğərim.
Ey-vay, Əli Əsğərim.

Gəlməz Əli qardaşun,
Tökmə yüzə göz yaşun,
Qoy sinəm üstə başun,
Lay-lay, Əli Əsğərim.
Ey-vay, Əli Əsğərim.

---

* Gülmürsən

*Əfrad*

Suya gümanım, oğul, gəlməz, eyləmə əfğan,
Susuz dodaxlaruva binəva anan qurban.

Bu möhnətün eyləyür ömrümi təmam, oğul,
Bu Kərbəladə olub su bizə həram, oğul.

Kəbab olur ürəgim hər baxanda gül yüzüvə,
Bir az təhəmmül edüb, yuxla, mən fəda gözüvə.

Nə növ`i ağlamayım, gəlməyim dilə, ya Rəbb,
Ki, az qalubdı susuzdan balam ölə, ya Rəbb.

Fərat bəhri kimin caridür biyabanə,
Susuzdan Əsğərimün ləbləri dönüb qanə.

*Baqiyi-növhə*

Oldum əcəb bəxtəvər,
Qanə dönübdür cigər,
Ağlama, nuri-bəsər,
Lay-lay, Əli Əsğərim,
Ey-vay, Əli Əsğərim.

Ağlayub az et fəğan,
Oldı gözün yaşı qan,
Haluva qurban anan,
Lay-lay, Əli Əsğərim,
Ey-vay, Əli Əsğərim.

Yuxla bir az, səbr elə,
Navəki-peykan ilə,
Su verəcək Hərmələ,
Lay-lay, Əli Əsğərim,
Ey-vay, Əli Əsğərim.

Nadimün ağlar müdam,
Ömri olunca təmam,
Növhə edər sübhü şam,
Lay-lay, Əli Əsğərim,
Ey-vay, Əli Əsğərim.

**Əli Əsğər, bala, lay-lay**

Yatub qan üstə ol rahət,
Əli, lay-lay, oğul, lay-lay.
Qalan suya suda həsrət,
Əli Əsğər, bala, lay-lay,
Anan ölsün, Əli Əsğər.

Beşikdən kim səni aldı,
Sinəmdə möhnətim qaldı,
Gözüm yaşı rəvan oldı,
Əli Əsğər, bala, lay-lay,
Anan ölsün, Əli Əsğər.

Səni əldən alub üdvan,
Məni qoydula sərgərdan,
Yaralı hülqüvə qurban,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Deyəm lay-lay gözüm üstə,
Töküm qan-yaş yüzüm üstə,
Başuvı qoy dizim üstə,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Cəfası tiğü peykanun,
Rəvanə eylədi qanun,
Oyan, aç çeşmi-giryanun,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Kəbab etmə bu biyarı,
Batan toprağə rüxsarı,
Sənə lay-lay deyəm, barı,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Qəribəm, çün zəliləm mən,
Sənə gəlmiş dəxiləm mən,
Südüm yoxdur, xəciləm mən,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Səni ox eyləyüb xəstə,
Səsimə səs ver ahəstə,
Yüzüvi qoy yüzüm üstə,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Evimi eyləmə viran,
Saralmış rəngüvə qurban,
Doyunca, qoy, edim əfğan,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Saraldun qönçə çağundan,
Yanar könlüm fəraqundan,
Öpüm, qoy, gül dodağundan,
Əli Əsğər, bala, lay-lay.
Anan ölsün, Əli Əsğər.

Nəzər qıl Nadimi-zarə,
Yazar gözyaşlı dilparə,
Nedim bəs mən güni qarə,
Əli Əsğər, bala lay-lay.
Anan ölsün, Əli Əsğər.

**Anan ölsün, Əli Əsğər**

Ey solan qönçəsifət, ləbləri ətşan, Əli, lay-lay,
Anan olsun bu susuz ləblərə qurban, Əli, lay-lay.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Haluvı bilməz Əli Əkbər, ətəşdən saralubsan,
Gül kimi suzi-ətəşdən, Əli, zülm ilə solubsan,
Xeymədə yoxdı südüm, yoxdı suyum, təşnə qalubsan,
Kaş, görüm Kərbübəlanı ola viran, Əli, lay-lay.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Kaş gələ imdi baban, ərz edim əhvaluvı, Əsğər,
Susuzundan yetişüb canə, ağa, bu güli-əhmər,
Su tədarük edər, əlbəttə sənə varisi-Heydər,
Ta susuz olmayasan vasili-Canan, Əli, lay-lay.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Bu Fərat sir eləyər cümlə, oğul, vəhşü tüyuri,
Çün sənün ağlamağun aldı bu gözdən, Əli, nuri,
Müntəzir rahuvı gözləllə sənün qəsrdə huri,
Seyr elə, axır olub göz yaşun al qan, Əli, lay-lay.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Sənə qurban ola bu madəri-naçarun, az ağla,
Kəhrəbatək saralub soldı rüxi-alun, az ağla,
Parələndi ətəşindən ləbi-gülnarun, az ağla,
Haluvı bilməz anan, Şahi-şəhidan, Əli, lay-lay.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Bu qədər ağlama, yat, ahü fəğan eyləmə, səbr et,
Məni-nalanun, oğul, bağrını qan eyləmə, səbr et,
Qəm əlindən məni zarü yarıcan eyləmə, səbr et,
Sinəmi parə edüb dırnağun al qan, Əli, lay-lay.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Qalmayub Əkbərü Əbbas, mənə imdad eləsünlər,
Su tədarük eləyüb, madərüvi şad eləsünlər,
Hanı Övnü hanı Cə`fər, məni bir yad eləsünlər,
Cümləsi Həqqə susuz bəzl eləyüb can, Əli Əsğər.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Bu qədər ağlama, yat, eyləmə şivən, sənə qurban,
Qəlbimi qan elədi nalələrün, mən sənə qurban,
Başım olmaz, nə edim, qüssədən eymən, sənə qurban,
Bikəsü bivətənəm, halı pərişan, Əli Əsğər.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

Ağlama, səbr elə, göz yaşuva qurban, güli-nərgiz,
Bilürəm, rəhm eləməzlər sənə bu ləşkəri-xunriz,
Bu susuz haluvı bilməz Şəhi-vala sənün hərgiz,
Nadimin kaş ola ol xaluva qurban, Əli, lay-lay.
Əli Əsğər, güli-növbər, anan ölsün, Əli Əsğər.

**Lay-lay, Əli, lay-lay, oğul**

Ey ləbləri gültək solan,
Lay-lay, Əli, lay-lay, oğul.
Ey qan ilə sirab olan,
Lay-lay, Əli, lay-lay, oğul.

Oldun xizab al qan ilən,
Ətşan ləbi-suzan ilən,
Sirab olan peykan ilən,
Lay-lay, Əli, lay-lay, oğul.

Kim tabuvı aldı, oğul.
Topraqlara saldı, oğul,
Gəhvarə boş qaldı, oğul,
Lay-lay, Əli, lay-lay, oğul.

Nazik ləbün gültək solub,
Qan ilə qundağun dolub,
Bikəs anan ağlar qalub,
Lay-lay, Əli, lay-lay, oğul.

Ey növgüli-ziba, Əli,
Ey bülbüli-şeyda, Əli,
Yıxdı evim ə`da, Əli,
Lay-lay, Əli, lay-lay, oğul.

Toprağə qanun qatmısan,
Bikəs anavı atmısan,
Yoxsa alub su, yatmısan,
Lay-lay, Əli, lay-lay, oğul.

Ey nuri-eynim, növrəsim,
Yox dadxahım, bir kəsim,
Səs ver mənə, batdı səsim,
Lay-lay, Əli, lay-lay, oğul.

Hülqün oxa oldı nişan,
Tabun alub tirü kəman,
Lay-lay deyüb qıllam fəğan,
Lay-lay, Əli, lay-lay, oğul.

Qanə batubdur əl-yüzün,
Qan üstə yatma, aç gözün,
Gəl nitqə, gültək gül özün,
Lay-lay, Əli, lay-lay, oğul.

Ey Nadimi-şirinzəban,
Hər bəzmdə eylə fəğan,
Bu beyti yaz, eylə bəyan,
Lay-lay, Əli, lay-lay, oğul.

## Sinəzəni-Əli Əsğər

Eylədüz biəqrəba, ey zümreyi-kafər, məni,
Rəhm edün, axır kəbab etdi Əli Əsğər məni.

Övnü Fəzlü Cə`fəri, ənsarımı öldürmüsüz,
Əkbər ilə Qasimi-biyarımı öldürmüsüz,
Qoymusuz tənha məni, sərdarımı öldürmüsüz,
Eylədüz bu ərsədə biyarü biyavər məni.

Bu Fərat, insafdür məmlüvv edə səhraləri,
Su kənarında susuz qoyduz məni-biyavəri,
Bari, sirab eyləyün oxla Əliyyü Əsğəri,
Təşnədür, dəstimdə yandırdı bu məhpeykər məni.

Şah idim gərçi əzəl, bu ərsədə xar olmuşam,
Doğranub xişü təbarım, zarü biyar olmuşam,
Mən sizün rə`yüzcə söylürsüz günahkar olmuşam,
Öldürürsüz, öldürün biyarü biyavər məni.

Söyləyün, neylüb sizə bu tifli-şirxarə bəs,
Üç gecə-gündüzdi ətşandı bu tifli-binəfəs,
Gər özüm ölməgligi etdim qəbul ruzi-Ələs,
Yandırar ölməgdən artıx bu susuz Əsğər məni.

Ya verin bu tiflə siz bir cür`ə su ehsan edin,
Taridən xövf eyləyün, zalimlər, az tüğyan edin,
Az qalub dəstimdə can versün susuz bu məhcəbin,
Gözləyər su camı əldə Ali-Peyğəmbər məni.

Ol zəmandə ləşkər içrə düşdi şurü qülqülə,
Ağladı səflər təmamən, aldılar dəsmal ələ,
Gördi o övzayi Sə`d oğlı dedi, ey Hərmələ,
Az qalub dönsünlə məndən, görməsün səflər məni.

Bu Hüseyn ibn Əli döndərdi rə`yi-ləşkəri,
Et nişanə navəkü peykanə hülqi-Əsğəri,
Ox kəmandan rədd olanda buldı nazik həncəri,
Söylədi bikəs Hüseyn, yandurdun, ey kafər, məni.

Ya Hüseyn, ol Əsğəri-ətşanə qurban Nadimün,
Ağlayar əldə qələm ruzü şəb hər an Nadimün,
Möhnətü qəmdən olub zarü hərasan Nadimün,
Ağladar düşdikcə yadə möhnəti-Əsğər məni.

**Əli Əsğər oxlandı**

Özün sən şahid ol, ya Rəbb, əlimdə Əsğər oxlandı,
Axub gül hülqinün qanı, əlim qan ilə islandı.

Alubdur dövrini ləşkər,
Şahi-biyavər oxlandı.
Qəribəm, yoxdı bir yavər,
Nə Övnü Fəzlü nə Cə`fər,
Əlimdə Əsğər oxlandı.

Kimim var dadimə gəlsün,
Hüseyni-yavərim olsun,
Əlimdən nə`şini alsun,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Aşub möhnət dodağımdan,
Axar qan əl-əyağımdan,
Alan yoxdur qucağımdan,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Ədulər atdı peykanı,
Axubdur hülqünün qanı,
Qucağımda çıxub canı,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Dedim, aya verəllər ab,
Edüblər qanına sirab,
Batub qanə gülür mehrab,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Dolub qundağ axub qanı,
Düşüb hər səmti hər yanı,
Axub gözlər, çıxub canı,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Ötübdür həddidən yasim,
Batubdur qaninə Qasim,
Susuz doğrandı Əbbasim,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Hanı ənsar, hanı yavər?
Alubdur canımı qəmlər,
Oyan, nakam Əli Əkbər,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Əman çərxin cəfasından,
Axar qan gül yərasından,
Xəcil oldum anasından,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

Ölüncə Nadimi-nalan,
Yazub ağlar edər əfğan,
Buyurdı Şahi-məzluman,
Əlimdə Əsğər oxlandı,
Şahi-biyavər oxlandı.

**İmtəhanımdur mənim**

Ey Xuda, qan oldı könlüm, imtəhanımdur mənim,
Oxladı ədu, bu tifli-bizəbanımdur mənim.

Mən bunı gətdim, Xudaya, əhli-kin versünlər ab,
Vermədilər hər qədr ki, ehticac etdim çün ab,
Etdilər dəstimdə qan ilə bu qundağun xizab,
Sən bilürsən, bu bəla arami-canımdur mənim.

Tökmüşəm göz yaşı mən rüxsarə bikəs, neyləyim,
Dadrəs yoxdur, qəribəm imdi əzbəs, neyləyim,
Səslərəm, verməz səsimə bu bala səs, neyləyim,
Səbrim aldı çünki bu ruhi-rəvanımdur mənim.

Yarü ənsarım durun, artdı genə yasim, həray,
Övnü Fəzlü Cə`fərü həm Əkbərü Qasim, həray,
Əsğərim oxlandı, gəl imdadə, Əbbasim, həray,
Bu salan dəstimdə qönçə müşkbarımdur mənim,

Baxdı ağlar çeşmilə Şahi-şəhidan Əsğərə,
Qoymadı ol qandən bir qətrəsi düşsün yerə,
Dönüb ol vəqtə Hüseyn yüz himmət ilə Əkbərə,
Söylədi, yox bir kəsim axır gümanımdur mənim.

Gəlmişəm dərgahuva baş ilə, canü mal ilən,
Can verür imdi İmamım, gör, nə bir münval ilən,
Ruzi-həşrü məhşərə gəlləm həmin bu hal ilən,
Filhəqiqət qəlbi-imanım çü canımdur mənim.

Eylərəm, ya Rəb, əməl öz əhdimə, peymanimə,
Səğirün qanı qarışdı sinəm üstə qanimə,
Ümmətün asilərin əfv eylə bu qurbanimə,
Çün əzəl əhd etdigim sirri-nihanımdur mənim.

Əhd etmişdim sənün rahündə başü can verim,
Canü mülkdən dinə abi-çeşmeyi-heyvan verim,
Bir həyatın eşqinə yetmiş iki qurban verim,
Bil ki, ölməklik həyati-cavidanımdur mənim.

Olmaram Nadim, özüm dərdə dəvayə gəlmişəm,
Malü canından keçüb Kərbübəlayə gəlmişəm,
Ümməti-Peyğəmbərə, ya Rəb, duayə gəlmişəm,
Bu Əli Əsğər təmamən imtəhanımdur mənim.

**Əsğərün baxdı Hüseyn laleyi-həmra yüzinə**

Əsğərün baxdı Hüseyn laleyi-həmra yüzinə,
Əgləşüb gərdi-əcəl gördi o ziba yüzinə.

Gördi ol tiflün ətəş cismdən aramın alub,
Gülə bənzər dodağı qönçəsifət xəndan olub,
Kəhrəbatək ətəşindən saralub rəngi solub,
Baxdı ağlar göz ilə Sərvəri-Taha yüzinə.

Ruhi təndən südəmər dilsiz uşağ zəhrü alu,
Şahi-din gördi ətəşdən saralub qönçə güli,
İstər əhvalını izhar eləsün, yoxdı dili,
Baxır həsrətlə susuz ol Şəhi-Bətha yüzinə.

Zeynəbə Şahi-şəhidan dedi, avarə bacı,
Ver mənə Əsğərimi bikəsü biçarə bacı,
Eyləyüb suzi-hərarət ləbini parə, bacı,
Saldı bu halı bütün vəlvələ dünya yüzinə.

Aparım bəlkə görüm rəhm eləyə ləşkəri-kin,
Əlinün üstə alub Əsğəri ləbtəşnə Hüseyn,
Ağladı lövhü qələm, lərzə edüb Ərşi-bərin,
Tökdi göz yaşı o dəm həzrəti-Zəhra yüzinə.

Tökdi göz yaşını Zəhra dedi, ətşan bala vay,
Sən de ki, va vələda, mən də deyim, can bala vay,
Bu anan Əsğəri-ətşanuva qurban, bala vay,
Baxdı ağlar gözinən Məryəmü Sara yüzinə.

Rəzmgahə gətirüb Əsğəri biçarə Hüseyn,
Yüz dutub söylədi ol ləşkəri-xunxarə Hüseyn,
Utanun Taridən, insaf edün, ey qövmi-ləin,
Baxacaqsuz necə bəs məhşəri-rizvan yüzinə?

Susuz öldürmüsüz Əbbasü Əli Əkbərimi,
Yarü ənsarım ilən Qasimi-məhpeykərimi,
Bari, sirab eləyün siz bu Əli Əsğərimi,
Tökməyün, bari, bunun qanını dünya yüzinə.

Görüm, ey kaş, döneydün səni al qanə, Fərat,
Vermədün su bir içim Əsğəri-ətşanə, Fərat,
Nə rəvadur axa səhravü biyabanə, Fərat,
Verməyüb su baxasuz, Seyyidi-Bətha yüzinə.

İbn Sə`d etdi o halətdə əyan kin səsini,
Söylədi Hərmələyə, kəs bu Hüseynün səsini,
Əlinün üstə susuz oxladı gül dəstəsini,
Hərmələ qoydı yüzün ərseyi-Mina yüzinə.

Ah o vəqtdən ki, Hüseyn səmtinə rədd oldı kəman,
Əsğərün hülqi olub navəkü peykanə nişan,
Xırda qundağını əlvan elədi qırmızı qan,
Hülqinün qanı axub lö`löyi-həmra yüzinə.

*Əfrad*

Dedi, oğul, cigərim yandı dərdü möhnətdən,
Fələk ölüncə qurtarmaz məni xəcalətdən.

Dəgəndə ox sənə bitabü taqət oldum mən,
Anan Rübab yanında xəcalət oldum mən.

Gözüm yaşinə, Əli, rəhm elə, səni Tari,
Bu qan dolan gözüvi bir də açgilən, bari.

*Təmamiyi-növhə*

Ya Hüseyn, var sənün ismündə yəqin abi-həyat,
Cəm`i-ənsar sənə canı verüb tapdı nicat,
Qurtarar narın əzabindən özin vəqti-məmat,
Lütf ilən baxsan əgər Nadimi-şeyda yüzinə.

**Xanım Şəhrəbanu dilindən**
**Əli Əsğərə təskinlik**

Mən olum fədası bu ləblərün,
Balam, ağlama, oğul, ağlama.
Dolub əşki-xun ilə gözlərün,
Balam, ağlama, oğul, ağlama.

Dolub əşk ilən bu qəra gözün,
Bələşübdi qanına əl-yüzün,
Ola kaş dilün, deyəsən sözün,
Balam, ağlama, oğul, ağlama.

Bu müsibətə eylüm fəğan,
Ləbüvi xizab eyləyübdi qan,
Necə səbr edə bu qəmə anan?
Balam, ağlama, oğul, ağlama.

Gələ gər atan, edərəm xitab,
Balamı ətəş eyləyüb kəbab,
Sənə ta gedüb gətürəllə ab,
Balam, ağlama, oğul, ağlama.

Ürəgimdə qaldı, oğul, dağun,
Bələşübdi qan ilə qundağun,
Sinəmi edüb yara dırnağun,
Balam, ağlama, oğul, ağlama.

Yetişübdi türfə gülə xəzan,
Eyləyübdi bülbüli bağrıqan,
Bu Fərat suyu, kaş, olaydı qan,
Balam, ağlama, oğul, ağlama.

Bu gözün fədası olum, oğul,
Bu qəm eylədi məni dilməlul,
Nə edim ki, yoxdı südüm, oğul,
Balam, ağlama, oğul, ağlama.

Oğul, ağlayar anan müdam,
Susuz oxluyar səni əhli-Şam,
Bizə, Əsğərim, su olub həram,
Balam, ağlama, oğul, ağlama.

Mən olum fədası bu göz yaşun,
Bala, sinəm üstə qoy başun,
Qırılubdı qövmü qardaşun,
Balam, ağlama, oğul, ağlama.

Bari, bir təhəmmül et, Əsğərim,
Boyanubdı qanına Əkbərim,
Gedüb əldən hamı köməklərim,
Balam, ağlama, oğul, ağlama.

Bu qədər, Əli, eyləmə fəğan,
Axır əşki-çeşmün olubdı qan,
Ola göz yaşuva fəda anan,
Balam, ağlama, oğul, ağlama.

Bu günümdə bircə atan gələ,
Ala qanlı qundağuvı ələ,
Ox ilə sirab edər Hərmələ,
Balam, ağlama, oğul, ağlama.

Bu əzadə Nadim edər səda,
Tökər əşk əzadə o binəva,
Bu zəban ilən eylər səda:
Balam, ağlama, oğul, ağlama.

### Müslimin balaları*

Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Rəhm eylə mehmani-binəvayə,
Salmaz heç kim qonağını bəlayə,
Çün çıxub ahü vamız səmayə,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

---

* «Sinəzəni-pəsərani-Müslim»

Zülm ilə çün öldürdülər babamız,
Qənnarələrdə qaldı atamız,
Yolumızı çün gözlər anamız,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Çün anamız yolumuzu gözlər,
Öldürmə bizi sən, ey sitəmkər,
Bu müsibətə ağlar Peyəmbər,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Çün çıxıbdur səmayə fəğanım,
Yetimlik alub əldən təvanım,
Ey Haris, tökmə zülm ilə qanım,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Bikəsəm, ey Haris, yox pənahım,
Yoxdı çün bir nəfər dadxahım,
Hər zəman övc edər ərşə ahım,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Tökmə sən qanımızı dünyadə,
Eylə sən ya bizi azadə,
Ya apar bəzmi-ibn Ziyadə,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Artdı bu Kufədə ahü vamız,
Çün şəhid oldı Kərbəladə atamız,
İntizar yol gözlər çün anamız,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Gər qəbul etsən bu bəyanı,
Kəs səri-muyi-ətrfəşanı,
Rəhm et, öldürmə biz binəvanı,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Kəs səri-zülfi-ətrfəşanım,
Mali-dünyayə gəlmir gümanım,
Görsə hər kim verər qədri-qanım,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Rəhm eylə, biz yetim, qəribux,
Bikəsux, biz sənə dəstgirux,
Müslimün vəslindən binəsibux,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Kufədə yox anamız edək naz,
İzn ver, ta edək rəddi-nəmaz,
Xaliq ilən edək razü niyaz,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

Çün olub Nadimim zarü giryan,
Bu müsibətdən oldı hərasan,
Bu qəmi eylüb əlində ünvan,
Öldürmə, Haris, biz binəvayux,
Bu qərib eldə bidadxahux.

**Müslimin balaları**

Rəhm et bizi-biçarəyə, biyarü yetimux,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

Peyğəmbərə bu zülmlərün cümlə əyandur,
Axır bu gecə biz sənə mehmanux, əmandur,
Qəmdən gözümüz cari edər göz yaşı qandur,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

Göz yaşı olub səfheyi-rüxsarə rəvanə,
Hicri babamuzun doyurubdur bizi canə,
Salma bizim ahimiz ilə suz cəhanə,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

Ağlar gözümüz yaşinə bax, rəhm elə, Haris,
Salma bizi qürbətdə belə müşkilə, Haris,
Yoxdur anamız başimiz üstə gələ, Haris,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

Qəmdən boyanub xun ilə, vallah, dili-alım,
Atam öləli cuş eləyüb dərdü məlalım,
Hicri babamun bəsdi bizə, rəhm elə, zalım,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

Yox taqətimiz cövri-bu şəmşiri-fuladə,
Gəl, düşməgilən cəhl ilə bu cəhlü inadə,
Zibh etmə bizi, bari, apar ibni-Ziyadə,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

Göz yaşımızı eyləmə sən zülm ilə cari,
Ağlar, yolumuz gözlər anam leylü nəharı,
Qanımızı nahəq yerə tökmə, səni Tarı,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

Bilməm bu necə möhnəti-üzmadur, İlahi,
Bu tiflilərün bəs nə imiş cürmü günahi,
Nadim, gözümi ağladı* çox onlarun ahi,
Haris, bizi öldürmə, bu şəhr içrə qəribux.

**Saxla qədəm, Şahi-şəhidan, baba**

Saxla qədəm, Şahi-şəhidan, baba,
Bircə sözüm var sənə, ətşan baba.

En bir atundan, Şəhi-gülgunqəba,
Bir də doyunca səni eylüm vida,
Başıvı zibh eyləməmiş əşqiya,
Olmamış öz qanuva qəltan, baba.

Tökmə, qızım, göz yaşuvi didədən,
Getməliyəm məclisi-Cananə mən,
Xeymələrə gəlməsəm, ey bivətən,
Səbr elə, sən düxtəri-giryan, bala.

* Ağladır

Mərhəmət eylə, məni ağuşə al,
Ey baba, qollaruvi boynuma sal,
Öldürər axır məni dərdü məlal,
Kim eləsün dərdimə dərman, baba?

Bəsləmişəm izzət ilə mən səni,
Salmaram heç vəchlə gözdən səni,
Dindirər hər haldə əmmən səni,
Yarun olan Zeynəbi-nalan, bala.

Başıma əl çək, məni dindirgilən,
Öldürür axır məni dərdi-mühən,
Batsan əgər rəzmdə al qanə sən,
Eylər ədu xeyməni talan, baba.

Gözləyür axır Əli Əkbər məni,
Ağlayuban şad eləmə düşməni,
Kəssə başım kin ilə Şimri-dəni,
Eyləmə şivən, məhi-taban, bala.

Həsrətəm əl`an Əli qardaşıma,
Rəhm elə sən, bari, bu göz yaşıma,
Qəmçi vırar Şimri-dəğa başıma,
Görsələr gül cismüvi üryan, baba.

Vırsa başım növki-cidayə Sinan,
Səcdəgəhim olsa bu səhradə qan,
Vırsa Yəzid əllərimə xeyzəran,
Məskən olar sizlərə viran, bala.

Soldı bu gülşəndə mənim güllərim,
Qanə batub Əkbəri-məhpeykərim,
Getmə, baba, bağlar ədu qollarım,
Qoy, dolanım başuva əl`an, baba.

Ağlayar hər ruzü şəban Nadimin,
Qəmdən edər əşk rəvan Nadimin,
Qaldı əcəb naləkünan Nadimin,
Saxla qədəm, Şahi-şəhidan, baba.

**Əfrad**

Rəhm etgilən bu hali-pərişanə, ey baba,
Gəl, getmə, həqq rizasinə meydanə, ey baba.

Nari-fəraqə yanmağa yox tabü taqətim,
Salma bu tifli möhnəti-hicranə, ey baba.

Getdi gətirməgə su mənə namdar əmüm,
Batdı su üstə cismi qızıl qanə, ey baba.

Əhli-cəfa ki, qollarını etdilər qələm,
Döndi bu qəmdə göz yaşım ümmanə, ey baba.

Bir də ölincə istəmərəm su yanam əgər,
Sənsiz gərək gələ su bu ətşanə, ey baba.

Su içmərəm yana bu dilim, su olub həram
Əbbasdən sora məni-nalanə, ey baba.

Allah rizasinə, bizi qaytar Mədinəyə,
Mən dəstgir olanmaram üdvanə, ey baba.

Getsən, səni şəhid eyləyər Şimri-bihəya,
Rəhm eyləməzlə Şahi-şəhidanə, ey baba.

Ləbtəşnə batdı qanə bu gün nazlı Əkbərim,
Su vermədi ədu belə ətşanə, ey baba.

Öldürsə Şimr gər səni, eylər bizi əsir,
Qolbağlı gəzdirəllə zəlilanə, ey baba.

Səndən sora bu xeymələri yandırar ədu,
Bu əhli-kinə atəşi-suzanə, ey baba.

Ahu kimi bu Ali-Əli yüz qoyar təmam,
Qaçmağlığa bu kuhü biyabanə, ey baba.

Eylər əsir bu ləşkəri-üdvan əyaluvi,
Qolbağlı gəzdirəllə zəlilanə, ey baba.

Axır çəkəllə bizləri Şamə cəfa ilən,
Məskən olar əyaluva viranə, ey baba.

Məhşər güni şəfaət edən vəqtə ümmətə,
Lütf etgilən bu Nadimi-nalanə, ey baba.

## Əfrad

Az ağla, gəlmə naləvü əfğanə, ey bala,
Az qaldı, göz yaşun dönə ümmanə, ey bala.

Fani cəhanda səbr elə dərdü müsibətə,
Döndi sirişki-didələrün qanə, ey bala.

Səbrü təhəmmül et, qızım, öldürsələr məni,
Olsan əsir bu ləşkəri-üdvanə, ey bala.

Qurbanə rəsmdür, su verəllər kəsən zəman,
Verməzlə su mənim kimi qurbanə, ey bala.

Zibh eyləyər susuz, başımı Şimri-bihəya,
Rəhm eyləməz bu ərsədə mehmanə, ey bala.

Gəlləm o vəqt soruşmağa əhvaluvı sənün,
Məskən olanda guşeyi-viranə, ey bala.

Ruzi-cəzadə qəsri-cinan eylərəm əta,
Nadim əza dutar səni-nalanə, ey bala.

## Həzrət Əbbas və Külsumun dilindən

Göz yaşın müdam üzarə elərəm rəvanə, qardaş,
Qədimi qəmi-zəmanə döndərüb kəmanə, qardaş.

Kərbəlayə gəlməmişdən mən əzəl öleydim, ey kaş,
Gözlərim tökər üzarə bu cəhətdən imdi qan-yaş,
Bu Minadə yoxdur oğlum, dərdimi sənə edim faş,
Şövq ilə fəda edəydim Şahi-biməkanə, qardaş.

Tökmə göz yaşun üzarə, ey əzizi-cani-Heydər,
Var hələ həyati-Əbbas, etmə ahü nalə, xahər,
Arizu ki, eyləyürsən, arizun olub müyəssər,
Dut əlim, apar, fəda et Şahi-insü canə, Külsum.

Olmaram riza bu əmrə, ey bəradəri-vəfadar,
Qətlüvə durubdı səf-səf Kərbəladə ceyşi-xunxar,
Hicrüvə nə növ`i, Əbbas, səbr edim ki, yoxdı qəmxar,
Sən Minayə azim olsan, gəlləm əl-əmanə, qardaş.

Səbr elə fəraqə, baci, vəslidür bunun bəqası,
Ağlamaqdan ötri xəlq oldı Kərbəla binası,
Guşimə gələr bu çöldə əşqiyalərün sədası,
Qeyzidən qəyur cismim imdi doydı canə, Külsum.

İmdi ki, əxa, olubsan bu bəlalı əzmə azim,
Səbr edəm gərək, bəradər, bu nəvavü ah nə lazim,
Canuvı gedüb fəda et, tək qalub Şəhi-Hicazim,
Gər vəsiyyətün var, eylə sən bu natəvanə, qardaş.

Eylərəm vəsiyyət hərgiz atmasın, bacı, hərasın,
Qarətə gedən zəmanda zinətü zərü libasın,
Əhli-kinə döndərəndə qanə Qasimün hənasın,
Leyli ağlayan zəmandə Əkbəri-cəvanə, Külsum.

Bu vəsiyyətin çün etdi qəlbimi kəbab, qardaş,
Möhnətü qəmim ziyadə oldı bihesab, qardaş,
Qətlgahdən keçəndə eylərəm səvab, qardaş,
Nə`şün üstə zülf yollam boyananda qanə, qardaş.

Yox anam mənim bu çöldə səni Fatimə məzarı,
Qövmi-dun çəkən zəmanda qətligahdən qətarı,
Gəl, yaralı nə`şim üstə analartək, ağla, barı,
Göz yaşın yarama, barı, etgilən rəvanə, Külsum.

Zülfümi yolub, yaralı nə`şün üstə ağlaram mən,
Əhli-kinə versə möhlət, gözlərüvi bağlaram mən,
Hər qədər həyatım olsa, bil, əzavı saxlaram mən,
Naləvü fəğanım hər gün övc edər səmayə, qardaş.

Bülbüli-qəməm, solubdur hamı güllərim çəməndə,
Eylə madərimi hali şəhri-Yəsribə gedəndə,
Bir yetim balam qalubdur, xar etməyün vətəndə,
Geydirün libasi-faxir ol əziz canə, Külsum.

Hər vəsiyyətün bəçeşməm, ey əzizi-cani-Heydər,
Qara bağlayıb dəmadəm saxlaram əzavı illər,
Candən əziz billəm ol yetimüvi, bəradər,
Tutivəş gələr həmişə Nadimün fəğanə, qardaş.

## Gecə-gündüz odlanub ağlaram

Nedim, əmməcan, məni-xuncigər gecə-gündüz odlanub ağlaram,
Bu şərareyi-qəmə Şamdə məni-dərbədər baxub ağlaram.

Mənə bəs degil, buyur, əmməcan, məgər Əkbərün qəmi-firqəti,
Gərəkdür düşüm fəraq oduna dübarə çəkim bu müsibəti,
Həmi Şimri-dunun əziyyəti, həmi əhli-Şamun şəmatəti,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub ağlaram.

Məni-bikəsün olub adəti gecə-gündüz ağlamaq, əmməcan,
Həm üzarə dideyi-tər töküb, həm sinə dağlamaq, əmməcan,
Bu səğirə sinndə qismətim başə qarə bağlamaq, əmməcan,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub ağlaram.

Necə nalə etməyim, əmməcan ki, ənisim oldı gözüm yaşı,
Necə ağlamaz birisi onun ölə zülm ilə neçə qardaşı?
Necə şad olar o əzizə qız, yad əldə qalubdur açux başı,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub ağlaram.

Hanı bir nəfər ki, mən ağlayanda verəydi, barı, səsimə səs,
Gecə-gündüz ağlaram, əmməcan, dəgi* növhə eyləməgim əbəs,

---

* Deyil

Bu xərabə künc bülbüli-qəmə oldı möhnət ilə əcəb qəfəs,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub
ağlaram.

Gecə-gündüz ağlaram, halımı niyə bilmiri Əli qardaşım?
Deyüsən ki, sağdı bəradərün, niyə bəs qalubdur açux başım?
Bu xərabə içrə, ey əmməcan, çün ənisim olubdur göz yaşım,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub
ağlaram.

Görürəm bu Şam uşaxları ki, görür həqarətlən məni,
Kimisi gülür, kimi dindirür bilürəm şəmatətlən məni,
Degilən o Şimrə ki, vırmasun dəxi çox ədavətlən məni,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub
ağlaram.

Ölürəm mən imdi, ey əmməcan, babamun vüsalına
yetmədim,
Əli Əkbərün gözi həsrət öldi, o gül cəmalinə yetmədim,
Yazun, əmmə, daşinə qəbrimün, ölürəm vüsalinə yetmədim,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub
ağlaram.

Məni Əkbərün qəmi-firqəti eyləyür kəbab, sızıldaram, əman,
Qolumı kəsübdi, çox incidür məni bu tənab, sızıldaram,
əman,
Tökərəm üzarimə, Nadiməm, bu sirişki-əbr, sızldaram,
əman,
Məni-dərbədər, məni-xuncigər gecə-gündüz odlanub
ağlaram.

## Getdi, əmməcan, gəlmədi

Getdi, əmməcan, su ala babam mən qəribü ətşanə, gəlmədi,
Qorxuram, sala cismini ədu parə-parə meydanə, gəlmədi.

Ruhim, əmməcan, olubdı qəra, gəlmədi babam rəzmgahdən,
Qüssədən könül tarümardür, intizarəm ol padşahdən,
Ya salubdılar qövmi-bihəya Şahi-bikəsi Zülcənahdən,
Su gətürməsün, yansa ləblərim razıyam bu suzanə, gəlmədi.

Vırdı bu fələk ayrılux daşun,
Gözlərim tökər şur göz yaşun,
Qorxuram kəsə əhli-kin başun,
Döndi göz yaşım qanə, gəlmədi.

Açdı, əmməcan, canəmazını,
Gəlmədi qılaydı nəmazını,
Düxtəri-əzizi-Hicazını,
Saldı nari-hicranə, gəlmədi.

Əhli-kin vırar təbli-şadman,
Tirə tar olur ruyi-asiman,
Xaki-Kərbəla rəngi oldı qan,
Noldı Şahi-dövranə, gəlmədi.

Cari eylərəm əşki-xuni-bəsər,
Başimə mənim, gör, gəlür nələr,
Bəs babam əcəl şərbətin məgər
Nuş qıldı məstanə, gəlmədi?

Yoxsa, əmməcan, yıxdılar evim ləşkəri-ədu cövri-kindən,
Kərbəla çöli lərzə eyləyür xövfdən əman, titrəyür bədən,
İxtiyarsız gül üzarimə göz yaşım olu cari didədən,
Verməgə təsəlli qərib atam bir də bu yetimanə, gəlmədi.

Sübhü şam edərdim həmişə mən vəsli-Əkbəri-gülcəmal ilən,
Əmmə, mən necə rahət əgləşim, etməyim fəğan ahü zar ilən?
İztirab edər qəlbim hər zəman, əmmə, bu dili-biqərar ilən,
Eylərəm xəyal rəzmgahdə batubdı deyən qanə, gəlmədi.

Ey olan Şəhənşahi-insü can, Nadimün olub qüssədən kəbab,
Çeşmimə olub tar bu cəhan, möhnətü qəmim olub bihesab,
Damənindən əl üzmərəm, əman, əmmə, üzmə məni, vergilən cəvab,
Getdi, əmməcan, su ala babam mən qəribü ətşanə, gəlmədi.

**Sinəzəni-Səkinə**

Şimri-bihəyadən, ey baba, vardı çox şikayətim mənim,
Cövri-əşqiyadən, ey baba, qalmayubdı taqətim mənim.

Çün o vəqtdən səni şəhid eyləyüb bu qövmi-kufəyan,
Dəstgir edüb Səkinəni zülm ilə bu ceyşi-bədnihan,
Yoxdı taqətim fəraqüvə, ta ölüncə eylərəm fəğan,
Ağlamaq olubdur, ey baba, leylü ruz adətim mənim.

Kərbəladən Şamə, ey baba, çox yolı piyadə gəlmişəm,
Naqə üstə adətim mənim olmuş ahü nalə, gəlmişəm,
Vay, Əli, deyüb səbahü şam ağlayub məlalə gəlmişəm,
Yoxdı qəmküsarım, ağlamaq çün olubdur adətim mənim.

Eylərəm həmişə nalə mən, bu fəğanə ümdə var səbəb,
Təxtinün üstə bərqərar olub, hökm edər bizə biədəb,
Eyləyər xərabələrdə məskən əyali-Şahi-təşnələb,
Bu xərabə içrə ruzü şəb ağlamaqdı qismətim mənim.

Doğradı bu qövmi-bihəya təşnələb Əliyyü Əkbəri,
Oxladı sitəmlə Hərmələ tifli-şirəxarə Əsğəri,
Zülm ilə şəhid edüb səni firqeyi-zəlul ləşkəri,
Çün gedüb əlimdən, ey baba, Kərbəladə izzətim mənim.

Kərbəladə Şimri-bihəya soldurubdı gül üzarımı,
Eyləyüb əsiri-ruzigar, artırub qəmü məlalımı,
Kufəyan şəhid edibdülə Əkbəri-məhcəmalımı,
Neyləyim əlimdən, ey baba, getdi şə`nü şövkətim mənim.

*Əfrad*

O gündən, ey baba, səndən məni edüblə cüda,
Başıma qəmçi vırar kin ilə o Şimri-dəğa.

Fəraqı Əkbərimün eyləyüb məni dilgir,
Əyaqlarımı kəsüb kündə, boynumi zəncir.

Həvayi-vəsllə çox ağlaram, baba, hər ruz,
Mənim kimi görəsən var qalan bir ac-susuz?

Bu ağlamaqlığıma firqətün olubdı səbəb,
Hər ağladıqca, təsəlli verər bibim Zeynəb.

Baba, qutar məni bu tə`nəvü şəmatətdən,
Dua elə ki, ölüm, qurtarım əsarətdən.

Saldı Əkbərün fəraqi bu möhnətü məlalə canımı,
Hicri Əkbərün zəmanədə sala min xəyalə canımı,
Suznak olar fəraq odı, yandırar şərarə canımı,
Cövri-əşqiyadən əl-əman, qalmayubdı qüdrətim mənim.

Xeyməgahi Şimri-bihəya Kərbəladə narə yandırub,
Xarici əsirtək bizi hər diyardə dolandırub,
Şamdə şəmatəti-ədu candan məni usandırub,
Töhmətü şəmatət artırub möhnətü müsibətim mənim.

Dərk edüb əcəl xərabədə zarü natəvan Səkinəni,
Eylədi bu Şamdə fələk azimi-cinan Səkinəni,
Nadim ağlayar fəğan ilən zarü natəvan Səkinəni,
Eyləsün rəva əcri Hüseyn, vardı bircə hacətim mənim.

**Əfrad**

Mənzil edəndə Zeynəbi-nalan xərabədə,
Gəldi fəğanə cümlə əsiran xərabədə.

Ya Rəb, neçün yıxılmadı ərşi-Xuda yerə?
Bimar o vəqt ki, oldı nigəhban xərabədə.

Bilməm Hüseyn bu zülmi necə eylədi qəbul,
Tə`nə edəndə Zeynəbə üdvan xərabədə.

Ol gün Yəzid şiələrün bükdi qamətin,
Verdi İmamə mənzili-viran xərabədə.

Tab etmədi Səkinə Hüseynün fəraqinə,
Dərdi zibəs ki, eylədi tüğyan xərabədə.

Can tapşıranda Zeynəbə ərz etdi, əmməcan,
İmdi olaydı Əkbəri-ətşan xərabədə.

Şəhla gözün öpeydim ölən saətində mən,
Can tapşuraydı sonra bu giryan, xərabədə.

Əlbəttə siz kəfəndə yazun Əkbərün adun,
Hər gün olar bu dərdimə dərman xərabədə.

Həşrə kimin məzardə, va Əkbəra, deyüb,
Ruhim həmişə eyləyər əfğan xərabədə.

Nə Əkbərim qalubdı, nə Əbbasü Qasimim,
İmdi tilavət eyləyə Qur`an xərabədə.

Qismət ola, Xuda, o qəribün ziyarəti,
Növhə edə bu Nadimi-nalan xərabədə.

**Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni**

Bikəsü bivətənü bipədərəm, Şimri-dəğa,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.
Mənim əhvalıma ağlar bu zəman ərzü səma,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Bəsdi bu qəm mənə, əvvəl vətən avarəsiyəm,
Gülşəni-Ali-Əbanun güli-növrəstəsiyəm,
Bu cəfaculərin aləmdə nə pabəstəsiyəm,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Bu kifayətdi mənə alduz əlimdən elimi,
Bülbüli-qəmzədəyəm, soldurub ə`da gülimi,
Doğraduz xəncər ilə Əkbəri-şirindilimi,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Məgər azdur qəmi-Əsğər, yüzi qanə boyanub,
Ox dəgüb parələnüb hülqi, yuxudan oyanub,
Zülmi-dun şö`lələnüb, dudi səmayə dayanub,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Bəsdi bu qəm, babamun qolsuz Ələmdarı ölüb,
Övn ilə Fəzl ilə həm Cə`fəri-qəmxarı ölüb,
Qırılubdur köməgi, nasirü ənsarı ölüb,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Qasimü Əkbərü Əbbas batub qanə bu gün,
Yıxılublar görürəm, ərseyi-meydanə bu gün,
Bu müsibətdə gəlim, qoy məni əfğanə bu gün,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Babamun vəslini bir anı mənə çox görüsən,*
Dindirim Şahi-şəhidanı, mənə çox görüsən,
Baxaram zülfümə, bu qanı mənə çox görüsən,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Qoy, doyunca babamun parə dodağından öpüm,
Ayrılıq mövsümidür, qanlı yanağından öpüm,
Mane` olsan yüzinə, bari, əyağından öpüm,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

---

* Görürsən

Cövr ilə gərçi bizi Şamə rəvan eyliyüsən,
Babamun hicri ilə bağrımı qan eyliyüsən,
Bəsdi bu büğz, bu zülmini əyan eyliyüsən,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

Siz gedün, qoy, məni bu Kərbəladə qalaram,
Babamun qəbrinə bu çöldə mücavir olaram,
Nadimi-qəmzədəyəm, ağlayub axır ölərəm,
Bax gözüm yaşinə, ey Şimri-dəni, vırma məni.

**Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu**

Ey olan Ali-Əbayə nasirü ənsar, əmu,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Sən bilürsən, imdi səndən qeyri yarım qalmayub,
Qasimü Əkbər ölüb, bir qəmküsarım qalmayub,
Qardaşım, yarım dəxi xurdü kibarım qalmayub,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Göz yaşım cari olub rüxsarimə qəmdən, əmu,
Caridür rüxsarimə fəvvarə didəmdən, əmu,
Ağlaram hər ruzü şəb bu möhnətü qəmdən, əmu,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Göz yaşım cari olub rüxsarimə, rəhm et mənə,
Cam əlimdə gəlmişəm əl`an, dəxiləm mən sənə,
Olma razi, ey əmu, icz eyləyim mən düşmənə,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Xırdaca qızlar ətəşdən ağlayallar ah, ah,
Qalmayub ənsardən, əshabdən bircə pənah,
Bir bölük əlsiz-əyaqsız qızlara sənsən pənah,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Caridür göz yaşı məmzuc xun ilə hər didədən,
Gülistan oldı xəzan, gülşəndə soldı yasəmən,
Az qalub, billah, susuzdan çün həlak olsun bədən,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Tökməyim göz yaşımı rüxsarə, axır neyləyim,
Hicri-Əkbər eyləyüb avarə, axır neyləyim,
Təşnəlıqdan bəs məni-dilparə, axır neyləyim,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Bu Fərat cari olub səhralərə misli-zülal,
Mürği-gülşən nitqdən düşdi, ətəşdən oldı lal,
Get ədulərdən biqədri bir içim, bari, su al,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

Nadimi-biçarəni məhşər güni xar eyləmə,
Qəbrini rövşən elə, vəhşət şəbün tar eyləmə,
Təngdil etmə onı dünyadə, biyar eyləmə,
Bir içim su tap, ətəşdən yandım, ey sərvər əmu.

## Səkinənün dilindən

Ey baba, xərabə içrə mən gəlməyim fəğanə, neyləyim,
Ağlayanda Şimri-dun vırar çubü taziyanə, neyləyim.

Tifl ikən əlimdən aldılar, ey əzizü mehriban, səni,
Rumü Həbəş əsiritək, baba, gəzdirəllə hər zəman məni,
Zeynəbün verər təsəlli çox arizu edəndə mən səni,
Navəki-bəlayə, ey baba, olmuşam nişanə, neyləyim.

Cami-möhnəti-bəlanı nuş edüb bu canə, ağlaram,
Var səbəb bu ahü zarimə əldə bir bəhanə, ağlaram,
Gahi növhə eyləyüb sənə, gahi Əli cəvanə ağlaram,
Ağlamaqdan əşki-çeşmimi döndərüblə qanə, neyləyim.

Bülbüli-qəmim düşüb, könül, gülşəni-çəmən sorağinə,
Ta qoyam ləbimi Əkbərün lalətək solan dodağinə,
Qıllam arizu qoyam yüzüm bir də Əkbərün əyağinə,
Çün səmumi-zülm ilə xəzan yetdi gülistanə, neyləyim.

Gül cəmalını görənmərəm, olmuşam mən Əkbər həsrəti,
Bu xərabə guşəsində ol varisi-Peyəmbər həsrəti,
Çox çətindi mehriban bacı olsa gər bəradər həsrəti,
Hicr şö`ləsi salubdı od bu zəif canə, neyləyim.

Şahi-zarım rəvadı bu sübhü şam ac-susuz qalum,
Gah Şimrə, gah Sinanə mən, gahi saribanə yalvarum,
Topraq üstə başaçux yatım, nə rəvadı belə xar olum,
Mürğtək gözüm olub, baba, həsrət aşiyanə, neyləyim.

Bu Səkinənün qəmində mən Nadiməm, müdam ağlaram,
Hər qədər qələm yaza müsibəti, ol qədər sinə dağlaram.
Qəbrinə nəsib ola, verrəm guşeyi-xərabədə səlam,
Yoxdı istitaətim, Xuda, gəlməyim fəğanə, neyləyim.

**Əmmə, necə səbr edim, gəlməyim əfğanə mən**

Əmmə, necə səbr edim, gəlməyim əfğanə mən,
Guşeyi-viranədə doydum əcəb canə mən.

Öldi cəvan qardaşım, adətim əfğan olub,
Düşdi bəlayə başım, qismətim hicran olub,
Cari edim göz yaşım, mülki-könül qan olub,
Göz yaşını ta gərək döndərəm ümmanə mən.

Cuşə gəlüb qəmlərim, əmmeyi-müztər, mənim,
Çünki solub güllərim zülm ilə yeksər mənim,
Qanə batub qardaşım şibhi-Peyəmbər mənim,
Ağlayub ol Əkbərə, qurram əzaxanə mən.

Gül kibi rəngim solub, əmmə, mənim qüssədən,
Adətim əfğan olub, qan tökərəm didədən,
Qismətim hicran olub, ağlaram hər vəqtə mən,
Tə`neyi-əğyardən doydum əcəb canə mən.

Harda qalub Əkbərim, söylə sən, ey əmməcan,
Noldı o qəmpərvərim, söylə sən, ey əmməcan,
Cuşə gəlüb qəmlərim çünki mən, ey əmməcan,
Ağlaram ol Əkbəri-ləbləri ətşanə mən.

Əsğərimi zülm ilə oxladılar kufəyan,
Əkbəri-məhpeykəri doğradı Şimrü Sinan,
Bais odur ağlaram şur ilə, ey əmməcan,
Saxlaram həm tə`ziyə Əsğəri-nalanə mən.

Xırda uşaxlar hamı ağlayar əllərdə cam,
İtrəti-əthərə su, oldı bu çöldə həram,
Həşrə kimi ağlaram, Əsğəri-tiflə müdam,
Düşmişəm hicran ilə bərrü biyabanə mən.

Əmmələrim cümləsi başə salublar qəra,
Hər biri bir növ` ilə eyləyər əl`an səda,
Bacı gərək şur ilə qardaşını ağlaya,
Ağlaram ol Əkbəri-Yusifi-Kən`anə mən.

Məskənimiz Şamdə, zülm ilə viran olub,
Adətimiz sübhətək, naləvü əfğan olub,
Təşnə babam, əmməcan, qaninə əlvan olub,
Ağlaram ətşan ölən Sərvəri-dövranə mən.

Əmmə, yuxum gəlmiri, bais odur çün acam,
Çün mənə şadlıq babamdan sora oldı həram,
Gəlmir əcəl Şamdə, ömrim olaydı təmam,
Vəqt yetibdür olam azimi-rizvanə mən.

Saxlayaram ruzü şəb Şahi-şəhidə əza,
Bəzmi-əzadə müdam eylərəm ahü nəva,
Ya Rəb, özin əfv elə Nadimi ruzi-cəza,
Çün səni verrəm qəsəm Şahi-şəhidanə mən.

**Ölürəm, əmmə, müyəssər degil Əkbər görüşi**

Ölürəm, əmmə, müyəssər degil Əkbər görüşi,
Çün düşüb başimə ol şibhi-Peyəmbər görüşi.

Nə babam gəldi məni-bikəsi yad eyləməgə,
Soruşub halımı, bu qəlbimi şad eyləməgə,
Bu bəladən məni-naşadı azad eyləməgə,
Qismət olmaz mənə ol Şafiyi-məhşər görüşi.

Deyüsən, əmmə, gedüb Əkbəri-ətşan səfərə,
Nə üçün gəlmədi təskin verə mən dərbədərə,
Bax, gözümdən tökülən, əmmə, bu əşki-bəsərə,
Arizuvi eləyür ol məhi-ənvər görüşi.

Saldı gözdən məni göz yaşı kimin, xar elədi,
Vəsldən üzdi əlim, həsrəti-didar elədi,
Yetməz heç vəslinə əl, həsrəti-rüxsar elədi,
Nə nəsib oldı mənə yarü nə yavər görüşi.

Tökərəm göz yaşı rüxsarimə mən sübhü məsa,
Yanmışam hicr oduna, əmmə, məni-bəxti qəra,
Könlüm istər eləyim Əkbərimi bir də vida,
Qismət olmaz mənə heç bir də bəradər görüşi.

Qoymayub Əkbərimün firqəti heç məndə dəvam,
Ağlaram, şadlıq olubdur mənə aləmdə həram,
Nə gələr yanıma Əkbər, nə əmüm, bikəs atam,
Ya Rəb, eylə mənə qismət Şəhi-məhşər görüşi.

*Əfrad*

Əli, Əli deyübən ağlaram məni-külbaş,
Xərabəyə niyə bəs gəlmüsən,* Əli, qardaş?

O səndən ayrılalı adətim olub əfğan,
Xərabələrdə qolum bağlı, zarü naləkünan.

Həmişə ağlayaram mən sənə, Əli Əkbər,
Müyəssər olmurı vəslün çü şibhi-Peyğəmbər.

*Təmamiyi-növhə*

Nadiməm, şamü səhər virdim olub naləvü ah,
Ya Hüseyn, səndən əlavə mənə yox yarü pənah,
Qeybdən eylə müyəssər mənə azuqeyi-rah,
Çox düşüb başıma çün zadeyi-Heydər görüşi.

**Səkinənün dilindən**

Lərzə edərlə yerlər banuyi-ismət, əmmə,
Yoxsam qiyam edibdür ruzi-qiyamət, əmmə.

Gördüm bu saət, əmmə, Ali-Peyəmbər ağlar,
Söyləllər, "va qəriba", nazlı hərəmlər ağlar,
Sağdur babam, neçün bəs ətfalı yeksər ağlar,
Küffarlər vırdılar təbli-bəşarət, əmmə.

---

* Gəlmirsən

Əmmə, eşitmisən[*] bəs meydanda bu sədanı?
Vır, öldürün sədası doldurub Kərbəlanı,
Bu qəm hərasə saldı mən zarü binəvanı,
Sağdur babam, buyur, bəs bu nə əlamət, əmmə?

Əmmə, məgər degil bəs şəhzadə Əkbər öldi,
Əbbasü Qasim, Övnü Fəzl ilə Cə`fər öldi,
Hülqi cəfa oxuna oxlandı, Əsğər öldi,
Doymub hələ cəfadən əhli-şərarət, əmmə.

Ya Rəb, bu nə əlamət, zülmət cəhanı dutdı,
Badi-siyəhlər əsdi, yerlər təzəlzül etdi,
Zülmün odı alışdı, dudı səmayə yetdi,
Yoxsa babam içibdür cami-şəhadət, əmmə.

Əmmə, əman, xiyamə yüz qoydı əhli-kinə,
Söylə, nə çarə etsün bu bağrıqan Səkinə,
Qanə batub əlimdən getdi mahi-Mədinə,
Qalsaydı Əkbər, ə`da tapmazdı cür`ət, əmmə.

Fərmanı əhli-kinə verdi o Şimri-kafər,
Yüz qoydı xeyməgahə ol ləşkəri-sitəmkər,
Çün xeymələr alışdı nari-cəfayə yeksər,
Söylərdi ol yetimə etsün himayət, əmmə.

Ahutək Ali-Taha səhralərə dağıldı,
Bə`ziləri od aldı, narə yanub yaxıldı,
Atlar əyağı altda bə`ziləri yıxıldı,
Rəhm eyləməz neçün bəs əhli-şəqavət, əmmə?

---

[*] Eşitmirsən

Qəlbündə et təsəvvür, nolardı hali-Zeynəb,
Həddən ziyadə oldı dərdü məlali-Zeynəb,
Gördi Səkinə söylər, ol dəm cənabi-Zeynəb,
Yoxsa babam ölübdür, bu nə əlamət, əmmə?

Hər qədr həyatun olsa, et ahü nalə, Nadim,
Ol haləti gətür bir məddi-xəyalə, Nadim,
Bu misrayə dübarə yaz et məqalə, Nadim,
Yoxsa şəhid olubdur Şahi-vilayət, əmmə.

**Nə çarə eyləsün Ali-Peyəmbər, əmməcan**

Xeymələrə gəlür, əman, Şimri-sitəmkər, əmməcan,
Söylə, nə çarə eyləsün Ali-Peyəmbər, əmməcan?

Yoxsa kim, öldürüblər, əmmə, Şəhi-Mədinəni?
Qoydıla çeşmi-əşkbar zülm ilə bu yətiməni,
Kim alu bəs qucağına vay eləsə Səkinəni?
Möhnətü qəm hücum edər üstümə yeksər, əmməcan.

Əkbərim öldi, ağlaram çünki o məhcəmalə mən,
Xalına həsrət olmuşam, yetmədim heç vüsalə mən,
Gör, necə olmuşam ənis, dərdü qəmü məlalə mən,
Həşrətək ağladar məni firqəti-Əkbər, əmməcan.

Xeyməyə, əmməcan, hanı bir də qərib babam gələ,
Vermək üçün təsəlli bu zarü həzinü bülbülə,
Eylədi navəkə nişan Əsğəri zalim Hərmələ,
Bağrımı qan edüb mənim haləti-Əsğər, əmməcan.

Qönçəmisal güllərim səhni-çəməndə soldılar,
Qövmü qəbiləmi bu gün zülm ilə əldən aldılar,
Getdi əmüm su almağa, təşnə qolını saldılar,
Gəlmədi xeyməyə, xəcil oldı o sərvər, əmməcan.

Əmmə, məni apargilən, barı, babamı bir görüm,
Yetdi fəraq mövsümi, bəlkə o şahü yavərüm,
Halımı can verən zəman bəlkə babama bildürüm,
Ey baba, nazımı çəkər, söylə, bə kimlər, əmməcan?

Cari olub üzarimə möhnətü qəmdə göz yaşım,
Ölsə babam, xərabədə, əmmə, açux qalur başım,
Yox bu qəribdən əlavə nə müinü qardaşım,
Əl çəkər ağlayanda kim başıma göstər, əmməcan?

Rəzmdə öldürər ədu zülm ilə bir oğulsuzi,
Xəncərün atda can verər, xeymələrə baxar gözi,
Ölsə babam, əsir edər kin ilə əşqiya bizi,
Kufəvü Şamı gəzdirər Şimri-sitəmkər, əmməcan.

Yoxdı mənim o taqətim əhli-şərarə yalvarım,
Bir güli-nazpərvərəm, icz ilə xarə yalvarım,
Sağ degi Əkbərim gedəm, bari, o yarə yalvarım,
Şamdə can verər məni-zarü mükəddər, əmməcan.

Nadiməm, ağlasun gərək çeşmim əzadə hər zəman,
Ölübdi çün bəradərim, öldi əmuyi-mehriban,
Kim mənə yar olar, sölə, yoxdı babam da, əmməcan,
Sölə, nə çarə eyləsün Ali-Peyəmbər, əmməcan.

## Səbr elə, Əkbər gələcək

Mənə, əmmə, deyisən, səbr elə, Əkbər gələcək,
Ölürəm, bəs mən, haçan şibhi-Peyəmbər gələcək?

Qollarım bağlıdı, bir kimsə mənə rəhm eləməz,
Şimr mən zarü qəribi-vətənə rəhm eləməz,
Rəhmi yox zərrə məni-qəmzədəyə, rəhm eləməz,
Bəs haçan dadimə Əbbasi-dilavər gələcək?

Ruhdən xalidi, vallahi, bu quşsuz qəfəsim,
Öldürər qüssə məni, kimsənə yox dadrəsim,
Səslərəm, Əkbəri-naşad heç eşitməz bu səsim,
Şamdə dadimə viranədə kimlər gələcək?

Nə Mədinə, nə vətən, ölkə qərib, Ali-Rəsul,
Nə qəbilə, nə kömək, oldux hamı zarü məlul,
Eyləməz ərzimi əlbəttə, mənim Şimr qəbul,
Çün bilür dadimə nə yarü nə yavər gələcək.

Əmməcan, rəhm elə əhvalimə, qoy başimə əl,
Axır ərzimdi mənim, ərzimə, dur, eylə əməl,
Qolumı, Şimrə de, açsun, məni dərk eylür əcəl,
Can verəndə başım üstə babam Heydər gələcək.

Xürdi kərpic ilə, dur, cayi-yataq hazır elə,
Yüzümə çəkməgə bir qarə duvaq hazır elə,
Əmmə, dur, başımun üstündə çıraq hazır elə,
Gözümi bağlamağa sibti-Peyəmbər gələcək.

Qoymayub məndə bu zəncir görüsən[*] taqətü tab,
Ruh pərvaz eləməkligdən ötür etdi şitab,
Söylə, ətrafıma cəm` olsun hamı Ali-Türab,
Did üçün bir də kəsik baş müsəxxər gələcək.

Əmmə, topraqlarun üstə görüsən xar oluram,
Qollarım bağlı, özüm Şimrə giriftar oluram,
Doyurub canə məni, tə`neyi-əğyar, ölürəm,
Bilürəm dərdü qəmün üstünə qəmlər gələcək.

Nadiməm, aləmi-mə`nadə kimim vardı mənim?
Yarü qəmxar bu dünyadə kimim vardı mənim?
Sala bu halidə bir yadə, kimim vardı mənim?
Qəbrdə didim üçün saqiyi-Kövsər gələcək.

**Məskənim bu viranələr olub**

Əmmə, bəs hanı xanimanımız?
Məskənim bu viranələr olub.
Qalmış ac-susuz Ali-Bu Türab,
Xarü dəstgir, dərbədər olub.

Əkbərim neçün gəlməz, əmməcan,
Gözlərim qalub yolda hər zəman,
Qüssədən mənim bağrım oldı qan,
Məskənim bu viranələr olub.

Yoxdı bir nəfər halımı bilən,
Bu xərabədə yanıma gələn,

---

[*] Görürsən

Ağlayan zəman gözlərim silən,
Məskənim bu viranələr olub.

Nə ənis vardur, nə həmdəmim,
Artar hər zəman möhnətü qəmim,
Əşki-xun tökər çeşmi-pürnəmim,
Məskənim bu viranələr olub.

Olmuşam əsir Şimri-kafirə,
Başaçux məni saldı çöllərə,
Yoxdı rəhm edən Ali-Heydərə,
Məskənim bu viranələr olub.

Öldi Əkbərim, dadə yox gələn,
Bir danışdırub, halımı bilən,
Neylim imdi mən zarü bivətən,
Məskənim bu viranələr olub.

*Əfrad*

Əyağə durgilən, ey əmmeyi-mələkmənzər,
Düşübdi yadıma, əmmə, cəvan Əli Əkbər.

Nə halımı soruşan var, nə rəhm edən, əmmə,
Mənə şəmatət edər hər gəlüb gedən, əmmə.

Əsirü dərbədərəm, cari eylərəm qan-yaş,
Hanı, hərayə gələ nə ata, əmu, qardaş.

Fərağı Əkbərimün saldı min məlalə məni,
Fələk zəmanədə həsrət edüb vüsalə məni.

Tərəhhüm et, mənə, əmmə, qəribü zar ölürəm,
Zibəs acü susuzam, xarü şərmsar ölürəm.

*Təmamiyi-növhə*

Mülki-dil dönüb qanə, ağlaram,
Gəlləm imdi əfğanə, ağlaram,
Tə`n edəllə biganə, ağlaram,
Məskənim bu viranələr olub.

Nadimim gərək ağlasun müdam,
Saxlasun əza hər səbahü şam,
Əmmə, qüssədən ömr olur təmam,
Məskənim bu viranələr olub.

**Səkinənün dilindən**

Rəhm eyləgilən xahəri-nalanə, bəradər,
Salma bacuvı kuhü biyabanə, bəradər.

Billəm məni bu qüssə yəqin öldüri, qardaş,
Bu Münqizi-bidin gülimi solduri, qardaş,
Şəhla gözüvi xuni-cəfa dolduri,* qardaş,
Razi degiləm, getmə bu meydanə, bəradər.

Heç kimsə əlin qardaş əlindən üzə bilməz,
Hicranuva, qardaş, Səkinə dözə bilməz,
Şəhzadə bacun Kufəvü Şamı gəzə bilməz,
Gəl, getmə dəmi-xəncəri-bürranə, bəradər.

---

* Öldürür-soldurur-doldurur

Bir bülbüli-bibalü pərəm, didəsi giryan,
Hicründə gərək daim edəm naləvü əfğan,
İmdi ki, sənə izn verüb Şahi-şəhidan,
Gəl, şanə edim zülfi-pərişanə, bəradər.

Bu növ` ilə can verməgə getmə, səni Tari,
Eşqündə gərək nalə edəm leylü nəhari,
Gəl, şanə edim zülfi-pərişanuva, bari,
Çün rəsmdür zinət hamı qurbanə, bəradər.

Bu çöldə səni öldürə gər ləşkəri-kinə,
Hicran oduna odlanı* biçarə Səkinə,
Səbr eyləyü** illərlə necə mahi-Mədinə?
Eşqün elər axır məni divanə, bəradər.

Ə`da edələr cismüvi al qan ilə əlvan,
Leyla eləyər sinəsini çaki-giriban,
Səhrayi-biyabandə Məcnun kimi heyran,
Nalə edər hər vəqtə zəlilanə, bəradər.

Şam əhli sənün qətlüvə, qardaş, edüb iqdam,
Qorxum budur, ey mahi-Mədinə, gəlü əyyam,
Bu çöldə səni öldürələr həsrətü nakam,
Əlvan edələr laləsifət qanə, bəradər.

Gülşəndə xəzan olsa əgər bir güli-xoşbu,
Eşqündə edər leylü nəhar bülbül qu-qu,
Ölsəm də ətəşdən dəxi mən istəmərəm su,
Yandırma məni firqəti-suzanə, bəradər.

---

* Odlanır
** Eyləyir

*Əfrad*

Dəxi su istəmərəm, Əkbərim, dayan, getmə,
Fəda ola sənə bu zarü biməkan, getmə.

Susuzluğa dözərəm sən yanımda olsan gər,
Kənarə getməgüvə olmaram riza, Əkbər.

Sənə fəda mən olum, ey əzizü yari-Hüseyn,
Gedüb əlindən hamı yari-cannisari-Hüseyn.

Sən də getsən, Əli, billəm ki, öldürər düşmən,
Fəraquva necə illərlə tab edim bəs mən.

Sənün fəraquva yox taqətim, Əli, qardaş,
Gəl, olma razi tökə gözlərim yüzə qan-yaş.

Şəbihi-Əhmədi-Muxtar, mahi-dünyasən,
Sürurü taqətü arami-qəlbi-Leylasən.

*Təmamiyi-növhə*

Qardaş, necə səbr eyləsün hicranuva Leyla,
Həsrət qala ol zülfi-pərişanuva Leyla,
Hər vəqtə yanar firqəti-suzanuva Leyla,
Salma bizi hicran ilə tufanə, bəradər.

Amadə olub qətlüvə bu ləşkəri-xunxar,
Zülm ilə səni öldürəcək ləşkəri-küffar,
Bu qissəni çün nəzmə çəkər Nadimi-naçar,
Növhə edər hər yerdə zəlilanə, bəradər.

## Əl-ətəş

Qalmayub suzundan, ey əmu, taqətü təvanım, əl-ətəş,
Eylə bircə çarə, yanub məğzi-üstüxanım, əl-ətəş.

Et nəzər nə növ`i, gör, əmu, parədür bu qönçə ləblərim,
Odlanubdı nari-möhnətə bu dili-həzinü müztərim,
Olma razi Şimrə yalvarım, icz ilə solubdı güllərim,
Təşnəlik hərarəti, əmu, yandırubdı canım, əl-ətəş.

Sağ degil Əli Əkbərim mən o məhliqayə yalvarım,
Qasim ilə Övnü Cə`fərim, hansı tacdarə yalvarım,
Gəlmişəm dəxil mən sənə gəldim aşkara yalvarım,
Bir əlac elə, əmandı, ey mehribanım, əl-ətəş.

Cari eyləyür üzarimə gözlərim sirişki-qəm, əmu,
Qalmayubdur məndə tabi-atəş imdi sahibi-qəm, əmu,
Yarsən bu Əhli-Beytə sən, ey əzizü möhtəşəm, əmu,
Bir əlac elə, dəhənimdə yandı bu zəbanım, əl-ətəş.

Sən nə qədr sağsan, ey əmu, çəkmərəm bu Kərbəladə ah,
Ağlayur mənim bu halimə imdi asimanü mehrü mah,
Nə etmişəm bu qövmə, bilmirəm, yoxdı məndə zərrə günah,
Aldılar əlimdən Əsğəri, Əkbəri-cəvanım, əl-ətəş.

Bu bəla çölündə bu Şahi-bikəsi qoyublar vəhid,
Eyləyüblər yarü yavərin zülm ilə bu ərsədə şəhid,
Eyləyüblər cövrü cəfa bu qəribə ləşkəri-ənid,
Su yanında od dutub yanar, təşnədür dəhanım, əl-ətəş.

Cam əldə yalvarur mənə düxtəri-şəhzadələr təmam,
Ağlayub tökdülər göz yaşın su kimin üzarə əldə cam,
Bizlərə məgər olub, əmu, Kərbəla çölündə su həram,
Səndən özgəyə bu ərsədə gəlməyür gümanım, əl-ətəş.

Nadiməm, həmişə ağlaram bu tifllərün halinə,
Qəmzədə olub zəmanədə baxmışam onun məlalinə,
Çünki həsrət oldı Əkbərim ol Hüseyn surətü cəmalinə,
Soldı, ölübdür təşnələb Əkbərim, cananım, əl-ətəş.

**Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş**

Susuz ətəşdən, əmu, soldı gülüm, əl-ətəş,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Təşnəlıq aramımı, ey əmu, əldən alub,
Xırda uşaxlar hamı xeymədə ətşan qalub,
Gül kimi rəngim, əmu, suzi-ətəşdən solub,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Yox bizə bir dadrəs, nalədi virdim, əmu,
Artar ətəşdən mənim möhnətü dərdim, əmu,
Bu ətəşə şahidimdür rüxi-zərdim, əmu,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Qönçəsifət solmuşam, çıxmırı canım, əmu,
Yandı ətəşdən, əlac eylə, dəhanım, əmu,
Cismdə, vallahi, yox tabü təvanım, əmu,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Olma riza əl tapa xari-cəfa bülbülə,
Badi-xəzan əl tapub səhni-çəməndə gülə,
Gözlərimün yaşinə bax, əmucan, rəhm elə,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Halıma yox bir yanan, aləmə yavər, əmu,
Qanə batub Əsğərim, doğranub Əkbər, əmu,
Yandı ətəşdən hamı Ali-Peyəmbər, əmu,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Olma riza icz edim əhli-inadə bu gün,
Soldı ətəşdən ləbim Kərbübəladə bu gün,
Çün məni bir qəmküsar yox sala yadə bu gün,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Səndən əlavə dəxi yoxdı yanan halimə,
Suzi-ətəşdən solub, bax, əmu, rüxsarimə,
Rəhm elə, sərdar əmu, dideyi-xunbarimə,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

Nadiməm, hər sübhü şam əldə qələm, ağlaram,
Eylədi bu macəra qəddimi xəm, ağlaram,
Söylədi ol binəva kani-kərəm, ağlaram,
Tap mənə bir cür`ə su, yandı dilim, əl-ətəş.

## Bəzmi-am edüb mürəttəb Şamdə...

Bəzmi-am edüb mürəttəb Şamdə Yəzidi-qəddar,
Daxil oldı çün o bəzmə Zeynəlabidini-bimar.

Məscidə girüb cəlallı gördi ol Yəzidi məsrur,
Əsr İmamını nəzərdə gördi çün həqirü məqhur,
Xatibə xitab edübdi kibrü kinə ilə məğrur,
Minbərə çıxub Yəzidün şə`nin eylə xəlqə izhar.

Minbərə çıxub xətibi-bihəyayi-namüsəlman,
Xütbəni təmam edəndən sora söylüb hərzə hədyan,
Şad olub o macəradən hazirani-ali-Süfyan,
Söylədi Yəzidə məhzun, ol mərizi-bimədədkar.

Xeyli vəqti Şimri-kafər dəstimi edübdi bəstə,
Gər icazə olsa hasil mən qəribü dilşikəstə,
İzn ver Xudayə məhzun həmd edim bu minbər üstə,
Vermədi Yəzid icazə, əhli-məclis etdi təkrar.

Vermisən* neçün icazə, ey Yəzidi-bimürüvvət?
Bu qəribü bipənahə bu nə zülmü nə ədavət,
Eylədi təmami-hüzzar bəs ki, çox Yəzidə minnət,
Bərqərar olubdı minbər üstə ol mərizi-təbdar.

Əvvəl ismi-Xaliq ilə məclisi edüb müzəyyən,
Eylədi fəsahət ilə dedi, ey mühibbi-rövşən,
Zahir oldı nuri-bərhəqq xar olub təmam düşmən,
Əmr edüb Yəzid, müəzzin elədi əzanı iqrar.

---

* Vermirsən

Elədi nida müəzzin, zikr olanda zikri-təkbir,
Söylədi İmami-bərhəqq, bəli, birdi Həyyü Qadir,
Zikr olan zəman Mühəmməd, oldı çün daha müəssir,
Döndərüb yüzin Yəzidə söylədi ki, ey sitəmkar.

Söylə, bu Rəsuli-bərhəqq kimdi zikr olur mükərrər?
Gər desən sənün babandur, etmüsən cəfa, sitəmkər,
Gər mənim babamdı hərgah bu Şəfii-ruzi-məhşər,
Bəs niyə xərabələrdə qoymusan bizi cəfakar?

Kəşf olub Yəzidi-dunun kibri oldı xəlqə zahir,
Açdılar zəbani-töhmət çün Yəzidə xəlqi-hazir,
Hansı dindədür Peyəmbər oğlınun qolunda zəncir,
Ta ola xərabələrdə möhnətü qəmə giriftar.

Çün Yəzid gördi zülmi tə`sir etdi əhli-dinə,
Zahir eyləyüb təəssüf, söyləyirdi Abidinə,
Zadeyi-Ziyadə lə`nət, elədi cəfa Hüseynə,
Oldular bu macəradən Ali-Müstəfa xəbərdar.

Şamdə edübdi Zeynəb bir əzani çün mürəttəb,
Dutdılar Hüseynə matəm, kəşf olubdı xəlqə mətləb,
Tazədən batubdı yasə çünki bəxti qarə Zeynəb,
Hər əzayi-qəmfəzadə, Nadim, et bu şərhi izhar.

## Sinəzəni-ərbəin

Bülbüli-qəmkəş məqami-vəsli-gülzar istədi,
Seyr üçün bir səhni-gülzarü çəmənzar istədi.

Zeynəbi-biçarənün həddən ötüb möhnətləri,
Aləmi-rö`yadə gördi Padşahi-məhşəri,
Qeyz ilə məcbur edüb hökmən Yəzidi-kafəri,
Talibani-vəsli-yarə könli dildar istədi.

Yatmayub ol şəb Yəzidi-bihəya etdi səbah,
Bəzminə hazır edüb Ali-Əbanı, ah, ah,
Abidi-bimarə söylüb istədi əfvi-günah,
Tərk edüb cövrü cəfanı üzr o biar istədi.

Zeynəbə yüz dutdı ərz etdi, əya binti-İmam,
Zülm Əli övladına etməkligi etdim həram,
Lə`nəti-aləm ola ibni-Ziyadə bit-təmam,
İtrəti-Peyğəmbəri o bihəya xar istədi.

Hər nə xahiş eyləsəz, qıldım rəva, eylün əyan,
Yəsribə getməkligə olsaz riza, qıldım rəvan,
Zeynəbi-biçarə çeşmi əşkbar qıldı bəyan,
Qarəti-Kərbübəlanı eyləyüb izhar, istədi.

Fikr edüb ol bihəya, baxdı əsiranə tərəf,
Qarəti-Kərbübəla söylüb olub yeksər tələf,
Etdilər şivən təmamən itrəti-Şahi-Nəcəf,
Cümlə qarətgərləri çün qaldı naçar, istədi.

Hökm edüb gətdi hamı Kərbübəla qarətlərin,
Verdilər Leylayə qəlxanun Əliyyü Əkbərin,
Gördi bir cüft çəkmə əldə bir ləini-kəmtərin,
Vay, oğul, sölüb onı Leylayi-biyar istədi.

Əhli-məclis gördi gəldi bir ləini-bihəya,
Var əlində bircə boxca, açmağa eylər həya,
Sölədi Əsğər anası rəxtüvə qurban, bala,
Hansı zülm qundağın qan ilə gülnar istədi?

Daxil oldı bəzmə bir şumi-ləini-kəmtərin,
Qasimün qanə bələşmiş açdı toy xəl`ətlərin,
Çün Səriyyə natəvan sölüb, kəsilsün əllərin,
Qasimün rəxtün ərusi-zarü biyar istədi.

Yandı qəlbim gözlərim ağlar bu yerdə dəmbədəm,
Bu sözi yazmaqlığa ağlar, həya eylər qələm,
Daxil oldı bir nəfər çignində bir qanlı ələm,
Gördi qanlı beydəği Külsum naçar istədi.

*Əfrad*

Yəzid bəzminə daxil olanda Ali-Əba,
Neçün tökülmədi göglər o dəmdə, vaveyla.

Cəfanı tərk eləyüb zahirən o bədbünyad,
Bu fikrə düşdi edə Ali-Heydəri azad.

Yəzid doymamuş idi əgər cəfasından,
Gətirdi üzri-günah səltənət hərasından.

*Baqiyi-növhə*

Bircə boğça gətdi dəstində o dəm Şimri-dəğa,
Boğçanı kimsə ki, gördi eləyüb ahü nəva,
Gördilər bir pirəhən min doqquz yüz əlli yəra,
Köynəgi ol Zeynəbi-zarü dilfikar istədi.

*Əfrad*

Girəndə Şimri-ləin bəzmə pirəhən əldə,
Əyağə durdı xanım Zeynəb ahü va dildə.

Dedi, mənə gətirün qardaşım nişanəsini,
Binayi-naləvü əfğanımın bəhanəsini.

Alub o pirəhəni dəstə, söylədi: hüzzar,
Baxun bu köynəgə, bircə deyün müsəlmanlar.

Bu qəd* yarə vıralla məgər qərib ölənə?
Vətəndən ayrı düşən zarü binəsib ölənə.

Vırubla yarə o qədr bircə sağ yeri yoxdur,
Təmam nizə yeri tirü xəncərü oxdur.

Baxun bu halə düşə bir kəsün ki, pirəhəni,
Görün nə halə düşər zəxm alandə bəs bədəni.

Belə yaralıya mən növhə etməyim, neylüm,
Ver Hüseyn başını, ağlayum, öpüm, iylüm.

---

* Qədər

Bu sözdə Abidi-bimar Yəzidə etdi xitab,
Babam başun mənə ver, qəlb qəmdən oldı kəbab.

Yəzid söylədi, bu iş məhaldur, heyhat,
Hüseyn başun görsən* bir də yövm ta ərəsat.

Bu söz nə sözdi deyürsən, Yəzidi-bədəxtər,
Babam başınımi görmək mənə çətindi məgər.

Yüzini dutdı məqami-səri-Hüseynə tərəf,
Gözindən əşk töküb yadigari-Şahi-Nəcəf.

Edübdi boynunı kəc, çəkdi suz ilə bir ah,
Dedi, səlamün əleyk, ya zəbihi-rahi-Əllah.

O vəqtə gördilə lərzə edüb dərü divar,
Durub həvadə səri-paki-Şahi-din xunbar.

Dedi, əleykə səlam, yarü qəmküsarım, oğul,
Qalan müsibəti-qəm içrə yadigarım, oğul.

Gətür əyalımi ol səmti-Kərbəlayə rəvan,
Məzarım üstə gedüb et tilavət Qur`an.

*Təmamiyi-növhə*

Aldılar Ali-Peyəmbər cümleyi-qarətləri,
Tazədən gəldi büruzə birbəbir möhnətləri,
Saldı hər bülbül xəyalə bir güli-xunpərvəri,
Ol şəqidən bir əza bəzmi o bimar istədi.

---

* Görərsən

Qurdılar bəzmi-əza Şam içrə övladi-Hüseyn,
Ol müsibətdən təmam ağlar cinanda hurül-eyn,

Çünki üç gün qaldı xak üstə kəfənsiz Şahi-din,
Zeynəbü Külsum Şam içrə əzadar istədi.

Çün susuz ölməkligi Mövlam özi eylüb qəbul,
Təşnə zibh etdi səri-Mövlanı ol ceyşi-zəlul,
Nadimi-biçarəni naləkünan, qəlbi məlul,
Min üç yüz igirmüçümci* ildə zəvvar istədi.

**Dübarə Kərbəlayə varid olma****

Şamdən oldı xilas Ali-Əba giryan gəlür,
Kərbəla səhrasinə banaləvü əfğan gəlür.

Yetdilər təlli-səlamə Əhli-Beyti-binəva,
Əl verüb riqqət, təmami-qəhrlə eylüb səda,
Söylədi Zeynəb, Hüseyncan, ətrüvə ruhim fəda,
Gördi badi-sübh əsir, ətri-şəhi-ətşan gəlür.

Söylədi Külsumi-məhzun, bacı, Zeynəb, əl-əman,
Kərbəla səhrasinə yetmək mənə oldı əyan,
Həzrəti-Əbbas guya gözləri məmlüvvi-qan,
Pişvazə peykəri-xunbari-ləbətşan gəlür.

Tökdi Leyla göz yaşın rüxsarinə başurü şin,
Naləsi peyda olub, va Əkbəra, sölüb həzin,
Bundan əqdəm kaş öleydi, ey oğul, bu madərin,
Qəbrüvün müştağı olmuş madəri-nalan gəlür.

---

* Hicri 1323 – miladi 1905-ci il
** «Dübarə vürud bə Kərbəla»

Madəri-Qasim töküb göz yaşını əfsürdəhal,
Kərbəlayi-pürbəladur, qəlbim oldı pürməlal,
Naz ilə topraqdə yatma, Qasimi-şirinməqal,
Ey oğul, didaruva həsrət qalan canan gəlür.

Sölədi Əsğər anası, rə`şə düşdi canimə,
Bais oldı tazədən bu naləvü əfğanimə,
Ey Əli Əsğər, oğul, dur, süd gəlüb püstanimə,
Şamdən oldı xilas, dur, madəri-giryan gəlür.

Növərus sölüb, əmoğlı, ey şəhidi-tiri-tiz,
Dəstgir oldux əsiri-Rumtək ə`dayə biz,
İstədi tazə ərusi Şamdən şahi-kəniz,
Növərusi-natəvanun, dur, sənə mehman gəlür.

Kərbəla səhrasinə bimar o dəm etdi nəzər,
Qəbrlər üstündə gördi zahir olmuş nalələr,
Söylədi, get, ey Bəşir, gör kimdi bu zəvvarlər,
Hər kim olsa, söylə, ətfali-Şəhi-mərdan gəlür.

Cabiri-Ənsardür gördi Bəşiri-biqərar,
Gəldilər Ali-Əba ilə dedi, Bimari-zar,
Qəbrlərdən, xahiş eyləllə, olun bir az kənar,
Ali-Taha eyləsünlər naləvü əfğan, gəlür.

Abidi-bimar Hüseynə verdi əvvəl bir səlam,
Naqələr üstən töküldi Ali-Peyğəmbər təmam,
Hər əsir bir qəbri guya qəsd edüb etdi qiyam,
Qəbrüvə olsun fəda bu Nadimi-nalan gəlür.

**Sinəzəni-mövsümi-ərbəin**

Gətdim[*] hüzuruva əsir əyalun,
Oyan, ətşan baba, səlamün əleyk.
Gətür başın yerdən Abidi-zarun,
Sənə qurban, baba, səlamün əleyk.

Bizə qismət olub imdi vüsalun,
Baba, nə növ`idür bəs yaralarun?
Yəravə göz yaşin bu bacılarun,
Edər dərman, baba, səlamün əleyk.

Təmamən itrəti-Zəhranı gətdim,
Əsir olan ali-Tahanı gətdim,
Xüsusən Zeynəbi-nalanı gətdim,
Şəhi-dövran baba, səlamün əleyk.

Sual etsən əgər lütf ilə halım,
Bəli, bir barədə çoxdur məlalım,
Bizi Şam içrə ol Yəzidi-zalim,
Edüb giryan, baba, səlamün əleyk.

Gətirdim cümlə Əhli-Beyti-zarı,
Bəqeyr əz bir Səkinə dilfikarı,
Xərabə Şamdə qaldı məzarı,
Olub viran, baba, səlamün əleyk.

Gətirmişdün Əraqə izzət ilən,
Əsir oldı bu çöldə möhnət ilən,

[*] Gətirdim

Xərabə Şamdə bu zillət ilən,
Veribdür can, baba, səlamün əleyk.

Bizə Şam əhli çox eylüb şəmatət,
Səkinən can verincə çəkdi zillət,
Məzarı üstə qalmub bir tilavət
Edən Qur`an, baba, səlamün əleyk.

Bu əhli-Kufə zülm eylər İmamə,
Bularun izzəti yetməz təmamə,
Bibim Zeynəb Kərbübəladən Şamə,
Edüb əfğan, baba, səlamün əleyk.

Səni zibh eyləyəndə Şimri-kafər,
Bizi əsir edibdür ol bədəxtər,
Düşən gül cismi qumlar üstə bisər,
Qalan üryan, baba, səlamün əleyk.

Həram eylüb sənə bu qövm həyatı,
Bu qəmdə yandırublar kainatı,
Oyan, ey zülm ilən qüslü hənutı
Olan al qan, baba, səlamün əleyk.

Oyan, bir aç bu çeşmi-xunfəşanı,
Dindirgilən bu zarü natəvanı,
Cəhanda zülm əlilə xanimanı
Olan viran, baba, səlamün əleyk.

Dağılan izzəti Kərbübəladə,
Batan al qanə dəşti-Neynəvadə,
Başı Şamə kimi növki-cidadə
Edən cövlan, baba, səlamün əleyk.

Bu qəmdə çünki Nadim oldı şeyda,
Edər bəzmi-əza hər vəqtə bərpa,
Mənə səndən sora sitəmli dünya,
Olub zindan, baba, səlamün əleyk.

**Ey Bəşir, gedüb əhli-Yəsribə...**

Ey Bəşir, gedüb əhli-Yəsribə,
Söylə, bir ağır karvan gəlür.
Abidi-bimar, Zeynəbü Külsum,
Cümləsi olub natəvan gəlür.

Dəstüvə gətür bir qəra ələm,
Get Mədinəyə, ey Bəşiri-qəm,
Əhli-Yəsribə, söylə dəmbədəm,
İtrəti-Rəsul bağrıqan gəlür.

İzzətim gedüb əldən hər nə var,
Eyləyüb bizi xar ruzigar,
Ali-Müstəfa zarü biqərar,
Olmuş hər biri növhəxan gəlür.

Oldı çün Bəşir Yəsribə rəvan,
Eyləyürdi bu virdi çün bəyan:
"Qutiləl-Hüseyn"* Şahi-insü can,
Xahərani-u bağrıqan gəlür.

Çün Bəşir edüb bu sözi bəyan,
Oldı Yəsribün əhli bağrıqan,
Eylədi sual hər gələn cəvan,
Əkbəri-cəvan bəs haçan gəlür?

---

* Hüseyn (ə) qətlə yetirildi

Şəhrə çün yetən vəqtidə Bəşir,
Cəm` olub hamı növcəvanü pir,
Adbaad sorardıla birbəbir,
Qasimü Əkbər bəs haçan gəlür?

Söylədi, olun cümlə baxəbər,
Əhli-Yəsribə zarü xuncigər,
Öldi Əbbas, Övn ilə Cə`fər,
Gülləri solan bağiban gəlür.

Kərbəladə ol ləşkəri-ənid,
Şahi-Yəsribi qoydular vəhid,
Etdilər Əli Əkbərün şəhid,
Leyla oldı bixaniman gəlür.

Əsğərün oxa etdilər nişan,
Ağladı o vəqt Şahi-insü can,
Qan həna yaxub Qasimi-cəvan,
Madəri olub bağrıqan gəlür.

Eylədi tüğyan ləşkəri-Nəsnas,
Qarətə gedüb xeyməvü əsas,
Qollarun fəda eylədi Əbbas,
Xahəri olub növhəxan gəlür.

Nadim, ağla Şahi-Mədinəyə,
Vırdılar başın növki-nizəyə,
Etdilər rəvan Şamü Kufəyə,
Qəlbimə bu qəm çox giran gəlür.

# İzahlı lüğət

**A**

Ab – su. Klassik növhə ədəbiyyatında Kərbəla faciəsinin əsas atributlarından biri.

Abdar – sulu, təravətli

Abi-həyat – əbədi həyat suyu. Xızr (ə) peyğəmbərin tapıb içdiyi su.

Abi-Fərat – Fərat çayının suyu. Kərbəla faciəsi bu çayın sahillərində baş vermişdi.

Abidi-bimar – xəstə Abid. Dördüncü İmam Zeynəlabidinə (ə) işarədir. Kərbəla faciəsi baş verən zaman ağır xəstə olduğuna görə qətlə yetirilməmiş və əsir götürülmüşdü.

Adəm (ə) – ilk insan və ilk peyğəmbər

Afaq –üfüqlər

Aftab – günəş

Ahi-pürsuz – çox yanıqlı ah

Ahü va – ah-vay, şivən

Ahu – ceyran

Aqqi-Şafiyi-məhşər – Axirət günü müsəlmanlara şəfaət verəcək olan Məhəmməd Peyğəmbər (s) və Onun Əhli-Beytinə (ə) ağ olmaq, onlara qarşı çıxmaq

Ali-Əba – Məhəmməd Peyğəmbərin (s) Əhli-Beyti (ə) – Məhəmməd Peyğəmbər, qızı Fatimə (s.ə), kürəkəni və əmisi oğlu Əli (ə), nəvələri Həsən (ə) və Hüseyn (ə)

Ali-Əli – Həzrət Əlinin (ə) ailəsi, Əhli-Beyti (ə)

Ali-Heydər – Həzrət Əlinin (ə) ailəsi

Ali-Peyğəmbər – Peyğəmbərin (s) ailəsi

Ali-Süfyan – Əbu Süfyanın nəsli. Əbu Süfyan ibn Hərb Bəni Üməyyə qəbiləsinin başçısı, İslamın və Peyğəmbərimizin qatı düşmənlərindən biri, Müaviyənin atası, Yəzidin babası idi.

Ali-Taha – "Taha" Qurani-Kərimin 20-ci surəsidir. Təfsirçilərin ümumi rəyincə Məhəmməd Peyğəmbərin (s) şəninə nazil olub. Ali-Taha – yəni Peyğəmbərin ailəsi

Ali-Türab – Türabın ailəsi. Əbu Türab torpaq atası deməkdir. Peyğəmbər (s) tərəfindən Həzrət Əli (ə)-a verilən ləqəbdir.

Ali-Yasin – Yasin Qurani-Kərimin 36-cı surəsidir. Yasin – ya Seyyidəl-mürsəlin (ey peyğəmbərlərin ağası) deməkdir, yəni Həzrət Məhəmməd

(s). Ali-Yasin dedikdə, Peyğəmbərimizin (s) Əhli-Beyti (ə) nəzərdə tutulur.
Alullah – Allahın ailəsi. Məhəmməd Peyğəmbərin (s) ailəsi, Əhli-Beyti (ə) nəzərdə tutulur.
Amac – hədəf
Amadə – hazır
Amil – bur. əməl edən
Aram – sakit
Arif – bilən, tanıyan
Asi – düşmən
Asib – zərər, ziyan
Asitan – eşik, qapının ağzı
Aşiyan – yuva
Aşura – məhərrəm ayının onuncu günü Kərbəlada İmam Hüseyn (ə)-ın öz yaxınları ilə şəhadətə yetişdiyi gün.
Aşüftəhal – halı pozğun, bikef
Avarəvətən – vətəndən ayrı düşən
Aya – sual ədatı (mı, mi, mu, mü)
Ayinə – ayna, güzgü
Azar – dərd, azar, əziyyət
Azimi-meydan – meydana yola düşmə
Azimi-üqba – vəfat etmə, əbədi dünyaya yola düşmə

**B**

Baba – ata; baba
Babi-nicatü rəhmət – mərhəmət və qurtuluş qapısı. Peyğəmbər (s) və Əhli-Beyti (ə) nəzərdə tutulur. Burada sonuncu İmam Mehdi (ə.f)-ə işarə olunur
Babi-rəhmət – rəhmət qapısı
Babi-rəvaq – qübbə, tağ, bur. ziyarətgah
Babi-risalət – Peyğəmbərin (s) qapısı
Babullah – Allahın qapısı
Babül-həvayic – ehtiyacların qapısı. Həzrət Abbasın ləqəblərindən biri
Bad – külək, yel
Bak – qorxu
Baqi – qalan, daimi, qalıq

Baqiyi-növhə – növhənin ardı
Balü pər – qanad
Baran – yağış
Bargah – hüzur
Barilahi – Allah-təalaya müraciət
Bari-qəm – qəm yükü
Barişi-qəm – qəm yağışı
Bavər – inanmaq, inam
Beydəq – bayraq
Bəççeyi-şir – şir balası
Bəçeşm – gözüm üstə
Bədbünyad – əsli-kökü olmayan, nanəcib
Bədəxtər – bədbəxt
Bədxab – yuxusu pozulmuş
Bədhəva – havası pis
Bədru – pis sifətli
Bəhəmdüllah – Allaha həmd olsun
Bəhr – dəniz
Bəqa – əbədiyyət, daim var olmaq
Bəlakeş – bəla çəkən
Bənd – oynaq, bənd
Bəradər – qardaş
Bərhəm – dağınıq, pozğun
Bərg – yarpaq
Bərq – ildırım, şimşək
Bərqasa – ildırım kimi, sürətli
Bərqərar – yerləşmək, qərar tutmaq
Bərməla – aşkar, aydın
Bərrü biyaban – çöl, səhra
Bəsan – sanki
Bəsirət – gözüaçıqlıq
Bəsrə – İraqda şəhər
Bəstə – bağlı
Bəstər – yataq
Bəşir – xəbər gətirən
Bəşiri-Həzləm – Bəşir ibn Həzləm. İmam Zeynəlabidin (ə)-in dostlarından idi. Əhli-Beytin Mədinəyə dönüşündə İmam (ə) tərəfindən

Mədinəyə göndərilir ki, İmam Hüseyn (ə)-ın şəhadətə yetməyini şəhər əhlinə xəbər versin.
Bətha – Mədinə şəhərinin qədim adı
Bətul – pak, müqəddəs. Həzrət Fatimə (s.ə)-nın ləqəbi
Bəzl – əsirgəmədən vermək
Bəzm – məclis
Bəzmi-am – ümumi ziyafət
Bəzmi-əza – matəm məclisi
Bəzmi-ziyafət – ziyafət məclisi
Bibal – qanadsız
Bidad – ədalətsiz
Bidadxah – köməksiz
Bidar – oyaq
Bid`ət – dinə dəyişiklik gətirmək
Bixar – tikansız
Bihiss – hissiz
Biqərinə – yoldaşsız, dostsuz; tayı-bərabəri olmayan
Bikəs – kimsəsiz
Bimar – xəstə
Binəva – yazıq, köməksiz
Binitq – dinməz, susmuş halda
Bint – qız
Binti-İmam – İmamın qızı. Bur. Həzrət Zeynəb nəzərdə tutulur
Bipayan – sonsuz
Bipədər – atasız
Bipər – qanadsız
Bipərva – qorxusuz
Bisər – başsız
Bismillah – Allahın adı ilə
Bişərm – utanmaz
Bişümar – saysız-hesabsız
Bittəmam – təmamilə, bütünlüklə
Biyar – dostsuz, köməksiz,
Biyavər – köməksiz
Bizar – təngə gəlmək
Biz`eyi-Peyəmbər – Peyğəmbərin (s) bir parçası
Busə – öpüş

Busəgahi-Əhmədi-Siddiq – Məhəmməd Peyğəmbərin (s) öpdüyü yer. Məşhur rəvayətə görə Peyğəmbərimiz (s) sevimli nəvəsi İmam Hüseyn (ə)-ın boynundan və boğazından öpərmiş və ağlayarmış.
Butə – bur. kol
Büğz – kin-küdurət
Büka – ağlamaq
Bülbüli-şeyda – dəlicəsinə vurulmuş bülbül
Bülənd – hündür, uca
Büləndəsas – yüksək məqam sahibi
Bürhan – dəlil, sübut
Bürran – kəsən, kəsici
Büruz – meydana çıxma, zühur etmə
Büt – büt, gözəl
Bütxanə – bütlərin saxlandığı yer

**C**

Cabəca – yerbəyer, yerli-yerində
Cabiri-Ənsar – Cabir ibn Abdullah əl-Ənsari. Məhəmməd Peyğəmbərin (s) səhabələrindən olmuşdur.
Camə – paltar
Cami-bülur – büllur qədəh
Canfəşan – canını əsirgəməyən, canını fəda edən
Cannisar – canını qurban edən
Car, cari – axar, rəvan
Cayi-xəlvət – xəlvət yer
Cayi-ibadət – ibadət yeri
Cayiz – icazə verilmiş
Cayizə – mükafat
Ceyhun – Orta Asiyada çay
Ceyşi-üdvan – düşmən qoşunu
Cəbbar – qüvvət, qüdrət, əzəmət sahibi olan Allah-təala
Cəbərut – əzəmət, cəlal
Cəbrail, Cibril – Allah-təalanın dərgahına yaxın olan dörd mələkdən biri, Allah-təala ilə Peyğəmbərlər arasında elçi
Cəbrən – məcburi
Cədd – baba

Cəddə – nənə
Cəfa – əziyyət, zülm
Cəfacu – zülmə düçar olan
Cəfagüstər – əzab verən, incidən
Cəfakar – zülm edən, incidən
Cə`fər – Cəfər bin Əqil bin Əbu Talib. İmam Hüseyn (ə)-ın əmisi Əqilin oğlu. Aşura günü Kərbəlada şəhid olmuşdu.
Cə`fər – Cəfər bin Əli bin Əbu Talib. Həzrət Əli (ə)-ın oğlu, Həzrət Əbbasın qardaşı.
Cə`fərimətzhəb – altıncı İmam Cəfər Sadiq (ə)-ın qurduğu məzhəbin davamçısı.
Cə`fəri-Təyyar – uçan Cəfər. Cəfər ibn Əbu Talib. Həzrət Əli (ə)-ın qardaşı. Mutə savaşında müsəlmanların bayraqdarı olmuş və iki qolunu itirməsinə baxmayaraq, bayrağı yerə salmamış, sona qədər döyüşmüşdü. Buna görə Peyğəmbərimiz buyurub: "Allah-təala ona iki qolunun əvəzində iki qanad verəcək və o, bu qanadlarla behiştdə istədiyi yerə uça biləcək".
Cəhan – dünya
Cəhaz – cehiz
Cəhət – bur. səbəb
Cəhim – cəhənnəm
Cəlayi-vətən – vətəndən uzaq düşmə
Cəng – müharibə, dava
Cərahət – yara
Cərcis – qəbri Beyləqanda olan Peyğəmbər
Cəzbeyi-eşqi-İlahi – İlahi eşqin cazibəsi
Cida – nizə
Cidal – döyüş
Cihad – Allah yolunda savaş
Cilveyi-eşq – eşqin cilvəsi
Cinan – cənnətlər
Cövr – əziyyət
Cuya – axtarmaq
Cüda – ayrı, uzaq
Cüft – cüt
Cühəla – cahillər, nadanlar
Cünun – dəli

Cüstucu – axtarış
Cür`ə – bir içim, qurtum (su)
Cürm – günah
Cüzam – yoluxucu və sağalmaz xəstəlik

**Ç**

Çah – quyu
Çaki-giriban – yaxası cırıq
Çalak – cəld, çevik
Çavuş – Kərbəla və ya Məşhəd ziyarətinə gedən zəvvarların karvanında qarşıda gedərək uca səslə səsləyən kəs
Çavuşi – çavuşların oxuduqları şeir
Çeşm – göz
Çəharüm – dördüncü
Çəmənzar – çəmənlik, yaşıllıq
Çəngi-təfriqə – fikir ayrılığı, ikitirəlik
Çərxi-fələk – dünya; tale, bəxt
Çətr – çətir
Çub – çubuq, ağac, taxta
Çü, çün – indi ki, elə ki

**D**

Dadxah – fəryada çağıran, dada çağıran
Dadrəs – dada çatan, fəryada yetişən
Dağdar – bur. yaralı
Dam – tələ, tor
Damad – kürəkən
Damən – ətək
Dar – dünya, ev
Dari-din – din evi
Dari-fəna – fani dünya, bu dünya
Davər – münsif, hakim
Deyr – kilsə, monastır
Deyrani – kilsə əhli, monastırda yaşayan rahib
Dəf` – ortadan qaldırma

Dəxil – birinə pənah aparma
Dəhan – ağız
Dəhbaşı – on başı
Dəhr – dünya
Dəğa – hiyləgər, xəbis
Dəlir – igid, cəsarətli
Dəliranə – qəhrəmancasına
Dəməşq – müasir Suriyanın paytaxtı, digər adı Şamdır
Dəmi-peykan – bur. oxa nişan olmaq
Dəndan – diş
Dəni – alçaq
Dəst – əl
Dəstbəstə – əlləri bağlı
Dəstgir – ələ keçmə
Dəstəmaz – namazdan öncə yuyunma
Dəşti-bəla – bəla səhrası. Kərbəlayə işarədir
Dər – qapı
Dərban – qapıçı
Dərgah-dərgəh – bur. hüzur
Dərk – yetişmək, çatmaq
Dərya – dəniz
Did – görüş
Didar – görüşmək
Didə – göz
Didətər – gözü yaşlı
Digərgun – halı pozğun, bərbad
Dilara – ürəkaçan, könülaçan
Dilavər – cəsarətli, qəhrəman
Dilxun – ürəyi qana dönmüş
Dilhəzin – qəlbi kədərli
Dilparə – ürəyi parçalanmış
Dili-rəncur – ürəyi sınmış
Dilşikəstə – qəlbi sınıq
Diləfruz – bur. dərdli
Dilfikar – ürəyi ağrıyan
Dimağ – burun
Dini-mübin – aydın, aşkar din. İslam dini nəzərdə tutulur

Divanəsifət – dəli kimi
Dövrü bər – ətraf
Dud – tüstü
Dun – alçaq
Duvaq – baş örtüsü
Duzəx – cəhənnəm
Dübarə – təkrar
Düxtər – qız
Dünim – ikiyə bölünmüş
Dünyavü mafiha – bütün dünya
Düta – ikiqat

**E**

Ehticac – dəlil gətirmə
Eyd – bayram
Eymən – qorxusuz, təhlükəsiz
Eyni-səadət – əsil xoşbəxtlik
Eyş – şadlıq
Eyvani-təlakar – qızıl eyvan. İmam Hüseyn (ə)-ın Kərbəladakı hərəminə işarədir

**Ə**

Əbbas, Əbülfəzl – Həzrət Əli (ə)-ın oğlu, Həzrət Hüseyn (ə)-ın qardaşı, İmam (ə)-ın qoşununun bayraqdarı. Klassik növhə ədəbiyyatında adı qəhrəmanlıq, dönməzlik və dözümlülük nümunəsi kimi çəkilir. "Qəməri-Bəni Haşim", "Səqqa", "Ələmdar", "Babül-həvaic" və digər ləqəbləri vardır.
Əbdi-bipənah – köməksiz qul
Əbəta – ey mənim atam!
Əbri-zülmət – qara bulud
Əbri-bəhar – bahar buludu
Əbrişəm – ipək
Əbru – qaş
Əcr – yaxşı bir əməl qarşısında verilən mükafat
Əda – bur. davranış, tövr

Ə`da – düşmənlər
Ədna – çox rəzil, çox alçaq
Ədu – düşmən
Əfğan – fəryad, nalə
Əflak – fələklər
Əfrad – təklər, fərdlər. Növhənin arasında verilən və adətən bir neçə beytdən ibarət olan şeir
Əğyar – yadlar, özgələr
Əhli-Beyti-Nəbəvi – Peyğəmbərin (s) Əhli-Beyti (ə)
Əhli-Beyti-Taha – Peyğəmbərin (s) Əhli-Beyti (ə)
Əhli-cəfa – Əhli-Beytə (ə) zülm edənlər
Əhli-əyal – ailə, arvad-uşaq
Əhli-kinə – Əhli-Beytə (ə) qarşı kin saxlayanlar
Əhli-inad – bur. küfr əhli
Əhli-qiblə – qiblə əhli, müsəlmanlar
Əhli-səqər – cəhənnəm əhli
Əhli-şəqavət – yaramaz adamlar, quldurlar
Əhmədi-Muxtar – Məhəmməd Peyğəmbər (s)
Əhmədi-Siddiq – Məhəmməd Peyğəmbər (s)
Əhmər – qırmızı
Əxa, əxi – ey qardaş!
Əxbar – xəbərlər
Əqdəm – qabaq, öncə
Əqvam – bur. qohum-əqrəba
Əl`an – indi
Əlhəzər – saqın, uzaq olsun
Ələf – ot, saman
Ələm – bayraq; dərd
Ələmdar – bayraqdar, Həzrət Abbas nəzərdə tutulur
Əl-ətəş – suzuluğu bildirmək, “çox susuzam”
Əli ibn Əbu Talib (ə) – Məhəmməd Peyğəmbərin (s) əmisi oğlu və kürəkəni, şiələrin əvvəlinci İmamıdır.
Əli Əkbər – İmam Hüseyn (ə)-ın böyük oğlu
Əli Əsğər – İmam Hüseyn (ə)-ın kiçik oğlu
Əlqəm(ə) – Fərat çayının digər adı
Ə`mal – əməllər
Əməngah – xətərsiz yer

Əmirəlmö`minin – Möminlərin əmiri, Həzrət Əli (ə) nəzərdə tutulur
Əmmə – bibi
Əmr ibn Əbdüvəd – Xəndəq savaşında Həzrət Əli ilə döyüşən məşhur pəhləvan
Əmri-qəza – qəzavü qədərin əmri
Əmud – toppuz
Ənbiya – Peyğəmbərlər
Əncümən – məclis, cəmiyyət
Əndəlibi-şeyda – dəlicəsinə vurulmuş bülbül
Ənduhü məlal – qəm-qüssə, kədər
Əngüştər – üzük
Ənqa – Qaf dağında yaşayan əfsanəvi bir quş
Ənid – inadçı, tərs
Ənis – yaxın adam, həmdəm
Ənsar – köməkçi, tərəfdar, yaxın adam
Əraq – indiki İraq
Ərbəin – Kərbəla şəhidlərinin qırxı
Ərəsat – qiyamətdə insanların bir yerə toplaşacağı meydan
Ər`ər – sərv ağacı
Ərməğan – hədiyyə
Ərsə – meydan
Ərşi-bərin – çox uca göy
Ərşi-ə`la – çox uca göy
Ərus – gəlin
Ərvah – ruhlar
Ərz – anlatma, ifadə etmə
Ərzi-hal – xahiş, istək; vəziyyət
Əsas – təməl; vacib şeylər
Əsb – at
Əshab – tərəfdarlar
Əsiran – əsirlər
Əsirnəvaz – əsirə hörmət göstərmə
Əsləhə – silah
Əsrari-Həqq – Allahın sirrləri
Əsr – əsr, zaman; günortadan sonra
Əstəğfürullah – Allah bağışlasın
Əşədd – çox şiddətli

Əşk – göz yaşı
Əşkbar – göz yaşı axıdan
Əşqiya – canilər
Əşrar – şər adamlar
Ətfal – uşaqlar
Ətəş – susuzluq
Ətləs – atlaz parça
Ətubi ileyh – tövbə edirəm
Ətrfəşan – ətirsaçan
Ətləsi-əhmər – qırmızı atlas
Ətşan – susuz
Əya – ey!
Əyərbənd – yəhər
Əyyub (ə) – Qurani-Kərimdə adı çəkilən və İbrahim (ə) peyğəmbərin nəslindən olan peyğəmbər. Klassik ədəbiyyatda adı səbir, iradə və dözümlülük nümunəsi kimi çəkilir.
Ə`van – köməkçilər, yardımçılar
Ə`za – bədən üzvləri
Əzaxanə – yas saxlamaq üçün yer
Əzayi-qəmfəza – qəm artıran matəm, yas
Ə`zəm – çox böyük
Əzm – məqsəd, məram

**F**

Fatehi-Xeybər – Xeybəri fəth edən. Həzrət Əliyə (ə) işarədir
Fatimə (s.ə) – Peyğəmbərimizin (s) qızı Həzrət Fatimə (s.ə) Həzrət Əlinin (ə) xanımı, İmam Həsən (ə) və İmam Hüseynin (ə) anası
Fatimeyi-süğra – kiçik Fatimə. Xəstə olduğuna görə Mədinədə qalan və Kərbəlayə getməyən İmam Hüseyn (ə)-in qızı
Faş – sirrin üstünü açma
Fe`l – iş
Fədək – Mədinə yaxınlığında xurma bağı. Peyğəmbərimiz tərəfindən qızı Həzrət Fatiməyə (s.ə) hədiyyə olaraq verilmiş bağ.
Fəğan – nalə, fəryad
Fələk – göy, asiman, kainat; tale, bəxt
Fərahəm – toplu, yığcam

Fərağət – istirahət
Fəraq – ayrılıq
Fəramuş – unutma
Fərar – qaçış
Fərd – bur. Tək beyt
Fərq – baş
Fərş – döşənəcək
Fəsahət – gözəl və aydın danışma qabiliyyəti
Fəsli-büka – ağlamaq zamanı
Fəsih – gözəl və aydın danışan
Fəzli-Rəbi – Fəzl ibn Rəbi. Abbasilər sarayında vəzir olmuşdur
Filfövr – cəld
Fil-həqiqət – həqiqətən, doğrudan
Firaş – döşək, yataq
Firəng – qədimdə müsəlmanların Avropaya verdikləri ümumi ad
Firqə – dəstə, partiya
Firqət – ayrılıq
Firiştəliqa – mələk çöhrəli
Fir`on – qədim Misir hökmdarlarının adı
Fisq – əxlaqsızlıq, pozğunluq
Fişar – sıxmaq, təzyiq etmək
Fövt – əldən qaçırma
Fulad – polad

**G**

Gəbrü nəsara – atəşpərəst və xaçpərəstlər
Gərdi-əcəl – əcəl tozu
Gərdişi-çərxi-fələk – zəmanənin gedişatı
Gəhvarə – beşik
Gilə – giley-güzar
Giran – ağır
Giriftar – düçar olma
Giriban – yaxa
Giryan – ağlar
Giysu – saç
Göftar – danışıq

Guş – qulaq
Guşeyi-viranə – viranənin künci
Gülab – gül suyu
Güli-növbər – təzə açılmış gül
Gülpirəhən – bur. köynəyi qana bulaşmış
Gülzar – güllük, çiçəklik
Gülgunqəba – paltarı qızılgül rəngində olan
Gülgunkəfən – kəfəni gül (qan) rəngində olan
Gümrah – yolunu azmış
Güruhi-bihəya – həyasızlar dəstəsi
Güruhi-kinə – kin-küdurət əhli
Güzar – yolu düşmə

**H**

Habil – ilk insan və ilk peyğəmbər olan Həzrət Adəm (ə)-ın oğlanlarından biri.
Hacər – İbrahim peyğəmbərin (ə) zövcəsi, İsmail (ə)-ın anası
Hail – maneə, əngəl
Halə – bur. ətraf
Haris – Müslim ibn Əqilin uşaqlarının qatili
Haruni-Rəşidi-bihəya – Abbasi xəlifəsi Harun ər-Rəşid nəzərdə tutulur
Haşimi – Məhəmməd Peyğəmbərin (s) qəbiləsindən, onun sülaləsindən olan
Heydəri-Kərrar – Həzrət İmam Əli (ə)-ın ləqəblərindən biridir. Mənası, təkrar-təkrar düşmənə hücum edən aslan deməkdir.
Həbəş – Həbəşistan əhalisindən olan
Həbib ibn Məzahir – Kərbəlada şəhadətə yetişən Həbib ibn Məzahir Kufənin Bəni Əsəd tayfasından idi. Məhəmməd Peyğəmbərin (s) əshablarından olmuşdur. Hər üç savaşda – Siffin, Nəhrəvan və Cəməl savaşlarında Həzrət Əli (ə)-ın tərəfində mübarizə aparmışdır.
Həkimi-haziq – mahir həkim
Həqir – qədir-qiyməti bilinməyən, aşağı
Həqiranə – həqircəsinə
Hələta – Qurani-Kərimin 76-cı surəsi. Digər məşhur adları "İnsan" və "Dəhr"dir. İmam Əli (ə) və Əhli-Beyt (ə)-ın şəninə nazil olmuşdur.
Həmağuş – qucaqlaşmaq

Həmayil – boyunbağı, həmayil
Həmdü səna – şükür etmə
Həmə – hamı
Həmra – qırmızı
Həmrah, həmrəh – yol yoldaşı
Həmta – bənzər, oxşar
Həmzəban – həmfikir
Həncər – boğaz
Hənut – meyidi kəfənə tutarkən vurulan xüsusi balzam
Hənuz – hələlik
Həras – qorxu
Hərasan – qorxa-qorxa
Hərəm – arvad-uşaq
Hərəmsəra – qadınlara məxsus olan yer
Hərfi-bica – boş söz
Hərir – ipək parça
Hərmələ – Hərmələ ibn Kahil. İmam Hüseyn (ə)-ın kiçik oğlu Əli Əsğərin qatili
Həsən – On iki İmamın ikincisi, Peyğəmbərimizin (s) nəvəsi, Həzrət Əli (ə) və Həzrət Fatimə (s.ə)-ın oğlu, İmam Hüseyn (ə)-ın qardaşı
Həşr – qiyamət günü
Hərzəvü hədyan – mənasız və boş danışma
Həvva – Həzrət Adəm (ə)-ın zövcəsi
Həyati-cavidan – əbədi həyat
Həyyü Qadir – həmişə diri, canlı və hər şeyə qadir olan qüdrət sahibi Allah-təala
Həyyü Qədim – həmişə diri, canlı və başlanğıcı olmayan qədimdən var olan Allah-təala
Hətki-hörmət – hötmətsizlik göstərmək
Həzardəstan – bülbül
Həzar – min
Həzin(ə) – hüznlü, kədərli, qəmli
Həzl – zarafatla söylənilən söz
Hicab – pərdə, örtük; bur. utanmaq, xəcalət çəkmək
Hiclə – yeni evlənənlər üçün bəzənmiş xüsusi otaq
Hicr – ayrılıq
Hicran – ayrılıq

Hifz – saxlama, qoruma
Hilal – ay
Hövli-cəhənnəm – cəhənnəm qorxusu
Hud (ə) – Ad qövmünə göndərilmiş peyğəmbərdir. Qurani-kərimin 11-ci surəsi bu peyğəmbərin adı ilədir
Hurül-eyn – huri gözlü
Hüccac – hacılar, Məkkə ziyarətinə gedənlər
Hüccət – dəlil, sübut
Hücrə – otaq
Hülq – boğaz
Hünərvər – hünərli, bacarıqlı, məharətli
Hürr – Kərbəla şəhidlərindəndir
Hüseyn ibn Əli (ə) – On iki İmamın üçüncüsü, İmam Əli (ə) və Həzrət Fatimə (s.ə)-nın oğlu, Məhəmməd Peyğəmbərin (s) sevimli nəvəsi. Kərbəla hadisəsinin əsas qəhrəmanı.
Hüveyda – aydın, aşkar
Hüzzar – hazır olanlar, iştirak edənlər

## X

Xab – yuxu
Xabi-naz – şirin yuxu
Xaceyi-Qənbər – Qənbərin ağası, Həzrət Əli (ə) nəzərdə tutulur
Xahər – bacı
Xahərani-u – onun bacıları
Xali – boş
Xaliqi-Sübhan – Allah-təala (c.c)
Xaliqü xəllaq – Allah-təala (c.c)
Xaliqi-səttar – Allah-təala (c.c)
Xaki-bəla – bəla torpağı. Kərbəlayə işarədir
Xakistər – kül
Xamə – qələm
Xamuş – sakit, susan
Xanə – ev, mənzil
Xaniman – ev-eşik, avadanlıq, mal-mülk
Xar – tikan
Xarü xaşak – tikan, çör-çöp

Xari-müğilan – tikan kolları
Xatib – xitab edən, nitq söyləyən
Xatun – xanım
Xeybər – Mədinənin 170 km. şimalında yerləşmiş olan bu qalanı İmam Əli (ə) fəth etmişdi.
Xeymə – çadır
Xeyməgah – çadırların qurulduğu yer
Xeyrün-nisa – qadınların ən xeyirlisi. Həzrət Fatimə (s.ə) nəzərdə tutulur
Xeyzəran – çubuq
Xəcil – xəcalətli
Xədəng – ox
Xədicə – Məhəmməd Peyğəmbərin (s) xanımı, Həzrət Fatimə (s.ə)-nın anası, İslamı ilk qəbul edənlərdən biri.
Xəlil – bax: xəlilullah
Xəlilullah – Allahın dostu, Həzrət İbrahim (ə) nəzərdə tutulur
Xəm, xəmidə – əyri
Xəndan – gülən, şad; tamam açılmış gül
Xəndəq – İslamın ilk əvvəllərində baş vermiş ən böyük savaşlardan biri.
Xəsm – düşmən
Xəraş – cırmaq
Xərgah – çadır, alaçıq
Xətmi-Quran – Qurani-Kərimi oxuyub bitirmə
Xətərnak – xətərli, qorxulu
Xətib – xütbə oxuyan
Xətmi – gülxətmi
Xətmi-Rəsul – Peyğəmbərlərin sonuncusu Məhəmməd Peyğəmbərə (s) işarədir.
Xətmi-ənbiya – Peyğəmbərlərin sonuncusu Məhəmməd Peyğəmbər (s) nəzərdə tutulur.
Xəzan – saralıb-solam vaxtı, payız
Xilqəti-əzzəl – ilk yaranmış. Həzrət Adəm (ə)-a işarədir
Xinzir – donuz
Xişü əqrəba – qohum-əqrəba
Xişü təbar – qohum-əqrəba, yaxın adamlar
Xiyam – xeymələr, çadırlar
Xizab – boyama, rəngləmə
Xorasan – İranda vilayət. İmam Rza (ə)-ın dəfn olunduğu yer

Xoşbu – xoş ətirli
Xoşgüvar – ləzzətli, dadlı; rahat həzm olan
Xövfü həras – qorxu
Xubru – gözəl üzlü
Xuda, Xudavənd – Allah-təala (c.c)
Xuli – Xuli bin Yəzid Əsbəhi. Əhli-Beyt (ə)-ın qatı düşmənlərindən biri olmuşdur. Kərbəla faciəsində xüsusi amansızlıq göstərmişdir
Xun – qan
Xunab – qanlı su
Xunalud – qana bulaşmış
Xunbar – qan yağdıran, çox ağlayan, çox göz yaşı tökən
Xuncigər – ciyəri qanla dolmuş
Xunfəşan – qan saçan
Xundil, xunindil – ürəyi qanla dolu
Xunxar – qan içən
Xurşidvəş – günəş kimi
Xüldi-bərin – cənnət, behişt
Xüram – nazla yerimə
Xürd-xürd – xırda-xırda
Xürdü kəbir, xürdü kibar – böyük-kiçik
Xüşk – quru
Xütur – yada düşmə

## İ

İbn Mülcəm – Əbdürrəhman ibn Mülcəm Muradi. Həzrət Əli (ə)-ın qatili
İbn Ziyad – Übeydullah ibn Ziyad Kufə valisi, İmam Hüseyn (ə) və yaxınlarının qətlə yetirilməsi əmrini verən və Kərbəla faciəsində "xüsusi xidmətləri" olan cani.
İbtida – başlanğıc
İcabət – icra etmə, qəbul etmə
İcma – qəbul edilmiş qərar
İcz – acizlik
İdris – Həzrət Adəm (ə)-ın övladlarından və Qurani-Kərimdə adı çəkilən peyğəmbərlərdən biri. İlk yazı yazan və dərzilik sənətini icad edən şəxs.
İktifa – kifayətlənmək
İqdam – təşəbbüs etmə, başlama

İmami-məşriqeyn – şərqin və qərbin İmamı. İmam Hüseyn (ə) nəzərdə tutulur
İmşəb – bu gecə
İncil – İsa peyğəmbərə (ə) nazil olmuş müqəddəs kitabın adı
İntəha – son
İntizar – gözləmə
İrfan – mərifət
İrtiqa – yüksəyə qalxma, ucalma
İsa (ə) – dörd böyük peyğəmbərdən biri. Allah-təala ona İncil adlı kitab nazil etmişdir. Qurani-Kərimdə İsa peyğəmbəri (ə) vəsf edən çoxlu ayələr mövcuddur.
İskəndər – məşhur makedoniyalı İskəndər nəzərdə tutulur
İsm – ad
İsmail (ə) – Qurani-Kərimdə adı çəkilən peyğəmbər, Həzrət İbrahim (ə)-ın oğlu.
İsrafil – qiyamət günü ölüləri diriltmək üçün sur çalmaq vəzifəsini daşıyan mələk
İstiğasə – dua. Allahdan yardım istəmə
İstitaət – bacarıq, iqtidar
İşrət – kef
İştiyaq – arzu etmə, çox istəmə
İtmam – tamamlamaq, bitirmək
İtmami-hüccət – hüccəti tamamlamaq. Peyğəmbərlərin və İmamların öhdələrinə düşən vəzifəni sonadək yerinə yetirmək.
İtrəti-əthar – pak ailə
İyadət – xəstənin görüşünə getmək
İzhar – ifadə etmə, bildirmə

**K**

Kakil – zülf, saç
Kani-vəfa – vəfa mədəni, vəfa mənbəyi
Kar – iş
Kə`bə – Məkkədə Allahın evi. Bütün müsəlmanların ibadət edərkən yönəldikləri qiblə
Kəc – əyri
Kəcavə – dəvələrin belinə qoyulan xüsusi otaqcıq

Kəlbi-əqur, kəlbi-səqər – alçaq it
Kəlbi-kəmtərin – ən əskik it
Kəlisa – kilsə
Kəman – yay
Kəmin – pusqu; aciz, həqir
Kəmsipah – az sayda qoşun
Kərbü bəla – qəm və bəla, müsibət
Kəsrəti-qəm – qəmin çoxluğu
Kəşidə – çəkilmiş, düzülmüş
Kəşti – gəmi
Kətf – çiyin
Kibr – təkəbbür
Kinə – kin-küdurət
Kişvər – ölkə
Kövkəb – ulduz
Kufə – İraqda şəhər. Bağdadın 170 km şimalında, Nəcəfin 10 km şimal-şərqində, Fərat çayının kənarında yerləşir.
Kufəyan – kufəlilər
Kufi – kufəli
Kuh – dağ
Küffar – kafirlər
Külsum – Ümm Külsum. Zeynəbi-süğra da (kiçik Zeynəb) deyirlər. Həzrət Əli (ə)-ın və Həzrət Fatimə (s.ə)-nın qızı, İmam Hüseyn (ə) və Həzrət Zeynəbin bacısıdır
Kürki-Buxara – Buxara kürkü

## Q

Qabil – ilk insan və ilk peyğəmbər olan Adəm (ə)-ın oğlanlarından biri.
Qadirü Qəhhar – sonsuz qüdrət sahibi olan Allah (c.c)
Qadisiyyə – Kufə yaxınlığında qəsəbə
Qafilə – karvan
Qaib – gözdən uzaq olan
Qaili-Qur`an – Qurana inanan
Qaim – bur. mövcud olma

Qalu bəla – Allah-təala ruhları yaratdıqdan sonra: “Mən sizin Rəbbiniz deyiləmmi?” (Ələstu birabbikum) – soruşmuş, onlar da: “Bəli, Rəbbimizsən!” – deyə cavab vermişdilər. (Əraf, 172)
Qarəpuş – qara geymək
Qarun – Musa peyğəmbər (ə) zamanında yaşamış çox dövlətli bir şəxs olmuşdur. Musa (ə)-ın duasından sonra var-dövləti ilə birlikdə yerə batmışdır.
Qasim – İmam Həsən (ə)-ın oğlu. Aşura günü qəhrəmancasına vuruşmuş və şəhid olmuşdur.
Qeydi-tənab – kəndirə bağlı, əsir
Qəbih – çirkin
Qəbzeyi-şəmşir – qılıncın dəstəsi
Qədi-rə`na – gözəl qədd-qamət
Qəfa – baş
Qəffar – günahları bağışlayan Allah-təala (c.c)
Qəhr – qəzəb
Qəhri-əzim – böyük qəzəb
Qələm – bur. kəsilmiş
Qələt – səhv
Qəltidə – bulaşmış
Qəmçi – qamçı
Qəmər – ay
Qəmxar – qəm zamanı təsəlli verən
Qəmkeşidə – qəm çəkən
Qəmküsar – qəm zamanı təsəlli verən
Qəmzədə – kədərli, qəmli
Qənbər – Həzrət Əli (ə)-ın sadiq, vəfalı xidmətçisi
Qəndab – şərbət
Qəribi-Kərbəla – İmam Hüseyn (ə)-a işarədir
Qərq bəxun – qana qərq olmuş
Qərqi-ahən – bur. dəmirə bürünmək
Qəsəm – and
Qəsri-cinan – cənnət qəsri
Qəssal – mürdəşir, ölüyuyan
Qəşş – ürəyi getmə
Qət` – kəsmə, biçmə
Qətlgah – adam öldürülən yer

Qəvi – qüvvətli
Qəyur – qeyrətli
Qəyy – qusma, qaytarma
Qəza – tale
Qəzavü qədər – alın yazısı
Qəzənfər – aslan, şir. Həzrət Əbbasın ləqəblərindən biri
Qiladə – boyunbağı, həmayil
Qilaf – qın, silah qabı
Qissə – hekayə
Qit`əbəqit`ə – parça-parça
Qövmi-dun – alçaq insanlar
Qövmi-Lut – Qurani-Kərimdə adı çəkilən peyğəmbərlərdən biri olan Lut (ə) peyğəmbərin qövmü. Bu qövm öz peyğəmbərinin sözünə qulaq asmayaraq yollarını azmış və məhv olmuşdular.
Qövmi-naşinas – tanımayanlar, bilməyənlər
Qövmi-şərir – şər əhli, yaramaz insanlar
Qövmi-yəhud – yəhudilər
Qövmi-zülam – zalım tayfa
Qövsü quzeh – göy qurşağı
Qövr – yaranın yenidən baş açması
Qumri – qumru quşu
Qutəvər – suya batıb-çıxan, qərq olan
Qübar – toz; qəm, kədər
Qübaralud – toz basmış
Qübur – qəbr, qəbrlər
Qülqülə – gurultu, hay-küy, səs-küy
Qürfəvü bam – eyvan, çardaq, dam
Qürub – günəşin batması; yox olma
Qüsl – cənazənin xüsusi qaydalarla yuyulması

**L**

Laməhalə – şübhəsiz
Laməkan – məkanı olmayan
Laməzhəb – dini-imanı olmayan
Leyli-vəhşət – təklik, yalnızlıq gecəsi. İnsanın vəfatının birinci gecəsi.
Leylü ruz – gecə-gündüz

Leylü nəhar – gecə və gündüz
Leyla, Ümmi Leyla – Əbu Mürrə Səqəfinin qızı, Həzrət İmam Hüseyn (ə)-ın zövcəsi, Əli Əkbərin anası
Ləb – dodaq
Ləbaləb – ağzınacan dolu
Ləbbeyk – bəli, hazıram, gəldim
Ləbriz – dop-dolu
Ləhzə – an
Ləxtəbələxtə – laxta-laxta
Ləin – lənətə gəlmiş
Lə`li-Bədəxşan – Bədəxşan ləli. Bədəxşan ləl-cəvahiratı ilə məşhur olan yerin adıdır.
Ləng – bur. dayanma, durma
Ləngər – lövbər
Lə`ni-İlahi – Allahın lənəti
Ləşkəri-bihəya – həyasız qoşun. Yəzidin qoşununa işarədir.
Licam – yüyən
Liva – bayraq
Lö`lö`yi-həmra – qırmızı dürr
Lüccə – dənizin dibi

**M**

Madər – ana
Mah, məh – ay
Mahi-Mədinə – Mədinənin ayı. Cənab Əli Əkbərə işarədir
Mahi-Bəni Haşim – (Qəməri-Bəni Haşim) Bəni Haşim qəbiləsinin ayı. Həzrət Əbbas nəzərdə tutulur
Mahi-münir – nurlu, işıqlı ay
Mahir – bur. mehr bağlamaq, bağlanmaq
Mahliqa – ay üzlü
Mahmənzər – aya bənzər, aya oxşar
Mahtəl`ət – ayüzlü, camallı
Mail – meyl edən
Malü mənal – mal, dövlət
Mar – ilan

Maridi-bidin – dinsiz Marid. Həzrət Əbbas tərəfindən öldürülmüş sərkərdə
Masiva – Allahdan başqa hər şey, maddi aləm
Matəmsəra – yasxana
Mehman – qonaq
Mehr – günəş, gün; məhəbbət, sevgi
Mehrab – məscidlərdə qiblə cəhətdəki divarda qayrılmış və pişnamazın önündə durub namaz qıldığı oyuq
Me`rac – Məhəmməd (s) Peyğəmbərin Allahın dərgahına çıxması
Meymənə – ordunun sağ qolu, sağ cinah
Meysərə –ordunun sol qolu, sol cinah
Mə`bud – ibadət olunan, Allah-təala
Mə`cər – üz örtüsü
Məcmu` – ümumi
Məcruh – yaralı
Məddi-nəzər – nəzərə alınmış, göz işlədikcə görünən yer
Mədfən – məzar, qəbir
Mədinə – şəhər; Hicazda (Səudiyyə Ərəbistanı) Məhəmməd Peyğəmbərin (s) mübarək türbəsi yerləşən şəhər. İslamiyyətdən əvvəl adı Yəsrib idi.
Mədədkar – köməkçi, yardıma gələn
Məğzi-üstüxan – sümüyün iliyi
Məğmum – qəmli, qüssəli
Məhal – çətin, qeyri-mümkün
Məhparə, mahparə – ay parçası, gözəl
Məhzun – hüznlü
Məhbub – sevimli dost
Məhmudi-Həqq – Məhəmməd Peyğəmbərə (s) işarədir
Məhərrəm – qəməri təqvimin birinci ayı. Kərbəla faciəsinin baş verdiyi ay.
Məhməl – kəcavənin bir növü
Məhməli-zərnigar – zərli kəcavə
Məhasin – bığ-saqqal
Məhcəbin – alnı ay kimi parlaq, gözəl
Məhmiz – mahmız
Məhşər – axirət günü
Məhtab – aydınlıq gecə

Məhzər – hüzur
Məxfi – gizli
Məxrəc – xaric olma, çıxma
Məlaik – mələklər
Məlaikani-müqərrəb – Allaha ən yaxın olan mələklər
Məlamət – məzəmmət, qınama
Məlekül-mövt – ölüm mələyi, Əzrail (ə)-a işarədir
Məlul – kədərli, qüssəli
Məl`un – lənətə gəlmiş
Mə`mən – qorxusuz, təhlükəsiz
Məmlüv(v) – dolu
Mə`mun – Abbasi xəlifəsi
Məmzuc – qarışıq, qarışmış
Mənnan – mərhəmətli, səxavətli olan Allah-təala (c.c)
Məkkə – Hicazda (Səudiyyə Ərəbistanı) Kəbə evinin yerləşdiyi və Həzrət Məhəmməd (s)-in doğulub boya-başa çatdığı müqəddəs şəhərin adı
Məkr – hiylə
Məqal – söz, söyləmə
Məqhur – tabe edilmiş
Mərd – kişi
Mərizi-biməddkar – köməksiz xəstə
Mərizi-təbdar – qızdırmalı xəstə
Mərkəb – minik heyvanı
Mərvan – Mərvan ibn Hikəm Əhli-Beytin (ə) qatı düşmənlərindən və Bəni Üməyyənin məsləhət verənlərindən idi.
Məryəm – İsa (ə)-ın anası
Mərtəbə – dəfə
Mərqəd – yataq; məzar, qəbir
Məsa – axşam
Məsəli-hübab – qabarcıq kimi, köpük kimi
Məscidül-Əqsa – Beytül-Müqəddəsdə müsəlmanların ilk qibləsi olmuş məscid. Əsası Davud (ə) tərəfindən qoyulmuş, Süleyman (ə) tərəfindən tamamlanmışdır.
Məsmum – zəhərlənmiş
Mə`sum – günahsız
Mə`sumə – İmam Musa ibn Cəfər (ə)-ın qızı, İmam Rza (ə)-ın bacısı
Məsrur – şad, şən

Məşk – tuluq
Məşriqeyn – şərq və qərb
Mətbəxsəra – mətbəx
Mətləbi-talib – istəyənin məqsədi
Mətləbi-xəfa – gizli məqsəd
Məzhəb – yol, məslək, din
Məzid – artma, çoxalma
Mə`zur – üzürlü
Miğfər – dəbilqə; qalxan
Mina – Məkkənin şərqində dağlıq bir yerdir. Ərəfat yolunun üstündə yerləşən bu yerdə hacılar qurban kəsirlər.
Minacat – Allaha xitabən yazılmış klassik şeir forması
Mişkbar – müşksaçan, ətirsaçan
Miri-hüda – hidayət rəhbəri
Mizan – tərəzi
Möhnəti-üzma – böyük əzab-əziyyət
Mövc – dalğa
Mövla – ağa
Muxtar – azad, müstəqil
Murü mələx – qarışqa və milçək
Musayi-kəlim – Üluləzm peyğəmbərlərdən biri. Tövrat ona nazil olmuşdur. Tur dağına çıxıb Allah-təala ilə heç bir vasitəçi olmadan danışdığına görə ona Kəlimullah (Allahla danışan) deyirlər.
Museyi-Cəfər – yeddinci İmam Musa ibn Cəfər (ə) (İmam Museyi-Kazım) Harun ər-Rəşid tərəfindən zəhər içirilərək öldürülmüşdür. Qəbri İraqın Kazımeyn şəhərindədir.
Muy – tük, saç
Müaf – əfv, bağışlama
Müamilə – rəftar, hərəkət
Müaviyə – Müaviyə ibn Əbu Süfyan. Əməvilərin birinci xəlifəsi. Əhli-Beytin (ə) qatı düşmənlərindən biri. Yəzidin atası.
Mübah – izin verilmiş
Mübəddəl – dəyişdirilmiş, əvəz edilmiş
Mücavir – ziyarət edən
Mücəssəm – xəyalən cism halına girmiş, canlanmış bir şey
Müctəba – seçilmiş, bəyənilmiş. İmam Həsən (ə)-ın ləqəblərindən biri
Müdam – həmişə, davamlı olaraq

Mühən – möhnətlər, dərdlər
Mühəqqər –təhqir olunmuş, alçaldılmış
Mühəyya – hazır
Mühibb – sevən; dost
Müəddəb – ədəbli, nəzakətli
Müəssir – təsir edən
Müəttər – ətirli
Müəzzəm – əzəmətli
Müəzzin – azan verən
Müin – köməkçi, yardım edən
Mükatibani-qəza – insan taleyini yazan katiblər (mələklər)
Mükəddər – kədərli, qəmli
Mükərrər – təkrar
Müqabil – qarşı, üzbəüz
Müqəddəm – bur. rəhbər
Mülhəq – qatılmış, əlavə edilmiş
Mültəfit – iltifat edən
Mültəci – pənah aparma
Münafiq – ikiüzlü, riyakar
Münəvvər – işıqlı, nurlu
Münkir – inkar edən
Münqizi-bidin – dinsiz Münqiz. Mürrə ibn Münqiz Əbdi, Əli Əkbərin qatili
Münşəqq – parçalanma
Müntəzir – gözləyən, intizar çəkən
Mürəttəb – tərtib olunmuş
Mürğ – quş
Mürğvəş – quş kimi
Mürüvvət – bur. mərhəmət, şəfqət
Mürtəza – seçilmiş, bəyənilmiş. Həzrət Əli (ə)-ın ləqəblərindən biri
Müsafir – səfərə çıxmış
Müsafirət – səfərə çıxmaq
Müshəf – Qurani-Kərim
Müsəlləm – təslim edilmiş
Müslim – müsəlman
Müslim – Müslim ibn Əqil İmam Hüseyn (ə)-ın əmisi oğlu idi. İmam Hüseyn (ə)-ın Kufəyə göndərilmiş xüsusi nümayəndəsi idi.

Müstəfa – seçilmiş, bəyənilmiş; Məhəmməd Peyğəmbərin (s) ləqəblərindən biri
Müşəxxəs – müəyyən
Müşkilgüşa – çətinlikləri həll edən
Müştaq – arzulayan, can atan
Mütəhəmmil – dözən, qatlaşan
Müttəsil – ara vermədən
Müttəli – xəbərdar
Mütəlla – zərli, qızıl suyuna çəkilmiş
Mütərra – təravətli
Müzəyyən – bəzəkli
Müzməhill – alt-üst olmuş, məhv olmuş
Müztər – məcbur, naçar, iztirablı, sıxıntılı

**N**

Nabəkar – yaramaz
Naçar – əlacsız
Nadim – peşiman
Naibi-Şahi-Lafəta – Həzrət Əli (ə)-ın canişini. Məhəmməd Peyğəmbərin (s) belə bir kəlamı var: "La fəta illa Əli, la seyfə illa Zülfiqar" – Əli kimi oğul yoxdur, Zülfüqar kimi qılınc.
Naibi-şiri-Xuda – Allahın Şirinin (Həzrət Əli) canişini
Naibi-Şahi-Nəcəf – Nəcəf Şahının (Həzrət Əli) canişini
Naqəsəvar – dəvəyə minmiş
Nam – ad
Namdar – adlı-sanlı
Nameyi-ə`mal – əməl dəftəri
Namə – məktub
Namurad – muradına yetməyən
Nagah – birdən, təsadüfən
Nalan – ağlar
Naləkünan – fəryad edərək, inləyərək
Nan – çörək
Nar – od, atəş
Napədid – görünməz
Nasirü ənsar – yaxın köməkçilər

Natəvan – zəif, gücsüz
Navək – ox
Ney – qamış; qamışdan qayrılmış tütək
Neynəva – İmam Hüseyn (ə)-ın şəhadətə yetişdiyi yerin adı.
Nəbi – xəbər gətirən (peyğəmbər)
Nəcəf – İraqda Həzrət Əli (ə)-ın dəfn olunduğu şəhər
Nəhar – günorta
Nəhr – çay
Nəhy – qadağan olunmuş
Nəfxi-sur – qiyamət günü İsrafilin sur çalması
Nəqqarə – nağara
Nəqli-məkan – bir yerə getmə, yer dəyişmə
Nəmrud – İbrahim peyğəmbərin (ə) zamanında yaşamış zalım bir hökmdar olmuşdur. İbrahim (ə)-ı oda atdırmış, lakin Allah-təala öz peyğəmbərini oddan xilas etmişdi.
Nə`rəkünan – nərə çəkərək
Nəsb – dikmə, sancma
Nəsrin, nəstərən – çiçək növləri
Nə`ş – cənazə
Nəşvü nüma – böyüyüb artma
Nəva – avaz, səs, nəğmə; muğam adı
Nəvaxan – oxuyan; nalə edən
Nəzarə – baxmaq, gözdən keçirmə
Nigah – baxma, nəzər
Nigahban – gözətçi, qarovulçu
Nigahdar – qoruyan, saxlayan
Nihan – gizli
Nilufər – nilufər, suzanbağı
Nik – yaxşı
Nikolay Romanoviç – sonuncu rus imperatoru II Nikolay nəzərdə tutulur
Nim – yarı
Nimşəqq – yarıya bölünmüş
Nisar – səpmə, dağıtma; qurban
Niyran – od, cəhənnəm
Nöhüm – doqquzuncu
Növbəhar – yazın əvvəli, bahar
Növcəvan – yeniyetmə

Növgüli-şükufteyi-tər – yeni açılmış qızılgül
Növkədxuda – yeni ailə qurmuş gənc
Növki-cida – nizənin ucu, nizənin başı
Növhə – əsasən Kərbəla şəhidlərinə həsr olunmuş hüznlü şeir
Növhəxan – növhə oxuyan
Növgül – tər qızılgül
Növrəs – bur. cavan
Növrəsid(ə) – yeniyetmə
Növrəstə – yeniyetmə
Nuri-eyn – gözün işığı
Nuri-düeyn – iki gözün işığı
Nuhi-nəbi – Nuh peyğəmbər (ə)
Nuri-bəsər – göz uşağı
Nuzdəhüm – on doqquzuncu
Nümayan – görünən, zahir olan
Nüzul – aşağı enmə, nazil olma

**Ö**

Ömər ibn Sə`d ibn Vəqqas – İbn Səd adı ilə məşhurdur. Kərbəlada İmam Hüseyn (ə)-la vuruşan İbn Ziyad qoşununun komandanı idi. Əhli-Beyt (ə)-ın ən qatı düşmənlərindən biri idi.
Övc – bir şeyin son, ən yüksək nöqtəsi
Övd – qayıtma, təkrarlama
Övn – Övn ibn Cəfər ibn Əbu Talib (Cəfəri-Təyyarın oğlu) Kərbəla şəhidlərindəndir.
Övn – Övn ibn Abdullah ibn Cəfər. Həzrət Zeynəbin oğlu. O biri qardaşı Məhəmmədlə birlikdə aşura günü şəhid olmuşdur.
Övn – Övn ibn Əli ibn Əbu Talib. Kərbəla şəhidlərindəndir.
Övliya – vəlilər, başçılar; Allahın dostları
Övsaf – vəsflər
Övza – vəziyyət, durum

**P**

Pabəsər – başdan-ayağa
Pabəstə – ayağı bağlı, əsir, dustaq

Padşahi-fəthi-Hüneyn – Hüneyni fəth edən padşah. Həzrət Əli (ə) nəzərdə tutulur
Padşahi-məhşər – məhşər gününün padşahı. Bur. İmam Hüseyn (ə) nəzərdə tutulur
Padşahi-Kərbəla – Kərbəla şahı, İmam Hüseynə (ə) işarədir
Padşahi-təşnəcigər – ciyəri susuz padşah, İmam Hüseynə (ə) işarədir
Pa(y) – ayaq
Pabus – ayaq öpmə
Pamal, paymal – ayaq altında qalma, məhv olma
Pas(i)ban – gözətçi, qarovulçu
Peykan – ox
Peykər – bədən
Pəjmürdə – əzgin, solğun
Pəlid – alçaq
Pənctəni-Ali-Əba – Məhəmməd Peyğəmbər (s)-in özü, qızı Həzrət Fatimə (s.ə), kürəkəni və əmisi oğlu Həzrət Əli (ə), sevimli nəvələri İmam Həsən (ə) və İmam Hüseyn (ə)-dən ibarət əba əhli, Əhli-Beyt (ə)
Pərşikəstə – qanadı sınmış
Pərəstar – qulluqda durma
Pərişan – dağınıq, kədərli
Piçidə – dolaşmış
Pirəhən, pirahən – köynək
Pirü cəvan – qoca və gənc
Piş əz – qabaqca, öncə
Pişva – rəis, başçı
Pişvaz – qarşılama
Pünhan – gizli
Püram – adamla dolu
Pürbəha – çox qiymətli
Pürxun – qanla dolu
Pürqəm – qəmlə dolu, qəmli
Pürşərar – yandırıcı

**R**

Rah – yol
Rağib – rəğbət göstərən

Ravi – rəvayət edən
Razü niyaz – Allaha yalvarıb-yaxarma
Rehlət – köçmə; rəhmətə getmə
Rəcəz – döyüşdən əvvəl pəhləvanların üz-üzə durub oxuduqları şeir
Rəfiq – yoldaş, dost
Rəha – qurtulma, xilas olma
Rə(a)hi-hidayət – düz yol
Rəhmi-bipayan – sonsuz mərhəmət
Rəhnüma – yol göstərən, bələdçi
Rəxnə – xələl, ziyan
Rəxt – paltar
Rəxtxab – yataq, yorğan-döşək
Rəməq – son nəfəs, qüvvə
Rənc – əzab, əziyyət
Rə`s – baş
Rəsuli-Əkrəm – Məhəmməd Peyğəmbər (s)
Rəsuli-rəhnüma – düz yol göstərən Peyğəmbər (s)
Rəstə – qurtulmuş, azad olmuş
Rəstgar – xilas olma
Rə`şə – titrəmə, titrəyiş
Rəşid – rəşadətli, igid, qorxmaz
Rəvaq – sütunlu eyvan
Rəzm – dava, döyüş
Rəzmgah – döyüş meydanı
Rida – bur. əba
Rikab – atın üzəngisi
Riqqət – təəssüf etmə, rəhmi gəlmə
Risalə – əsər, kitab
Risman – ip, kəndir
Riş – saqqal
Rişə – kök, əsl
Riza – səkkizinci İmam Rza (ə)
Riza – razılıq
Rizvan – behişt
Rö`ya – yuxu
Rövnəq – parlaq, gözəl; çiçəklənmə
Rövşən – aydın, işıqlı

Rövzeyi-mütəhhər – pak məzar
Rubəru – üzbəüz
Rudi-xun – qandan ibarət çay
Rum – qədim Vizantiya
Rusiyah – üzüqara
Ruygərdan – üzü dönmüş
Ruzi-cəza – axirət günü
Ruzi-Ələst – Ələst günü. Yaradılışın ilk günündə Allah-təala ilə insanlar arasında bağlanan əhd günü.
Ruzigar – zəmanə, dövran, həyat
Rübab(ə) – İmrəül-qeys bin Ədinin qızı, İmam Hüseyn (ə)-ın xanımı, Əli Əsğər və Səkinənin anası
Rücu` – qayıtmaq
Rüx – üz, sifət
Rüxsar – üz, çöhrə
Rüxsət – icazə, rüsxət

**S**

Sahəti-Mina – Mina (Məkkə yaxınlığında hacıların qurban kəsdiyi yer) fəzası, məkanı
Sahibəza – yas sahibi
Sahibi-zəmanə – zəmanənin sahibi. Sonuncu İmam Mehdi (ə.f) nəzərdə tutulur.
Sahibül-əsr – Əsrin sahibi. İmam Mehdi (ə.f) nəzərdə tutulur
Saqiyi-Kövsər – cənnətdə olan Kövsər bulağının saqisi (su paylayanı) Həzrət Əli (ə) nəzərdə tutulur
Sail – dilənçi
Sal – il
Salar – rəhbər, başçı
Saleh (ə) – Səmud qövmünə göndərilmiş peyğəmbərdir. Ərəb olmasına baxmayaraq Tövratda adı çəkilmişdir.
Sara – Həzrət İbrahim (ə)-ın birinci zövcəsinin adı
Sariban – dəvələri sürən
Sayə – kölgə
Sayəban – kölgə salmaq üçün örtü
Satir – örtü

Seyd – ov
Seydvəş – ov kimi
Seyl – sel
Seyyid – ağa, cənab
Seyyidüş-şühəda – şəhidlərin ağası. İmam Hüseyn (ə)-ın ləqəbi
Seyyümbarə – üçüncü dəfə
Səba – yüngül və lətif meh
Səbarə – üçüncü dəfə
Səbt – yazıb qeyd etmə
Səbz – yaşıl
Səcdəgah – səcdə edilən yer
Səd – yüz
Sədparə – yüz parça, parça-parça
Sədri-zin – yəhərin üstü
Səfheyi-rüxsar – üz, sifət
Səf-səf – dəstə-dəstə
Səfidru – üzü ağ
Səfşikən – məc. qəhrəman, pəhləvan
Səfdər – səfləri dağıdan. Həzrət Əli (ə) nəzərdə tutulur
Səhl – asan
Səhmü səlabət – mətinlik, cəsarət
Səhi – qədd-qamətli, düz
Səhni-çəmən – çəmənlik
Səgi-əbtər – quyruğu kəsilmiş it
Səğir – kiçik, Əli Əsğərə işarədir
Səqqa – saqi, suçu
Səqər – cəhənnəm
Səqt – uşaq salma
Səlsəbil – cənnətdə olan çeşmələrdən birinin adı
Səkinə – Həzrət İmam Hüseyn (ə)-ın Rübabdan olan qızı
Səmavat – səmalar, göylər
Səməndər – əsatirə görə odda yaşayan və odu təcəssüm edən canlı
Səmumi-sitəm – səmum zülmü. Səmum səhralarda əsən çox şiddətli, isti və quru küləkdir
Səndəl – stul, kürsü
Sənəm – məc. gözəl, sevgili
Səngi-bəla – bəla daşı

Sər – baş
Sərfəraz – başı uca
Sərdar – komandan, başçı
Sərəndib – Hindistanın cənubunda yerləşən indiki Seylon adası. Rəvayətə görə Həzrət Adəm (ə)-ın behiştdən gəlib düşdüyü ilk yerdir
Səri-dürah – iki yol ayrıcı
Sərgərdan – avara
Sərnigun – yıxılmış, məhv edilmiş
Sərmənzil – mənzil başı
Sərməst – sərxoş
Sərsəri-sitəm – zülm sərsəri. Sərsər çox bərk və soyuq küləyə deyilir
Sərvər – başçı, rəis
Sərvəri-dövran – zəmanənin rəhbəri
Sərzəniş – məzəmmət
Sərzəmin – ölkə, yer
Səyyad – ovçu
Səyyarə – planet
Səza – layiq, yaraşan
Sibi-behişt – behişt alması
Sibti-Peyəmbər – Peyğəmbər nəvəsi. İmam Hüseyn (ə) nəzərdə tutulur
Sidq – doğruluq, səmimilik
Sili – sillə
Sinan – nizənin ucu
Sinan – Sinan ibn Ənəs. Ömər ibn Sədin qoşununda vuruşan canilərdən biri. Deyilənlərə görə, İmam (ə)-ın başını kəsib nizəyə taxmış və bu işinə görə ibn Ziyaddan mükafat istəmişdi.
Sindi ibn Şahək – İmam Museyi-Kazım (ə)-ın qatili
Sinəçak – məc. yaslı
Sinn – adamın yaşı
Sipər – qalxan
Sir – tox, doymuş
Sirab – sudan doymuş
Siraət – yayılmaq
Sirişk – göz yaşı
Siyah – qara
Siyəhkər – günahkar
Siyəhru – üzüqara

Sitarə – ulduz
Sitəm – zülm
Sitəmkər – zülmkar, zalım
Sövt – səs, səda
Sultani-məzluman – məzlumların sultanı, İmam Hüseynə (ə) işarədir
Susən – zambaq
Suzi-ətəş – susuzluqdan yanmaq
Suziş – yanğı, ağrı
Süfuf – səflər
Süleyman (ə) – Bəni İsrail peyğəmbərlərindən Davud (ə)-ın oğludur. Qurani-Kərimdə adı çəkilmişdir.
Sükna – sakin olma
Sürur-qəlb – ürəyin şadlığı

## Ş

Şafiyi-ruzi-məhşər – axirət gününün şəfaət verəni. Məhəmməd Peyğəmbər (s) və ya Əhli-Beyt (ə)-dan hər hansı biri nəzərdə tutulur.
Şaha – ey Şah. Bur. İmam Hüseyn (ə) nəzərdə tutulur
Şahanə – şah kimi, şaha layiq
Şahi-din – dinin şahı. Bur. İmam Hüseyn (ə) nəzərdə tutulur
Şahi-Hicaz – Hicazın şahı. İmam Hüseyn (ə)-a işarədir
Şahi-məzluman – məzlumların şahı. İmam Hüseyn (ə) nəzərdə tutulur
Şahi-insü can – bütün canlıların şahı, bur. İmam Hüseyn (ə) nəzərdə tutulur
Şahi-Yəsrib – Mədinənin şahı. İmam Hüseyn (ə) nəzərdə tutulur
Şahi-Nəcəf – Nəcəfin şahı. İmam Əli (ə) nəzərdə tutulur
Şahi-şəhidan – şəhidlərin şahı. İmam Hüseyn (ə) nəzərdə tutulur
Şahi-Kərbəla – Kərbəlanın şahı. İmam Hüseyn (ə)-a işarədir
Şahi-mərdan – mərdlərin şahı. Həzrət Əli (ə)-a işarədir
Şahi-vala – məqamı ali olan Şah
Şaki – şikayətçi
Şam – Dəməşqin digər adı
Şamiyan – şamlılar, dəməşqlilər
Şami-qəriban – lüğəti mənası "qəriblərin gecəsi" deməkdir. İmam Hüseyn (ə)-ın və digər şəhidlərin şəhadətə yetişmələrinin ilk gecəsi (məhərrəm ayının 10-dan 11-nə keçən gecə). Bu gecədə məscidlərdə və

təkyələrdə İmam Hüseyn (ə) və Əhli-Beyti (ə) üçün xüsusi təziyə məclisləri tərtib olunur.
Şanə – daraq
Şaye` – hamıya məlum olan
Şeşguşə – altıguşəli. İmam Hüseyn (ə)-ın Kərbəlada olan məzarına işarədir
Şeşpər – toppuz
Şeyhə – kişnəmə
Şeyhəkünan – kişnəyərək
Şəb – gecə
Şəbi-nöhüm – doqquzuncu gecə. Tasua günü
Şəbi-vəhşət – təklik, yalnızlıq gecəsi. İnsanın vəfatının birinci gecəsi.
Şəbi-yelda – yelda gecəsi, ilin ən uzun gecəsi (dekabrın 21-i)
Şəddeyi-mərcan – mərcan dənələri düzülmüş sap
Şədid – şiddətli
Şəfaət – Axirət günü müsəlmanların bağışlanmasını Allah-təaladan istəmək.
Şəhbaz, şahbaz – şahin, tərlan
Şəhadət – İslam yolunda şəhid olma
Şəhd – bal
Şəhənşəhi-Neynəva – Neynəvanın Şahı, İmam Hüseyn (ə)-a işarədir
Şəhpər – qanad
Şəhrəbanu – İmam Hüseyn (ə)-ın zövcəsi, İmam Zeynəlabidin (ə)-ın anasıdır.
Şəqi – yaramaz adam, quldur
Şəmatət – başqasının dərdinə, müsibətinə sevinmə; tənə, töhmət, məzəmmət
Şəmşiri-bərqasa – ildırım kimi qılınc
Şəms – günəş
Şə`n – əzəmət, şöhrət, ad-san
Şərarə(t) – qığılcım, od; məc. müsibət; yamanlıq
Şərirani-Əraq – İraqın yaramazları, şər adamları
Şərməndə – xəcalətli
Şərmü həya – utanma və həya
Şərmsar – xəcalətli
Şə`şə`at – bərq vurma, parıldama
Şibhi-Peyəmbər – Peyğəmbərə oxşar, Əli Əkbərə işarədir

Şibhi-Müstəfa – Müstəfayə (s), yəni Məhəmməd Peyğəmbərə oxşar, Əli Əkbərə işarədir
Şiəyani-Mürtəza – Mürtəza (ə)-ın (Həzrət Əli) tərəfdarları
Şikar – ov
Şikəstə – sınıq
Şikvə – şikayət
Şimr ibn Zülcəvşən – Kərbəlada İmam Hüseyn (ə)-ı qətlə yetirənlərdən biri. Ömər ibn Sədin ordu komandanlarından idi.
Şirinzəban – şirindilli
Şiri-qürran – nərə çəkən şir
Şiri-Xuda – Allahın şiri. Həzrət Əli (ə)-ın ləqəblərindən biri (Əsədüllahül-qalib – Əliyyibni Əbu Talib)
Şiri-jəyan – coşmuş, qəzəblənmiş şir
Şirxarə – südəmər, Əli Əsğər nəzərdə tutulur
Şitab – tələsmək
Şö`leyi-azər – od şöləsi
Şövt – bur. dolanma, fırlanma
Şumi-ləin – lənətə gəlmiş uğursuz
Şur – bur. eşq, həvəs
Şurü şeyn – hay-küy, qışqır-bağır
Şuriş – çaxnaşma, qarışıqlıq
Şühəda – şəhidlər
Şüeyb – Qurani-Kərimdə adı çəkilən peyğəmbərlərdəndir. Musa (ə)-ın qaynatası idi.
Şüküftə – açılmış (çiçək)
Şümar – say, hesab
Şümşad – şimşad ağacı
Şürb – içki
Şürbə – bir qurtum su

**T**

Tabü təvan – güc, taqət
Tacdar – hökmdar, padşah
Taət – itaət, ibadət
Tağı-hilal – məc. əyri qaşlar
Tağı-kəlisa – kilsə tağı və ya gümbəzi

Taq – bur. əzilmiş, büzülmüş
Taqə – bir parça, bir tikə (parça, şal və s. nəzərdə tutulur)
Talib – tələb edən, istəyən, arzulayan
Tar – qaranlıq
Tarac – qarət, soyğun
Taziyanə – qamçı, qırmanc
Təbah – məhv olmuş, puç olmuş
Təbaq – toy xonçası
Təbli-bəşarət – şad bir xəbəri bildirmək və gözaydınlıq vermək üçün çalınan təbil
Təbli-şadi – şadlıq təbili
Təcdidi-vüzu – dəstəmazın yenilənməsi
Təcəlla – əyan olma, zahir olma, görünmə
Təğyir – dəyişmə
Təhəmmül – dözmək, səbr etmək
Təxtəparə – taxta parçası
Təqsim – bölgü
Təkbir – "Allahu Əkbər" (Allah ən böyükdür) demək
Təkəllüm – danışmaq, söyləmək
Təla – qızıl
Təlx – acı
Təll – təpə
Təlli-cəla – ayrılıq təpəsi
Təlli-Zeynəbiyyə – Kərbəlada Həzrət Zeynəbin savaşı seyr etmək üçün çıxdığı təpə.
Tən – bədən
Tənab – ip, kəndir
Təng – darısqal; çətin vəziyyətə düşmə
Təngdil – ürəyi sıxılmış, qəmgin
Tənur, tənnur – təndir
Tərəhhüm – rəhm etmə
Tərsa – xaçpərəst
Təsəddüq – sədəqə vermə
Təşnə – susuz
Təşnəcigər – ciyəri susuzluqdan yanan
Təşnələb – susuzluqdan dodağı qurumuş
Təşti-təla – qızıl teşt, qızıl ləyən

Təşyi`cənazə – dəfn etmək
Təvaf – Məkkədə Kəbə evinin ətrafında dolanma
Təvan – güc, qüvvət
Təyyi-mənzil – bur. yol getmə
Təyyi-rahil – bur. yola düşmə
Təzəlzül – sarsınma, zəlzələyə düşmə
Tə`ziyə – matəm, yas
Tə`ziyəsəra – matəm saxlanılan yer
Tiflü səğir – kiçik uşaqlar
Tiği-bürran – iti qılınc
Tilavət – Qurani-Kərimi xüsusi qayda ilə oxuma
Tip – bur. qoşun dəstəsi
Tir – ox
Tiri-tiz – iti ox
Tirə bəxt – bəxti qara
Tövbə – günahlara görə peşimançılıq çəkib bir daha etməmək haqqında Allah-təalaya söz vermək
Tövrat – Musa (ə) peyğəmbərə nazil olmuş səmavi kitab
Tuba – Behiştdə gözəl, hündür bir ağac
Tuf – tüpürmək
Tuşə – azuqə
Tutivəş –tutuquşu kimi
Tutizəban – tutuquşu kimi şirin danışan
Türab – torpaq
Türbəti-Kərbəla – Kərbəla torpağı
Türfə – nadir şey; qəribə, əcaib

## Ü

Übur – keçmə, atdama
Üdvan – düşmənlər
Üqab – qartal
Üqba – axirət dünyası, əbədi həyat
Ümman – dəniz, dərya
Ümməti-Xatəm – Peyğəmbərin ümməti (müsəlmanlar)
Ümmülbənin – Fatimə bint Hizam. Həzrət Əbülfəzl Abbasın anası, Həzrət Əli (ə)-ın Həzrət Fatimə (s.ə)-nın vəfatından sonra ailə qurduğu

xanım. Ümmülbəninin Həzrət Əli (ə)-dan dörd oğlu olmuşdur: Abbas, Cəfər, Abdullah və Osman. Dördü də aşura günü Kərbəlada şəhid olmuşdular.
Ünas – qadınlar
Ünfan, ünfən – istəmədən, məcburi
Üruc – yüksəlmə
Üryan – lüt
Üsəra – əsirlər
Üstüxan – sümük
Üşşaq – aşiqlər
Üzar – yanaq, üz
Üzma – çox böyük

**V**

Vadiyi-Sina – Sina vadisi
Vadiyi-eymən – əmin-əmanlıq vadisi
Va vələda – vay, övladım!
Va əsəfa – vay, təəssüflər olsun!
Vaveyla – heyf, təəssüf; bağırtı, fəryad
Vaqiə – hadisə, əhvalat; yuxu, röya
Varisi-Heydər – Həzrət Əli (ə)-ın varisi
Vəcahət – gözəllik, gözəl üz
Vəch – üz, sima; üsul, tərz; səbəb, vasitə; qiymət, dəyər
Vəcih – gözəl, lətif
Vəhid – tək-tənha
Vəhşü tüyur – vəhşi heyvanlar və quşlar
Vəqf – savab bir iş üçün ayrılmış mülk, mal və s.; Əhli-Beyt (ə) aşiqlərinin ayırdıqları vəsait hesabına tərtib edilən məclislər.
Vəqti-zəval – tələf olma, məhv olma vaxtı
Vəliyullah – Allahın vəlisi; Həzrət Əli (ə)-ın ləqəblərindən biri
Vəsf – tərif etmə, təsvir etmə
Vəsl – birləşmə, qovuşma, vüsala çatma
Vəsiyyi-Peyğəmbər – Peyğəmbərin (s) canişini, Həzrət Əli (ə)-a işarədir.
Vətənqərib – vətəndən ayrı düşmə
Vəz-züha – Qurani-Kərimin 93-cü surəsi. Səhər və səhər işığı mənası verir.

Virdi-zəban – dilin əzbəri
Vükəla – bur. nümayəndələr
Vürud – daxil olma
Vüs`əti-aləm – geniş dünya
Vüzu – dəstəmaz

**Y**

Yasin – Qur`ani-Kərimin 36-cı surəsi
Yavər – köməkçi, yardımçı
Yekkəvü tənha – tək-tənha
Yeksər – başdan-başa, tamamilə
Yeksan – düz, bərabər
Yəbni – "ya ibni", "ey mənim oğlum" deməkdir
Yədullah – Allahın əli
Yəhya (ə) – Bəni İsrail peyğmbərlərindən Zəkəriyya (ə) peyğəmbərin oğludur. Yəhudilər tərəfindən qətlə yetirilmişdi.
Yə`qub (ə) – Qurani-Kərimdə adı çəkilən peyğəmbərlərdəndir. Yusif (ə) peyğəmbərin atası, İshaq (ə)-ın oğludur. Bir adı da İsrail olduğundan bu nəsildən olanlara Bəni İsrail deyilir. Böyük oğlunun adı Yəhud olduğundan sonradan onlara yəhudi deyilmişdir.
Yəmin – sağ, sağ tərəf
Yəsar – sol, sol tərəf
Yəsrib – Mədinə şəhərinin qədim adı
Yəzid ibn Müaviyə – atası Müaviyə öldükdən sonra hakimiyyətə gələn ikinci Əməvi xəlifəsi. Əhli-Beyt (ə)-ın qatı düşmənlərindən biri, Kərbəla faciəsinin əsas baiskarı.
Yövmi-ərəsat – Məhşər günü
Yusifi-Kən`an – Yəqub peyğəmbərin on iki oğlundan ən kiçiyi, Qurani-Kərimin 12-ci Yusif surəsi onun haqqındadır.

**Z**

Zadeyi-Mərcanə – Mərcanənin övladı. İbn Ziyada işarədir. Kufə valisi Übeydullah ibn Ziyadın anası Mərcanə adlı bir kəniz olub.
Zadeyi-Zəhra – Zəhra övladı. İmam Həsən (ə), İmam Hüseyn (ə) və onların övladları.

Zadeyi-Ziyad – Ziyad övladı, İbn Ziyada işarədir
Zahid – ibadətlə məşğul olan şəxs
Zağü zəğən – qarğa
Zakir – zikr edən, təsbih və vird edən; təziyələrdə əzadarlıq edib növhə oxuyan
Zar – ağlayan, inləyən
Zail – fani, keçib gedən, keçici
Zair – ziyarət edən
Ziba – gözəl
Zibh – kəsmək, qurban kəsmək
Zibəs – o qədər, kifayət qədər
Zibi-çəmən – çəmənin bəzəyi, zinəti
Zikri-mühən – müsibətlərin, dərdlərin xatırlanması. Kərbəla faciəsindən bəhs edən növhə, sinəzən, mərsiyə söyləmək və ya yazmaq.
Zikri-möhnət – bax: zikri-mühən
Zikri-müsibət – bax: zikri-mühən
Zimistan – qış
Zində – diri
Zindəganlıq – yaşayış, həyat
Zirü zəbər – alt-üst
Ziyadə – çox
Zivər – zinət, bəzək
Zəban – dil
Zəbihi-rahi-Əllah – Allaın yolunda kəsilən
Zəbihullah – Allah yolunda kəsilən
Zəbun – zəif, taqətsiz
Zəccə – nalə, fəyad, şivən
Zəcr – məcbur etmə; zülm etmə
Zəvvari-Kərbəla – Kərbəlanı ziyarət edənlər
Zəhi – nə gözəl (bur. istehza ilə deyilib)
Zəhra (s.ə) – Peyğəmbərimizin (s)-in qızı Həzrət Fatimə (s.ə)-nın ləqəblərindən biri
Zəhri-həlalhil – çox qüvvətli və öldürücü zəhər
Zəmzəm – Məkkədə Kəbənin yaxınlığındakı quyunun adı
Zeynəlabidin (ə) – On iki İmamın (ə) dördüncüsü, Peyğəmbər (s)-in nəvəsi İmam Hüseyn (ə)-ın ortancıl oğlu. Kərbəla faciəsi zamanı xəstə olduğuna görə qətlə yetirilmir.

Zeynəb – Həzrət Əli ibn Əbu Talib (ə)-ın və Həzrət Fatimeyi-Zəhra (s.ə)-nın qızları, İmam Hüseyn (ə)-ın bacısı. Kərbəla hadisəsində iştirak etmiş, Yəzidin qoşununa əsir düşmüş və Şama aparılmışdı. Növhə ədəbiyyatında qorxmazlıq, dönməzlik, iradə, iffət nümunəsi kimi verilir.
Zəxmdar – yaralı
Zəxmi-xəncəri-bürran – iti xəncərin yarası
Zəlalət – doğru yoldan azma; alçalma; əziyyət çəkmə
Zəlilanə – yazıqcasına
Zərbi-şəst – qolun qüvvəti
Zərd – sarı
Zəmin – yer, torpaq
Zən, zənan – qadın, qadınlar
Zənəx – çənə
Zükurü ünas – kişilər və qadınlar
Zülfiqar – Həzrət Əli (ə)-ın iki haçalı qılıncının adı
Zülcənah – İmam Hüseyn (ə)-ın atının adı
Zülfi-müənbər – ənbər saçan zülf
Zülfi-mişki-fam – müşk kimi qara zülf
Züleyxa – Yusif peyğəmbərə (ə) aşiq olmuş Misir əzizinin zövcəsi.

Mündəricat

## MÜXTƏLİF ŞEİRLƏR

## NOVHƏ VƏ SİNƏZƏNLƏR